## AZƏRBAYCAN ƏFSANƏŞÜNASLIĞI VƏ SƏDNİK PAŞA PİRSULTANLI

Böyük elm yoluna 26 yaşında ikən (1955-ci ildə) yazdığı «Xalq ədəbiyyatı nümunələri nə vaxt nəşr ediləcəkdir?» adlı məqaləsi ilə çıxan S.P.Pirsultanlı keçən müddət ərzində Azərbaycan folklorunun, o cümlədən əfsanələrin toplanması və tədqiqinə, sözün həqiqi mənasında, ömrünü vermişdir. Əfsanə və rəvayətlər onun elmi fəaliyyətində əsas yeri tutmuş və alim bu janrların toplanması və tədqiqinə fundamental əsərlər həsr etməklə «S.P.Pirsultanlı» imzasını Azərbaycan eposunun tədqiqi tarixinə həkk etmişdir.

Əslində, əfsanələr «Əsatirlərin, əfsanələrin və rə-vayətlərin toplanması, nəşri və araşdırılması bir folk-lorşünas kimi mənim taleyimə yazılmışdır», – deyən S.P.Pirsultanlının alim və şəxsiyyət taleyinin əhə-miyyətli parçasıdır. Folkloru öyrənə-öyrənə özü də canlı folklor daşıyıcısına çevrilən bu alimlə istənilən mədəni ünsiyyət əfsanəsiz ötüşmür: S.P.Pirsultanlı milli insanı ümumən folklordan, mifdən, əfsanə və rəvayət tari-xindən qıraqda təsəvvür etmir və onun üçün hər bir insan folkloru, o cümlədən folklorda yaşayan tarixi (əfsanə və rəvayətləri) bildiyi qədər insandır, ondan artıq deyildir. S.P.Pirsultanlının Azərbaycan insanına verdiyi bu qiymət onun özünəməxsus elmi baxışlar sisteminin də əsasını təşkil edir.

Azərbaycan əfsanəşünaslığının bu canlı elm əfsa-nəsinin folklora baxışlar sisteminin formalaşma tarixi əlamətdar hadisədir. O, folklorun bağrından

qopmuşdur: 1929-cu ildə sözlü-nağıllı bir məkanda dünyaya göz açan müəllif bütün ömrü boyu folklorun cazibəsindən qopa bilməmiş, canlı folklorun ifa olunduğu el-obadan ayrı durmağı bacarmamışdır. Yeniyetməliyi, gəncliyi və bütün ömrü folklor mühitində keçmişdir. Ali məktəb ona ədəbi düşüncəyə, xalq yaradıcılığına yeni nəzərlə baxış imkanı vermiş və S.P.Pirsultanlı folklorun dəyəri heç nə ilə müqayisəyə gələ bilməyəcək xəzinə olduğunu an-layıb, o zamandan bütün varlığını folklora bağlamışdır. Hər bir əsərinə canının bir parçası, övladı kimi baxan alimin yarım əsr ərzində «can dünyasından» 50-dən çox kitab, yüzlərlə məqalə qopmuşdur. Bunların içərisində neçə-neçə toplama və tədqiqat əsərləri («Yaşayan əfsa-nələr» (1973); «Yurdumuzun əfsanələri» (1976); «Niza-mi və folklor» (1976); «Yanardağ əfsanələri» (1978); «Nizami və xalq əfsanələri» (1983); «Azərbaycan əfsa-nələrinin öyrənilməsi» (1985); «Azərbaycan xalq əfsa-nələri» (1985); «Azərbaycan mifoloji mətnləri» (1988); «Azərbaycan xalq söyləmələri» (1992) və s. əfsanə və rəvayətlərə həsr olunmuşdur. Görkəmli folklorşünasın burada oxuculara təqdim olunan ***«Azərbaycan türkləri-nin xalq əfsanələri»*** kitabının isə əlahiddə və fundamen-tal əhəmiyyəti vardır.

«Azərbaycan türklərinin xalq əfsanələri» kitabı prof. S. P. Pirsultanlının əfsanələrin toplanması, nəşri və tədqiqi istiqamətində gördüyü işlər içərisində xüsusi yeri və əhəmiyyəti olan hadisədir. Bu hadisə bütün hallarda mükəmməlliyi ilə seçilir: istər onda təqdim olunmuş mətnlər, istərsə də həmin mətnlərin elmi tədqiqi baxımından.

Biz dəfələrlə yazmışıq ki, prof. S. P. Pirsultanlının folklorşünaslıq görüşləri əsas etibarı ilə kitablardan deyil, canlı folklorla yarım əsrlik canlı ünsiyyətdən nəşət etmişdir. Bu cəhət eynilə onun əfsanəşünaslıq görüş-lərinə də aiddir. Kitabın əvvəlində verilmiş «Əfsanə və onun başqa epik janrlarla əlaqəsi» adlanan ön söz, bu baxımdan, prof. S. P. Pirsultanlının uzun onilliklər ərzin-də cilalanan, cilalandıqca təkmilləşən, daha dərin intellektual mənalar kəsb edən əfsanəşünaslıq gö-rüşlərini parlaq şəkildə əks etdirir.

İlk baxışdan normativ elmi standartlar əsasında ya-zılmış bir «giriş» təsiri bağışlayan müqəddimə, əslində, prof. S. P. Pirsultanlının dinamik inkişafda olan folklorşünaslıq görüşlərinin, bir növ, şərti yekunudur. O, bütün əsərlərində olduğu kimi, burada da dərin elmi mətləbləri, mürəkkəb nəzəri formulları özünə məxsus olan dahiyanə sadəliklə şərh etmişdir. Əfsanə janrının poetik strukturuna dair verdiyi model alimin epik mətni necə formullaşdırmasını əyani şəkildə ifadə edir.

Prof. S.P.Pirsultanlı əfsanənin poetik formulunu aşağıdakı kimi müəyyənləşdirmişdir:

- Əfsanənin həyati məzmunu;
- Əfsanənin ideya mahiyyəti;
- Əfsanələrin xəlqiliyi;
- Əfsanədə ənənəvilik;
- Əfsanənin bədii sistemi;
- Əfsanə və əsatirin qarşılıqlı mənsubiyyəti: bu janrın genetik əlaqəsi;
- Əfsanənin tarixən dəyişməsi;
- Həqiqət və əfsanə.

Əfsanənin poetik strukturuna dair alimin sadaladığı maddələr onu bir janr kimi

səciyyələndirən struktur səviyyələrinin natural çoxluğu kimi yox, sistemi şərt-ləndirən, hərəkətə gətirən morfoloji-sintaktik kons-truksiya kimi təqdim olunmuşdur. Bu cəhətdən sada-lanan struktur səviyyələrinin hər birinin sistemdə öz yeri, funksiyası vardır. Məsələn:

***«Əfsanənin həyati məzmunu»*** mətnin funksional mahiyyətini nəzərdə tutur. Əfsanə janrı bir formal struk-tur hadisəsi olmaqla məzmununu reallıqdan alır. Bu ba-xımdan, mətndə əks olunan məzmun formanı həm şərt-ləndirir, həm də onu hərəkətə gətirir.

S.P.Pirsultanlının təqdimatında ***«əfsanənin ideya mahiyyəti»*** mətnin funksionallaşma imkanlarının funda-mental istiqamətlərini nəzərdə tutur. Mətn məz-munundan asılı olmayaraq kommunikativ xarakterli iş görür. Bu halda ideya kommunikasiyanın funksional isti-qamətini müəyyənləşdirmiş olur.

***«Əfsanələrin xəlqiliyi»*** dedikdə prof. S. P. Pirsul-tanlı məsələyə heç də vulqar sosiologiyada olduğu kimi sinfiləşdirmə kontekstində yanaşmır. Burada «xəlqilik» mətnin sosial-praqmatik funksionallaşma imkanlarını ifa-də edir.

Alim ***«əfsanədə ənənəvilik»*** dedikdə janrın tarixi-mədəni mövcudluğunun əsas poetik mexanizmlərindən birini ortaya qoyur. Bu halda əfsanənin varlığı onun özü-özünü necə təşkil etməsinə (yaratmasına) müncər olur.

Prof. S. P. Pirsultanlının yanaşmasında ***«əfsanənin bədii sistemi»*** mətnin poetik struktur elementlərinin bə-dii-estetik səviyyəyə necə kodlaşmasını nəzərdə tutur.

Alim ***«əfsanə və əsatirin qarşılıqlı mənsubiyyəti: bu janrın genetik əlaqəsi»*** qatını təqdimat müstəvisinə gətirməklə mətnin poegenezisinə və onu təşkil edən struktur mexanizmlərinə təhlil aktuallığı vermiş olur.

***«Əfsanənin tarixən dəyişməsi»*** adı altında S. P. Pir-sultanlı poetik sistemin tarixən dəyişməsini nəzərdə tutur. Lakin alim bu halda strukturu və dinamikanı ciddi şəkildə bir-birindən fərqləndirir. Onun təqdimatında «əf-sanənin tarixən dəyişməsi» dəyişəni (dinamikanı) və də-yişməzi (strukturu) vahid sistem kimi əhatə edir.

Alimin təqdiqatında ***«həqiqət və əfsanə»*** yanaşma konsepti sadə hadisə deyildir. Burada «həqiqət və uydur-ma (təxəyyül)» münasibətlərinin mürəkkəb strukturu nə-zərdə tutulmuşdur. Filosof Rəhman Bədəlovun yazdığı kimi, «həqiqət-uydurma» oppozisiyasının metaforizmi semiotik yozumlarda əhəmiyyətli dərəcədə o zaman ara-dan qaldırılır ki, mif və onun reduplikasiyaları (təkrarları, yandaşları, qoşalaşmaları – S. R.) potensial, dərkolun-mamış işarəlilik, incəsənətdəki «həqiqət-uydurma» isə «məqsədli işarələndirmə» ilə «qeyri-işarəvi işarəlilik» arasında işarədaxili fərqlər kimi başa düşülsün (R.Bə-dəlov. Qəhrəmanlıq eposunda həqiqət və uydurma. Bakı, «Elm», 1983, s. 128-129).

Əfsanə janrının bu orijinal modelləşdirilməsi fo-nunda bir cəhətə təkrarən toxunmaya bilmirik. Belə ki, prof. S. P. Pirsultanlının folklorla bağlı nəzəri görüşləri-nin özünəməxsusluğu onun bir insan və alim kimi ömür yolu ilə müəyyənləşmişdir. Bütün ömrü və yaradıcılığı boyu folklor mühitindən qopmayan alim folklor haqqın-da nəzəri bilikləri

yalnız kitablardan öyrənməmişdir. Kitablar onu folklor poetikasının astanasınacan gətirmiş-dir: o yerə qədər ki, orada folklor düşüncəsinin univer-salizmi tükənir və hər bir milli düşüncənin öz folklor poetikası başlanır. S.P.Pirsultanlı bu astananı keçmiş və Azərbaycan folklorunun poetik mahiyyəti ilə birbaşa el-mi-intellektual ünsiyyətin feyzindən bütün ömrü boyu qopa bilməmişdir. Bu baxımdan, S. P. Pirsultanlı Azər-baycan folklorşünaslıq elminin o nadir alimlərindəndir ki, folklorla bağlı nəzəri-intellektual görüşləri birbaşa folklor mühiti ilə canlı ünsiyyətdən nəşət etmişdir. Ali-min Azərbaycan və ümumtürk folklorunun bir çox fundamental məsələləri ilə bağlı müstəqil, orijinal və polemik tədqiqatlarının mənbəyində də bu durur: folklo-ru mətn və düşüncə hadisəsi kimi onunla canlı ruhani-intellektual ünsiyyət prosesində dərk etmək. Bu baxım-dan, prof. S. P. Pirsultanlı öz alim bioqrafiyasında bir çoxlarından fəqli olaraq, kitablardan oxuduqlarını folklor mətnlərinə uyğunlaşdırmaqdan tez bir zamanda əl çəkib, folklorun nə olduğunu mətnin özündən öyrənməyə çalış-mışdır. Alimin «Azərbaycan türklərinin xalq əfsanələri» adlı kitaba yazdığı «Əfsanə və onun başqa epik janrlarla əlaqəsi» adlı müqəddimədə əfsanələrə belə orijinal baxışları, əslində, onun bütün folklorşünaslıq yaradı-cılığının nəzəri-intellektual mahiyyətini təşkil edir.

Ümumiyyətlə, alimin təkcə bu müqəddimədə yox, son dərəcə zəngin digər folklorşünaslıq araşdırmalarında reallaşdırdığı düşüncələrinə görə, əfsanə və rəvayət janrlarının öyrənilməsi ilk növbədə onlarda yaşayan mil-li tarixlə əlamətdardır: «Azərbaycan folklorunun müstə-qil janrlarından

sayılan əfsanə və rəvayətlər özünə-məxsus yaranma, formalaşma və yayılma mərhələləri keçirmişdir. Bu janrlar ideya-məzmun tutumuna görə yüzilliklərə yoldaşlıq etmiş, cəmiyyətdə baş verən ictimai-siyasi hadisələrə biganə qalmamışdır».

Azərbaycan folklorşünaslığının ağsaqqalının fikrin-cə, əfsanə və rəvayətlərin poetik təbiəti elə qurulmuşdur ki, onlarda etnosun həyatının daha çox ictimai-siyasi hadisələri işarələnir. S. P. Pirsultanlının bu fikri ilk ba-xışda etiraz doğura bilir. Çünki elə əfsanə və  rəvayətlər vardır ki, onlar lirik-psixoloji məzmunlu olub, zahiri planda ictimai-siyasi məzmun daşımır. Ancaq ömrünü folklorla canlı ünsiyyətdə keçirmiş Sədnik müəllim əfsa-nə və rəvayət janrlarının poetikasına intellektual nüfuz edərək bu janrların kosmopoetik strukturunun ictimai-siyasi kodlar üzərində qurulduğunu anlamışdır. Başqa sözlə, gerçəkliyin istənilən tematik bütövü əfsanə və rəvayət janrının poetik strukturundan keçərkən ictimai-siyasi koda uyğun obrazlaşır. Bu cəhətdən, hətta sevgi məzmunlu əfsanə və rəvayətlərin məzmununun struktur planını da ictimai-siyasi kod təşkil edir. Alim bu xüsusda yazır ki, «mifoloji-tarixi gerçəkliyi bu və ya başqa for-mada özündə qoruyan əfsanə və rəvayətlər poetik söz sənətinin ənənəvi janrları, xüsusi ilə epik növü ilə həmişə təmasda, qarşılıqlı əlaqədə təkmilləşib özünə-məxsus bir təkamül yolu keçmişdir. Bu janra dair örnək-lər Azərbaycan türklərinin ayrı-ayrı tarixi kəsimlərdəki inkişaf yolunu, həyat və məişətini, adət-ənənəsini işıq-landırmış, mənəvi dünyasının, ovqatının tərcümanına çevrilmişdir».

Prof. S. P. Pirsultanlı uzun illərin müşahidəsi nəti-cəsində əfsanə və rəvayət janrlarının milli epik

düşün-cənin əsaslarını təşkil etməsi qənaətinə gəlmişdir. Alim göstərir ki, «əfsanə və rəvayətlər ozan-aşıq sənətindən gələn epos-dastan yaradıcılığı üçün də rüşeym, başlanğıc rolunu oynamışdır. Bu janrlarda qorunan süjet və motiv-lərin xalq hekayətlərinə çevrilməsi prosesi bunu bir daha aşkar etməkdədir. Başqa sözlə, şeirlə nəsrin növbələş-məsində nizamlanan Azərbaycan epos-dastan yaradıcı-lığı öz formalaşma istiqamətində əfsanə və rəvayətlər-dən də köklü surətdə bəhrələnmişdir. Bu komponentin elmi-nəzəri kontekstdə aşkarlanması epos və dastanların poetik strukturunu təyin etməkdə effektli rol oynamış-dır».

Göründüyü kimi, alimin bu fikirlərində əfsanə və rəvayətlər epos yaradıcılığının üzvi tərkib hissəsi kimi götürülmüşdür. Azərbaycan folklorşünaslığında uzun il-lər ərzində dastan və nağıllar, əfsanə və rəvayətlər və s. epik janrlar sisteminə aid edilsə də, bu janrlara epos sisteminin struktur səviyyələri kimi baxılmamışdır. İndi də əksər tədqiqatlarda «epos» adı altında yalnız «dastan» nəzərdə tutulur. Halbuki bu anlayışlar arasında mürək-kəb poetik münasibətlər vardır. Epos etnosun düşüncə sisteminin epik əsasıdır: milli düşüncə sisteminin bütün poetik sxemləri onda cəmləşir. Düşüncə sistemi olan epos mətn səviyyəsində dastan, nağıl, əfsanə, rəvayət və s. epik janrlardan təşkil olunur. S. P. Pirsultanlının yuxa-rıdakı fikrində epos-dastan və əfsanə-rəvayət münasi-bətləri məhz epos düşüncəsi sistemində birləşən üzvi tərkib hissələri kimi təqdim olunmuşdur. Azərbaycanı qarış-qarış gəzən, onun folklorunu misra-misra, sətir-sətir öz düşüncəsindən keçirən Sədnik müəllim əfsanə və rəvayətlərin bütün janr müstəqilliklərinə

baxmayaraq, digər epik janrlardan təcrid olunmadığını müşahidə et-mişdir. O, aydınlaşdırmışdır ki, xalq arasında müstəqil hekayətlər kimi gəzib-dolaşan əfsanə və rəvayətlər öz növbəsində dastanların poetik strukturuna daxil olur və bütün bu janrların hamısı epos sistemində bir-biri ilə qovuşaraq xalqın epik düşüncə sistemini (etnoepik təfək-kür modelini) təşkil edir.

Qeyd etmək istərdik ki, prof. S.P.Pirsultanlının yaradıcılığında epik janrlar bütün hallarda bir sistem ha-lında öyrənilmişdir. O, əfsanələri heç vaxt əsatirlərdən, rəvayətlərdən ayrı təsəvvür etməmiş, bu janrları bir-bi-rindən ayıran sərhədləri dəqiq və düzgün təsəvvür et-məklə onları vahid sistem müstəvisində araşdırmışdır. Bu cəhətdən əfsanə və rəvayətlərin epik düşüncə sis-temində yerini müəyyənləşdirən alim qeyd edir ki, «kol-lektiv yaradıcılıq məhsulu kimi əsrdən-əsrə keçərək məzmun və ideyaca zənginləşən, xalq təcrübəsinin ən yaxşı keyfiyyətləri ilə bəzənən əfsanə və rəvayətlər folklorun epik növünə daxil olan müstəqil janrlar kimi şifahi xalq yaradıcılığının ənənəvi janrları içərisində özünəməxsus yer tutur».

Göründüyü kimi, alimin düşüncələrinə görə, əfsa-nə və rəvayətlər folklorun ən qədim janrlarındandır və bu mənada folklor dünya modelinin struktur dəyərlərinin daşıyıcılarıdır, digər tərəfdən, etnoepik düşüncənin bü-tün struktur dəyişmələri həmin janrlarda öz əksini tap-mışdır.

S. P. Pirsultanlı uzun illərin müşahidəsi nəticəsində belə bir qənaətə gəlmişdir ki, «əfsanə, əsatir və rəva-yətlər arasındakı yaxınlıq tipoloji yox, genetik xarakter-dədir. Rəvayət daha çox real həyat həqiqətlərinin təhki-yə formasındakı bədii ifadəsidir.

Rəvayətdə olmuş, baş vermiş həyat hadisələri yığcam şəkildə inikas olunur. Lakin əhvalat inkişaf etdikcə təhkiyənin də keçid mərhə-lələri dəyişir. Bu zaman o törəndiyi yerdən özgə bir yerə, əraziyə adladıqda nəyisə itirir və ya nə isə yeni bir ştrix, əhvalat, hadisə ona əlavə olunur. Bütün bunlarla yanaşı, rəvayətlərdəki reallıq daha çox tarixi şəxsiyyət-lərin həyatı və hünərləri ilə bağlı olduğu üçün bu və ya digər tərzdə özünəməxsusluğu qoruyub saxlayır».

Görkəmli alimin əfsanə, əsatir və rəvayətlərin struktur mahiyyəti və rəvayətin poetik-tipoloji strukturu haqqındakı mülahizələri çoxillik elmi araşdırmaların nəzəri təzahürü kimi diqqəti cəlb edir. Həmin fikri təhlil etdikdə bu janrların poetik mahiyyət baxımından nə qədər mürəkkəb olduqları və onların struktur poeti-kasının öyrənilməsinin nə qədər vacib olduğu üzə çıxır.

S. P. Pirsultanlının yuxarıdakı fikrinin təhlilindən bu qənaətlər aydın olur:

1. Əfsanə, əsatir və rəvayətlər epik janrlar kimi tipoloji oxşarlıq kontekstində yox, genetik səviyyələr olaraq birləşir. Başqa sözlə, epizm həmin janrları birləş-dirən tipoloji keyfiyyət yox, genetik struktur atributudur. Əfsanə, əsatir və rəvayətlər epik sistemə aid olduğu üçün oxşarlıq təşkil etmir, onların bir-birinə yaxınlığının əsasında epik düşüncə genetizmi durur. Sözü gedən janrlar eyni genetik sistemə bağlı olduğu, eyni genetik qaynaqdan nəşət etdiyi, eyni genetik bünövrə üzərində boy atdığı üçün vahid epos sisteminin müxtəlif səviy-yələrini təşkil edir.

2. Rəvayət bir janr kimi əfsanə və əsatirdən həyat hadisələrini daha real şəkildə inikas etməsi ilə

fərqlənir. Bu janrın poetik imkanları gerçəkliyi «tarix» donunda təqdim etməyə imkan verir. Rəvayət janrının tarixə bu «iddiası» və «imkanları» onu tarixi şəxsiyyətlərlə daha çox bağlayır.

Əfsanə janrının poetik mahiyyətini əsatirlə müqa-yisədə aydınlaşdıran S. P. Pirsultanlı göstərir ki, «əfsa-nələr mahiyyət etibarilə əsatirlə də çox yaxındır. Əvvə-la, onu deyək ki, əsatir, sadəcə olaraq, Günəş, Ay, ulduz, tanrılar panteonu, ümumiyyətlə, təbiətdə baş verən müx-təlif əhvalat və hadisələr haqqında hekayətlər toplusu deyil. Əsatir, əslində, təbiət və yaxud həyat hadisələrinə adamların baxışını xəyali bir şəkildə əks etdirən şifahi hekayətlərdir. İstər əsatirin, istərsə də əfsanənin əsasını qeyri-adi, möcüzəli hadisələr təşkil edir. Amma daha qədim olan və ilkin izləri bəşər tarixinin başlanğıcı dövr-lərinə gedib çıxan əsatirlər, əsasən, fantaziya ünsürləri ilə süsləndiyi halda, əfsanələrdə gerçək tarixi hadisə və real coğrafi ərazilərlə bağlılıq aparıcı mövqedə durur. Əsatir özü dünyanın təbiət hadisələrinin, ibtidai insanın şüurunda müəyyən mənada dəyişilmiş inikasıdır».

Göründüyü kimi, Sədnik müəllim əfsanə janrını əsatirlə müqayisədə dəyərləndirmişdir. Bu da təsadüfi deyildir. Əsatirlər mifoloji-kosmoqonik dünya modelinin strukturunu əks etdirən mətnlərdir. Əfsanələr janr səviy-yəsi baxımından əsatirlə rəvayətlərin ortasında dayanır. Onlar öz fantastik məzmununa görə əsatirlərə yaxın olsa da, əfsanənin reallığa təmayülü, fantastikanı gerçəklik səviyyəsində təqdim etmə onun bir janr kimi fərqlən-dirici atributudur.

Prof. S. P. Pirsultanlı Azərbaycan əfsanə və rəva-yətlərinin bəşəri-humanist mahiyyət daşıdığını, insan-pərvərlik ideyalarına qulluq etdiyini aşkarlamış və bu-nunla milli mədəniyyətimizin bu geniş yayılmış janr-larının həm də dünya mədəniyyətinin inciləri olduğunu vurğulamışdır.

Alimə görə, Azərbaycan eposunun özünəməx-susluğu əfsanə və rəvayətlərlə sıx bağlıdır. O cümlədən, dastanların poetik strukturu əfsanə və rəvayətlərin struk-turu ilə əlaqəlidir. Dastan ən iri epik janrdır. Onda daşınan inam, etiqad, davranış stereotipləri dastana əfsa-nə və rəvayət janrları ilə birgə daxil olur. Bu baxımdan, alimin qənaətincə, dastanın poetik strukturunun öyrə-nilməsi əfsanə və janrların tədqiqini zəruri şəkildə nə-zərdə tutur.

Prof. S. P. Pirsultanlının düşüncələrinə görə, yazı mədəniyyəti şifahi ənənələrin yaşanması və qorunma-sında yeni (alternativ) vasitə rolunu oynamışdır. Şifahi ənənədən yazılı ənənəyə keçən folklor strukturları yazılı ənənə vasitəsi ilə həm də itməkdən, yox olmaqdan qorunmuşdur.

«Nizami və xalq əfsanələri» mövzusu ilə bütün yaradıcılığı boyu məşğul olan alimin təbirincə, «əfsanə, rəvayət və yazılı ədəbiyyat əlaqələrinin öyrənilməsinə Nizami yaradıcılığı daha zəngin material verir». Sədnik müəllimin qənaətinə görə, Nizami haqqında tarixi hə-qiqətlərin öyrənilməsində yazılı qaynaqlarla bərabər, şifahi qaynaqların çox böyük əhəmiyyəti vardır və onla-rın tədqiqi zəruridir. Çünki «Nizaminin həyatı və poetik irsi nə öz dövründə, nə də sonrakı yüzilliklərdə əsaslı şəkildə öyrənilməmişdir. Şairin tərcümeyi-halı çox son-ralar, qismən «Xəmsə» əsasında araşdırılmışdır. Halbuki Azərbaycanda Nizaminin həyat və yaradıcılığı ilə

bağlı yer adları, kəndlər, qalalar, arxlar və bunlarla bağlı çoxlu əfsanə və rəvayətlər indi də mövcuddur. Bunlar şairin yaradıcılıq yolunun bir çox cəhətlərini aydınlaşdırmaq işində əhəmiyyətli rol oynayır».

Əlbəttə, prof. S. P. Pirsultanlının son dərəcə zəngin və nəhəng olan folklorşünaslıq görüşlərindən onun, əsa-sən, əfsanələrə dair umumiləşdirmək istədiyimiz nəzəri görüşləri «Azərbaycan türklərinin xalq əfsanələri» adlı fundamental kitabda təqdim olunmuş nəhəng mətn kor-pusunun tədqiqat modelində parlaq şəkildə gerçəkləş-dirilmişdir. Bunu alimin mətnləri tematik-klassifikativ baxımdan necə modelləşdirməsi əyani şəkildə təsdiq edir. Əfsanənin təqdimatının «S. P. Pirsultanlı modeli» iki cəhəti ilə əlamətdardır:

1. Mətnlərdə təqdim olunmuş dünya modelinin bütövlüyü və sistemliyi;

2. Mətnlərin Azərbaycan əfsanə yaradıcılığının tematik fondunu bütövlükdə əhatə etməsi.

Bu iki cəhət əfsanəşünas alimin Azərbaycan folk-lorşünaslığına uzun illərin zəhmətinə və təcrübəsinə əsaslanmaqla verdiyi töhfədir və heç nə ilə əvəz olun-mur. Bunu kitabdakı mətnlərin tematik bölgüsünü nə-zərdən keçirməklə əyani şəkildə görmək olur.

***Dağ, daş və qayalar haqqında əfsanələr:***

Bu, Azərbaycan epik dünya modelinin ternar bölgüsünün yerüstü səviyyəsini ifadə edir. Əsasında torpaq stixiyası durur.

***Bulaq, çay, dəniz haqqında əfsanələr:***

Bu bölgüdə gerçəkliyin epik düşüncədə işarələn-miş modelinin su stixiyası əsasında təşkil olunmuş obraz-larının yaratdığı hidrosəviyyə əhatə olunmuşdur.

***Çiçək və gül əfsanələri:***

Bu səviyyə etnosun epik özünüifadəsinin vegetativ kodunu ifadə edir. Bu, həm də Azərbaycan türkünün qavradığı gerçəkliyin flora mozaikasıdır. Həmin mozaika türkün gerçəkliyə münasibətinin estetik özəlliklərini özündə birbaşa inikas edir.

***Quş və heyvanlar haqqında əfsanələr:***

Bu mətnlər dünya modelinin zookodunu təqdim edir. Bu kod mürəkkəb mexanizmə malikdir. Epik xronotopun – kosmik kontiniumun həm yerüstü , həm də astral sferalarını işarələyir.

***Ay, Gün və Dədəgünəş əfsanələri:***

Bu, birbaşa astral koddur. Astral kodun «Dədə-günəş» simvolu həmin kodun indiki halda astral-antro-poloji səviyyəsini də təqdim edir.

***Qədim qalalar haqqında əfsanələr:***

Bu əfsanələrlə dünya modelinin relyef kodunun universal elementlərindən biri təqdim olunur. Mətnlər qala elementinin bütün mifoloji-arxaik poetizmini canlı şəkildə özündə qorumuşdur. Qala mədəni qəhrəmanın (ilk əcdadın) fəaliyyətinin məhsulu və vasitəsi kimi son dərəcə arxaik semantikaya malikdir. O, dünya modelinin müstəqil universal simvollarından biridir.

***«Dədə Qorqud» əfsanələri:***

Bu əfsanələr türk dünya modelinin kosmoqonik-mediativ kodunu özündə əks etdirməklə, əslində, bizim folklorumuzun nadir və azsaylı səhifəsini təqdim edir.

***Nizami mövzuları ilə səsləşən əfsanələr***:

Bu əfsanələr Azərbaycan xalqının bədii intellek-tinin, poetik təxəyyül zənginliyinin, bədii

sözə qarşı föv-qəlhəssaslıq kodunun canlı təzahürləridir.

***Koroğlu əfsanələri:***

Bu əfsanələrdə Azərbaycan türklərinin tarixən bir neçə epoxal mərhələni adlamış qəhrəmanlıq ruhu kod-laşmışdır.

***Apardı sellər Saranı:***

Bu mətnlər xalqımızın gerçəkliyə bədii-estetik münasibətinin fövqəlhumanist kodunun ifadəsidir.

***Müxtəlif mövzulu əfsanələr:***

Bu bölgü, əslində, Azərbaycan türk etnosunun epik özünüifadəsinin əfsanə kodunun nə qədər zəngin və tükənməz olduğunu parlaq şəkildə ifadə edir.

Əlbəttə, «Azərbaycan türklərinin xalq əfsanələri» kitabında təqdim olunmuş əfsanələr haqqında çox danış-maq olar. Lakin bu, kitabda təqdim olunmuş əfsanələrin oxunmaq, oxucuların isə onlardan zövq almaq haqqına toxunmaq demək olar. Bu haqq isə Sədnik Paşa  hey-ranlısı olaraq bizim üçün çox əzizdir...

***Seyfəddin RZASOY***

## Əfsanə və onun başqa epik janrlarla əlaqəsi

Azərbaycan türklərinin əsatir və əfsanələri çox zəngindir, qərinələr, əsrlər boyunca uzun bir tarixə malikdir. Uzaq keçmişlərdən başlayaraq, min ildən artıq inkişaf yolu keçmiş, Azərbaycan türklərinin müxtəlif tarixi mərhələlərində onun canlı tarixini, həyatını, əmək və məişətini özündə əks etdirmiş, onun tarix boyu əldə etdiyi mənəvi xüsusiyyətlərini və ideallarını ifadə etmişdir. Buradan, təbiidir ki, belə bir sual meydana çıxır: əfsanə əsatirdən nə ilə fərqlənir? Əfsanə əsatirdən özünün həqiqi, ictimai təbiəti, real və bədii məzmunu, ideya mahiyyəti ilə fərqlənir.

Mifologiyada qədim insanın dünya haqqında, təbiət haqqında təsəvvürlərinin izlərini müşahidə etmək olar. Mifologiya dünyanın, təbiət hadisələrinin ibtidai insanın şüurunda təhrif olunmuş inikasıdır. Məhz buna görə də K.Marks mifologiyanı təbiət və

ictimai hadisələrin xalq fantaziyasında qeyri-şüuri şəkildə işlənib hazırlanması kimi mənalandırmışdır.[1] Bu da mifologiyanın necə bir məntiqi əhəmiyyətə malik olan əsər kimi diqqəti cəlb etdiyini söyləməyə haqq verir və buradan belə bir nəticə ilə razılaşmaq qənaətinə gəlinir.

Bir sıra əfsanələrdə, hətta orta əsrlərin sonuna qədər yerli əhali arasında qalmış qədim dini ayinlər əks edilmişdi («Şamama-Nigar», «Fironun aqibəti») və bir çoxları xalq məişətinin müxtəlif cəhətlərinə həsr edilmişdi. Onlardan bəziləri dinə zidd xarakter daşıyır. («Komurad», «Göyün qəzəbi») və b.

Əlbəttə, tarixi əfsanə və rəvayətlərdə doğruluğun ölçüsünü mübaliğə etmək lazım deyil, lakin şübhəsiz ki, onlarda tarixiliyin müəyyən elementləri mövcud olmuş və elmdə yardımçı (əlavə) mənbə kimi istifadə oluna bilər. Bir halda ki, bu müəyyən tarixi şəxsiyyət haqqında məlumat, digər halda – tarixi hadisəyə işarə, üçüncü halda – baş verən hadisənin yeri və s. ola bilər. Burada folklor əsərinin yarandığı zamanın əhəmiyyətli dərəcədə rolu vardır, ona görə ki, tarixi əlamətlər arxaik (qədim) təbəqələrdə bir qayda olaraq abidələrə nisbətən fantastik stixiyada tez əriyib gedir, qədim, orta əsr abidələrində isə onlar real hekayə formasında çıxış edir.

Orta əsrlərə, bəziləri isə ola bilsin ki, əvvəlki dövrlərə aid olan əfsanələr silsiləsi «Astiaq» və «Tomris», «Göy-Göl», «Maral göl», «Oğlan qala», «Qız qalası», «Qırx qız» daşlarının meydana gəlməsi və s. təbii hadisələrin baş verməsinin (davamı) xalq tərəfindən özünəməxsus izahı verilir.

---

[1] Slovar literaturovediçeskix terminov. Moskva,1971, səh. 171.

Ümumiyyətlə, orta əsr Azərbaycan türklərinin əfsanələri və əsatirlərinin süjetləri öz müxtəlifliyi ilə fərqlənir. Azərbaycan türklərinin əfsanələrinin öyrənil-məsi bizim eradan əvvəl Herodotla başlanır. O, ilk dəfə olaraq Azərbaycan türklərinin əfsanələrindən «Astiaq» və «Tomris»i toplamışdır. Bunlar tarixi qəhrəmanlıq əfsanələridir. Bu sahənin geniş tədqiqi və ümumiləş-dirilməsi, onun əsas tendensiyaları janrın spesifik xü-susiyyətləri baxımından çox əhəmiyyətlidir.

- Əfsanənin həyati məzmunu;
- Əfsanənin ideya mahiyyəti;
- Əfsanələrin xəlqiliyi;
- Əfsanədə ənənəvilik;
- Əfsanənin bədii sistemi;
- Əfsanə və əsatirin qarşılıqlı mənsubiyyəti: bu janrın genetik əlaqəsi;
- Əfsanənin tarixən dəyişməsi;
- Həqiqət və əfsanə.

Bizim eramızdan əvvəl Azərbaycan torpağında bir çox əfsanələr mövcud idi. VII əsrin 30-40-cı illərində ərəb işğalçıları «Odlar ölkəsinə» hücum etmiş, tarixi memarlıq abidələrini məhv etmişlər. Həmin abidələr içərisində əfsanələr, nağıllar, hətta xalqın tarixi olmuşdu.

Xalqın əsrlərdən bəri yaratdığı və qoruyub yaşatdığı mənəvi sərvətlərin ən qiymətlilərindən sayılan folklor, hər şeydən öncə məxsus olduğu xalqın istək və arzusunu, gələcəyə ümidini, tarixə münasibətini, insan və zaman haqqında dünyagörüşünü yüksək şəkildə ifadə edir. Məhz, buna görə də bu yaradıcılıq zaman keçdikcə köhnəlmir, əksinə keçmiş haqqında ən etibarlı, ən mötəbər idrak qaynaqlarından biri olaraq yaşayır,

yeni keyfiyyətlər əxz edir, zənginləşir, xalqın tarixi-mənəvi təcrübəsinin ümumiləşmiş inikası kimi onun həyatına həmişəlik daxil olur və bu cəhətdən əfsanələr məxsusi əhəmiyyətə malikdir. Bu da səbəbsiz deyildir. Əfsanələr təkcə bizim yox, bütün dünya xalqlarının şifahi yara-dıcılığında ən maraqlı janr kimi müstəsna mahiyyət daşıyır, xalqın taleyi ilə bağlı olduğuna görə onun əsas mündəricəsini də bilavasitə həyat həqiqətləri təşkil edir. Lakin bu əfsanələrin yaranması səbəbləri hələ indi-yənədək müəmmalı olaraq qalır. Bu barədə danışan K.Paustovski yazır: «Xalq əfsanələrinin necə yarandığını biz hələ də bilmirik. Bu əfsanələr ölkənin dərin-liklərində, çöllərdən keçən yollarda, meşələrdə, közərən tonqalların başında yaradılır. Bunları keçmiş döyüşçülər, məktəblilər, çobanlar söyləyir, onu titrək səsli el nəğmə-karları, el aşıqları oxuyurlar. Əfsanələr külək kimi yara-nır. Bunlar ölkəni dolanıb ağızdan-ağıza keçir, xalqın zəfər eşqini və qürurunu onun oğul və qızları vasitəsilə yayır.

Hökumət qəhrəmanları fəxri adla təltif etdiyi kimi, xalq da ən yaxşı oğullarını gözəl əfsanələrlə mükafatlandırır.

Əfsanə ümumxalq hörməti, məhəbbəti və minnət-darlığının ifadəsidir».[1]

Azərbaycan türklərinin folkloru da belə bir minnət-darlığın nəticəsi olaraq yaşamış, müasir dövrə müxtəlif şəkildə gəlib çıxmışdır. Bu da bir həqiqətdir ki, hədsiz əsarətə və zorakı assimilyasiya cəhdlərinə baxmayaraq, heç kəs ona maddi mədəniyyətini, doğma dilini, elmini, ədəbiyyat və

---

[1] K.Paustovski. Yaxın və uzaq adamlar, «Gənclik», Bakı, 1971., səh.13.

incəsənətini unutdura bilməmiş, əksinə xalq öz keçmişinə hörmətlə yanaşmış, onu yaşatmış, inkişaf etdirmiş və bütün sınaqlardan keçirib saxlamış-dır.

Yüksək ideyalı, dolğun məzmunlu Azərbaycan türklərinin folklorunun- «özünəməxsusluğunu» bütöv-lükdə səciyyələndirən ən əsas xüsusiyyətlərindən biri onun forma cəhətdən son dərəcə kamil olmasıdır. Ən xırda lirik xalq şeir formasından tutmuş geniş şaxəli epik dastanlara qədər mürəkkəb yaradıcılıq yolu keçmiş bu folklor çoxjanrlı zəngin bir irsdir ki, bunun da ən qədim növlərindən biri əfsanədir.

Yaxın və Orta Şərq folklorunda, xüsusilə türkdilli xalqların şifahi ədəbiyyatında bu janr əsasən «efsane» və ərəb kəlməsi «rəvayət» terminləri ilə izah olunur.

Azərbaycan folklorşünaslığında əfsanə əsasən fars mənşəli söz «əfsanə» olub, məna çalarlığı «nağıl», «əsli olmayan hekayə», «dillərə düşən vaqeə», daha geniş mənası isə «dastan» deməkdir. Əfsanə həqiqətdə olmuş hadisə kimi ağızlarda yaşayan, ağızdan-ağıza ötürülən nağıl və hekayədir. Buradakı «nağıl» ifadəsi şifahi ədə-biyyatın bir növü, janrı mənasında deyil, vaqeə danışmaq mənasındadır. «Hekayə» anlayışı da o qəbildəndir.[1]

Məxəzlərin verdiyi məlumata görə «leqenda» - əfsanə termin kimi orta əsrlərdən meydana çıxmış və bu ad müqəddəslərin xatirə günlərində oxunan, onların həyatından bəhs edən əsərlərə verilmişdir.

---

[1] Bax: T.Fərzəliyev. Əfsanə anlayışı və Azərbaycan əfsanələrinin təsnifinə dair. Azərb. SSR EA xəbərləri (ədəbiyyat, dil və incəsə-nət seriyası)1978, № 1, səh.32.

[2] Bax: KLE, IV cild, 1967, səh.90.

Xalq yaradı-cılığında isə bu anlayış altında bütöv bir janr düşünülür. Doğrudan da, əfsanə ədəbiyyatın, daha doğrusu folk-lorun epik növünə daxil olan müstəqil bir janrdır. K.V.Çistovun fikrinə görə, əfsanə şifahi xalq hekayəti olub, onun əsasını fantastik obraz və təsəvvürlər təşkil edir. Bunu hekayətçi və dinləyici həqiqətə uyğun hadisə kimi qəbul edir. Müəllif bunu da xatırladır ki, əfsanə rəvayətdən fərqli olaraq öz mündəricəsinə görə həmişə fantastikdir və onda keçmişdən bəhs olunduğu kimi, indidən və gələcəkdən də söhbət açılır[2].

Kollektiv yaradıcılıq məhsulu kimi əsrdən- əsrə keçərək məzmun və ideyaca saflaşan, xalq təcrübəsinin ən yaxşı təfərrüatları ilə bəzənən əfsanə, hər şeydən əvvəl, epik janrdır. Yəni, bu janrda müəyyən bir əhva-lat, hadisə danışılır. Ortaya əfsanənin ilkini sayılan əsatir və rəvayət gəlir. Ümumi anlamda bunlar arasındakı yaxınlıq tipoloji yox, genetik xarakterdə olduğu aydın-laşır. Rəvayət, real həyat həqiqətlərinin təhkiyə formasında bədii ifadəsidir. Əfsanə, qeyd etdiyimiz kimi, əsatirdən sonra yaranmış və onunla da yaxındır. Əsatir təbiət, yaxud həyat hadisələrini xəyali bir şəkildə nəql edən şifahi hekayətə deyilir. Bu mənada əsatir daha qədimdir və onun ilkin izləri bəşər tarixinin başlanğıc dövrlərinə gedib çıxır. Yunan mifologiyasından danışar-kən K.Marks yunan mifologiyasının yunan incəsənətinin zəmini olduğunu göstərərkən mifologiyanı təbiət və ictimai hadisələrin xalq fantaziyasında qeyri-şüuri bəzənmiş şəkildə işlənib hazırlanması kimi mənalan-dırmışdır.[1] Marksın verdiyi təriflə mifologiyanın idraki əsası

---

[1] Bax: K.Marks və F.Engels. Ob iskustve, I cild, M.1957, səh. 135.

müəyyənləşdirilmişdir. Həqiqətən, mifologiya xalq təxəyyülünün məhsulu olub və bu yaradıcılığa ayrı-ayrı təbiət hadisələrinə, yaxud dini mərasimlərə bədii-obrazlı şərh verilir. Ümumiyyətlə, miflərdə qeyri-adi, fövqəladə qüvvələrdən bəhs etmə üstünlük təşkil edir.

Lakin XVII əsrə qədər miflərin yalnız yunanlara məxsus olduğu iddia edilirdi. Sonrakı tədqiqatçılar başqa xalqların da məişətində, anlayışlarında mifin dərin kök saldığını müəyyən etdi. Xüsusilə Hind, Misir, İran və s. qədim xalqların mifləri bu sahədəki yanlış fikirlərə qüvvətli zərbə vurdu. XIX əsrdə miflərin öyrənilməsinə marağın artması ilə əlaqədar olaraq mifoloji nəzəriyyə təşəkkül tapır və bu məktəb mifi anlaşılmaz səma hadisələrinin (günəşin, ulduzların hərəkətini, ay təbəqələrini, küləyi, tufanı və s.) antik şəkildə şəxsləndirilməsi və izahı kimi səciyyələndirilirdi. Mif, həmçinin fantaziyanı şəxsləndirmək gücünün məhsulu kimi də şərh olunmuşdur. Mif haqqında elm olan mifologiya müəyyən etmişdir ki, bütün xalqlarda miflər mövcuddur və həm də hər bir xalqda o başqa-başqa şəkildə, özünəməxsus məzmun və anlama malikdir.

Lakin mifin əfsanə ilə əlaqəsi məsələsi yeni problem deyildir. Mif əfsanəyə yaxındır. Əvvəla, istər mifin, istərsə də əfsanənin əsasında qeyri-adi, möcüzəli bir hadisə durur. Bundan başqa, əfsanə kimi mif də fantaziya ünsürləri ilə zəngindir. Ancaq bununla belə, miflə əfsanə bir-birindən həm də kəskin şəkildə fərq-lənir. Əfsanədə mövzunun əsasını bilavasitə gerçək hadisələr təşkil edir. Prof. M. Rəfili yazır: «İbtidai insan-lar tarixi hadisələri bir hekayə şəklində bir-birinə nəql edərdilər. Bu hadisələr getdikcə əfsanəyə çevrilərək, nəsildən-

nəsilə, ölkədən-ölkəyə keçir və yayılırdı. Əfsanələrdə həm tarixi hadisələr, həm də insanların təbiətlə mübarizələri, mədəniyyətin ilk kəşfləri əks etdirilirdi».[1]

Mifdən fərqli olaraq əfsanənin real hadisələrlə bağlılığını nəzərdə tutan V.Q.Belinski yazmışdır: «Tarix həmişə və hər bir xalqda olmuşdur. Bəzilərində o əfsanə şəklində, bəzilərində nağıl, üçüncülərdə poema, dördüncülərdə xronika şəklində meydana çıxmışdır».[2]

Azərbaycanda əfsanələr ilk dəfə e. ə. V əsrdə yazıya alınsa da, mövcud nümunələr bu janrın daha qədim tarixə malik olduğunu söyləməyə imkan verir. Bunu Herodotun göstərdiyi əfsanələrlə yanaşı, yurdu-muzun müxtəlif rayon və kəndlərində indiyə qədər yaşayan çoxsaylı əfsanələrin məzmun və xarakteri də təsdiq edir. Lakin əfsanələrin bəziləri ictimai inkişafın tələbinə müvafiq olaraq zaman keçdikcə unudulmuş, bəziləri isə daşlar, qalalar, şəhərlər, çaylar, yurdlar, bulaqlar, hətta tarixi hadisə və tarixi şəxsiyyətlərin adları, izləri ilə bağlanaraq əbədiyyət qazanmışdır. Bir sıra əfsanələr də sonrakı dövrlərin yazılı ədəbiyyatda özlərinə ünvan tapmaqla mühafizə olunmuşlar. Bu sonuncu cəhət yazılı ədəbiyyatla şifahi ədəbiyyat arasındakı qarşılıqlı əlaqə probleminin öyrənilməsində əfsanələrin necə gərəkli sahə olması məsələsini də ortaya çıxarır.

Azərbaycan əsatir və əfsanələri, bizim fikrimizcə əsasən üç yolla bizə gəlib çatmışdır:

---

[1] M.Rəfili. Ədəbiyyat nəzəriyyəsinə giriş. Bakı, 1958, səh. 219.
[2] V.Q.Belinski. Sobr. soç. V cild, 1943, səh. 227.

a) Şifahi yolla, müstəqil bir əsər kimi: Dədə Günəş, Aldədə əsatir və əfsanələri, Qız qalalarına aid əfsanələr, Ovçu Pirim haqqındakı əfsanələr və s.

b) Nağılların və eposların daxilində, onların tərkib hissəsi kimi: «Tapdığın nağılı», «Koroğlu» dastanındakı Qırat, Düratın doğulması, Misri qılınc, Qoşabulaq əfsanəsi və s.

v) Klassik sənətkarlarımızın əsərlərində: Nizaminin «Xəmsə», Arif Ərdəbillinin «Fərhadnamə», Əlinin «Qisseyi Yusif», Əssar Təbrizinin «Mehr və Müştəri» əsərləri və s.

Folklorşünas Ə.Axundovun 1968-ci ildə nəşr etdirdiyi «Azərbaycan folkloru antologiyası»nın ikinci kitabında əfsanələrdən nümunələr verilmişdir. Amma burada əfsanə və rəvayətlərin sərhədləri müəyyənləş-dirilməmişdi.

İnamla demək olar ki, Azərbaycan əfsanələrinin bir küll halında toplanması, nəşri və tədqiqi əsasən keçən əsrin 70-ci illərindən başlayır.

Ekspedisiyalar və folklor toplamaq səfərləri zamanı yeni-yeni əfsanə nümunələrinin toplanması, bu sahədə təzə bölgü aparmaq zərurətini meydana çıxarır. «Yurdumuzun əfsanələri» (1976) kitabının nəşri zamanı biz əfsanələrin mövzuya görə təsnifini əsas götürdük. Həmin təsnifat belədir:

Təbiət və insan haqqında əfsanələr;

Qəhrəmanlıq əfsanələri;

Məhəbbət əfsanələri;

Ailə-məişət əfsanələri;

Tarixi əfsanələr.[1]

«Yanardağ əfsanələri» (1978), «Azərbaycan xalq əfsanələri» (1985) kitablarındakı əfsanələrin

---

[1] S.Paşayev. Yurdumuzun əfsanələri. Bakı, «Gənclik», 1976.

mövzu zənginliyi, mövcud bölgüləri artırmaq tələbatını doğurdu. Əfsanələr belə qruplaşdırıldı:

Daş və qayaların əfsanələri;
Dağ əfsanələri;
Bulaq, çay, göl və dəniz əfsanələri;
Sara haqqında əfsanələr;
Çiçək və gül əfsanələri;
Quş əfsanələri;
Ay və Gün əfsanələri;
İlan əfsanələri;
Maral və ceyran əfsanələri;
Nuhla bağlı əfsanələr;
Qədim qalaların əfsanələri;
Qız qalaları haqqında əfsanələr;
Dədə Günəş əfsanələri;
Nizami mövzuları ilə səsləşən əfsanələr;
«Koroğlu» eposu ilə səsləşən əfsanələr;
«Əsli-Kərəm» dastanı ilə səsləşən əfsanələr;
Müxtəlif mövzulu əfsanələr.

Bu bölgü və təsnifat altında toplanan müxtəlif məzmunlu əfsanələr Azərbaycan xalqının tarixi təşəkkülünün necə bir şəkildə inkişaf edib formalaşdığı, ərazi qədimliyi, coğrafi bütövlüyü, bu yerlərdə məskunlaşanların adət-ənənəsi, inam və inamsızlığı, Aya, Günəşə, Suya, Torpağa tapınması səbəbləri haqqında geniş məlumat almağa imkan verir. Həm də suya inanmaq görkəmli tədqiqatçı M.Seyidovun qeyd etdiyinə görə əkinçilik və maldarlıqla bağlıdır.[1]

Deyilənə görə, Göktanrı Cəbrayılı göndərir ki, get sudan insan düzəlt, dünyanı bəzə, Cəbrayıl istəyi yerinə yetirə bilmir. İkinci dəfə Cəbrayılı

---

[1] Bax: M.Seyidov. Azərbaycan mifik təfəkkürünün qaynaqları., «Yazıçı», Bakı, 1983, səh. 221.

göndərir ki, oddan insan düzəldib dünyanı bəzəsin. Lakin yenə bir nəticə hasil olmur. O, üçüncü dəfə Cəbrayıla torpaqdan insan düzəldib dünyanı bəzəməyi tapşırır. Bunu eşidən torpaq ah-nalə edir. Amandı mənlə işin olmasın deyə, Tanrıya yalvarır. Göktanrı Cəbrayılı başa salır ki, torpağa desin, torpağı ondan borc alır, yenə geri qaytaracaq. Torpaq bu şərtlə razı olur. Odur ki, insan yaranır, yaşayır, ölür, torpaqdan yarandığı üçün yenə də torpaq olur. Beləliklə, bu yolla torpaq verdiyi borcu geri alır.

Qədim azərbaycanlıların dünyanın yaranması haqqında da maraqlı təsəvvürləri olub. Bu baxımdan «Bülbül nəğməsi» adlı mifoloji qaynaqdan su içmiş bir əfsanə xüsusilə diqqəti cəlb edir: «Vaqif Nəsimdən, Nəsim də Bülbüldən böyük idi. Amma bu üç qardaşın üçü də bir gücdə, bir hünərdə idi. Ağıllarının itiliyinə, kamallarının dərinliyinə, mərifət-qanacaqlarına söz ola bilməzdi; ona görə də el-oba onların başına and içirdi. Ağır oturub durmaları, hamının dadına – köməyinə çatmaları onların səs-sorağını bütün mahala yaymışdı. Amma heç kəs bilmirdi ki, qardaşların qəlbini bir pünhan dərd üzür. Çünki onlar dərdlərini, müşkül arzularını ürəklərində gizli saxlayırdılar. Utanırdılar ki, açıb-ağartsalar, camaat onların bu diləklərinə gülər, özlərinə də sərsəri təki baxar.

Bir axşam qardaşların qapısını ixtiyar bir baba döydü, bir gecə yatmağa, dincəlməyə bucaq istədi.

Qardaşlar qocanı hörmətlə qarşıladılar: evin ən yaxşı döşəyini onun altına saldılar, ən yaxşı mütəkkəni dirsəyinə söykənəcək etdilər, qu tükü doldurulmuş yastığı başının altına qoydular. Süfrəyə dadlı-ləzzətli növ-növ naz-nemət düzdülər. Qoca

gördü ki, bu qardaşların hər işi düzdür, heç bir kəsirləri, ehtiyacları yoxdur, amma di gəl ki, ürəkdən gülmürlər.

Dedi:

- Balalarım, sizin böyük dərdiniz var, məndən gizlətməyin, deyin, bəlkə bir çarə tapdım.

Qardaşlar da elə bil ki, ertədən duymuşdular ki, bu qoca onların indiyənə kimi tanıyıb gördükləri kimsələrə bənzəmir, üz-gözündən nur yağır.

Vaqif dedi:

- Baba, bu dünya başdan-başa bir rəngdədir. Bombozdur, havası bir, suyu birdir. Belə də dünyamı olar?

Qoca böyük qardaşa aman vermədi, fikrini havadan aldı. Dedi ki, balalarım, bu sözləri ağıllı adamların çoxundan eşitmişəm. Amma ağıllılar tək olurlar, tək əldən səs çıxmır. İndi görürəm, siz üçsünüz, üçünüz də biriniz daş qoyduğu yerə baş qoyar. Dünyanı dəyişmək üçün üç tilsim sındırmalısınız, hərənizə biri düşür.

Birinci tilsim sınanda hər yer belə dümdüz olmayacaq, dağlar, dərələr görünəcək, çaylar, bulaqlar axacaq, göllər, dəryalar yaranacaq.

İkinci tilsim sınanda nəsimlər gələcək. Birinci nəsim göylərə, çöllərə, dağlara, düzlərə rəng verəcək, hər yan güllə, çiçəklə örtüləcək. Hər yaşıllığın bir rəngini, bir ətrini bu diyara, bu diyarınkını da o diyara çiləyəcək. Meşələr, ağaclar bitəcək, çiçək açacaq, hər çiçək bir meyvəyə çevriləcək, dadı dodaqlardan getməyəcək.

İkinci nəsimdə hər kolun dibində bir çörək olacaq, dünya bolluq yuxusu içində mürgüləyəcək.

Üçüncü nəsimdə çöllər naxış-naxış saralacaq, qızaracaq, əlvanlaşacaq; bu əlvanlıqda tala-tala yerlər əkiləcək, taxıl səpiləcək.

Üçüncü nəsimdə göylərin qar yorğanı yerə enəcək, hər yana layla çalacaq. Üçüncü tilsim sınanda dünyaya quşlar gələcək, hamısı bülbül nəğməsi oxuyacaq. Çaylar da, bulaqlar da bu nəğməni oxuyacaqlar. Dünya nəğmələrlə yatacaq, nəğmələrlə oyanacaq, dünya şirin nəğməyə dönəcək, ömür nəğmələrlə başlanacaq, nəğmələrlə qurtaracaq.

Qoca susdu. Qardaşlara bir də baxdı. Qardaşlar sevindilər:

Bu qoca nə yaxşı gəldi… Tilsimləri sındıracayıq, dünya dəyişəcək, dünya cənnətə dönəcək.

Balalarım, - deyə qoca bu işin qorxulu, çətin yönünü aramla, özü də xeyli ehtiyatla, çəkinə-çəkinə danışmağa başladı. Dedi ki, tilsimləri ağılla sındıracaqsınız, amma siz bir də bu el-obaya indiki şəkildə qayıtmayacaqsınız.

Qardaşlar heyrət etdilər. Böyük qardaş xəbər aldı:

- Bəs nə şəkildə, baba?

- Siz dəyişdiyiniz dünya ilə dünyaya yayılacaq, dünyada qalacaqsınız. Balalarım, heç bilirsinizmi bu nə deməkdir?

Qardaşların sorğulu nəzərləri qocanın üzünə zilləndi, dillənmədilər, amma baxışları ilə soruşurdular: «Nə deməkdir, baba?»

Qoca üzünü bürüyən nurlu bir təbəssümlə pıçıldadı:

- Dünya durduqca durmaq deməkdir, balalarım…

Qardaşlar bir-bir diz çöküb, qocanın sağ əlindən öpdülər. Qoca onlara tilsimlərin sirrini açdı, onu sındırmağın yolunu öyrətdi.

Qabaqcadan böyük qardaş Vaqif getdi. Aradan bir il keçdi. Dünya dağlaşdı, dərələşdi.

Sonra ortancıl qardaş Nəsim getdi. Bir il ötəndən sonra dünyanın rəngi dəyişdi.

Axırda kiçik qardaş Bülbül getdi. Bir ilin tamamında dünya quşlarla, nəğmələrlə doldu. Göylər də nəğmə oxudu».[1]

Əfsanənin yaratdığı qənaət belədir: bütün cisimləri sındıran, dünyanı dəyişən, onu gözəlləşdirən, ömrünü-gününü bu torpağa bəxş edən insandır. İnsan olmasa dünya elə bir rəngdə qalar. Onu bu cür gözəlləşdirən insan əməli, insan ağlıdır.

Əfsanələrdə, eyni zamanda müharibəyə, istibdada, zülmə və bunların törətdiyi rəzalətlərə qarşı təkcə adamlar yox, canlı-cansız, bir növ, rəmzi mənada təsvir olunan bütün mövcudiyyət nifrət bəsləyir. «Lalə əfsanəsi»ndə deyildiyi kimi müharibə ancaq fəlakət, zəlalət gətirir, analar oğulsuz, arvadlar ərsiz qalır. «Göyərçin», «Sona uçan» və «Şəmkir qalası» əfsanələri də bu cəhətdən tərbiyəvidir. İki qüdrətli şah arasında davam edən düşmənçilik müharibəyə gətirib çıxarır. Davaya çağrılan şah anasından döyüş papağını gətirməyi xahiş edir. Ana gedir və əliboş qayıdaraq oğluna: «Səni and verirəm halal südümə, papağa dəymə… onun içində ağ göyərçin yuva bağlayıb. Özünün də üç dənə ətcə balası var. Biaram özünü çölə vurub balalarını yemləyir. Onları təhlükəsiz bir yerdə boya-

[1] Yanardağ əfsanələri, səh. 64-67.

başa çatdırmaq istəyir. Mən bu günahsız balalara toxunsam, ağ göyərçin bizdən küsüb gedər, yetim balaların ah-naləsi ölkəmizə bəlalar gətirər», - deyir.

Şah döyüşə papaqsız getməli olur. Müqabil tərəf məsələnin mahiyyətini bildikdə vuruşacağı şaha əlini uzadıb «Gəl sülh bağlayaq. Sənin anan adi bir quşun –ağ göyərçinin evini dağıtmaq istəmir. Biz niyə nahaq qan töküb, minlərlə insanların evini dağıdaq» - deyir.

Məzmun və ideyasına görə bu əfsanələr müasir səslənir. Mütərəqqi insanların nümayişlərə gətirdikləri bayraqların üstündəki göyərçin rəmzləri də bunu sübut edir.

Bununla belə, bir həqiqəti unutmaq olmaz ki, əsatirlərdə xəyalla, fantaziya ilə, əfsanələrdə isə müəyyən mənada, həqiqət, real zəminlə bağlılıq güclüdür. Əsatirlərdə çox məsələ açılmamış, gizli, örtülü göründüyü halda, əfsanələrdə bu bir qədər ayrı şəkildədir.

Ulu keçmişin, tarixin müəyyən izlərini özündə yaşadan əfsanələr həmişə real həyata bağlı olmuş, bir elin harayını, bir nəslin sevinc və kədərini, bəzən bir dövrün ümid və inamını əks etdirmişdir. Əfsanələrdə bədii təxəyyül nə qədər qanadlı olsa da, daha çox, geniş mənada torpağa, insana, tarixə bağlıdır. Hər əsrarlı əfsanədə bir gerçəklik vardır.

Mifoloji əfsanələrimizdə Dədə Günəş, Aldədə oda basdırılır, yanmır, əksinə, onların saqqalı buz bağlayır. Xıdır Nəbi «Həzrət baba» dağında buzdan ocaq çatır. Kərəmin ağzından çıxan od-alova çevrilir, Əslini yandırır. Cavanşirin, Koroğlunun qılıncı ildırım kimi od saçır.

Mifoloji növə daxil olan bu əfsanələr hər şeydən əvvəl, qeyri-adi, möcüzəli bir hadisəyə

bağlılığı, güclü fantaziyaya malik olmaları ilə fərqlənirlər. Mükəmməl poetik xüsusiyyətə, dərin məna və yüksək ideyaya malik əsatiri təbiətli bu əfsanələrdə çoban daşa dönür, gəlin qayalaşır, ağ gül bülbül qanından qırmızı rəng alır, səməndər quşu yanmağı ilə öz əhdinə, murazına çatır. Qırx qız «Qırxbulaq» olur, qızların göz yaşından «Qız gölü» yaranır, daşa dəyən ox daşı yaralayır, daşın qəlbindən axan qan ona «Qanlı Daş» adını qazandırır. Oğlan dənizə, qız qağayıya dönür, geniş taxıl zəmisinin sünbülləri oxuyur və s.

Yurdumuzun «Gəlin qaya»ları, «Çoban daşa dönən» daşlıqları və qayalıqları, «Qırxqız bulaq»ları çoxdur və bunlarla əlaqədar çoxsaylı əfsanələr mövcuddur. Kəklik, turac, hophop quşları haqqındakı əfsanələr də bu qəbildəndir.

Əlbəttə, elə başa düşülməsin ki, bu sadalanan sıraya daxil olan əfsanələr yalnız bizim xalq yaradıcılığımıza daxildir. Düzdür, folklor əsəri, eləcə də, əfsanə öz spesifikası – başlıca olaraq məxsus olduğu xalqın milli xüsusiyyətlərini əks etdirməsi ilə seçilir. Bununla belə, ayrı-ayrı əfsanə nümunələrindəki mövzu və süjet oxşarlığından tamamilə imtina etmək də mümkün deyil. Məhz bu cəhəti nəzərə alan K.V. Çistov qeyd edir ki, «Hər bir xalqın əfsanələrində müəyyən beynəlxalq süjetlərə, yaxud bu süjetlərin elementlərinə rast gəlmək mümkündür».[1]

Yuxarıda adlarını çəkdiyimiz daşların, qayaların, quşların və bulaqların əfsanələrində digər xalqların əfsanələri ilə müqayisədə oxşar süjetlər özünü aşkar şəkildə göstərməkdədir. Gəlini

---

[1] K.V.Çistov.Ruskiye narodnıye soçsialno utopiçeskie leqendı, s. 136

qaynatası paltarsız, yaxud başı açıq, başını yuduğu yerdə gördüyü üçün, bir daha abır-həyadan üzə çıxmaq istəmir, üzünü göylərə tutub yalvarır və özünün «quşa», «daşa» dönməsini arzu edir. Gəlinin istəyi həyata keçir. O, «Gəlin qayası» şəklində heykəlləşir, daşa, daraq başında şanapipik quşuna, əlləri xınalı kəkliyə çevrilir. Yaxud gəlin ona tapşırılan əmanətin yerini unutduğu üçün öz arzusu ilə turac quşu olur. Əmanətin yeri sonra yadına düşür, lakin gec olur. Bununla belə, turac quşu – gəlin günahsız və halal olduğunu qayınatasına və qayınanasına bildirmək üçün tez-tez oxuyur, əmanətin yerini onlara bildirmək istəyir:

***Taxçadadır,***
***Boxçadadır.***

Hophop adlı oğlu, Gültop adlı qızı olan günahsız bir gəlini günahı olmadan qayınatası evdən qovur. Ata evinə getməyi ar bilən qız, övlad ayrılığına dözməyən ana öz arzusu ilə quş olur, övladlarına yaxın olan meşəlikdə yuva bağlayır. Buradan tez-tez övladlarını səsləyir: Hophop, Gültop… Ana bununla təskinlik tapır.

Göründüyü kimi, xalq əsatiri təbiətli əfsanələrdə gəlin qayınana, qayınata, övlad münasibətlərini olduqca incə şəkildə və həm də çox ustalıqla ifadə etmişdir. Bu əfsanələrdə eyni zamanda ailə-məişət məsələlərinə də çox ciddi şəkildə toxunulmuşdur.

«Qırxqız bulaq»ları öz nişanlılarını davada itirən, arzuları, istəkləri ürəklərində qalan, düşmən tərəfindən qovulan, təqib olunan, lakin ələ keçməyib, qaçıb gizlənən, dumanlı, çənli dağların

qoynunda, qayalıqlarda itən, azan, kimsəsiz qırx qızın axıtdığı göz yaşından yaranmışdır.

Əlbəttə, İslam dini pərdəsi altında hakimiyyətləri-ni zorla qəbul etdirən ərəblər, yaxşı bilirdilər ki, atəşgahları, yerli inamlarla bağlı məbədləri – «Qız qala»larını, «Oğlan qala»larını gözdən salmadan, adamların üzünü birdən-birə məscidlərə döndərmək çətin olardı.

Əsatiri təbiətli elə əfsanələr də vardır ki, onlar az qala iri həcmli müstəqil bədii əsər təsiri bağışlayır: «Yanardağ əfsanəsi» buna misal ola bilər.

«Elturan adlı bir gənc var imiş. Bu gənc gözəl bir qızı sevirmiş. Gecə də, gündüz də onun haqqında fikirləşirmiş. Birdən qarşısında sevdiyi qızın özünü görür. Heç birinin tərpənməyə iqtidarı olmur. Özlərinə gəldikdən sonra şirin söhbət edə-edə yaxındakı dağa doğru yol alırlar. Oğlan xəyalı həqiqətə çevirmək istəyir. Ürəyini qıza açır.

Oğlanı eşqin alovu bürüyür. Elturan dərindən bir ah çəkir, ağzından torpağa qığılcım düşür, torpaq alovlanır. Torpaqdan tüstüsüz, rəngarəng alov qalxır.

Qız:

- Bu nədir belə? - deyə sual verir.

- Bu sənə olan sevgimin, məhəbbətimin atəşidir.

- Xeyr, bu adicə oddur.

- Elturan qızın sözlərindən daha da alovlanır. Yenə ah çəkir, yenə ağzından od tökülür.

- Odu oddan seçməyi bacar, mələyim!

Qız alova diqqət yetirir. Görür dağın döşündə şölə saçan bu alov gülə-çiçəyə zərər yetirmir. Əksinə, alovun yanından bir şiv qalxır, qollu-budaqlı

nəhəng bir ağaca çevrilir. Bu ağac sarı rəngi tanımır, ilin dörd fəslində yamyaşıl olur. Ağac bütün qidasını – işığını, havasını, suyunu, bu alovdan alır. Artıq bundan sonra o, inanır ki, bu od eşq, məhəbbət odudur. O ancaq həyat bəxş edir. Qız buna əmin olduqdan sonra qəlbini oğlana verir».[1]

Akademik M.İbrahimov çox doğru olaraq qeyd edir ki: «hər xalqın öz Prometeyi var». «Pərvanə əfsanəsi» də bu fikrin həqiqət olduğunu təsdiq edir. Kamran adlı oğlan Pəri adlı qızı sevir. Nağıllarda olduğu kimi qızın atası onun qarşısına şərt qoyur. Düşmən əhatəsində qalan müqəddəs ocağın sönməkdə olan odunu gətirsin. Oğlan oda yaxınlaşanda gözətçilər oğlanı görür və tutmaq istəyirlər. O, özünü oda atır. Alova bələnən oğlan sevdiyi qızın ocağına gəlir. Od düşmən mühasirəsindən çıxarılır. Qız da pərvanəyə çevrilib onun ətrafına dolanır, özünü yandırır. «Odun oğurlanılması»[2] adlı Abxaz əfsanələrində də əhvalat təqribən belə olur.

Bu tipli əfsanələr öz əsas bədii məğzini qədim mifoloji görüşlərdən, əsatirlərdən aldığı kimi, gerçəkliyi də tarixi həqiqətlərə yaxınlıqda qazanır. İnsanın yaradıcı xəyalı, fantaziyası isə onu bəzəyir.

«Pərvanə əfsanəsi», «Əriyən qaya», «Kiçik xanım və çoban» və başqa əfsanələrdə obrazlılıq ancaq bədii təfəkkür sahəsində dünyanın dərk edilməsinin, mənim-sənilməsinin zəruri şərti kimi göstərilmişdir. Deməli, bədii obrazlılıqdan kənarda əsatir və əfsanə yoxdur. Lakin əsatir və əfsanə təkcə obrazlılıqla məhdudlaşmır, o, yeri gəldikcə

---

[1] Yanarağ əfsanələri, səh. 12-13.
[2] Bax, Paçulli. «Leqendi lazurnoqo bereqa», M. 1973, səh.19.

gerçəkliyi mənimsəməyin digər forma-ları olan xalq fəlsəfəsi və pedaqogikasından, elmdən və başqa sahələrdən istifadə edir. Bu fikirlə yanaşdıqda əsatir və əfsanələrin müəyyən süjet ətrafında müstəqil şəkil almasını, ətə-qana dolmasını, gözəl məzmun və forma ilə biçimlənməsini başlıca olaraq dil materialı, daha doğrusu, bu dilin imkanları, onun bədii təsvir vasitələri təmin edir. Epik növün yığcam, lakonik janrlarından sayılan əfsanələrin özlərinə məxsus təsvir və ifadə vasitələri vardır. Burada elə boyalar, elə təsvir vasitələri, söz çalarları var ki, onlardakı əlvanlıq, rəngarəng gözəllik, emosional ifadə yalnız və yalnız əfsanələrə məxsus, xas keyfiyyətlərdir. Çoxsaylı Azərbaycan əfsanələri, mövzuca əhatəli, məzmunca dərin və mənalı olduğu kimi, forma etibarı ilə də zəngindir, həm də əsrlərdən bəri biçimlənən, daim yeni məna, məzmun və forma qazanması ilə fərqlənən Azərbaycan əfsanələrində bədii sənətkarlıq məsələləri həmişə bitkin olmuşdu.

Zaman-zaman dəyişən, yeniləşən, təkmilləşən, hətta abidələşən, lokallığı, doğma əraziyə bağlılığı ilə seçilən əfsanələrin bədii ifadə tərzinə, məzmun və forma xüsusiyyətlərinə də təsir göstərir.

Əsatir və əfsanələrin üslubunu nəzərdən keçir-dikdə onda xalqın danışıq dilinin xüsusiyyətlərini tam aydınlığı ilə görmək olar.

Əfsanələrdə xalq fantaziyası ilə süslənmiş romantik vüsət, dərin ümumiləşdirmə, ağılla emosional cəhətlərin uyğunluğu, vəhdəti üstünlük təşkil edir. Deyilən xüsusiyyət eyni zamanda, bu yığcam janrda mühüm ictimai-əxlaqi məsələlərin bədii ifadəsini tapmasına da imkan yaradır və bu

cəhətdən məhəbbət əfsanələrinin də özlərinə məxsus geneologiyası – yazılı şəcərəsi var.

Şərtə görə, çətin ov dalınca gedən Laçın sıldırım qayalar arasında qalır, çıxış yolu tapa bilmir. Sevgilisinin bircə dəfə onu dağ başına çıxıb çağırması, Laçına yeni əzəmət, yeni qüvvət verir. O, çıxılmazlığı dəf edir, qayalar arasından dağın başına qalxıb sevgilisi ilə görüşür. Xan öyrəndikdə ki, xanımlardan biri öz çobanına vurulub, onları qarşılaşdırmağı, baxışlarını oxumağı qərara alır. Sevgilisini ələ vermək istəməyən çoban gözlərinə mil çəkir, özünü kor edir. Göründüyü kimi xalq nümayəndəsi olan çoban öz sevgilisini gözlərindən üstün tutmuşdur. «Əriyən qaya», «Laçın qayası», «Kiçik xanım və çoban» əfsanələrində isə gənclərin məhəbbəti sədaqət rəmzi kimi təsvir edilmişdir.

Yazılı ədəbiyyat nümayəndələri folklordan, eləcə də əfsanələrdən səmərəli şəkildə faydalandıqları kimi, özləri də bu tərzdə yadda qalan, folklorlaşan nümunələr yaratmışlar.

R.Rza Nizami Gəncəvinin cavanlığına aid «Alagöz» adlı hekayə yazmışdır. Hekayədə söhbət Göy Gölün əmələ gəlməsindən ibarətdir və onu balaca İlyasa atası danışır. Əsatir- daha sonrakı dövrlərdə tədricən epikləşərək yerini əfsanə və nağıla vermiş, eyni zamanda, epos və dastanların yaranması üçün də əsas istifadə mənbəyinə çevrilmişdir.

Qeyd etdik ki, əsatirlə əfsanələr arasında sərhəd qoymaq çox çətindir. Əsatirlərin kökləri çox qədim dövrlərə gedib çıxır. Onlar təbiətin bir canlı məxluq kimi qəbul olunması ilə, uzaq keçmişlərdə yaşamış insanlara fantastik xüsusiyyətlərin verilməsi ilə əlaqədardırlar. Əfsanələr əsatirə nisbətən tarixi

hekayətlərə daha yaxındır. Lakin bunların da qəhrəmanları fövqəladə xüsusiyyətlərə malikdirlər. Zəngin mifologiyası olan xalqların yazılı ədəbiyyatı da çox erkən yaranmış və geniş şöhrət tapmışdır.

Azərbaycan folklorunda Fərhad obrazı bu cəhətdən diqqəti daha çox cəlb edir. «Fərhadın səsi», «Nəğməkar Fərhad» əfsanə olsalar da, burada elə bil doğrudan-doğruya çox qədim bir eposun izləri mühafizə olunubdur. «Fərhadın səsi» adlı əfsanədə göstərilir ki, Mahmud Qəznəvinin hökmdar olduğu Əfqan-Əfşarda kasıb bir kişinin Pəri adlı qızı vardı. Qızın qənirsiz gözəlliyi uşağı da, cavanı da, çobanı da heyrətə salır, hamı ona heyran kəsilir. Pərinin gözəlliyində sanki əsrarəngiz bir hikmət vardır. Hər şey bu gözəlliyin qüdrəti ilə təzələnir, canlanır. Hamı ona İlham Pərisi deyir. Pəri qapılarına gələn saysız-hesabsız elçilərin heç birinə məhəl qoymurdu.

Həmin ölkədə Fərhad adlı igid, boylu-buxunlu, pəhləvan cüssəli, daş yonub ev tikən bir bənna yaşayırdı. Onun sənətinin şöhrəti xeyli uzaqlara yayılmışdı.

Bir gün Fərhad yenə daş yonurdu. O, bir də baxıb gördü ki, ətrafdakılar iş-güclərini buraxıb çarşı-bazara tərəf axışırlar. İstər-istəməz Fərhad da onlara qoşuldu. Sən demə, İlham Pərisi bazara çıxıbmış, hamı heyrət və məftunluqla onun gözəlliyinə tamaşa edirdi. Fərhad Pərini görən kimi dünya başına fırlandı, qara daşlar gözlərinin qabağında qırmızı güllər açdı, sinəsində eşqin odu alovlanıb dil açdı. O, bir də ayıldı ki, hamı dağılıb, bazarda özündən başqa heç kimsə qalmayıb. Amma çiçəklərdən, ağaclardan, cansız divarlardan, əngin səmalardan İlham Pərisinin nəfəsi, qoxusu

gəlir. Fərhadın sinəsindəki ocaq daha gur yanmağa başladı. İstədi İlham Pərisinə – sevgisi haqqında söz desin. Amma qüdrətdən söz səsə çevrildi, dalğa-dalğa hava-landı, zəngulәsi dağları-daşları lərzəyə saldı. Bu səs İlham Pərisini haraylayırdı, çağırırdı.

Fərhadın sirli-sehrli səsi özünün elçisi oldu. Bu səs Pəriyə çatan kimi o da Fərhadın məhəbbət yanğısına alışdı, eşqin odu onun məğrurluğunu əritdi.

İlham Pərisinin gözəlliyinin sorağı oba-oba, oymaq-oymaq yayılıb, nəhayət, Mahmud Qəznəvinin də qulağına çatdı, hökmdar şöləsi ilə qaranlıqları işıqlandıran çiçəyi dərməyə tələsdi, dünya gözəlini sarayına apartdırıb özünə arvad elədi.

Nakam eşqin zərbəsi Fərhadın səsinin yanğısını daha da artırdı, zəngulәsini daha da gücləndirdi. O, hər gün oxuyub səsilə sevgilisini haraylayırdı. Səs Pəriyə çatan kimi o sarsılır, bütün varlığı əsim-əsim əsirdi. Hökmdar Pərini nə qədər dərin yerlərə, nə qədər gizli otaqlara apardısa da, səsdən qoruya bilmədi.

İşi belə görən Mahmud Qəznəvi Fərhadın küçədə, çarşı-bazarda oxumasını qadağan etdi. Fərhadın səsi daha da gur eşidildi. Hökmdarın göstərişi ilə onu zindana saldılar. Amma şah istəyinə nail ola bilmədi. Zindandan gələn səs İlham Pərisini havalandırır, haldan-hala salırdı.

Çıxılmaz vəziyyətdə qalan Mahmud Qəznəvi vəzir-vəkillərini, sarayın başbilənlərini, dünyagör-müşlərini bir yerə yığıb Fərhadın səsini batırmaq üçün məsləhət istədi. Fərhad Arran ölkəsinə sürgün edildi.

Bir gün Mahmud Qəznəvi öz ölkəsini gəzirdi. Gördü ki, xalq başdan-başa qara geyinib. Hökmdar təəccübləndi və bunun səbəbini soruşdu. Dedilər ki, Fərhadın səsini itirən xalq matəm içərisindədir. Hökmdar bərk təşvişə düşdü. Əmr verib Fərhadı Arrandan gətirtdi. Mahmud Qəznəvi maraqla Fərhaddan soruşdu:

- Arranda nə işlə məşğul idin?

Fərhad cavab verdi:

- Köhnə sənətimə qayıtmışdım, daş yonub saray tikirdim.

- Bəs niyə oxumurdun, mənim qəzəbimdən qorxurdun?

- Xeyr, hökmdar. Aşiqlərdə qorxu hissi olmur. Mənim səsim Pərinin nəfəsinə bağlıdır. Külək onun nəfəsini uzaq ölkəyə gətirib çatdıra bilmirdi. Bu səbəbdən susmuşdum.

Mahmud Qəznəvi xalqın matəmdən çıxması xətrinə Fərhada orta meydanda ancaq həftədə bir dəfə oxumasına icazə verdi. Günorta çağı idi. Mahmudla Pəri qabaq-qabağa oturub qızıl piyalədə şərbət içirdilər. Birdən Fərhadın səsi gəldi. İlham Pərisi qeyri-ixtiyari qızıl piyaləni əlindən saldı. «Odur… Odur…» deyə-deyə havalanmış halda səs gələn tərəfə qaçdı. Mahmud Qəznəvi heyrət içində özü-özünə danışırdı:

- Sən eşqin gücündəki hökmə bax. O qızıldan da, hökmdardan da, qılıncdan da güclüdür…[1]

Bu əfsanənin «Koroğlu» eposu ilə səsləşən nöqtələri vardır. Fərhadın səsi öz elçisi olduğu kimi, Koroğlunun da igidliyi, dəli nərəsi görməzə-bilməzə Nigarın qəlbinə məhəbbət toxumları səpmişdi.

---

[1] S.Paşayev. Nizami və xalq əfsanələri, Bakı, Gənclik, 1983, səh.58-60.

Koroğluya gücü, səsi, dəli nərəni bəxş edən doğma yurddakı Qoşabulağın suyudur. Fərhadın ecazkar səsi isə elin dilbər sonasının - İlham Pərisinin nəfəsinə bağlıdır. Aldədə öz torpağında quş kimi uçur, küləkdən qanad alır, yad torpaqda isə ilan kimi sürünür. Fərhad da belədir. Uzaq, yad ölkədə olduqda külək Pərinin nəfəsini çatdıra bilmir və bu səbəbdən onun səsi boğulur, kəsilir. Öz torpağında isə Pərinin nəfəsi ona tez çatır və səsinin zənguləsi könülləri vəcdə gətirir. Burada eyni zamanda məhəbbətin gücünə, qadirliyinə böyük inam vardır.

Sarı Aşıq Fərhadın səsi əfsanəsilə və ya başqa əfsanələrlə, həm də öz taleyinə uyğun olaraq belə bir nadir cinaslı bayatı yaratmışdır:

***Aşıq, qaz binə bağlar,***
***Meylin Qazbinə bağlar.***

***Gözüm yaşı göl olar,***
***Ördək- qaz binə bağlar.***

Burada işlənən Qazbin dedikdə Mahmud Qəznəvinin yaşadığı Qəzvin şəhəri nəzərdə tutulur. Bayatı bizə bir möcüzə kimi göründü.

Sadə kəndli qızı Ərəbzəngi inək sağdığı zaman inək təpiklə vurub südü yerə tökür. Qız hirslənib inəyi yumruqla vurur. Bir yumruğun zərbindən inək ölür. Ərəbzəngi onda bilir ki, onun qolunda necə qüvvət vardır. Öz məzmununa görə «Güllərin hünəri» əfsanəsi Ərəbzənginin igidliyinə bənzəyir. Əfsanədə deyilir: «İrandan şahın pəhləvanı Gəncəyə gəlir və xanın pəhləvanını yıxır. O vaxt qayda belə imiş. Əgər şahın pəhləvanı və ya aşığı

xanlığın qırx pəhləvanını yıxsa və ya aşığını bağlasa, vergilər yarıbayarı artarmış, yox, xanlığın bir pəhləvanı və ya bir aşığı qalib gəlsə, vergilər yarıbayarı azalarmış.

Gəncə xanı onsuz da ağır olan vergiləri ödəyə bilmirdi. Bu tərəfdən də qırx pəhləvanın məğlubiyyəti onu xeyli sarsıtmışdı. Şahın pəhləvanı xana üç gün möhlət verdi və dedi:

- Mahala car çəkdir, qoy qolunun gücünə, dizinin möhkəmliyinə inanan varsa, meydanıma gəlsin.

Bir çoban meydandakı adamları yara-yara düz xanın yanına gəldi, əyilib xanın qulağına dedi:

- Möhtərəm xan, bir möcüzəni sizə bildirməyə gəlmişəm. Gülazar bulağından xeyli yuxarıda, Naltökən yaxanlığındakı Xan bulağının yanına bir mal binəsi düşmüşdü. Hələ də gördüyüm möcüzəyə inana bil-mirəm. Bir qız idi, gəlin idi bilmirəm. Camış sağırdı. Camışın balağı qabaq ayaqlarına bağlanmışdı. Birdən camışın iki yaşar balası o biri tərəfdən anasının altına düşdü. Qız camışın bu ikiillik balasını nə qədər qovdusa, bala camış heyvanı sağmağa imkan vermədi. Qız necə hirsləndisə ikillik camış balasının quyruğundan yapışıb, çəpərin o biri üzünə atdı, heyvan yerindəcə ölüb qaldı…

Xan Gülləri gətizdirdi. Güllər kişi paltarı geyib həmin pəhləvanla bir süfrə arxasında yanaşı oturdu. Ayağa qalxan zaman Güllər sağ əli ilə basıb, pəhləvanın sol qıçını sındırdı. Güllər pəhləvan qiyafəsində güləş meydanına çıxdı və həmin pəhləvanı öz hüzuruna istədi. Pəhləvan çox təkan verdi, yerindən dura bilmədi».

Göründüyü kimi, Ərəbzəngi ilə Güllər çox güclü və az qala bir-birinə bərabər qəhrəmanlardır.

Bu cür cəngavər qızlar nəslinə məxsus Telli də, Ruqiyyə də, Pərzad da eyni kökə bağlıdırlar.

«Dədə Qorqud və Salmani-fars» adlı bir əfsanədə deyilir ki, Salmani–fars Həzrəti Məhəmmədin dostu idi. Ölkədə nə mühüm xəbərlər olsa Salmani-farsa çatdırılardı və o da öz növbəsində bunları Məhəmmədə bildirərdi. Bir gün Salmani-farsa xəbər verdilər ki, Qorqud adlı bir ozan camaat arasında «Quran»ın ayələrini nəzmə çəkib qopuzla çalıb oxuyur.

Salmani-fars Qorqudu əlində qopuz Məhəmmədin yanına gətirir və Məhəmməd peyğəmbərə bildirir ki, bu ozan «Quran»ı nəzmə çəkib qopuzda oxuyur. Məhəmməd deyir:

- Ona toxunmaq olmaz. O, dədə ozandır. Qoy oba-oba gəzib «Quran»ı təbliğ etsin. Xalq ona qulaq asır. Qoy nə şəkildə, necə bacarırsa islamın şərəfinə söz desin. O, ancaq alqışa layiqdir.[1]

Bu tarixi əfsanənin bizi maraqlandıran ən əhəmiyyətli cəhəti budur ki, Salmani-fars kimi, Dədə Qorqud da Məhəmməd peyğəmbərin müasiri və yaxın dostu kimi təqdim edilir. Bu eyni zamanda «Kitabi Dədə Qorqud»un müqəddiməsindəki «Rəsul Əleyhüssəlamın (Məhəmməd peyğəmbərin-S.P.) zamanına yaxın Bayat boyundan Qorqud Ata derlər bir ər qopdu» fikrinin reallığına, həqiqiliyinə inam hissi oyadır.

Azərbaycan əfsanələri xalq arasında yaşadığı kimi, yazılı ədəbiyyatın tərkibində də yaşayıb, zəmanəmizə gəlib çatmışdır. Başqa sözlə desək,

---

[1] Bu əfsanə 1968-ci ildə Daşkəsən rayonunun Qabaqtəpə kəndində yaşayan Cavad Bayram oğlundan lentə köçürülmüşdür.

klassik ədəbiyyat əfsanələri, yaxud onların müəyyən elementlərini toplayıb saxlayan vasitələrdən biridir.

Azərbaycan folklorunun yaradıcısı və yaşadıcısı olan xalqımız öz müdrikliyinin, yaradıcı dühasının zəngin mənəvi sərvəti ilə qədim mədəniyyətə malik xalqlar arasında fəxri yerlərdən birini tutur. Onun tarixin qaranlıqlarından zəka məşəli kimi nur saça-saça gələn əsrlər yaşıdı mifologiyası, saysız əfsanələri, maraqlı nağılları, duzlu lətifələri, şirin bayatıları, yanıqlı ağıları, həzin holavarları, hikmətamiz atalar sözləri və müdrik məsəlləri bitib-tükənməyən mənəvi sərvətdir, xəzinədir. Dünyanın ən böyük sənətkarları, o cümlədən Nizami bu xəzinədən pay götürmüş, əbədiləşmişdir.

Prof. M.H.Təhmasib yazır: «Qədim Azərbaycan ədəbiyyatı haqqında məlumat mənbələrindən biri də Nizami kimi dahi sənətkarların əsərləridir. Nizami şifahi ədəbiyyatın bir çox janrlarından istifadə etdiyi kimi, xüsusilə qədim eposdan da bacarıqla istifadə etmişdir. Bu dahi sənətkarın «Xəmsə»sində yüzlərlə kiçik, böyük əfsanələrə, əsatirə təsadüf edilir. Bunlardan bəzilərini o özü yaratmış, bəzilərini isə müəllif yazılı məxəzlərdən, şifahi ədəbi əsərlərdən istifadə edərək yenidən işləmiş, təkmilləşdirmiş, xalqdan alaraq yenidən xalqa qaytarmışdır».[1]

Nizaminin folklor əlaqələri müxtəlif şəkildə təzahür edir ki, bunları da əsasən üç qrupda tədqiq etmək olar:

1. Nizaminin istifadə etdiyi yerli əsatir və əfsanələr, yaxud da başqa folklor nümunələri;

---

[1] Bax: Azərbaycan ədəbiyyatı tarixi, Bakı, 1960, səh. 28

2. Nizaminin özü tərəfindən yaradılmış folklor nümunələri;

3. Nizaminin həyatı ilə əlaqədar yaranmış yeni folklor nümunələri, əsərlərinin süjet və motivləri.

«Dədə-Qorqud» boyları, Nizami «Xəmsə»si, «Koroğlu» eposu və «Əsli-Kərəm» dastanları ilə bağlı xalq arasında çox sayda əsatir, əfsanə və rəvayətlər yaşayır.

Azərbaycan əfsanələrini özündə cəmləşdirən aşağıdakı kitabları nəşr etdirmişik. «Yaşayan əfsanələr» (1973), «Yurdumuzun əfsanələri» (1976), «Yanardağ əfsanələri» (1978), «Azərbaycan xalq əfsanələri» (1985), «Xalqın söz mirvariləri» (1999), «Eldən-obadan eşitdiklərim» (2005) folklor topluları, «Nizami və folklor» (1976), «Nizami və xalq əfsanələri» (1983), «Azərbaycan əfsanələrinin öyrənilməsi» (1985), «Azərbaycan eposunun əfsanə qaynaqları» (2002), «Azərbaycan əfsanə və rəvayətlərinin ədəbi abidə-lərimizlə müqayisəli tədqiqi» (2007) kitabları, onlarla jurnal və qəzet məqalələri nəşr olunmuşdur. Bu kitablar haqqında alim, yazıçı və jurnalistlər bir-birindən qiymətli elmi rəylər yazıb nəşr etdirmişlər. Həmin rəylər və elmi məqalələr «Elm və sənət adamları Sədnik Paşa Pirsultanlı haqqında» kitabında (Bax: Pirsultan nəşriyyatı, Gəncə - 2003, 400 səhifə) öz əksini tapmışdır.

Bizə görə, əfsanə tarix deyil, lakin tarixsiz də deyil, onda ya həqiqətin özü, izi və ya hər hansı bir əlaməti yaşayır. Əsatir və əfsanəsi olmayan bir xalqa qədim xalq demək olmaz. Əsatir və əfsanələr zaman keçdikcə əski, arxaik yaddaşı ilə tarixə dönür, qədim toponomik adları özündə yaşadır. Əsatir epikləşə-epikləşə öz həyatını əfsanələrə verir,

əfsanədə öz fantaziyasının gücü ilə gələcəyə can atır və getdikcə ölməzlik qazanır. Gəzərgi əfsanələr belə, öz varlığını dağa, daşa, gölə, qalaya və digər tarixi yerlərə bağlayaraq, lokallıq - müəyyən coğrafi məkana bağlılıq qazanır, həmin ərazidə yaşayan xalqın mənəvi dünyası ilə qaynayıb qarışır. Biz əfsanələri bu gün də toplayıb nəşr etdirməklə, yeni tədqiqat əsərləri yaratmaqla məşğuluq.

Azərbaycan xalq əfsanələri xalqın ictimai fikir tarixinin səlnaməsidir. Xalqın dünyagörüşü, mübarizəsi və humanizmi bu əfsanələrdə qorunub saxlanılmış, zaman keçdikcə eposlaşıb, yazıya alınmışdır. Bu sahədə Heradotdan sonra dahi Nizami çox iş görmüşdür. O, əfsanələrdən istifadə etməklə onların ömrünü uzatmış, bununla bir növ, əsatir və əfsanələrimizin ilk toplayıcısı, yaradıcısı və qoruyucusu kimi tarixi bir vəzifəni də yerinə yetirmişdir.

Başqa folklor nümunələri kimi əfsanələr də öz xüsusi inkişaf yolu ilə tarixə yoldaşlıq edir.

Törənişi etibarı ilə ilk və eyni qaynaqdan su içsələr də, əsatir birinci, əfsanə ikinci, rəvayət üçüncüdür.

Əsatirlərdə fantaziya ilə yanaşı möcüzələr də mövcuddur. Epikləşərək və müəyyən coğrafi məkanlarla birləşərək yeni keyfiyyətlər qazanan əfsanələr öz fantaziyası ilə bizə bədii hadisələr nəql edir. Lakin tarixi həqiqətlərlə, şəxsiyyətlərlə bağlı yaranan rəvayətlər də fantaziyadan xali deyildir, eyni zamanda hər bir rəvayət öz bədii tutumuna görə kiçik süjetli mükəmməl bir əsərdir.

Əsatirlə əfsanənin əlaqəsini aydınlaşdırmağın özü belə möcüzədir. Təbiəti seyr etdikdə gözünə dənizlər, göllər görünür. Gölün sahilə yaxın yerində

rəngarəng ağ, göy, sarı zanbaqlara rast gəlirsən, düşünürsən, bu zanbaqların kökü dənizin dibindədir, ya divarında. Axı, hər bir bitkinin kökü torpağa bağlıdır. Axı, hər bir bitki öz boyasını, rəngini torpağa bağlı kökündən alır. Bax, o zanbağın kökü əsatirdir. Gözəlliyi ilə insanı özünə cəlb edən zanbaq isə gerçəkliyə bağlı əfsanədir. Daha doğrusu, şərti olaraq onu deyə bilərik ki, zanbağın gözə görünməyən, möcüzəli tərəfi əsatirdir, gözə görünən, boyalarla, rənglərlə süslənmiş tərəfi isə əfsanədir.

Tarixi rəvayətlərlə yanaşı, yerli topnonimlərə bağlı əfsanələr dil tarixini, ayrı-ayrı sözlərin lüğəvi mənasını öyrənməkdə toponomik rəvayətlər böyük əhəmiyyətə malikdir. Rəvayətlər gələcəkdə xüsusi tədqiqat mövzu-suna çevrilməlidir. Rəvayətlərin məziyyəti ondadır ki, tarixi şəxsiyyətlər haqqında xalqın qənaətlərini bədii şəkildə özündə ifadə edir.

Əsatirlərin, əfsanələrin və rəvayətlərin toplanması, nəşri və araşdırılması bir folklorşünas kimi mənim taleyimə yazılmışdır.

**Sədnik Paşa Pirsultanlı**
**Filologiya elmləri doktoru,**
**professor, Azərbaycan**
**Yazı-**
**çılar birliyinin üzvü,**
**Əməkdar**
**mədəniyyət işçisi.**

## *1. Oğlan qız daşı*

Bir kişinin Zərbigül adlı pəhləvan kimi güclü qızı varmış. Qıza çox yerdən elçi gəlir, ancaq qız onların heç birini bəyənmir. Deyir ki, evimizin qabağında iki yekə daş var; o daşın birini mən atacağam, o birini də kim mən atan mənzilə atsa, ona gedəcəyəm.

Qız daşın birini atır. Daş göyün yeddi qatına çatır, sonra süzüb uzaqda yerə sancılır. Kəndin qızını gözü tutan cahıllar bir-bir gəlib ikinci daşdan yapışırlar, amma yerindən tərpədə bilmirlər. Xəbər qızın əmisi oğlu Zərbicəngə çatır. Oğlan daşı yerdən götürüb atır. Daş göydə havalanır, gözdən itir, gedib qızın atdığı daşın yanına düşür.

Qızın atası şad-xürrəm toy tədarükü görməyə gedir.

## *2. Qanlı daş*

Sarısuda[1] cavan bir ovçu yaşayırmış. Oxundan bir hədəf yayına bilməzmiş. Onun ovçuluq

[1] Göy-göl rayonundadır.

məharətindən cavanlar da, qocalar da ağız dolusu danışarmış.

Cavan ovçu qonşu qızı Gülpərinin eşqinə alışır. Necə deyərlər, sinəsi işvəsindən, qəmzəsindən qara daşları əridən gözəllər gözəli Gülpərinin nişangahına çevrilir. Gündüzlər meşələri dolaşan aşiqin gecələr gözlərinə yuxu getmir. Gülpəri əvəzinə ulduzlarla danışır.

Ovçu ata-baba adətilə qıza elçi göndərir. Qızın təkidi ilə atası oğlanı çətin sınaqdan çıxarmağı qərara alır:

- Meşədə maralı nənəm də vurar. Kəpəz dağında – «Maralgöl»ün qırağında, daşlar arasında məskən salan bir maral var. Əgər onu vurub gətirsə, qızı ona verərəm.

Cavan ovçu yay-oxunu götürüb daşlı, qayalı yerə gedir. Deyilən maralı görüb izinə düşür. Ox atır, amma marala dəymir. Yenə ox atır, yenə maral salamat qalır… Hər dəfə bir qaya sipərə çevrilib maralı qoruyur. Oxlar qayaya dəyir, marala dəymir. Gecə-gündüz maralla ovçu arasında çətin mübarizə gedir. Ancaq ovçu yavaş-yavaş maralı sıxışdırır, ağzını qayalıqdan daşlığa salır. Qayalar kiçilir, sipərlər xırdalanır, maral üçün gizlənmək çətinləşir. Növbə daşlara çatır. Əlacı kəsilən, qayalardan uzaq düşən maral daşlara sığınır, daşlara pənah gətirir. Daşlar da fədakarlığını göstərir, sədaqətini sübuta yetirir. Kiçik sinəsini böyük maralın özünə verir, mahir ovçunun oxuna hədəf edir.

Nəhayət, ovçu maralı haldan salır. Maral amansız oxdan yayınmaq üçün getdikcə balacalaşan daşların arxasında çox çətinliklə gizlənir.

İşi asanlaşan cavan ovçu maralı yaman yerdə yaxalayır. Bu dağların, meşələrin yaraşığını qoruyan daş maralın özündən qat-qat kiçik olur. Marala sipər olmağa, marala dayaq olmağa imkanı çatmır. Elə bu dəm  ovçu arzusuna çatmaq üçün yayı çəkir. Ox beş addımlıqdakı marala dəyir, ancaq onun əvəzinə daş inləyir. Son nəfəsdə maralı qoruya bilməyən daşın köksündən al-qırmızı qan axır…

Oğlan «Qanlı Daş»a baxıb ovçuluqdan da, belə sevdadan  da əl çəkir.

### *3. Gəlin daşı*

Bir gəlin körpəsi qucağında Murov dağından keçib atası evinə gedirmiş. Birdən bərk külək qopur. Gəlin görür ki, külək uşağı onun əlindən alacaq. Odur ki, yalvarmağa başlayır:

- Ey göylər, küləyi yavaşıt, bizi xilas elə!

Külək daha da şidddətlənir. Gəlin yenə də yalvarıb deyir:

- Ey fələk, qoyma külək balamı əlimdən alsın, bizi bir-birimizdən ayırsın. Bizi bir yerdə daş elə.

Gəlin uşağı bərk-bərk bağrına basır və eləcə də daşa dönür.

### *4. Daş gəlin*

Deyilənə görə, bir gəlin körpəsinin ağlamasına məhəl qoymadan paltar yuyurmuş. Bu vaxt gəlinin atası yolla ötüb gedirmiş. Qızının laqeydliyinə dözməyib qarğış edir:

- Ay səni daşa dönəsən, körpəni kiritsənə!

Ata bu qarğışdan sonra dönüb geri baxır və dəhşətli bir mənzərənin şahidi olur. Gəlin körpəsi də

qucağında, əlinin biri paltar teştinə uzanmış vəziyyətdə daşa dönüb. Ata təəssüflənsə də artıq gec olur.

İndi çoxları bu daşa baxanda:

-Ata nəfəsi ağırdır, onun qarğışı övladı daş da elər, quş da – deyirlər.

### *5. Qılınc və qaya*

Cavanşir öz qoşunu ilə Şamaxıya gəlirdi. Birdən onlar elə bir nəhəng dərəyə düşdülər ki, geri qayıtmaq mümkün olmadı. Pusquda dayanan düşmənlər Cavan-şirin yeganə çıxış yolunu kəsmişdilər. Hər tərəf sıldırım qayalıq idi. Nəinki atlı, heç piyada da ora dırmana bilməzdi. İki gün burada qaldılar. Cavanşir baxıb gördü ki, vəziyyət ağırdır, əgər tezliklə tədbir görülməsə qo-şun ya təslim bayrağı qaldıracaq, ya da acından məhv olacaq. Çox fikir elədi, axırı bu qərara gəldi ki, qayanı yarıb qoşunun çıxması üçün yol açsın. Ancaq qoşun əhlində külüng və qeyri alətlər yox idi. Çarə bir qılınca qalırdı.

Cavanşirin qılıncı ildırım daşından düzəldilmişdi. Onu göz bəbəyi kimi qoruyurdu. Amma başqa çarə yox idi. Təslim olmaq qəhrəmana ölümdən betər olardı. Gecə qoşun əhli yatan zaman Cavanşir öz vəziri ilə birlikdə qayalığın ayağına gəldi. Bir qədər ölçüb-biçdikdən sonra işə girişdi. O, hər dəfə qılıncını qayaya vuranda elə bil ildırım çaxırdı. Qaya parça-parça olub tökülürdü. Qolları yorulanda qulaqlarına bir qocanın səsi gəldi:

- Qollarına qüvvət gəlsin, bala, qayanı tez çap.

Cavanşir yeni qüvvə ilə qayalığı çapdı. Yoruldu. Qulaqlarına yenə o səs gəldi:

- Qoluna qüvvət gəlsin, bala, qayanı tez çap.
İldırım qılınc qayaları parça-parça etdi.
Cavanşir bu qayda ilə çalışıb-çarpışıb səhər açılanda yenə qoşunun içinə qayıtdı. Gündüz birtəhər əsgərlərin başını qarışdırdı. Gecə yenə qayanı çapmağa başladı. Bu minvalla qayanı çapdı, nəhayət, dərədən çıxmağa yol açdı.
Səhər qoşun əhli gördü ki, Cavanşir qayanı çapıb yol açıb. Heç kim inana bilmədi ki, üç gecəyə qılıncla qayaları çapıb yol açmaq olar.

### *6. Yaslı qaya*

Əmirvar[1] kəndində böyük meşənin içərisində bir qaya var. Bu qayaya el arasında «Yaslı qaya» deyirlər.
Varlı-karlı bir nəfərin qızına Ələsgər adında qədd-qamətli, qoçaq, lakin kasıb bir oğlan aşiq olur. Qız o qədər gözəl, o qədər boylu-buxunlu imiş ki, cavanların çoxu ona aşiq imiş. Oğlanların içində dövlətdən çox, ağıldan az biri zorla da olsa qızı almaq istəyir. Var varı çəkər. Ona görə qız atasının meyli bu oğlanaydı. Qız isə Ələsgəri sevirdi. Ələsgər hər gün işləyir, rəncbərlik edirdi. O, kotanın dəstəsindən tutub bu bayatını şirin avazla oxuyardı:

***Marallar qoşa gəlsin,***
***Bülbüllər coşa gəlsin.***
***Mənim də gözəl yarım,***
***Burda ağuşa gəlsin.***

Kəndin kənarındakı bulağa su aparmağa gələn Alagöz bunu eşidir:

---

[1] Daşkəsən rayonundadır.

*Marallar qoşa gələr,*
*Bülbüllər coşa gələr.*
*Arxayın ol, ay oğlan,*
*Bu əhdin başa gələr-*

deyir.

Alagöz səhəngi doldurub geri qayıdarkən Ələsgər onu dayandırır. Bu, Alagözün ürəyindən idi. O, bir təklifə bənd imiş. Onlar xeyli söhbət etdikdən sonra belə qərara gəlirlər ki, sabah gün əyiləndə hər ikisi bulaqda olsunlar və buradan da qoşulub getsinlər. Axı, Ələsgər qızın atasından bir neçə dəfə rədd cavabı almışdı.

Aşiqlər vədə yerində görüşürlər. Bunu qızın atasına xəbər verirlər. Sevgililər sevinə-sevinə qol-qola verib, sığınacaq üçün bir qayaya pənah gətirirlər.

Oğlan deyir:

- Əzizim, bax, atanla barışdıqdan sonra biz elə bu qayanın dalında ev tikdirər, buradaca yaşayarıq.

*Şəmkirçay yaman gəlir,*
*Durulur, duman gəlir,*
*Yollara bax, ay oğlan,*
*Gör hansı ceyran gəlir? -*

bunu mənə cütcü yoldaşım sən suya gələndə deyərdi.

Qızının qaçırılmasından xəbər tutan varlı bərk qəzəblənir, nökər-naibini başına toplayıb sevgililər olan qayaya gedir. Kişi qayanın zirvəsində

dayanmış aşiqləri görəndə özünü saxlaya bilmir. Ələsgəri oxla vurub öldürür.

Atası Alagözü evə aparmaq istəyir. Alagöz özünü qayadan atır.

Elə o gündən iki ürəyi həsrətdə qoyan bu qayanın adı «Yaslı qaya» qalır.

## *7. Laçın qayası*

Laçın məhşur ovçu imiş. Onun Ülkər adlı bir qıza gözü düşür. Elin adətinə görə qız evinə elçi göndərir.

Qızın atası Şahmar kişi elçilərə deyir:

- Eşitmişəm ki, sizin oğlan ovçuluğu ilə çox öyünür. Söz düşəndə: «Atdığım oxdan heç nə yayına bilməz!» - deyir. Əgər belədirsə, qoy sübut eləsin. Sıldırım qayada yaşayan dağkeçisini ovlayıb mənə gətirsə, qız onunkudur.

Elçilər bu xəbəri Laçına aparır. Laçın həm sevinir, həm də qəmlənir. Səhər erkən fikirli-fikirli sıldırım qayaya doğru yollanır. Çatan kimi də dağkeçisini görür. Keçi qayadan qayaya tullanır. Laçın da arxasınca düşür, fürsət tapıb dağkeçisini yaralayır. Keçini qayanın üstündə tutur, amma saxlaya bilmir. Keçi ilə birlikdə iki qayanın arasına düşür. Nə qədər çalışıb çabalayırsa da, oradan çıxa bilmir. Laçın üç gecə qayanın arasında qalır, tamam taqətdən düşür.

Xəbər obaya çatır, ancaq heç kim ona kömək edə bilmir.

Elin ağsaqqalı Elbəyi kişi deyir:

- Qaçın kənddən Ülkəri gətirin, o gəlməsə, oğlan öləcək.

Belə də edirlər. Elbəyi kişi deyir:

- Qızım, Ülkər! Qayanın başına çıx, Laçını ucadan çağır, sənin səsini eşidən kimi, onun qollarına qüvvət, dizlərinə taqət gələcək.

Ülkər qayanın başına çıxıb ucadan çağırır:

- Laçın hey!..

Elə bil oğlan bu səsə bənd imiş. Sevgilisinin səsi ona qol-qanad verir. Keçini çiyninə alıb üzüyuxarı qayaya dırmaşır. Ülkərin yanına çıxır və onunla qayanın başında qoşa dayanır.

### *8. Gəlin atılan qaya*

El-obaya yayılır ki, Nadir şahın qoşunu gəlir. Adamlar evlərini atıb dağlara, meşələrə qaçışırlar.

Adamlardan bir bölüyü uca bir qayanın belindən keçəndə Nadirin əsgərləri onları yaxalayır.

Əsgərlərin böyüyü soruşur:

- Dağlara qaçmağı sizin yadınıza kim salıb?

Bir gəlin cürətlə qabağa çıxır:

- Dağlara qaçmağı bu adamların yadına mən salmışam. Biz nə özgə evinə, nə də özgə torpağına qaçırıq.

- Sən bundakı cəsarətə bax, - deyib Nadirin adam-ları gəlinin qolundan tutub qayadan atırlar.

Gəlin üst-üstə altı-yeddi tuman geyinibmiş. Tumanlar havada çətir kimi açılır və gəlin sağ-salamat qayanın ayağındakı çəmənliyə düşür.

### *9. Gəlin qaya*

Yazın gül gülü, çiçək çiçəyi, bulaqlar, çaylar, göllər sonaları çağıran vaxtı imiş. Təzə gəlin körpəsini qucağına alıb, çölü, çəməni gəzməyə çıxır.

Görür ki, sonalar göllərdə üzür. Çox xoşuna gəlir. O da soyunub göldə çimir. Gəlinin ağ, mərmər bədəni ətrafa işıq saçır.

Çiçəkli dağdan gəlinə tamaşa edən qoca elə bilir ki, suda çimən mələkədir, heyran qalır. Gəlin də qocanı görür. Onlar bir-birini tanıyırlar: sən demə, həmin qoca gəlinin qayınatası imiş.

Gəlin körpəsini də qucağına alıb evə yollanmaq istəyir, ancaq yerindən tərpənə bilmir.

Gəlin həyalanıb üzünü göylərə tutub yalvarır: - Ya məni quş elə, ya daş elə!

Elə oradaca daşa dönür.

### *10. Əriyən qaya*

Nökərlə qaravaş bir-birini görməyəndə dünya başlarına daralırdı, gündüzləri də gecələrə dönürdü. Oğlan qızın, qız da oğlanın divanəsiydi. Bunu hamı bilirdi. Bu xəbəri xana çatdırdılar. Xan qəzəbləndi:

- Elə şey ola bilməz! - dedi.- Onlar nəkarədir ki, mənim sarayımda belə işlər görürlər? Bura bir parça çörək tapıb yeməyə gəlirlər, ya mazaqlaşmağa?

Xanı inandırmaq istədilər ki, bu cavanlar haqq aşiqidirlər. Onları bir-birindən ayırmaq olmaz! Birini günbatanda, digərini gündoğanda zəncirləsələr də, çarmıxa çəksələr də, tilsimi qıracaqlar, dəryalardan yel kimi keçəcəklər, yenə də görüşəcəklər.

Xan kinayə ilə güldü:

- Onların hərəsini bir zindana salın görüm, necə görüşəcəklər? Dəryaları keçənlər, tilsimləri sındıranlar aradakı o bircə divarı dağıda bilsələr, sözüm yox!..

Xanın əmri ilə oğlanı zindanın bir gözünə, qızı da digər gözünə saldılar. Onların arasındakı divar

sal qaya idi. Keşikçilər onları bircə an da gözdən qoymurdular. Oğlan o yanda, qız da bu yanda tez-tez köks ötürür, ağlayırdılar. Ürəklərindəki həsrət, intizar nəfəslərinə qarışıb sal qayaya hopurdu. Divar da ah-nalə edir, fəryad qoparırdı. Sal qayanın səsi keşikçiləri zara gətirmişdi. Onlar elə bilirdilər ki, bu dad-fəryad oğlanla qızın naləsidir, qapıları açıb onların yanında durdular ki, könülləri qübarlandıran, ürəkləri dağlayan bu səsləri eşitməsinlər. Amma gördülər ki, nə oğlan dillənir, nə də qız, sal qaya zülmdədir, iztiraba dözmür, ona görə də dərdli-dərdli oxuyur, oxuduqca da nazilir, əriyə-əriyə yuxalır.

İnanmadılar, xana xəbər verməyə qaçdılar. Xan gəlib gördü ki, sal qaya yoxdur, elə bil qeybə çəkilib. Mat qaldı: - Zərrə qədər bir daş, bir qaya qırıntısı da qalmamışdı, oğlan bu yanda, qız da o yandaca oturmuşdu, gülümsünürdülər, üzlərinin nuru, gözlərinin şəfəqi qaranlıq zindanı işıqlandırmışdı, elə bil gecə ilə gündüz burda görüşmüşdü, birində Günəş, birində də Ay…

### *11. Qanlı qaya*

Poladlı kəndində Əli adlı bir bəy yaşayırmış. Əli bəyin gözünün ağı-qarası olan qızı Telli çox gözəl imiş. Əli bəyin öz çobanı Hilal bir könüldən min könülə Telliyə aşiq olur. Telli də öz könlünü Hilala verir, onu ürəkdən sevir.

Əli bəy bu işdən xəbər tutur. Hilalı qapısından qovur. Hilal çöllərə düşür, hündür bir qayanın başında yaşamağa başlayır. Əli bəy qızı başqa bir oğlana vermək istəyir. Qız bu xəbəri eşidir. Göz yaşı axıtmağa başlayır. Qız atasından xəbərsiz Hilalla görüşür. Əhvalatı ona danışır. Hər ikisi əl-ələ verib,

həmin uca qayanın başına qaçırlar. Əli bəy işdən xəbər tutan kimi, qoşun toplayıb qayanın dibinə yaxınlaşır. Qoşun həmləyə keçməmiş Əli bəy özü qayanın başına bir xəbərdarlıq oxu atır. Ox süzüb çobanın sinəsindən keçir. Çobanın sinəsindən qan axıb qayanın üstünə tökülür. Çoban ölür. Telli bu haqsızlığa dözmür. Qayanın başına çıxıb, yanıqlı bir bayatı çəkir:

***Əzizim, Qanlı qaya,***
***Daşları qanlı qaya.***
***Əlim xına tutmadı,***
***Yasa bat, Qanlı qaya.***

Bu sözləri deyib, qız özünü qayadan atır.

Elə həmin vaxtdan xalq o qayanı «Qanlı qaya» adlandırır.

### ***12. Təklə igidləri***

Deyirlər qədimlərdə Qobustan qışlaqları tərəfində əkiz qardaşlar yaşayırmış, hər ikisi boya-başa çatmış, adlı-sanlı ovçu olubmuş. Oxlarından bir quş, nizələrindən bir cüyür yayınmazmış. Qılınclarından bir yağı can qurtara bilməzmiş. Şöhrəti hər yana yayılan igidlərin qorxusundan bu yerlərə düşmən ayaq basa bilməzmiş.

Bir gün qardaşlardan biri qonşu obada adı dillərə düşmüş gözəl bir qıza vurulur. Hər gün Gözəl deyib, hay-haray çəkir, yanıqlı bayatılar deyirmiş. Gözəli görmək istəyirmiş. Amma qardaşından ayrıla bilmirmiş. Bir gün tablaşmır və qardaşına deyir:

- Qardaş, sən məni burada gözlə, gedim Gözəli görüm.

Qardaşı deyir:

- Axı düşmən getməyindən duyuq düşər, məni təkləyər.

- Can qardaş, canım qardaş, çoxdandı düşmən bu yerlərə ayaq basa bilmir. Qoy gedim, Gözəlimi görüm, qollarıma qüvvət, dizimə taqət gəlsin, bundan sonra daha basılmaz olarıq.

- İndi ki, gedirsən, gəl sənin təhər-tövrünü dəyişək, ayrı geyimdə get, səni görüb tanıyan olmasın.

O, başqa geyimdə sevgilisinin görüşünə getməyə razılaşmır, deyir:

***Salma heç şəklə məni,***
***Gəl mindir şəklə məni.***
***Gedib gözəli görrəm,***
***Gələrəm, bəklə[1] məni.***

Qardaş bir söz demir. Oğlan gedir. Yağı bu biri qardaşın yurdda tək qaldığından xəbər tutub, ona hücum çəkir. Oğlan oxu yağının üstünə yağış kimi yağdırır. Sağdan vurub, soldan çıxır, soldan vurub sağdan çıxır. Düşmənə meydan oxuyur:

***Əzizim Təklədənəm,***
***Tək öylü Təklədənəm;***
***Arasbar tərlanıyam,***
***Sonalar təklədənəm.***

Amma yağı çox, oğlan tək imiş. Qardaşı da gəlib çıxmırmış. Axırda düşmən güc gəlir. Qardaşı qılıncdan keçirirlər.

---

[1] Bəklə- gözlə.

Sonra da o biri aşiq qardaşın yolunu güdürlər, onun gəldiyini görəndə qəfil üstünə atılır, sevən ürəyini oxlayırlar.

Elə o vaxtdan bəri aşiq qardaşın düşdüyü yerdə binələnən kəndə «Təklə» deyirlər.

### *13. Göyəzəndə qızıl piyalə*

Kəsəmən xanının qızı Nabat oğlan kimi təlim almışdı. O, at çapmaqda, ox atmaqda heç də igidlərdən geri qalmırdı.

Nabat xeyli vaxt idi ki, əmisi oğlu Halaya nişanlanmışdı. Bir gün Halay ova gedir, geri qayıtmır. Nabat bərk təşvişə düşür, istəyir yaraqlanıb Halayı axtarmağa getsin. Amma atasından həya edir. Onun bir qızıl piyaləsi vardı. Çətin vəziyyətdə, dar ayaqda piyalə Nabatın harayına yetərdi, arzularını həqiqətə çevirərdi. Əlac yenə qızıl piyaləyə qalır. O öz piyaləsini su ilə doldurur, suya yalvarır ki, sən aydınlıqsan, Halayın taleyini aydın elə! Su ona deyir ki, sevgilisi Göyəzən dağında son nəfəsdədir.

Birdən birə qızılquş şığıyıb içi su ilə dolu qızıl piyaləni dimdiyinə alıb göyə qaldırır. Nabat qızılquşu buraxmır. Quş göylə, Nabat yerlə Göyəzən dağına çatırlar. O vaxta qədər heç kəs cəsarət edib Göyəzən dağına çıxmayıbmış. Bu mənzərəni görənlər deyirlər:

- İlk dəfə Göyəzənə qadın çıxdı. O daha Göyəzən deyil, Kuhi-zənəndi, yəni qadın dağıdır.

Nabat görür ki, bu dağın beli geniş düzəngahdır. Burada gül-gülü, çiçək-çiçəyi çağırır, olduqca səfalı yerdir.

Qızılquş əvvəl bir çəmənliyə enir, oradan da bir daşın üstə qonur. Nabat zirvədən baxanda görür ki, Halay bir az aşağıda al-qan içindədir. O, tez özünü Halaya yetirir, sağ qoluna sancılmış oxu çıxarır, üzünə qızıl piyalədəki suyu səpir, yaralı sinəsini və qolunu yaylığı ilə sarıyır.

Halay gözlərini açanda bərk təəccüblənir ki, Nabat bu dağa necə gəlib çıxıb?

Nabat danışır ki, onu buraya o daşın üstünə qonmuş qızılquş gətirmişdir. Halay da başına gələn sərgüzəşti açıb söyləyir. Deyir ki, dağın o biri üzündən buraya yol var. Bir ceyranı mənə tərəf gələn gördüm, onu nişan aldım, yayı çəkməmiş, qəfildən bir ox sinəmi yaralayıb sağ qoluma batdı. Sən demə bu ceyranı başqa bir ovçu da qovurmuş. Sonrasından xəbərim olmayıb.

Nabat onu sevgilisinə qovuşduran qızılquşa min-nətdarlıq etmək istəyir. Heç bir şeyə gücü çatmır. Qızıl piyaləni ona uzadır. Qızılquş qızıl piyaləni dimdiyinə götürür və insan əli çatmayan bir qayaya qonur. İki aşiqi vüsala çatdıran qızıl piyaləni dağın ən uca zirvəsinə qoyur. Piyalə günəşin altında bərq vurub, zülmətə düşmüş aşiqlərin yolunu işıqlandırır.

Belə deyirlər ki, hələ də qızıl piyalə Göyəzən dağının zirvəsindədir.

### *14. Saçlı qaya*

Qoşa, uzun, xurmayı hörükləri olan bir qız kimsəsiz olduğu üçün dilənçilik edirdi. Görənlər deyirdi:

- Bu qoşa hörükləri kəs mənə sat.
- Nə qəşəng hörükləri var!..

- Belə uzun saçı olan qız da dilənçilik edər?

Bu qızı kənd bəyi də görmüşdü. Amma şəninə sığışdırıb el içində qıza bir söz deyə bilməmişdi. Qızın gözəlliyi onu haldan çıxarmışdı.

Bəy elə fürsət axtarırdı ki, qızı təklikdə tutsun. Qız bu kənddən, o biri kəndə gedəndə atı dalınca sürdü. Kəndin arası xeyli uzaq və dərə-təpə idi. Qız gördü ki, ona yaxınlaşan atlı dünənki bəydir. Gözləri od olub yanır və onu tutmaq istəyir. Qız üzünü göyə tutub yalvardı:

- İlahi, yer yarılsın yerə girim. Namusum ləkələn-məsin.

Elə o an qayanın üstündə yer yarıldı, qız yerə girdi. Ancaq uzun, qoşa hörükləri bir nişanə kimi qayanın başında qaldı. İndi o saçı dönə-dönə kəssələr də, yenə də uzanır.

O vaxtdan bəri Mərəzə yaxınlığında bir qaya «Saçlı qaya» adlanır.

### *15. Gəlin qayası*

Burada bir qaya var, qıza bənzəyir. Bu haqda belə bir əfsanə var. Kasıb və mərd gəncin həyat yoldaşına varlı bir bəyin gözü düşür. Gəlini ələ keçirmək istəyir. Ancaq gəncin mərdliyindən, onun xalq arasındakı hörmətindən qorxan bəy bu işi açıq-aşkar etməyin mümkün olmadığını görür. Fürsət gözləyir. Taxıl biçini yaxınlaşdığını görən camaat çölə-zəmiyə gedir. Bu fürsətdən istifadə edən bəy gəlini ələ keçirmək istəyir. Bəyin hiyləsini başa düşən gənc və gözəl gəlin Allaha yalvarır ki, daşa dönmək daha yaxşıdır. Elə o vaxtdan gəlin daşa dönür.

Bu əfsanə ilə əlaqədar olaraq xalq arasında bir bayatı da yaranıb, «Gəlin qaya» əfsanəsi yada düşən kimi sinəsi sözlü, dili bayatılı nənələrimiz şirin zümzüməylə yanıqlı-yanıqlı bayatı çəkirlər:

***Əzizim gəlin yaşa,***
***Dolmamış gəlin yaşa;***
***Əğyarə əl verməyib***
***Dönübdü gəlin daşa.***

Həmin daşa xalq arasında «Gəlin qayası» deyirlər.

### *16. Gəlin qayıdan qaya*

Keçmiş zamanlarda bir kişi başqa bir kənddən oğluna gəlin gətirirmiş. Toy adamlarının yolu indiki «Gəlin qaya» deyilən yerdən keçirmiş. Toy adamları dincəlmək məqsədi ilə orada əylənirlər. Kənarda bir at ilxısı görünür. İlxının içində iki ala at varmış. Keçmiş adətə görə atın alalığı çirkinlik imiş. Bu səbəbdən ala at saxlamazmışlar. Ona görə də ilxının içində ala at olması onları maraqlandırır. Toyu olan oğlanın atası deyir ki, gərək mən bunun səbəbini öyrənəm. Bu ilxının sahibi niyə bu iki atı tələf eləmir.

İlxıçını çağırıb soruşub öyrənir ki, ilxı filan hacınındır. Hacının yanına gedirlər. Toyu olan oğlanın atası soruşur ki, ay Hacı, bu qədər atın içində bu iki çirkin rəngli atı saxlamaqda məqsədin nədir? Hacı belə nağıl edir ki, mən hələ çox kasıb idim, onda bircə atım var idi. Öz yaylağımızda at otarırdım. Birdən hardansa ala bir ayğır gəlib mənim atıma qoşuldu. Bir ildən sonra atım ala rəngli bir bala doğdu. Başqa atım olmadığından onu tələf etmədim.

Sonra atlarım çoxaldıqca həmin ala atları nə qədər satdım, bağışladım ki, bəlkə kökü kəsilə. Amma nə qədər tələf eləsəm də yenə üç ildən, beş ildən bir üzə çıxır.

Toyu olan oğlanın atası çox fikirləşir. Gəlinin adamlarını, ağsaqqalını, ağbirçəyini çağırıb el adətinə görə duza-çörəyə and verir ki, bu gəlinin nəslində, nəcabətində nə eybi varsa gərək deyəsiniz. Gəlinin adamları duza-çörəyə and içirlər ki, biz bu gəlinin nə atasında, nə qoca nənəsində bir eyib bilmirik. Amma eşitmişik ki, qoca nənəsinin anası bitərbiyə olub. Oğlanın atası bu sözlərdən sonra çox fikirləşir, çox götür-qoy edir. Deyir ki, filan Hacı əlli ildir ala atın cinsini kəsə bilmir. Yəqin ki, o şakər də mənim gəlinimin nəslində üzə çıxacaq. Mənim nəslimdə bitərbiyə olmayıb, mən bu gəlini elə buradan da geri qaytarmalıyam. Qız tərəfin adamlarını çağırıb məsəlini açır. Mən nə qədər əziyyət, xərc çəksəm də öz boynuma. Mənimki daha sizlə tutmaz. Beləliklə, həmin qayanın adı gəlin qaya yox, «Gəlin qayıdan qaya» adlanır. İndi də qocalar ona görə bu qayaya «Gəlin qaya» yox, «Gəlin qayıdan qaya» deyirlər.

### *17. Zəncirli qaya*

Xarxar kəndi yaxınlığında bir qaya var, adına «Zəncirli qaya» deyirlər.

Rəvayətə görə, bu kənddə bir oğlan varlı bir kişinin qızına aşiq olur. Qız da onu sevir. Ancaq valideynlərin birinin varlı, digərinin kasıb olması bu işə mane olur.

Oğlanın atası aylarla qız evinin qapısına ayaq döyür. Amma bunun faydası olmur. Qızla oğlan

sözləşərək qoşulub qaçırlar. Onları kəndin yaxınlığında tutub qol-qola zəncirləyirlər. Oğlan qorxur ki, onu öldürəcəklər. Özünü dartıb qayadan atır, zəncirlə onun qoluna bağlı olan qız da onunla birlikdə qayadan uçur və hər ikisi ölür. Elə o vaxtdan həmin qayanın adı «Zəncirli qaya» qalır.

### *18. Qum-qum daş*

Laçın rayonunun Ağoğlan kəndi yaxınlığında, Həkəri çayının Minkənddən gələn qolununun sahilində böyük bir daş var. Bu daş dağın döşündəki böyük qayadan qopub gəlmişdi. İndi də onun qopduğu yer bilinir. Deyirlər ki, el dağa köçən zaman gəlib o qayanın dibinə düşürmüşlər. Qayınana ilə gəlin sac asıb, çörək bişirən zaman möhkəm göy guruldayır. Bu zaman dağdakı böyük daşdan belə bir səs gəlir:

***Qum-qum daş,***
***Gəldim qaç.***

Bu zaman möhkəm yağış başlayır. O nəhəng daş isə qoparaq çaya yuvarlanır. Bir neçə adamı, heyvanı məhv edir. Deyirlər bu daş səslənən zaman bunu ancaq gəlin eşidir, gəlinə inanmırlar. Ona görə də vaxtında qaçmadığına görə kənd camaatı bu nəhəng daşdan xeyli ziyanlıq çəkir. Həmin daş indi də «Qum-qum» daş adlanır.

### *19. Kar daş*

«Üçtəpə» kəndinin yaxınlığında olan Quru Qobunun gizli sahəsində «Kar Daş» deyilən bir daş var.

Bu daşa sevgililər, ata, analarımız nəzir-niyaz verirdilər. Həmin daşın üstündə rəngbərəng parça qırığı, qanla yazılmış müxtəlif adlar var. «Kar Daş»ın üstündə o qədər şam yandırıblar ki, daş tamam hiss bağlayıb. Deyirlər, iki istəkli oğlanla qız var idi. Bunlar bir-birini çox sevirdilər. Elə bir vaxt gəlir ki, artıq onların on səkkiz-iyirmi yaşı tamam olur. Oğlanın ata-anası qız evinə elçi gedir. Qızın ata-anası qızı onlara vermir. Qız çox ağlayır, heç bir faydası olmur.

Bir gün qız gedib kar daşa nəzir-niyaz verir. O qədər ağlayır ki, daşın bir tərəfi göz yaşından əriyir. Nə isə, qızı verirlər başqasına. Oğlan gəlib daşa deyir ki, bütün diləklər hasil oldu, bizim diləyimizi niyə eşit-mədin? Oğlan elə oradaca ölür. O gündən həmin daşa «Kar Daş» deyirlər.

## *20. Oğlan-qız daş*

Guya oğlanla qız bir-birini dərin məhəbbətlə sevirmiş. Ancaq bu iki gəncin məhəbbətinə qarşı çıxanlar da az deyilmiş. Qızın atası razı olmur ki, qız istədiyi oğlana getsin. Odur ki, oğlanın elçilərinə rədd cavabı verir. Oğlan əlacsız qalır. Bilir ki, varlı ailədən olan bir qızı heç kəs ona verməz. Beləliklə, gizlincə qızla görüşəndə, ona qoşulub qaçmağı təklif edir. Qız da atasının məqsədini bilir. Bilir ki, atası onu başqa bəy oğluna vermək fikrindədi. Qız isə

həmin oğlanı istəmədiyi üçün sevdiyi oğlanla qoşulub qaçmağa həvəslə razı olur. Qız oğlana sübh tezdən camaat yuxudan durmamış gəlməyi tapşırır. Oğlan gedəndən sonra qız hazırlaşır, ata-anasını yuxuya verib həyətə enir və oğlanla qoşulub qaçmağa başlayır. Amma, deyəsən, gecənin qaranlığında da bunları görən varmış. Qızla oğlan kənddən bir az aralanan kimi oğlanı istəməyən bir avara cavan qızın atasına xəbər verir və hansı tərəfə getdiklərini bildirir. Qızın atası durur, qılıncını götürür və harda çatsa qızını da, oğlanı da öldürəcəyinə and içib onların arxasınca düşür. Bu iki gənc isə öz məhəb-bətlərinə qovuşacaqlarını zənn edirlər.

Təəssüf ki, şirin xəyal çox çəkmir. Qız təsadüfən geri dönəndə atasının dərənin aşağı tərəfindən gəldiyini görür. Oğlan da, qız da hər ikisi qabaq-qabağa durub kişiyə tamaşa edirlər: qız bilir ki, atası bunları öldürəcək. Odur ki, üzünü göylərə tutur və yalvarır: «Ay Allah, sən bizi bu Əzrailin əlindən qurtar və elə et ki, qanımız tökülməsin». Allah qızın yalvarışlarını eşidib, hər ikisini daşa döndərir. Kişi çatanda artıq qızının da, oğlanın da daş olduğunu görür. O vaxtdan həmin dərə «Oğlan-qız dərəsi» adlanır və hər ikisinin daş heykəlləri hal-hazırda durur.

## *21. Daş pəhləvan*

Günlərin bir günündə iki qonşu padşahın bir-biri ilə ixtilafı düşür. Padşahlardan birinin ölkəsində çoxlu yenilməz pəhləvanlar varmış. Ona görə də bütün dünyada olan padşahlar bu padşahın bir sözünü iki eləməyə qorxurlarmış. Həmin padşah qonşu padşaha qəzəblənir və ona bildirir ki,

pəhləvanlarını vuruş üçün onun ölkəsinə göndərir və deyir ki, əgər pəhləvanlarım qələbə qazansa, sən mənim tabeliyimə keçəcəksən. Qonşu padşah qorxuya düşür, gecə-gündüz fikirləşir, ölkəsində həmin pəhləvanların qarşısına çıxa bilən bir pəhləvan tapa bilmir.

Bir gün padşah həyətdə oturubmuş. Bir də görür bir qadın çiynində bir öküz dağa çıxır. Padşah bu işə məəttəl qalır. Səhəri gün eyni vaxtda padşah yenə görür ki, həmin qadın öküz çiynində yenə dağa çıxır. Padşah vəzirini yanına çağırır. Əhvalatı ona danışır və deyir ki, qonşu pəhləvanların qarşısına çıxası adam təkcə o qadın olar. Vəzir həmin qadının ərini yanına çağırır və deyir ki, padşah gecə-gündüz həyətdə oturub, sənin arvadının öküzü dağa çıxarmağına tamaşa edir, ona görə də sənin arvadının yenilməz qüvvə sahibi olduğunu bilib, üstümüzə gələn qonşu pəhləvanlarla vuruşmağa çıxmasını istəyir.

Kişi çox bikef olur, evə gəlib əhvalatı arvadına söyləyir. Qadın bir qədər fikrə gedir və ürəklə ərinə deyir ki, mən razıyam, günü sabahdan onlarla görüşə bilərəm. Beləliklə, padşah məclis düzəltdirir və qonşusuna bildirir ki, pəhləvanlarını göndərə bilər. Görüşdən əvvəl iki pəhləvan duz-çörək kəsmək üçün süfrəyə dəvət edilir. Qadın kişi libasında tez qabağa yeriyib oturur və oturmaq dəvəti ilə qonşu pəhləvanın qolunu bərk sıxır. Elə bu andaca pəhləvanın qolundan dəhşətli bir ağrı tutur. Yemək mərasimi bitdikdən sonra, pəhləvanların görüşmək vaxtı çatır. Qadın görür ki, pəhləvan sıxılmış qolunu heç tərpətmir. Dərhal başa düşür ki, onun halı yaxşı deyil. Ona görə də deyir ki, görüşü təxirə salaq,  pəhləvanınız bir az naxoşlayıb.

Gecə ikən qonşu pəhləvan qaçır və əhvalatı öz padşahlarına danışır. Padşah bu işə qəzəblənir və yenidən ən qüvvətli pəhləvanını döyüş meydanına göndərir.

Qadın yenə ilk görüşdə əl atıb pəhləvanın əlini bərk sıxır, pəhləvan elə oradaca huşunu itirir. Oyananda bir qədər fikirləşir, yer üzündə yaşadığı müddətdə belə bir qüvvətli pəhləvana rast gəlmədiyini, belə adda pəhləvan olmadığını düşünür və belə qərara gəlir ki, bu, olsa-olsa yalnız qadın olacaq. Gecə ikən onu güdür və görür ki, budur pəhləvan paltarını çıxartdı, gözəl bir qadın oldu.

Səhəri gün görüş başlanır, pəhləvan fürsəti əldən verməyib əlini qadının döşünə atır. Elə bu dəm pəhləvanın əli havada asılı qalır. Camaatın gözü qarşısında qadın, pəhləvan, bir də padşah daşa dönür. İndi o yerə «Daş pəhləvan» deyirlər.

### *22. Oğlan-qız daşı*

Babəkən dağının ətəyində yanaşı iki qırmızı daş var. Buna «Oğlan-qız» daşı deyirlər. Keçmiş zamanlarda bir kasıb oğlan varlı bir xanın qızını istəyir. Ancaq qızın atası qızı varlı bir oğlana vermək istəyir. Qız isə getmir və oğlana qoşulub qaçır. Xan bunların dalınca qoşun salır. Oğlanla qız görür ki, qoşun onlara çatır. Onlar isə Allaha yalvarır ki, ay Allah, ya bizi daş elə, ya da quş. Birinci dəfə daş dediyinə görə Allah onları daş edir. Xan gəlib bunların yanına çatır və qəzəbindən daşı qılıncla vurub iki yerə bölür. Onları birləşməyə qoymur.

### *23. Daş qız*

Bir kasıb ailə varmış. Bu ailənin başçısı naxırçı imiş. O, həmişə çölə heyvan apararmış. Bir gün o, meşəyə çörəksiz gedir. Anası qızına deyir ki, atana çörək apar. Qız çörəyi siniyə qoyub başına alır və atasının yanına gedir. O, qəbiristanlıqdan keçəndə üç cavan atlıya rast gəlir. Qız bu atlılardan qorxur. Ona görə də üzünü göyə tutub deyir: «Tanrı, məni daşa döndər, ancaq bunlar mənim namusuma toxunmasınlar». Bu vaxt qız daşa dönür. O, vaxtdan da ona «Daş qız» demişlər.

### *24.Çoban və daşa dönən sürü*

Topbağ kəndində bir çoban yaşayırdı. Həmin çoban qoyunları ilə birlikdə yaylağa köçməli olur. Yolda bir ziyarətgahın yanında gecələyir. Çoban burada ocaq qalayır və öz-özünə deyir:

- Əgər bura doğrudan da ziyarətgahsa, mən yaylaq-dan qayıdana kimi bu ocaq burada yana-yana qalsın. Qayıdarkən görsəm ki, burada ocaq qoyduğum kimi yanır, yeddi qurban kəsəcəyəm.

Səhər tezdən çoban qoyunları qabağına qatıb yoluna davam edir. Çoban yaylaqdan enərkən yolunu həmin ziyarətgahın yanından salır. Görür ki, yaylağa çıxarkən yandırdığı ocaq necə yandırmışdısa, elə də yana-yana durur. Bunu görən çoban təəccüb edir. Lakin, verdiyi sözə əməl etmir. Yoluna davam etmək istəyir. Bu zaman çobanın özü də, sürüsü də daşa dönür.

Həmin yer hal-hazırda da Topbağda durur.

## *25. Soltanbud*

Tayfa başçısı Tomralın Pəri adlı ağıllı, gözəl, at çapmaqda, ox atmaqda, qılınc oynatmaqda tayı-bərabəri olmayan bir qızı var idi.

Bir gün Soltan atasına Pərini sevdiyini bildirir və deyir:

- Ata, el adətidir, elçi get, Tomralın qızını mənə istə.

Atası deyir:

- Oğul, get deyirsən gedim, amma bu iş baş tutan deyil.

Soltan deyir:

- Ata, bu yolda öldü var, döndü yoxdu.

Qoca çarəsiz qalıb bir neçə adamla elçiliyə gedir. Elçilər yaxşı qarşılanır. Tomral deyir:

- Soltan elin igididir, hamımız onunla fəxr edirik. Amma Pərini qonşu tayfanın oğlu Bud da istəyir. Səbəbsiz onlara yox deyə bilmərik, araya dava düşər. Odur ki, mən belə məsləhət görürəm: şərt qoyaq, qızı istəyən adam «Sarıçala» deyilən yerdə torpaqdan dağ vursun. Bud da, Soltan da Pərini istədiyi üçün bu işə girişsin. Kim daha hünərli olsa, qız onunkudur.

Elçilər razılaşıb qayıdır. O biri tayfaya da xəbər verirlər.

Soltan və Bud Sarıçalada işə başlayır.

Hər iki tayfanın adamları gənclərin qurduqları dağlara baxmağa gedirlər. Görürlər ki, Soltan torpaqdan qurduğu uca dağın zirvəsində məğrur dayanır, Bud isə alçaq bir təpənin başında durur.

Tomral deyir:

- Ey igid Soltan! İş bununla bitmir, sən qılıncınla da vuruşub, hünərini göstərməlisən.

Soltan qonşu tayfanın qoşunu ilə üz-üzə gəlir. Soltan bir nərə çəkib yeri-göyü titrədir, qılıncını sıyırıb özünü qoşuna vurur, sağdan vurub soldan çıxır, soldan vurub sağdan çıxır. Bütün gecəni torpaq daşımış olsa da, yenə cəngavər kimi vuruşur. Birdən Budla qarşılaşır, bir qılıncla onun başını bədənindən ayırır.

Bunu görən tayfa başçısı qəzəblənir, qoşunun sayı-nı birə-iki qat artırır. Soltanı mühasirəyə alırlar. Bu zaman üzü niqablı bir atlı Soltana köməyə gəlib, qoşunu yarır. Birdən niqablı adamın atını vururlar. Soltan köməkçisinin niqabını qaldıranda, ay camallı Pərini al qan içində üzən görür. Soltan qılıncını öz sinəsinə dayayıb Pərinin yanına yıxılır.

Soltanı, Pərini, Budu torpaq dağlarının arasında dəfn edirlər. Dağlarınsa adı Böyük Soltanbud qalır.

## 26. *Dəyirman dağı*

Keçmiş zamanlarda Qurudərə kəndində dəyirman daşı düzəldən bir qoca yaşayırmış. Qoca usta öz peşəsini oğluna da öyrədibmiş. Ata ilə oğlu öz peşələrindən razı imişlər. Onların düzəltdikləri daşları yaxın və uzaq ellərdən gəlib baha qiymətə alıb aparırmışlar. Güzə-ranları yaxşı keçirmiş. Buna baxmayaraq, qoca usta həmişə kədərli görünərmiş. Usta xeyli işlər, yorulanda isə bir daşın üstündə oturar, bütün ətraf dağları gözdən keçirərmiş. Sonra da köks ötürər, könülsüz-könülsüz ayağa qalxar, əzgin-əzgin işə başlarmış. Qocanın bir niskili varmış. Öz kəndində dəyirman qurmaq üçün su tapmırmış…

Qoca bir gün işi oğluna tapşırıb, yaxın dağlardaë su axtarmağa gedir.

Çox gəzir, haldan-dildən düşür, su tapmır ki, tapmır. Qoca çınqıllı bir dağın yamacında yanı pöhrəli yaşıl göyrüş ağacı görür. Öz-özünə düşünür:

«Susuz ağac bitməz. Yəqin ki, onun dibindən su axır».

Qoca bu ümidlə göyrüşün yanına çıxır. Dincəlmək üçün ağacın dibində uzanır. Onu yuxu tutur. Qoca başının altından axan suyun şırıltısına ayılır. Cəld baş qoyduğu daşı güc-bəla ilə yerindən tərpədir. Görür ki, daşın altı ilə bir dəyirmanlıq su axır. Qoca qaça-qaça oğlunun yanına gəlib deyir:

- Oğul, qaç Qurudərə camaatına müjdə apar, de ki, dəyirman qurmaq üçün su tapdıq.

Oğlan deyir:

- Ata, əvvəl o sudan özümüz içib doyaq, sonra da, camaata xəbər verək.

Qoca razı olur.

Ata ilə oğul yaşıl göyrüşün yanına gəlirlər. Amma nə daşı tapırlar, nə də suyu.

Qoca dilxor halda göyrüşün dibini eşməyə başlayır. Yenə də suyu tapa bilmir. Hirs qocanın beyninə vurur, xəncəri siyirib ağacı kəsir. O gündən peşəsindən əl çəkir. Hər gün qapıda oturub Çınqıllı dağa baxır, yaşıl yarpaqlı göyrüşü zirvədə görmür. Qoca qəmdən, kədərdən saralır, axır ki, yatağa düşür. Bir gün oğlunu yanına çağırıb deyir:

- Oğlum, mən ölürəm. Sinəmdə dəyirman dağı, gözümdə yaşıl göyrüş. Günahsız ağacı nahaq kəsdim. Sən heç olmasa yaşıl pöhrəsini qoru. Qoy elimizdən kökü kəsilməsin. Gec-tez onun dibindən dirilik çeşməsi göz verəcəkdir.

İllər ötür, yaşıl pöhrə böyüyüb iri bir ağac olur. Adını «Təkgöyrüş» qoyurlar, onun bitdiyi dağa isə «Dəyirman dağı» deyirlər.

### *27 .Qaraçənli və Dəlidağ*

Varlı bir ailə Gözələ elçi gəlir, onu oğluna istəyir. Qızın atası bundan çox xoşhal olur, razılıq verir.

İşi belə görən Gözəl sevdiyi Buta adlı çobana qoşulub dağlara qaçır.

Varlı oğlan dəstə bağlayıb, Gözəllə Butanı tutmağa gedir. Biri deyir:

- Onları tutan kimi çoban Butanı qızın gözünün qabağında qayadan atacam.

O biri deyir:

- Onu qızın gözünün qabağında bu xəncərlə iki şaqqalayacam.

Onlar xeyli yol gedib, oğlanla qıza çatırlar. Bu dəm araya elə bir qara çən çökür ki, göz gözü görmür. Onlar cavanları itirirlər. Çən çəkiləndə görürlər ki, Gözəllə Buta bir dağın başında oturub şirin-şirin söhbət edir. Onlara yaxınlaşmaq isətəyəndə dağ silkələnir, göy şaqqıldayıb dolu tökür. Gözəllə Buta qayaların altına girib gizlənirlər. Onları izləyən dəstəni isə dolu qırıb tələf edir. Ölən ölür, sağ qalan qayıdıb geri qaçır.

«Nə, oldu tapdınızmı?» - deyib soruşanlara salamat qalanlar cavab verirlər:

- Tapdıq, amma Qaraçənli təpə, Dəlidağ onların tərəfində oldu. Bizi gah çənə basdırdılar, gah da doluya döydürdülər.

### *28. Sənan dağı*

Hər axşam yatmaq vaxtı obaya yanıqlı ney səsi yayılırdı. Ney bu axşam bir bayatını, sabah axşam da özgə bir bayatını oxuyurdu:

***Bu qala qaşlı qala,***
***Çınqıllı daşlı qala.***
***Qorxuram nakam öləm,***
***Yar gözü yaşlı qala.***

* * *

***Gülü biçdim oraqla,***
***Yerə sərdim fəraqla.***
***İtirmişəm Vəfamı,***
***Axtarıram soraqla.***

Elin ağsaqqalları baş-başa verdilər. Biri dedi, bu, nə neydir, nə tütəkdir, qəbiristanlığa enir, qəribləri, nakamları dirildir, onların səsini, avazını göylərə çəkir, yəqin, o bədbəxtlərin günahı da var.

Başqaları dedilər ki, yox, kamı gözlərində qalan-ların ruhlarıdır, axşamlar qəbiristanlığa qonur, ölülərin bu dünyada gördükləri əzabı dirilərə danışır.

Axırda ağsaqqalların baş bilicisi, baş buyruqçusu dindi. «Hər kimdirsə bu dərdə giriftar olan bir növcavandır, dərdi tüğyan edib, qəmini-qüssəsini yellərə verir».

Obanın nərbiləkli, şirürəkli oğullarından bir dəstə düzəltdilər, qəbiristanlığa yola saldılar.

Onlar getdikcə səs uzaqlaşdı. Elə bildilər ney çalan adam onların gözünə görünmək istəmir, qaçır.

Atlandılar. Yenə çata bilmədilər. Neyin səsi bircə anda kəsilmədi. Dağlardan aşa-aşa, dərələrdən keçə-keçə getdi.

Atlar qan-tərə batdı. Minicilər heydən düşdülər. Onlar atları qolbənd eləyib buraxdılar, bu səsdən əl çəkmədilər, piyada getdilər. Səhərin gözü açılanda bir dağa çatdılar. Dağın başı dümağ idi, qarla örtülmüşdü, sinəsində duman sürünürdü. Daşlıqlardan keçən çaylar köpüklənir, süd kimi ağarırdı. Bulaqlar da yanıqlı-yanıqlı oxuyurdu. Bu dumanın, çənin içində qeybə çəkilən adam elə bil öz səsini, öz tütəyinin naləsini, fəryadını bu bulaqlara tapşırmışdı. Bulaqlar hər bayatısının sonunda: «Məni sən an, sən an!» -deyirdi.

Cavanlar geri döndülər. Ağsaqqallara dedilər ki, nə neyi tapdıq, nə də ney çalanı. Bir dağ gördük, dağ oxuyurdu, özü də axırda bizi çağırırdı: «Sənan!»

### *29. Dağların ayrılığı*

Alvız ana sac asıb yuxa bişirmək istəyirmiş. Xəmiri kündələyib yığır, süfrəyə düzür, sacın qızmağını gözləyirmiş. Böyük oğlu Qoşqar, ortancıl oğlu Murov, kiçik oğlu Kəpəz də ocağın qırağında oturublarmış. Qabaqlarında da dələmə, ovma, yuxa bişdikcə bölüşdürüb isti-isti yeyəcəkmişlər.

Alvız ana ilk yuxanı sacın üstünə salan kimi Kəpəzin tərsliyi tutur:

- Bu yuxa təkcə mənimdir, -deyir, - heç birinizə verməyəcəm.

Murov:

- Yox, mənimdir,- deyir,- hər şeyin ilkini həmişə sən götürürsən, indi də mən.

Qoşqar onlara acıqlanır:

- İndi ki, belə oldu, heç biriniz ona əlinizi vura bilməzsiniz. Gözləyərik, üç yuxa bişər. Hərəmiz birini götürərik.

Qardaşlar höcətləşirlər, yuxa bişməmişdən bir-birinin yaxasını cırası olurlar. Alvız ana onlara nə qədər təpinirsə, kirimirlər. Kəpəzlə Murov dalaşmağa başlayır. Qoşqar onların arasında oturub, onları sakitləşdirmək istəyir. Ancaq Murov bir kösöv götürüb, Kəpəzin peysərinə endirir. Kəpəz bar-bar bağırır. Boynunu tuta-tuta qaçır.

Qoşqar Kəpəzi çox istəyirmiş, kiçik qardaşının şivəninə dözmür, qızmar sacı qaldırıb Murovun başına çırpır. Murov da çığıra-çığıra başqa səmtə üz tutur.

Alvızın üzü bozarır. Qoşqar döyüləcəyindən qorxub günbatana yüyürür.

Üç qardaşın hərəsi ayrılıb bir yanda qərar tutur. Alvız ana tək qalır. O vaxtdan bəri qardaşlar öz analarına, ana da öz oğullarına bax-baxa qocalmışlar. Hər bulaq, hər çay onların bir göz yaşıdır, onların bu həsrətləri, bu intizarları dənizlərdə, dəryalarda görüşür.

### *30. Siyah zənən*

Ana görürmüş  ki, oğlu hər səhər, özü də lap tezdən dərələrdən keçə-keçə, dağlardan aşa-aşa dərya kənarına gedir. Ac-susuz gedir, amma dünyanın hər naz-nemətindən yeyib-doymuş tox adamlar təki qayıdır. Üzündə nur, gözlərində işıq

gətirir, hər gün bir az da gözəlləşir, bir az da göyçəkləşir.

Ana bu sirdən agah olmaq üçün bir səhər oğluna ara verə-verə onun dalınca gedir. Dərya kənarına yaxınlaşdıqca onu ətirli meh vurur, bülbül nəğmələri eşidir, göylərdə göy göyərçinlərin ağ qağayılarla çıxartdığı minbir oyunu görür. Görür ki, burada dəryanın kənarı yamyaşıldır, gül gülü çağırır, çiçək çiçəyi, bülbüllər oynayır, oxuyur. Görür ki, bu yaşıllıqda bir bulaq qaynayır, suyu da göylər kimi yamyaşıldır. Bulağın suyu mahnı oxuyur. Oğlu bulağın başında bir qızla üz-üzə, diz-dizə oturub. Qızın ağ qanada oxşar əlləri oğlunun əllərindədir, çəhrayı darayıdan paltarı, çəhrayı kəlağayısı var. Qızın gözləri gömgöydür, qırmızı laləyə bənzər hər yanağında qara xalı var.

Elə bu vaxt ağ ilanla bir qara ilan sürünə-sürünə bulağın başına gəldi, bir-birinə sarmaşdılar. Qız ilanları görüb, səksəndi, əllərini oğlanın əllərindən çəkdi.

Qız:

- Dəymə,-dedi,-onlar da sevişirlər.

Oğlan sözə baxmadı. Qalxıb ilanları öldürmək istədi. Qara ilan onun niyyətini başa düşüb, ağ ilandan aralanıb oğlanı çaldı, oğlan qapqara qaralıb daşa döndü.

Ana bu dərdə dözmədi; tüstüsü təpəsindən çıxa-çıxa kösöv kimi yanıb-yaxıldı. O vaxtdan ananı «Siyah zənən» -«qara arvad» çağırdılar. Guya indiki Siyəzən o ananın kösövə döndüyü yerdə binə tutmuşdur.

## *31. Ağrı dağı*

Əfsanəyə görə Ağrı və Qarnıyarıq dağları əvvəllər iki qardaş idi. Ağrı dağı böyük, Qarnıyarıq dağı isə kiçik qardaş olmuşdur. Qoçaq, mərifətli, olduqca istiqanlı olan kiçik qardaş böyük qardaşı çox istəyirmiş. Onun yolunda ölümə getməyə hazırmış. Böyük qardaş isə həmişə kiçiyə soyuq münasibət bəsləyirmiş.

Bir gün kiçik qardaş gözəl bir qıza vurulur. Qız da onu sevir. Kiçik qardaş adətən böyükdən məsləhət almamış bir iş görməzmiş. Bu dəfə də belə edir. Ancaq böyük qardaş kiçiyin sevgilisini görən kimi ona vurulur, açıb-ağarda bilmir. Arzusuna çatmaq üçün yollar axtarır.

Hamı kiçik qardaşın xətrini istədiyi halda, böyük qardaş düşmənli idi. Günlərin birində qardaşlar eşidirlər ki, düşmən qonşu kənddə gizlənib, böyük qardaşı öldürmək üçün məqam axtarır. Kiçik qardaş böyüyün yalançı etirazına baxmayaraq, düşmən qabağına özü çıxır. Kiçik qardaşı düşmən qabağına yola salan kimi böyük qardaş onun sevgilisini götürüb qaçır.

Kiçik qardaş düşmənlə döyüşdə qalib gəlir, qardaşının intiqamını alır. Sevinə-sevinə özünü kəndə çatdırır. Çox gözləyir, çox axtarır, nə qardaşını, nə də sevgilisini tapa bilir. Axırda camaat dözməyib bu ağır xəbəri kiçik qardaşa deyirlər. Bu qara xəbər onu sarsıdır. İllərlə sinəsində bəslədiyi sevgi, məhəbbət ürəyinə sığmır, qeyzindən dərya kimi çalxalanıb tüğyana gəlir. Kiçik qardaşın sinəsi yarılır və dağa çevrilir. Dağın orta hissəsi yarıq olduğundan bu dağa Qarnıyarıq adı verilir. O gündən hamı Qarnıyarıq dağını ziyarətə gəlir.

Bu xəbər böyük qardaşa çatır. Kiçik qardaşın ölümündən sonra dünya ona dar görünür. Onun

ürəyində dəhşətli ağrılar baş qaldırır. O da dağa çevrilir. Böyük qardaşın ürəyi ağrıdığı üçün bu dağa Ağrı dağı adı verilir. Böyük qardaş kiçik qardaşa soyuq münasibət bəslədiyindən Ağrı dağının başında bütün fəsillərdə qar olur.

### *32. Ana Ağrı dağı, Bala Ağrı dağı*

Bir çoban öz ağasının qızı Bəstini sevirdi. Onlar bir-birinin divanəsiydi. Bunu hamı bilirdi. Hər gün çoban öz sürüsünü Ağrı dağının ətəyində, göy çəmənlikdə otarırdı. Çoban sürüsünü bir gün Ana Ağrı dağına, bir gün də Bala Ağrı dağına aparardı.

Çoban yan tütəyini odlu dodaqlarına dirəyib yanıqlı nəğmələri, bayatıları ilə Bəstini çağırırdı.

Nəhayət, bu xəbər qızın atasına çatır. Xan çox qəzəblənir. O, dərhal öz adamlarına tapşırır ki, çobanı harda tutsanız orda doğrayın. Xanın adamları çobanın arxasınca düşürlər.

Çoban gah Ana Ağrı dağına, gah da Bala Ağrı dağına pənah aparır, onlardan sığınacaq istəyir. Lakin dağların başı öz şöhrət davalarına qarışmışdı. Onlar biri o birindən uca olması barədə qərinələrdən bəri müba-hisə edirdilər. Odur ki, çobanın hayını-harayını eşit-mədilər. Çoban görür ki, dağlar ayılana kimi nökərlər onu tutacaqlar. O, göylərə yalvarır ki, cəlladların əlində ölməkdənsə, onu daşa döndərsin. Elə həmin dəqiqə çoban sürüsü ilə bərabər daşa dönür.

Bu günə qədər daşa dönmüş çoban və sürüləri Ağrı dağının ətəyində qalmaqdadır.

Deyirlər başları şöhrət davasından ayazıyan dağlar görürlər ki, daha qayalarında çobanın yanıqlı bayatıları əks-səda vermir. Çobanın sürüsü ilə daşa

döndüyünü bildikdə bir-birinə acıqlanıb qarğış edirlər. Bala Ağrı Ana Ağrıya qarğış edir ki, görüm sənin başından duman-çən əksik olmasın. Ana Ağrı dağı isə Bala Ağrıya deyir ki, sənin də başında ilanlar məskən salsın.

Elə həmin vaxtdan Ana Ağrı dağının başından dumanlar-çənlər, Bala Ağrı dağının başından isə ilanlar əskik olmur.

### *33. Qırmızı dağda quşların söhbəti*

Şahın qoşunu böyük qənimətlə, qızıl yüklü dəvələrlə geri qayıdırmış. Qarşıda qalın meşəsilə, buz kimi sərin bulaqları ilə məşhur olan Yaşıl dağ dururdu. Bu dağ qarət olunmuş torpağın sonuncu dağı idi. Aşırımı keçəndən sonra karvan üçün heç bir təhlükə ola bil-məzdi. Dağın mənzərəsi qoşun başçısının çox xoşuna gəlir. Əmr edir ki, Yaşıl dağın yaşıl ətəyində kef məclisi qurulsun. Əmr dərhal yerinə yetirilir. Qoşun yeyib-içib nəşələnir. Sərkərdə ətrafa boylanıb ucadan deyir:

- Sən də şahid ol, ay Yaşıl dağ! Bu yerlərin iyidini, gözəlini, qocasını, körpəsini qılıncdan keçirib sərvətini əllərindən aldıq. İndi bu karvanı sənin belindən aşırıb aparıb evimizdə rahat yeyəcəyik.

Sərkərdənin sözü ağzından qurtarmamış Yaşıl dağın qaşqabağı tutulur, bir tufan, yağış başlayır, gəl görəsən, göy guruldayır, ildırım qarşıdakı qayanın parasını çapıb aparır.

Qoşun batır. Sağ qalanlar xəzinəni Yaşıl dağda gizlədirlər. Bir də görürlər ki, Yaşıl dağın yaşıllığından əsər-əlamət qalmayıb. Daş da, torpaq da, ağac da, çəmən də qıpqırmızıdır. Onlar qorxudan qaçıb dağılırlar.

İllər keçir, xəzinənin yeri unudulur. Ancaq haqqındakı söz-söhbətlər unudulmur.

Ovçu Pirim görür ki, Qırmızı dağda yaman çox quş var. Gizlənib onlara qulaq asır. Quşlardan biri deyir:

- Şahın o itən xəzinəsi, bax, bu Qırmızı dağdadır. Onun yerini bu yaxınlıqda yaşayan qoca bayquş daha dürüst bilir.

Quşların padşahı bir neçə quş göndərib qoca bayquşu çağırtdırır.

Qoca bayquş deyir:

- Şahın qırx cavahirat yüklü dəvəsi, yeddi yüz qoşunu bu dağda çovğuna düşüb məhv olub. Elə o vaxtdan bu dağın torpağı da, daşı da, otu da qırmızıdır. Ona görə ki, qoynunda cavahirat yatan bu yer insan qanı ilə suvarılıb.

Quşlar bu söhbətdən sonra uçub gedirlər.

Ovçu Pirim də gizləndiyi yerdən çıxır. Elə o vaxtdan o dağın adı Qırmızı dağ qalır.

### *34. Yanardağ əfsanəsi*

Qamo adlı bir gənc var imiş. Bu gənc bir gözəl qızı sevirmiş. Gecə də, gündüz də onun xəyalı ilə yaşayırmış. Çiçəklərdə onun yanağını, quşlarda səsini, uca sərvlərdə qamətini, ipək tellərdə zərifliyini və möhkəmliyini görərmiş. Qızın xəyalı onun yeganə sirdaşı imiş. Xəyalla danışar, küsüşər, barışarmış. Çünki qız sınaqdan çıxmayan oğlana könül vermirmiş.

Bir dəfə bərk qış olur. Oğlan yol gedirmiş. O, əslində hara, nəyə getdiyini bilmirmiş. Birdən qarşısında sevdiyi qızın özünü görür. Heç birinin tərpənməyə taqəti olmur. Özlərinə gəldikdən sonra

şirin söhbət edə-edə yaxındakı dağa doğru yol alırlar. Oğlan xəyalı həqiqətə çevirmək istəyir. Ürəyini qıza açır.

Oğlanı eşqin alovu bürüyür. Qamo dərindən bir ah çəkir, ağzından torpağa qığılcım düşür, qəribə, sirli bir atəşlə alovlanır. Qarı əridir, torpaqdan tüstüsüz, rəngarəng alov qalxır. Qız bunun səbəbini soruşur:

- Bu nədir belə?

Qamo deyir:

- Bu sənə olan sevgimin, məhəbbətimin gücüdür, belə alovlanır.

Qız inanmaq istəmir:

- Xeyr, bu adicə oddur.

Qamo qızın sözlərindən daha da alovlanır. Yenə ah çəkir, yenə ağzından od saçır.

- Odu oddan seçməyi bacar, mələyim!

Qız alova diqqət yetirir. Görür dağın döşündə şölə saçan bu alov heç yeri yandırıb yaxmır, nə gülə-çiçəyə, nə də yamyaşıl çəmənə ziyan verir. Əksinə, alovun yanından bir şiv qalxır. Az vaxt içində qollu-budaqlı nəhəng bir ağaca çevrilir. Bu ağac ilin dörd fəslində yamyaşıl olur, onun yarpaqları sarı rəngi tanımır. Ağac bütün qidasını, işığını, havasını, suyunu alovdan alır. Bundan sonra inanır ki, bu od eşq, məhəbbət odudur. O, ancaq həyat verə bilər. Qız buna əmin olduqdan sonra qəlbini oğlana verir.

## 35. *Keyti dağı*

Qədim zamanlarda yay-ox işlətməkdə mahir olan Keyti və Mehdi adlı iki qardaş var imiş. Onların

atdığı ox boşa getməzmiş. Özləri də maral ovlayarmışlar.

Bir gün Mehdi deyir:

- Gəl ova bir yerdə getməyək, görək kim çox ov eləyir. Keyti razılaşır. Hərəsi dağın bir tərəfindən düşür. Keyti bir maral vurur. Tez maralın dərisini soyub əyninə geyir və gəlib bərədə maralın yatdığı qayada uzanır. O, belə edir ki, marallar ondan qaçmasın. Maral dərisi  geymiş Keytini yuxu tutur. Marığa yatan Mehdi təpədə uyumuş marala ox atır. Sonra görür ki, oxla vurduğu qardaşıdır. Mehdi özünü öldürür. Elə o vaxtdan Zar kəndinin üstündəki dağa Keyti dağı deyirlər.

**İ k i n c i   ə f s a n ə:** Bir gün Keyti və Mehdi adlı qardaşlar ova çıxırlar. Bu dəfə məqsədləri nə ceyran, nə cüyür, nə maral, nə də quş vurmaq deyildi. İndiyə kimi bu yerlərdə görünməyən iki ayı ətraf meşədə peyda olmuşdu. Boz ayılar camaatın mal-qarasına çox ziyan vurub tez də aradan çıxırdılar. Maralın məhşur ovçuları ayıların izinə düşmüş, ancaq tapa bilməmişdilər. Keyti və Mehdi qərara gəlmişdilər ki, necə olursa-olsun mal-qaranın canını ayılardan qurtarsınlar. Qardaşlar çox gəzib, çox dolanırlar. Susuzluq və yorğunluq onları əldən salır. Kiçik qardaş Mehdi su axtarmağa gedir. Keyti isə oturub onu gözləyir.

Bir də görür budu, ayılar donquldana-donquldana ona doğru gəlirlər. O, fürsəti fövtə vermədən oxla ayıların birini yıxır. Keyti yorulduğundan qaçan ayını təqib edə bilmir. Fıkırləşir ki, ölən ayını soyub dərisini geyər, ayı kimi səs çıxarıb, ayı kimi yeriyər, yaxşıca «tələ» qurar. O biri ayı da yoldaşının sağ olduğunu güman edib ona doğru gələr. Bu zaman ovçu ikinci ayını da vurar.

Keyti dediyi kimi də eləyir. Elə bu ara Mehdi su tapıb gətirir. Baxıb görür ki, ayının biri onun üstünə gəlir. Tez nişan alıb onu vurur. Keyti çığırıb özünü tanıtmaq istəyir. Lakin artıq iş-işdən keçmişdi. Mehdi qardaşını ayı bilib ona ox atmışdı. O, bundan dəhşətə gəlir, ancaq nə fayda, olan olmuşdu. Mehdi buna dözə bilmir. Qardaşının meyitinin üzərində göz yaşı tökür, sonra oxu öz sinəsinə sıxır. İki qardaş ikisi də ölür.

Bu hadisəni eşidən el-oba yığışıb gəlir. Keyti ilə Mehdini həmin dağın zirvəsində dəfn edirlər, el-oba onlara yas tutur.

Elə həmin vaxtdan bu dağın adını Keyti qoyurlar.

### *36. Qoşa qardaş dağı*

İrmaşlıda aqil bir qoca yaşayırmış. Qocanın iki oğlu var imiş. O, oğlanlarını yanına çağırıb deyir:

-Dünya ölüm-itim dünyasıdır, görürəm, ömrümün son günlərini yaşayıram. Əkin yerimi, yaylaqlarımı, dağlarımı öz sağlığımda ikinizin arasında tən bölüb arxayın ölmək istəyirəm. Dünya malı şirin şeydir, məndən sonra aranızda dava-şava olmasın.

Oğlanlar:

- Yox, ata, biz qardaşların arasında var-dövlət üstə, torpaq üstə söz-söhbət ola bilməz.

Qoca dünya ilə vidalaşır.

Qardaşlar bir müddət mehriban yaşayırlar. Vaxt gəlir qardaşlar ata varını, ata yurdunu bölməli olurlar. Hər şeyi rahat bölürlər. Ancaq torpaq bölgüsü gəldikdə qardaşlar arasında narazılıq düşür. Turan deyir:

- Ağ çayı, Göy yurdu, Sarı yalı, Daşbulağı sənə verməərəm.

Həzaran da deyir:

- İncillini, İrmaşlı dağlarını sənə verməərəm.

Qardaşlar dalaşırlar. Kiçik qardaş xəncərlə böyük qardaşın qarnını yarır, atı minib getmək istəyərkən böyük qardaş bir əli ilə qarnını tutur, o biri əlindəki xəncərlə ehtiyatsız tərpənən kiçik qardaşın başını kəsir.

Elə oradaca iki qardaş bu vəziyyətdə dağa çevrililər. O vaxtdan bu qoşa qardaş dağların birinə «Qarnıyarıq», o birinə isə «Başıkəsik» deyirlər.

## *37. Beşikli dağ*

Uca bir dağın başında kiçik bir qəbilə yaşayırdı. Aylı bir axşam idi. Çoban öz çomağına söykənib qarşısında otlayan sürüsünə baxır. Bozdar onun ayaqları altında xoşallanır. Beli yəhərli kəhər at isə çəmənlikdə otlayırdı.

Qəbilə üzvlərinin hamısı yatmışdı. Təkcə bunlar, bir də beşik başında bir ana oyaq qalmışdı.

Ana ayın işığında çoxlu qaraltı görür. Diksinir. Diqqətlə baxdıqda görür ki, qəbiləyə düşmən qoşunu gəlir. Ana həyəcanlanır. O, qorxur ki, qanlı müharibə, döyüş-dava onu öz körpəsindən ayıra. Ana əlçatmaz göylərdən kömək diləyir:

- Ayırıb öldürməkdənsə bizi bir yerdə daş elə!

Qəbilə yatmış vəziyyətdə, çoban sürüsüylə, kəhər at yəhərli otladığı yerdə, ana beşik başında daşa dönür. Uzaqdan uşağın beşiyi daha aydın göründüyü üçün bu dağa «Beşikli dağ» deyirlər.

## *38. İncəbel*

Köçəri elatlar yaylağa qalxırmışlar. Bir kasıb kişinin gözəl bir qızı var imiş. Bu qız zərif əndamlı, incəbelli bir gözəl imiş. Hamı ona İncəbel deyərmiş. Qızın Kəmaləddin adlı sevgilisi varmış.

El yaylağa qalxanda Kəmaləddin İncəbeli götürüb qaçır. Bunlar dağın üstündə bir dəstə quldura rast gəlirlər. Quldurlar Kəmaləddini tutub sicimlə bir ağaca bağlayıb, qızı onun əlindən alırlar. Qız nə qədər ağlayıb yalvarırsa, ona qulaq asan olmur. Qızı quldurun birinin tərkinə mindirirlər. Qız görür ki, əli hər yerdən üzülür. Odur ki, ucadan ağlayıb deyir:

***Su gəldi arxa, haray,***
***Töküldü arxa, haray.***
***Yağı məni aparır,***
***Çağırram arxa haray!***

Kəmaləddin qızın səsini eşidir, ha güc vurur, sicimi qıra bilmir, əlacı kəsilir, ucadan deyir:

***Əzizinəm, başa mən,***
***Kirpiyə mən, qaşa mən.***
***Yarım əlimdən getdi,***
***Nöş dönmədim daşa mən?***

Elə bu bayatını deyən kimi oğlan dönüb dağ olur. İncəbel bir də baxıb görür ki, bəs oğlanın yerində bir dağ əmələ gəldi. O saat başa düşüb deyir:

- İlahi, məni yarımdan ayırma. O necə, mən də elə. Bunu deyən kimi, İncəbel torpaq olub atın belindən yerə tökülür, dərəni doldurur.

O vaxtdan həmin dağa Kəmaləddin, ona yaxın olan yastanaya isə İncəbel deyirlər.

## *39. Ocaq dağı*

İlin bütün fəsillərində  bu dağın başı dumanlı olur. Elə bil ki, kim isə başında ocaq qalayıbdır, onun tüstüsüdür göyə qalxır. Deyirlər vaxtilə bir gözəl qız və bir gözəl oğlan bir-birinə könül verib bu dağa qalxır, yad nəzərlərdən uzaq olmaq üçün bu səssiz guşəyə çəkilərmişlər. Bir gün qızın ata-anası bundan xəbər tutub oğlanla görüşməyi qızlarına qadağan edirlər.

Tezliklə onu başqa varlı bir oğlana ərə verirlər. Bunu bilən oğlan göz yaşı tökür. Hicrana, ayrılığa dözməyib, yenə də sevgisinin şahidi olan dağlara çəkilir. Oğlan bir od olub yanır. Ancaq ocaq keçmir ki, keçmir, hey tüstülənir. Bu yerin sakinləri ocağın yerini indi də axtarır, tapa bilmirlər.

## *40. Xanım tala əfsanəsi*

Keçmiş zamanlarda Axarca yaylağındakı Xanım talada bir varlı qadın yaşayırmış. Bu qadının bir oğlu var imiş. Bu oğlan çox igid, vurub-tutan imiş. Bir də xəbər çıxır ki, Ləzgi şahı dəstəsi ilə gəlir. Ləzgi şahının qəfil gəlişi qadını çaşdırmır. Bu igid qadın da öz qoşununu döyüşə hazırlayır. Yaxşı silahlanmış saysız-hesabsız ləzgi qoşunu talanı

mühasirəyə alır. Qadın ləzgi şahının fıkrini başa düşür. Torpağı, el-obanı qorumaq üçün vuruşa girməkdən başqa çarə qalmır. Döyüş başlanır. Hər iki tərəf böyük tələfat verir. Qan su yerinə axır. Şah qoşununun qat-qat çoxluğu öz işini görür. Qadının qoşunu dağılır. Ləzgi şahı qadını əsir alır. Lakin onun igid oğlunu tuta bilmir. Qadın son anda oğluna deyir:

- Oğul, igidləri başına topla, meşənin sıx yerinə çəkil, vətənə xilaskar ol.

Bundan sonra şahın qoşunu Aşağı-Pəyə dərəsində olan tayfaların üstünə hücum çəkir və onları qırır, qənimət götürür və yenidən yuxarıya-Axarcaya qalxır.

Qadının oğlu öz dəstəsi ilə pusqu qurur. Şah tələyə düşür. Sınığın yanından keçəndə ləzgi şahına ox dəyir. Şah özünü saxlaya bilmir, gümüş yəhərli atdan yıxılır. Gözlənilməz atəş hamını çaş-baş salır. Qoşun qisasçıları tutmaq üçün meşəyə dağılır. Yaralı şahdan amansız bir yanğı baş qaldırır. O, atəşini söndürmək üçün aşağı Xanımcan bulağına enir və su içir. Su içən kimi də ölür.

Qoşun oğlanın dəstəsini tuta bilmir, əksinə xeyli təlafat verib geri dönür. Vurulmuş şahı axtarırlar. Şahın meyidini bulağın başında tapırlar. Onlar ləzgi şahının meyidini götürüb talaya çıxırlar və gümüş yəhəri ilə birlikdə orada basdırırlar. Qadın isə hələ əsir düşərkən özünü öldürmüşdü. Onu da həmin talada dəfn edirlər. Qadının adı Xanım imiş. Ona görə də həmin yer «Xanım tala» adlanır.

### *41. Kürsəngi dağı*

Deyilənə görə qədim zamanlarda Kür adlı bir oğlan anası ilə birgə yaşayırmış. Onların yeri o

qədər susuzluq imiş ki, burada zəhərli ilanlardan başqa heyvan, yovşandan, qara tikandan başqa ot bitmirmiş. Kür hər gün gündüzlər işləyir, əkdiyi bir parça yeri öz alın təri ilə sulayırmış. Hər gecə, sərin düşəndə isə gəlib uzaqdan axan bir çaydan anası üçün su aparırmış.

Bir gün Kürün anası xəstələnir. Evdə nə bir qaşıq su olur, nə də yeməyə bir tikə çörək. Kür səhəngi götürüb yola düzəlir. İlan mələyən düzlərdən keçir, susuz kolluqlardan ötür, gəlir, kənarları qayalıq olan bir çaya çatır. O, ancaq indi yadına salır ki, anası üç gündür susuzdur. Axı o, üç gün yol gəlmişdi. Kür tez suya tərəf cumur. Özünü qayadan çaya atır. Sən demə, çay çox dərin, özü də iti axan bir çay imiş. Kürün səhəngini su aparır. Özü də güclə dayanır. Amma o necə olur-olsun anasına su aparmalı idi.

Kür özünü suya atır. Nəhayət Kür yorulur. Deyirlər, dalğalar səhəngi və Kürü daşlara çırpır, hər ikisi sahilə düşür. Amma artıq gec idi. Kürün nəfəsi kəsilmişdi. Onun üzündə bir kədər oxunurdu.

Sanki o, anasına su apara bilmədiyi üçün xəcalət çəkirdi. Çay tutduğu işdən peşman olub təlatümə gəlir, çağlayıb sahilini aşır, hətta Kürün xəstə anasının da daxmasına gəlir. Qarı sudan içib şəfa tapır.

Külək də Kürə olan məhəbbətinin izharı kimi, bütün külək nəslini başına yığır. İgid Kürün məzarını qumla, torpaqla örtür.

Kürün üstündə bir təpə ucalır. Təpənin kənarları da su. Düzənlərin yeganə heyvanı olan ilanlar isə suyun içindəki təpənin üstünə pənah gətirirlər, təpə ilanların məskəninə çevrilir. İllər keçir. Kür ilə səhənginin üstündə uca təpə böyüyür, bir

dağa çevrilir –Kürsəngi dağına. Sonralar buralara adamlar köçür. Yurd-məskən salırlar.

Belə deyirlər ki, ilan bir adamı vuran kimi, tez həmin dağa qaçır. Əgər ilan vuran adam həmin dağa ilandan gec gələrsə, onda xəstə sağalmaz. Əgər xəstə tez çatsa, mütləq sağalmalıdır. Bu da onunla əlaqədardır ki, guya şəfanı onlara Kür verir. Kürün məzarına kim daha tez çatıb ziyarət etsə, Kür ona şəfa verir.

## *42. Şah dağı*

Şah dağı çox şeylər görmüş, çox şeylərin şahidi olmuş başı bəlalı dağdır. Deyilənə görə, keçmişdə həmin Şah dağının başında bir şah öz ailəsi və adamları ilə yaşayırmış. Demək olar ki, burada kiçik bir kənd yaranıbmış.

Şahın ailəsi üç nəfərdən ibarət idi. Arvadı, oğlu və özü. Onun oğlu on səkkiz-on doqquz yaşlarında olardı. Şah öz oğlunu nəcib və ağıllı böyütmüşdü.

Deyirlər ki, oğlan yatır, yuxuda yeddi gecəlik ay parçası kimi bir qız görür. Bir könüldən min könülə qıza aşiq olur. Oğlan yuxudan durub hazırlaşmağa başlayır. Atası oğlundan soruşur ki, oğlum hara hazırlaşırsan? Oğlu yuxuda gördüyünü atasına danışır. Vəzirlər, vəkillər, anası, atası nə qədər deyirlər ki, getmə, yalvarırlar, yaxarırlar bir şey çıxmır. Xülasə, oğlan ata-anası ilə sağollaşıb yola çıxır. Qırx gün, qırx gecə yol gedir. Bu şəhər mənim, bu kənd sənin axtarır. Axır ki, vilayətlərin birində qızı tapır. Qız da oğlanı görən kimi vurulur: bir könüldən, min könülə aşiq olur oğlana. Ancaq qız həmin vilayətin padşahının oğluna nişanlı idi.

Oğlanla qız bir-biri ilə tanış olur, sonra isə qız əhvalatı oğlana danışır. Oğlan deyir ki, eybi yoxdu, mən səni qaçıraram. Oğlan elə həmin gün qızı götürüb, həmin vilayətdən çıxmaq istəyir. Ancaq vilayətdən çıxhaçıxda padşah və onun vəzir-vəkili xəbər tutur. Qoşun toplayıb düşürlər bunların dalınca. Oğlan bu çaydan, o dənizdən, bu vilayətdən, o vilayətdən keçərək çatır atasının torpağına. Amma qoşun bunların dalınca irəliləyir. Oğlan ata-anası ilə görüşür. Qızı onlara tapşırıb, uca bir dağın başına çıxır ki, görsün qoşun gəlirmi. Artıq qoşun gəlib çatmışdı. Qızın nişanlısı isə lap qabaqda qoşuna yol göstərir, həm də başçılıq edə-edə gəlirdi. Oğlan başlayır gələn qoşunu oxa tutmağa. Bir neçəsi ölür. Nəhayət, qızın nişanlısı oğlanı görür. Yerindəcə durub oğlanı nişan alır və oxu çəkir. Ox oğlanın ürəyinin başından dəyir. Qanı yaşıl otları al-qırmızı rəngə boyayır.

Qızın nişanlısı heç kəsin xəbəri olmadan içəri girib bir ox da qızın ürəyinə sancır.

Oğlanın ölüm xəbəri ata-anasına gec çatır. Artıq oğlan ölmüşdü. Elə həmin gündən o dağın adı «Şah dağı» qalır.

### *43. Ləlvar dağı*

Belə rəvayət edirlər ki, qədimdə bir dağ varmış. Bir gün bir kişi yuxusunda görür ki, həmin dağda oyuq var. O, oyuqda ləl, qızıl, cəvahirat var. Kişi səhər durur, yol tədarükü görüb dağa tərəf gedir. Gedib həmin oyuğa rast gəlir. Görür ki, mağaranın qabağında bir əjdaha yatır. Əjdaha kişinin fikrini başa düşür ki, onun ləllərini aparmağa gəlib. Əjdaha dilə gəlib:

-Ey insan, sən burda ləl olduğunu heç kimə demə, hər gün gəl, sənə bir ləl verəcəyəm, - deyir və ləlin birini ona verir.

Tamah kişiyə güc gəlir. O, evə qayıdıb əhvalatı qardaşına danışır. Kişi ilə qardaşı silah götürüb mağaraya gedirlər. Əjdaha bunları görüb fikirlərini başa düşür və hər ikisini udur.

Həmin vaxtdan dağın adı Ləlvar adlanır. Çünki kişi o dağda «ləlvar» deyə ora getmiş və əjdaha onu udduğu üçün gətirə bilməmişdi. Ləl yenə də o dağda qalmışdır.

### *44. Qısır dağ*

Bir bəy öz qoyunlarını müftə saxlamaq üçün adam axtarır. Bir çoban onunla razılaşır. O, çobanla belə bir şərt kəsir ki, qoyunlarımı on il müddətində saxla, on il tamam olduqda mən sənə qoyunlarımın bir illik balasını verim. Çoban bəyin bu şərtilə də razılaşır. O gündən çoban bəyin qoyun sürüsünü otarmağa başlayır.

Nəhayət, doqquz il tamam olur. Həmin il çoban bəyə bildirir ki, artıq bu il vədə tamam olur. Bunu eşidən bəy o ili bütün qoçları burdurur. Çobanın bu işdən xəbəri olmur. O, böyük bir dağın ətəyində qoyunları otarırdı. Beləliklə, həmin il qoyunların heç biri qoça gəlmir və heç bir quzu olmur. Qoyunlar dağdan arana qayıdır. Çoban elə bilir ki, qoyunların bala verməməsi, qısır qalması o dağın otundandır, o dağ günahkardır. Çobanın sözünə görə o vaxtdan indiyə kimi həmin dağın adı «Qısır dağ» qalır.

### *45. Abduləsər dağı*

Abduləsər dağı Dağlıq Qarabağın Mədinə kəndində yerləşir. Dağın başında gözəl bir göl də vardır.

Rəvayətə görə, Mədinə kəndində Abdul adında bir çoban yaşayırmış. O, kəndin yeganə gözəli Şəmsinura vurulubmuş, qız da onu sevirmiş. Günlərin bir günündə kəndə bədbəxtlik üz verir. Düşmənlər kəndə qəflətən basqın edib varidatını talayırlar. Onlar kəndin yeganə gözəli Şəmsinuru axtarırlarmış. Bu zaman qız qaçıb özünü hündür bir qayadan atmaq istəyərkən uzun saçları düşmənin əlinə keçir. Onu çıxarmağa başlayırlar. Qız saçlarının qırılmasını Allahdan arzulayır. Qızın saçları qırılır, qız yerə düşüb ölür. Saçları isə ilana çevrilib düşməni çalır. Bu hadisədən Abdulun xəbəri yox idi. O, bu xəbəri eşidib sarsılır və başına hava gəlir, yəni bu hadisə ona əsər edir. O zamandan etibarən dağın adı Abduləsər qalır.

Deyilənlərə görə dağın başında Abdulun göz yaşlarından göl əmələ gəlmişdir.

## *46. Qaradağ əfsanəsi*

Keçmişdə Borçalı mahalının Qızıl Hacılı kəndində Pirim adlı bir kişi yaşayırmış. Bu kişinin gözünün ağı-qarası Yasəmən adlı bir qızı var imiş. Qız hələ 12-13 yaşında ikən onun gözəlliyi, cazibədarlığı bütün mahalda söylənməyə başlanmışdı. Elə ki, Yasəmən 15-16 yaşına qədəm qoydu, Pirim kişinin həyəti elçilər oylağına döndü. Ancaq Pirim kişi qızının razılığı olmadan onu heç kəsə verməyəcəyini öz-özünə söz vermişdi. Elçilərin gündə gedib gəlməsinə baxmayaraq Pirim kişi onları

cürbəcür bəhanələrlə geri qaytarırdı. Qız el arasında o qədər təriflənirdi ki, hətta onu görməyən cavanlarda belə ona məhəbbət oyanırdı. Belə cavanlardan biri də həmin torpaqda böyüyüb, boya-başa çatmış çoban Zöhrab idi. Yasəmən el arasında öz gözəlliyi, cazibədarlığı ilə şöhrət tapdığı kimi, Zöhrab da öz qoçaqlığı, gözəlliyi və əməksevərliyi ilə şöhrət qazanmışdı. Zöhrab Yasəmənin haqqında eşitdiyi kimi, Yasəmən də Zöhrabı el arasında igid bir cavan kimi tanımış, haqqında çox şeylər eşitmişdi. Bu iki gəncin ürəyində gizli də olsa bir-birini görmək arzusu baş qaldırır.

Deyilənlərə görə, hazırda «Qara dağ» adlanan dağın arxasında yerdən bir bulaq qaynayırmış, həmin bulağın suyu təmiz və sərin olduğundan kənd camaatı suyu həmin bulaqdan gətirərmiş. Baharın gözəl çağlarında bulağın ətrafı və dağın döşü gül-çiçəklə elə örtülürmüş ki, sanki əl ilə bəzədilmiş bir xal idi. Yasəmən də həmişə su aparmaq üçün öz tay-tuşları ilə bu bulağa gələrmiş. Bir gün yenə bulağa gedərkən qızlar Yasəmənə varlı bir bəy ailəsindən elçi gələcəyini söyləyirlər. Yasəmən bu xəbərdən çox kədərlənir; o qorxur ki, atası onu bəyin hörmətinə və var-dövlətinə görə ağılsız oğluna verməyə razı olar. Qızlar bulağa çatdıqları zaman gül-çiçək toplamaq üçün dağın döşünə qalxırlar. Yasəmən isə qəmli halda bulağın başında tək qalır. Bu zaman Zöhrab su içmək üçün bulağa enir. Yasəməndən su istəyir. O, Zöhraba su verərkən gözləri onun gözlərinə sataşır. Bu zaman hər iki gənc bir-birinə vurulur və burada da əhd-peyman bağlayırlar, öz məhəb-bətlərinə axıra qədər sadiq qalacaqlarına söz verirlər. Onlar həmişə həmin dağın döşündə yerləşən bir daşın dibində

görüşərmişlər. Elə ilk görüşdən bir daşın dibində məskən salmış qara bir ilan Yasəməni görür və ona vurulur. Zöhrabla Yasəmənin görüşdükləri vaxt ilan da öz yuvasından çıxıb gizlin-gizlin Yasəməni süzərmiş. Bir gün yenə Zöhrab başını qızın dizləri üstünə qoyub yuxuladığı zaman ilan yuvasından çıxıb qəflətən Zöhrabı çalır, Zöhrab ölür. Yasəmən bu vəziyyətə dözmür, ürəyi partlayır, ölür. İlan da Yasəmənə sarmaşaraq başını onun sinəsinə qoyub ölür. O vaxtdan el arasında həmin dağa «Qara dağ» adı verilmişdir.

## *47. Ağrı dağı*

Bir cüt Ağrı dağı olur. Bunlar iki bacı olurlar. Biri böyük, biri isə kiçik. Bacılar dalaşırlar. Kiçik bacı böyüyə deyir ki, sənin başından qar, duman əksik olmasın. Böyük bacı isə kiçiyə deyir ki, sənin də başından ilan-çayan, od, alov əksik olmasın. Elə də olur. Dağın birinin başından qar, duman, o birinin başından isə ilan-çayan əksik olmur. Bundan əvvəl Kərbəlaya, Mədinəyə gedənlər bu iki dağın arasından keçirlərmiş. Böyük dağın başına çıxan yox olurmuş. Nə geri qayıdırmış, nə də irəli gedirmiş. Bu halda bir dəvəçi dəvələri ilə birlikdə Kərbəla ziyarətinə yollanırmış. Bu vaxt susuz səhraya rast gəlir. Dəvəçi deyir:

- Ey İlahi, bir bulaq çıxart dəvələr də, mən də içib doyaq. Kəndin kənarına çatanda sənə bir dəvə qurban kəsəcəyəm. Bu vaxt bir çeşmə çıxır. Dəvələr də, dəvəçi də bu çeşmədən doyunca su içib yola düşürlər. Ancaq dəvəçi vədinə əməl etmir, elə

oradaca dəvəçi də, dəvələr də daşa dönürlər. Bu daşlar hazırda qoşa Ağrı dağlarının arasında durur.

### *48. Qırxqız*

Rəvayətə görə, lap qədim zamanlarda köçəri tayfalar mal-qaranı və qoyun sürülərini gətirib «Çiçəkli» deyilən yaylağa çıxarandan sonra aranda əkdikləri məhsulu yığmaq üçün kişilər geri qayıdarmış.

Yaylaqda qalan gəlinlər, qızlar bu gözəl «Çiçəkli»dəki ətir saçan çiçəklərdən dəstə bağlayıb arandan gələn əzizlərini qarşılayarlarmış. Bir gün qızlar, gəlinlər çiçək dəstələri toplaya-toplaya, mahnı oxuya-oxuya alaçıxdan aralanır. Hava qaralır, duman gəlib dağları tutur.

Qırx qız dumanlı, çiskinli dağda azır, hara, hansı səmtə getdiklərini bilmirlər.

Qəflətən dəstə halda gedən qızlar qayalardan uçub məhv olurlar. O gündən bu sıldırım dağa «Qırxqız» deyiblər.

### *49. Nuh və qarı*

Nuh xəbər tutur ki, dünyanı su alacaq. Əl-ayağa düşür, gəmi hazırlayır, heyvanların hərəsindən bir cütünü də gəmiyə qoyur ki, onların nəsli kəsilməsin. İşdən halı olan, dünyagörmüş, ömür sürmüş, ağ saçlı, ağ birçəkli bir qarı Nuha yaxınlaşıb deyir:

-Məni də özünlə apar.

Nuh söz verir. Lakin səfər zamanı verdiyi söz huşundan çıxır, qarı qalır yer üzündə.

Deyirlər, bir yağış yağır, bir yağış yağır, tut ucundan çıx göyə. Çaylar şahə qalxır, hər yan suya qarışır, dünya görünməz olur.

Vaxt keçir, vədə yetişir. Günəş şığıyıb göydə alov-alov yanır. Günəşin zərbindən su ərşə çəkilir. Nuh qayıdanda qarı düşür yadına. Gedir ki, onun öldüsündən-qaldısından bir xəbər tutsun.

Qarının evinə yaxınlaşanda qulağına səs gəlir, dinləyib görür ki, cəhrə səsidir. Qarı salamatdı, özü də ip əyirir.

Soruşur:

-Qarı, dünyanı su aldı, sən bunu görmədinmi, duymadınmı?

-Yer üzünü su aldığını bundan bildim ki, piltələrim bir az nəm kimi oldu.

Nuh barmağını dişləyir, başa düşür ki, qarı qoca dünyanın özü imiş. Sən demə aləm batanda bunun ancaq piltəsi nəmlənərmiş.

## *50. Yanardağın qəzəbi*

Çox qədim dövrlərdə Bakı yaxınlığında böyük bir kənd vardı. Bu kəndin əhalisi o qədər varlı, o qədər xoşbəxt yaşayırdı ki, hamının gözü onlarda idi. Bu xoşbəxtliyi Allah onlara məhəbbətlərinin saflığına, əhd-peymanlarına sədaqətə görə veribmiş. Bir gün iki cavana toy qurulurdu. Elə bu vaxt düşmən ölkənin adamları kəndin var-dövlətini yağma eləmək üçün oranı mühasirəyə aldılar. Toy vaya çevrildi. İmkansız adamlar göyləri köməyə çağırdılar. Düşmən kəndin adamlarını yaxındakı dağa doğru sıxışdırdı. Camaat gördü ki, bu gedişlə onları qırıb-çatacaq, var-dövlətlərini yığıb aparacaqlar. Namusları ayaq altında itəcək. Allaha

yalvardılar ki, onların hər birini alov diliminə, sığınacaqları dağı yanar dağa çevirsin.

Bu zaman möcüzə baş verdi. Dağın ətəklərindən alov qalxmağa başladı. Düşmən yaxınlaşdıqca alov güclənir, ətrafa od saçırdı. Qəzəbli Yanardağ yadların, yağıların keçə bilmədiyi bir səddə çevrildi. O vaxtdan bu dağın adı Yanardağ qalıb. Belə deyirlər ki, təzə həyat quran oğlan və qız xeyir-dua almaq üçün Yanardağa gəlir. Əgər cavanlar təmiz ürəklə ailə qururlarsa alov bir qızıl gül topasına çevrilir. Yox, əgər onların qəlbində səmimiyyət azdırsa, məhəbbətdən kasaddırlarsa, alov kükrəyir, şiddətlənir, xeyir-duaya gələnlərin sifətini, saçını qarsalayır.

Yanardağ bu gün də öz müqəddəsliyini, möcüzələrini və qəzəbini yaşadır.

## *51. Lələ əfsanəsi*

Bir kişi uzaq səfərə yollanır. Xeyli yol gedəndən sonra gecələmək üçün bir kəndə dönür. Tanımadığı bir qapını döyür. Ev sahibi olan ərlə arvad onu yaxşı qarşılayır, atına və özünə yer verirlər. Qonaq görür ki, bu gözəl insanların övladı yoxdur. Yola düşüb gedərkən deyir:

- Zaman qardaş, Yaxşı bacı, yaradandan bircə istəyim var ki, sizə bir övlad versin. Siz ki, belə xoş xasiyyət insansınız.

Aradan bir il keçir. Xəbər gəlir ki, qonaq qayıdıb geri.

Yaxşı deyir:

- Ay Zaman, qonaq bizdən uşaq soruşacaq. Görəcək yoxdu, qəmgin olacaq. Deyirəm bir

ürgəncək düzəldim, divək daşını uşaq kimi bələyim qoyum ora. Soruşanda göstərib deyərik ki, “uşağımız oldu”. Qoy qonağımız məyus olmasın.

Belə də eləyirlər. Qonaq ürgəncəyi görüb sevinir. İrəli yeriyir ki, uşağın ürgəncəyinə bir hədiyyə qoysun, uşaq ağlayır. Ərlə-arvad bu işə mat qalırlar.

Yaxşı uşağı böyük məhəbbətlə sevir. Tək olduğu üçün uşağın adını Lələ qoyurlar.

Vaxt gəlir Lələ böyüyür, həddi-buluğa çatmış bir oğlan olur. O, Zamandan çox Yaxşıya bağlanır. Bir an belə Yaxşıdan ayrılmır, Yaxşı hara getsə onunla gedir.

Zaman bu qəribə oğlan uşağından şübhələnir. Yaxşını ona qısqanır, yerli-yersiz oğlanı incidir.

Lələnin vergisi elə ürgəncəkdə ikən verilibmiş. Ərsəyə çatandan sonra bayatı üstündə söz qoşur, ürəklərdən xəbər verir. Yaxşının özündən başqa iki bacısı varmış: Günəş və Liqa. Bir gün üç bacı çayda paltar yuyurmuş. Lələ də onların yanında imiş.

Günəş deyir:

- Ay Lələ, haqq aşığısan, de görək biz bacılardan hansımız daha gözəlik.

Lələ bir bayatı deyir:

***Evləri gün aşanda,***
***Xalları gün nişanda.***

***Ay Yaxşı, sən də yaxşı,***
***Sən handa, Günəş handa ?***

Lələ görür ki, Yaxşı bu sözdən bir az pozuldu.

***Eləmi çalma yeri,***

***Çal yeri, çalma yeri.***
***Günəşin özü gözəl,***
***Yaxşının çalma yeri.***

Zaman Lələ ilə Yaxşının isinişməsinə dözə bilmir. Qərara gəlir ki, Lələni öldürsün. Zaman nacağı (əl baltasını) götürüb çaya gəlir. Deyirlər Lələ haqq aşığı olduğu üçün bu iş ona əyan olur. Pis əməllərinə görə Lələ Zamanın adını Yaman qoyubmuş. Lələ Yaxşıya Yamanın onu öldürməyə gəldiyini bir bayatı ilə belə xəbər verir:

***Eləmi, daldanacağı***
***Lələnin daldanacağı.***
***Bax, a Yaxşı, Yaman gəlir,***
***Tutub da daldanacağı.***

Lələ sıçrayıb yaxınlıqdakı ağaca çıxır, paltarını soyunub bir budağın üstündə oturur.Yaman baxıb görür ki, Lələnin bədəni gömgöy daşdı. Daşın da üstündə bir dəstə gül bitib. Ona tamaşa eləyən Yamana Lələ deyir:

***Eləmi, daşdan mən,***
***Kirpikdən mən, qaşdan mən.***
***Nə atam, var nə anam,***
***Yaranmışam daşdan mən.***

Yamanın niyyətindən əl çəkmədiyini görən Lələ ağacdan düşüb məqsədini açır:

-Siz sağ, mən salamat. Daha mən gedəsi oldum.

Yaxşı çox yalvarır ki, Lələ getməsin. Lələ görür ki, Yaxşı əl çəkməyəcək deyir:

***Eləmi, Yaman məni,***
***İncidir Yaman məni.***
***Baş götürüb getməsəm,***
***Öldürər Yaman məni.***

Lələ halallaşıb gedir. Bu fəraqa dözməyən Yaxşı ağlaya-ağlaya bir bayatı çəkir:

***Dilimdə layla qaldı,***
***Çalmadın layla qaldı.***
***Qəlbimin gizli dərdi,***
***Canımda yayla qaldı.***

Lələ gedir. Aylar keçir ondan xəbər gətirən olmur. Bir axşam Yaxşı xaşıl bişiribmiş. Birdən Lələni xatırlayır:

-Ay Zaman, pis iş gördün. Daşdan yaranmışdı, hər nə idi, günümüzü onunla ovundururduq. O yazıq uşağı nahaq qovdun.

Zaman deyir:

-Arvad, əgər o doğrudan da haqq aşığıdırsa çağır gəlsin bu xaşıldan yesin.

Yaxşı üç dəfə kökürü qazana vurub. Lələni çağırır. Lələ gəlib çıxır və deyir:

***Eləmi, İtibeldən,***
***İtmişdim, itib eldən.***
***Yaxşı çağırdı, gəldim,***
***Getmişdim, İtibeldən*.**

Zaman möcüzəni görsə də şübhə ondan əl çəkmir.

Lələ bir gecə qalıb səhər çıxıb gedir. Gedəndə Zamanın fikrinə qarşı öz fikrini bildirir:

***Necə Zamanı görüm?***
***Özü yamanı görüm.***
***Nə yaman məni görsün,***
***Nə mən yamanı görüm.***

Lələ gedandan sonra Zaman üzünü Yaxşıya tutub deyir:

-Bu ola bilməz. Ləlöni hardasa gündüzdən buralarda gizlədibmiş, yoxsa nə oldu ki, çağıran kimi hazır oldu.

Bir gün Zamanla Yaxşıya xəbər gətirirlər ki, Lələ insan yaşamayan yiyəsiz bir düzdə özünə bir kümə tikib tək-tənha yaşayır. Qışın qarlı vaxtı olur. Zaman deyir:

- A Yaxşı, dur Lələyə qonaq gedək. Əgər Lələ haqq aşığısan qışın oğlan çağında qoy mənə qovun tapsın.

Razılaşıb gəlirlər. Deyilənə görə bu gəliş Lələyə qabaqcadan əyan olur. Lələ görür ki, Yaxşı ilə Zaman gəlir. Qabaqlarına çıxıb görüşür. Zaman içəri girib deyir:

-Lələ, bu şərtlə evinə girərəm ki, mənə tağ üstündən yemiş dərib verəsən.

Lələ deyir:

***Eləmi gəldin gir öyə,***
***Qonaq gəldin, gir öyə.***
***Lələ qovun tapmasa,***
***Başın qoyar kirayə.***

Zaman içəri girəndə görür ki, tağın birindən yemiş sallanır, o biri tağ isə hələ çiçəkdi. Lələ üzünü Yaxşıya tutub deyir:

***Lələ deyər: tağ ayır,***
***Sən zülfünü tağ ayır.***
***Irəli dur, a Yaxşı,***
***Gir bostana tağ ayır.***

Lələ qəhərlənib bir bayatı da çəkir:

***Bu dağlar kömürdəndi,***
***Keçən gün ömürdəndi.***
***Lələ bir qovun dərdi,***
***Tağları dəmirdəndi.***

Zaman bundan sonra Lələnın haqq aşığı olduğuna inanır. Tutduğu işlərdən peşman olur və Lələdən üzr istəyib deyir ki, Lələ, dur gedak evimizə. Lələ razı olmur. Yaxşı ilə Zaman evlərinə qayıdırlar. Lələ tək qalıb qəhərlənir, bir bayatı çəkir:

***Lələ bir kümə tikdi,***
***Ağzını günə tikdi***
***İçinin sahibi yox,***
***Kim bilsin, kimə tikdi.***

Lələ kəsdikləri qovunun toxumun evin dalındakı düz yerə səpir. Bostan əmələ gəlir. Bir çoban qoyun otarırmış. Bir qara qoyun gəlir Lələnin yemiş tağındabir yarpaq yeyir. Lələ deyir:

-Çoban, evin yıxılsın, məni işə saldın.

Lələ həmin gündən evi-eşiyi buraxır. Çardağından ayrılarkən kədərlənir, bir bayatı çəkir:

*Lələnin bardağı var,*
*Gümüşdən bardağı var.*
*Lələ gedib gəlməsə,*
*Bil ki, yolda yağı var.*

Lələ o gündən həmin qoyun sürüsünə çoban olur. Lələ çoban haqqı bir ilə bircə qara qoyun istəyir. Gecələr başını qoyuna sökəyib yatır. Vaxt gəlir qoyun bir qara quzu doğur. Lələ quzunu gözü kimi bəsləyir.

Deyirlər ki, sürü sahibi olan şahın uşağı olmurmuş. Bir gün şahın arvadı deyir ki, könlüm quzu əti istəyir. Həmin gün Lələ harasa gedibmiş. Baxırlar ki, Lələnin quzusundan yeməlisi yoxdu. Razılıqsız kəsirlər. Deyirlər, bir quzu əvəzinə Lələyə dörd-beş quzu verərik. Lələ quzunun kəsildiyini bilən kimi şivən qoparır:

-Eviniz yıxılsın, yenə də məni işə saldınız.

O vaxtdan doqquz ay keçir. Bir gün xəbər yayılır ki, şahın oğlu olub. Lələ şahın yanına gəlib deyir:

- Şah sağ olsun, uşaq mənimdi.

Şah deyir:

- Çoban dəli olub, aparın boynunu vurun!

Vəziyyətin fənalığını görən Lələ yanıqlı bir bayatı çəkir:

*Aman, ahı, Lələnin,*
*Qibləgahı Lələnin.*
*Ya gec tutar,ya da tez*
*Bir gün ahı Lələnin.*

Lələ dərdini sözlə də deyir:

- Şah sağ olsun mənim boynumu həmişə vurdura bilərsən. Şərtimə qulaq as, ağlına batmasa

boynumu vurdur. Uşağı, adama üç dəfə çağıraq. Sənə cavab versə, uşaq sənindi, mənə cavab versə, mənimdi.

Lələ deyir:

-Mənim oğlumun adı Budaqdır.

Şah deyir:

- Mənim də oğlumun adı Məhəmməddi.

Şah üç dəfə çağırır, uşaq dillənmir. Lələ Budaq deyib çağıran kimi uşaq dillənir: Lələ öz-özünə deyir ki,  gəl bu gözəl şahı başa sal ki, o haqq aşığıdı, vaxt gələcək sən şah da onun qəbri üstünə ziyarətə gələcəksən.

***Lələ haqq lələsidi,***
***Lələ can tələsidi***
***Lələnin qəbri üstə,***
***Gözəl şah gələsidi***.

Şah deyir:

- Hələ bir Lələyə bax... Bunun dirisini sayıram ki, öləndən sonra qəbrini ziyarətə gedəm....

Lələ gəlib görür ki, küməsi bomboşdu. Nə bir axtaran var, nə də soruşan. Qəlbi qəmdən qəhərlənir:

***Lələyəm, həyənim yox,***
***Al-yaşıl geyənim yox.***
***Yüz il bir yana getsəm,***
***Gəlmədi deyənim yox***.

Lələ yuxuda Yaxşının öldüyünü görür. Səhər onun qəbri üstünə gəlir. Görür ki, Yaxşının qəbrinə qar yağıb. Lələ bir bayatı çəkir:

*Eləmi ya qar, qar*
*Ötər qarğa, ya qar-qar.*
*Yaxşının gəl üzünə ,*
*Utanmazmı yağar qar.*

Lələ daha yaşamaq istəmir. Bir az aralıda Lələ öz qəbrini hazır görür. Son məskəninə varıb əbədiyyətə qovuşur.

Bir gün şah ova çıxıbmış. Şahın qızılquşu əlindən çıxıb uzaqlara uçur. Şah gedir, quş gedir. Axırda quş gəlib bir hündür daşın üstünə qonur. Şah da quşun dalınca ora gəlir. Şaha deyirlər:

- Bu daş, haqq aşığı Lələnin qəbridir.

Şah deyir:

- O vaxt Lələ deyəndə mən inanmadım. Onun qəbrini ziyarət eləməli oldum. Doğrudan da Lələ haqq aşığı imiş.

Belə deyirlərmiş ki, Lələnin qəbrini ehtiramla ziyarət edir. Sonralar isə onun qəbri üstündə möhtəşəm bir kümbəz tikdirir.

### *52. Nisə dağı*

Deyilənlərə görə bir oğlan Nisə adlı bir qızı sevirmiş, qızın da gözü həmin oğlanda imiş. Aralarında heç bir əhd-peyman olmasa da, ölsələr yerin, qalsalar bir-birinin payı olacaqlarına inanıblarmış. Oğlan yaylağa gedibmiş, qız aranda qalıbmış. Amma o, hər səhər-axşam kəndin üstündəki dağın başına çıxıb yaylağa sarı boylanırmış.

Bir səhər yenə ora gedir. Sevgilisinin nəfəsini yaylaq tərəfdən əsən mehdən almağa başlayır. Bu

zaman göyün üzü tutulubmuş, birdən şimşəklər oynayır, ildırım çaxır, qız yanıb külə dönür.

Bu xəbər oğlana çatır, o, tez atlanıb arana gəlir, həmin dağın başına qalxıb ağlaya-ağlaya bir bayatı deyir:

***Gəl tutma hisə dağı,***
***Dumana, sisə dağı,***

***Hər yara sağalsa da ,***
***Sağalmaz, Nisə dağı.***

### *53. Təkədonduran dağı*

Gününü çöllərdə keçirən bir ovçu varmış, amma evinə heç vaxt ovla qayıtmazmış. O, baxanda papaq salan bir dağın dibinə gəlirmiş, səhər tezdən, ya da gün batabatda o dağın yəhər aşırımlarında, daraq qayalarında zəncirlənib gedən dağ keçilərinə tamaşa edərmiş. Təkcə onların dalınca salışan canavarlara, toyuq-cücə oğrusu tülkülərə, çaqqallara, inəkləri, öküzləri basmarlayan ayılara-dünyanın bu çöl bəzəklərinə, yaraşıqlarına susayan ziyankarlara güllə atarmış. Bir səhər gəlib görür ki, dağı dolu döyüb, dağın ətəyində nə qədər dağ keçisi, təkə donub. Yanıb tökülür, üzünü dağa tutur, bayatı deyir:

***Təkədonduran havadı,***
***Vətəni sarı babadı.***
***Yoxdu sənlə aram, dağlar,***
***Sağalmaz yaram, dağlar*.**

## *54.Damcılı bulaq*

Keçmiş zamanlarda kasıb bir kişinin oğlu varlı qızını sevir, qız da onu sevir. Ancaq qızın ata-anası sevgililəri qovuşmağa qoymur. Çarəsiz qalan oğlan özünü qayadan atır, ölür. Qız isə heç kəsə ərə getmir. Hər gün həmin qayanın başına çıxıb doyunca ağlayır. İllər ötür, qız da dünyadan köçür, sonra həmin qaya dibindən göz verir, damcı-damcı ağlayır.

Deyilənə görə, «Damcılı bulaq» o qızın göz yaşından əmələ gəlib.

## *55.Oğlan bulaq, Qız bulaq*

İlisuda bir oğlanla bir qız əl-ələ verib, ovçu Pirimi görmək arzusu ilə dağları, qayaları axtarmağa çıxırlar. Onlar nəhayət, gəlib ovçu Pirimin yaşadığı yerə çatırlar. Oğlan deyir:

-Odur ey, Pirim baba o qayanın üstündəki evdə yaşayır. Yayını-oxunu da daşa söykəyib.

Qızla oğlan maraqla qayaya baxırlar. Onlar arzu edirlər ki, nə ola, buradan bir bulaq çıxa. Pirim babanın yanına əl-üzümüzü yuyub gedək. Bu vaxt bir atlı onların yanından çaparaq keçir. Atının nalı

daşa deyir. Nalın izindən su fəvvarə vurur. Oğlanla qız istəyirlər ki, bu suya tərəf qaçsınlar. Elə bu vaxt ovçu Pirim deyir:

-Dönün geri baxın, qayanın dibində iki bulaq görəcəksiniz. Qıza oxşayan bulaq «Qız bulaq», oğlana oxşayan bulaq «Oğlan bulaq»dır. Kim o bulaqlarda əl-üzünü yusa, suyundan içsə, çimsə, gözəlləşər, azar-bezarı yox olar. Onlar şəfa qaynaqlarıdır.

### *56.Qırxbulaq*

Gəncə xanı hər il yaylağa çıxar, Qoşqar dağının ətəyində yurd salarmış. Gözünün ağı-qarası bircə qızı varmış. Xan qızı qırx kənizlə hər gün çəmənlikdə gəzər, güllərin, çiçəklərin içində dövrə vurub oturar, çalıb-çağırar, kefi kök, damağı çağ halda binəyə dönərmiş.

Bir gün yenə seyrə çıxır, hər kəniz bir qucaq dolusu gül-çiçək dərir, xan qızının başına güldən tac hörür, saçlarının cığasına çiçəklər düzür, sonra da onu üzük qaşı kimi araya alıb əyləşir. Hərəsi bir nəğmə oxuyur. Birdən dağları, dərələri qalın duman bürüyür. Onlar binənin hayanda olduğunu unudurlar. O qədər çaşırlar, ora-bura qaçışırlar ki, xan qızını da itirirlər. Səsləri-ünləri dağlara əks edir, yamaclara yayılır, onların səsinə səs verən tapılmır. Neçə gün, neçə gecə dağlarda ac-susuz dolanırlar. Axırda bir qayanın altına yığışıb baş-başa verirlər, acı göz yaşları axıdırlar. Göz yaşları ilə əriyib yerə hopurlar. Həmin vaxtdan orada qırxbulaq göz verib,

qışda donur, yaz gələndə çağlayıb axır, yayda da həmişə bir həsrət nəğməsi oxuyur.

## *57.Qırxqız bulağı*

Bir mahalda qırx oba vardı. Bu obalar özlərinə bir toy yeri seçmişdilər. Bu yer dörd şiş dağın arasındakı yastanada idi. Yastananın ortasından bir bulaq axırdı. Bir qıza toy vurulanda qırx obanın qırxı da ora yığışardı. Oğlanlar orada sevər, qızlar orada sevilərdilər.

Bir gün qonşu mahalın şahı bu qırx obaya qoşun yeritdi. Obaların igidləri, ərləri davaya getdilər. Dava uzun çəkdi, gedənlərin qırxı qayıtmadı. O qırx oğlanı sevən qızlar başdan-ayağa qara geyinib həmin bulağın başına yığışdılar. Qırx gün, qırx gecə yas saxladılar. Sonra hər ilin yazında yenə qara geyindilər, ömürlərinin sonuna kimi ilk görüş yerində göz yaşı axıtdılar. Onların bayatıları, yanıqlı səsləri, göz yaşları bulağın duru sularına qarışdı. Hər baharda, el dağlara köçəndə o bulaq qırx qızın nakam məhəbbət mahnılarını oxudu.

## *58.Nəğməli bulaq*

Ata var-dövləti üstündə iki qardaşın giley-güzarı düşür. Böyük qardaşın tamahı güclü imiş, istəyirmiş ki, mal-mülkün çoxu, həm də ən yaxşısı onun olsun. Hər şeyi üç yerə bölür, çöp atır, iki pay böyük qardaşa verilır, yenə də razı olmur. Onun deyintisi, kiçik qardaşdan narazılığı kəndi başına

götürür. Bu şərikli malın bölünməsinə kəndin ağsaqqalları da qarışır.

Böyük qardaş bu dəfə də dəbbələyir. Axırda kiçik qardaş biabırçılıqdan can qurtarmaq üçün ata var-dövlətindən bir çöp də götürməyib kəndin ayağına köçür. Özünə yurd salır, ev tikdirir, arvad-uşağını başına yığıb əkin-biçinlə külfətini dolandırmağa başlayır. Camaat isə böyük qardaşı kənddən köçürür. O, bir meşənin ətəyinə çəkilib özünə bir bina qurur. Atasının ağır-yüngülünü, hər nəyi vardısa, ora daşıyır.

Aradan illər keçir. Böyük qardaşın oğlu, kiçik qardaşın da qızı böyüyür. Oğlanın adı Məhəmməd, qızın adı isə İsmət imiş. Məhəmməd atasının ilxısındakı xam dayları, dayçaları tutub minik öyrədirmiş. Qaçaraqda minib çapırmış. Ürgələr dağdan, yal-yamacdan ildırım təki ötəndə qarnının altından keçib yenə belinə qalxarmış. At çapa-çapa əyilib yerdən torpaq götürürmüş.

İsmət də qənirsiz gözəl imiş. Göyçəkliyinin sədası ellərə yayılıbmış.

Bir gün kənddə toy başlanır. Zurnanın səsi dağlardan aşır, böyük qardaşın obasına da çatır. Məhəmməd atasından xəlvət geyinib-kecinir, qaçarağına quşlar da çatmayan kəhəri yəhərləyir, qalxır belinə, zurnanın səsini tutub toy vurulan kəndə çapır. Özünü o vaxt yetirir ki, kəndin cavanları atlarının belinə qırğı kimi qonub öz kəhər-kürənlərini zurnanın havasına havalandırırdı. Kəndin gözəl-göyçək qızları da boy-boya verib tamaşaya dayanmışdılar.

Birdən kənd ağsaqqalı əlini qaldırıb endirdi. Çaparın biri əlindəki qırmızı yaylığı yelləndirə-yelləndirə atını irəli çapdı. O biri çaparlar da öz

atlarını mahmızladılar. Çapaçap başlandı. Atını hamıdan dalda səyirdən Məhəmməd onları keçdi. Ox kimi irəli çıxdı, yaylığı qabaqda gedən çaparın əlindən alıb öz kəhərinin başını başqa səmtə döndərdi, atını dağlarda, qayalarda quş təki səkdirdi. Kənd cavanlarının hərəsinin atı bir dərədə yorulub qaldı. Məhəmməd geri dönüb atını zurnaçıların qabağında saxladı, at zurna havasına oyur-oyur oynadı.

Kənd ağsaqqalı irəli çıxıb xələti oğlana verdi. Qırmızı yaylığı ondan alıb Məhəmməddən soruşdu:

- Adətimiz belədir: cıdırda qalib gələn oğlan kəndin ən gözəl qızını almalıdır. İndi de görüm, bu qızların hansını bəyənirsən?

Məhəmməd tanımadığı əmisi qızını göstərdi…

Onlar «Nəğməli bulaq» başında görüşməyə vədələşdilər.

Məhəmməd atını öz obalarına çapdı. Əhvalatı anasına, anası da oğlanın atasına danışdı. Böyük qardaş o kəndin ən göyçək qızının sorağını eşitmişdi. Bilmişdi ki, qardaşı qızıdır. İsmətlə görüşməyi oğluna qadağan etdi. Amma Məhəmməd atasından gizlicə atlandı, bulaq başına yollandı. Atası tez xəbər tutdu. Atını kəsə yollarla çapdı. Məhəmmədi qabaqladı. Oğlunu çəkib atdan yerə saldı, döyüb, öldürdü.

İsmət isə Nəğməli bulaq başında gözləyə-gözləyə qalır. Gecə yarıdan keçir, sevgilisinin səs-sorağını eşitmir, səhər açılır, istəklisinin qaraltısı görünmür. Axşam düşür. Qız fikirləşir ki, sevgilisi də bəlkə özgə bir bulağın başında onu gözləyir, bəlkə ayrı yerdə də Nəğməli bulaq var? O biri bulağın başına getmək istəyir, amma ürəyi gəlmir, elə bilir o

gedən kimi Məhəmməd gəlib onu burada axtaracaq, tapma-yacaq.

Bir meh əsir, qızın saçlarını alıb aparır, hər telini bir bulaq başında bitirir. O tellərin hərəsi bir söyüd ağacına dönür, Məhəmmədin yolunu gözləyir.

### *59.Qızbənövşə bulağı*

Belə deyirlər ki, keçmişdə dövlətli bir kişinin Bənövşə adında bir qızı olur. Bənövşə varlı qızı olmasına baxmayaraq heç kimə yuxarıdan aşağıya baxmaz, hamını bir gözdə görərdi. Onların sayı-hesabı bilinməyən qoyunlarını Yetim adlı bir çoban otarırdı. Fərasəti, qoçaqlığı, sədaqəti ilə ağasının hörmətini qazanmış Yetim ürəyinin hökmü ilə Bənövşəyə məhəbbət yetirir.

Çoban məhəbbətini özünə ar bilməyən Bənövşə gizli görüşə razılıq verir.  Sevgililər həmişə bulaq başında görüşməyi qərara alırlar.

Bənövşə vədə yerinə Yetimdən əvvəl gələr, boynunu büküb sevgilisinin yolunu gözləyərdi. Görüş bulağının sərin suyundan içdikdə onların məhəbbəti daha da alovlanardı.

Bir gün ağaya xəbər çatır ki, bəs deməzsən, qızın Yetimlə görüşür. Bunu eşidən ağa və oğlanları qulaqlarına inanmır, qızı güdməyə başlayırlar. Vədə vaxtı yaxınlaşır. Bənövşə bulaq başına tələsir. Ağa əsabələri ilə qızı gizlicə təqib etməyə başlayır. Bənövşə bulaq başına çatıb boynuburuq halda sevgilisinin yolunu gözləyir. Vədədən xeyli keçir. Yetim gəlib çıxmır. O saat ürəyinə damır ki, sevgilisinin başında bir iş var. Yəqin gizli sirlər aşkar olub, onlar bir daha görüşməyəcəklər. Bənövşənin

boynunun büküyü bir az da artır. Dərdli bir bayatı çəkir:

***Gözlərimi oysalar,***
***Üstə dərman qoysalar.***
***Mən səndən əl üzmərəm,***
***Dilim-dilim soysalar.***

Bayatı bütün kəndə səs salır.

Ağa Bənövşənin məhəbbətinin səsini kəsməyə çalışır, ancaq bayatı qor kimi Ağanın canına dolur.

Onlar görürlər ki, Bənövşənin səsini vaxtında kəsməsələr, hamı bu məhəbbətdən xəbərdar olacaq. Bu da ki, Ağa üçün ölümdən betərdir. Bu ara Yetim özünü sevgilisinə yetirir. Onlar sarmaşıq kimi bir-birinə sarınırlar. Qan ağanın beyninə vurur. Oğlanları ilə birlikdə gizləndiyi yerdən çıxıb doğma qızı Bənövşəni xəncərlə doğrayır. Yetimlə Bənövşənin oturduğu daş qana bürünür. Yetim dözə bilmir, bir ağı çəkir:

***Ahu dağda xoş mələr,***
***Xoş inildər, xoş mələr;***
***Əgər bivəfa olsam,***
***Oturduğum daş mələr.***

Sonra xəncəri çıxarıb ürəyinə saplayır. Xalq Bənövşənin meyidini Ağaya vermir. Onları bulağın başında dəfn edirlər.

Hər il yaz gələndə Bənövşənin qəbri üstündə, aşiqlərin qanı tökülən yerdə boynu bükülü bir çiçək açır, məhəbbəti kimi ömrü az olur, dörd-beş gündən sonra solur. Xalq bu çiçəyə iki nakam məhəbbətin rəmzi olaraq «Bənövşə» adı verir.

## *60.Qara at bulağı*

Şimşatın əhalisi su sarıdan bərk korluq çəkirdi. Hər yan susuzluqdan qovrulub xəzələ dönmüşdü. Yayın qızmar çağında daha dəhşətli olurdu.

Yaxındakı dağın döşündən car olan «Zəmzəm» kimi bulağın suyu kəsilmişdi. Camaat üçün bəlaya çevrilən bir qara, nəhəng ilan qıvrılıb bulağın gözünü tutmuşdu. Şimşatlılar nə tədbir tökdülərsə qara ilanı insafa gətirə bilmədilər. Xeyli itgi verəndən sonra başqa çıxış yolu axtardılar.

Su üçün camaat uzun-uzun quyular qazıb, dərin-dərin istillər düzəltdilər. Quyulardan suyu əvvəlcə kəllər çıxartdı. Kəllər gecə-gündüz işlədi, amma adamların təşnəsi sönmədi. Kəllər tələf olandan sonra öküzlər meydana gəldi. Öküzlərin də çıxartdığı bir ovuc su vəziyyəti yüngülləşdirmədi. Öküzlər də sıradan çıxdı. Axırda əlac atlara qaldı.

Kəllərə və öküzlərə nisbətən zərif heyvan olan atlar qızmar günəş altında ağır işə dözmür, tezliklə üzülüb əldən düşür, tələf olurdular. Çox keçmədi minik atları, çapar atları, döyüş atları, ən yaxşı cins atlar seyrəlib yoxa çıxdılar. Növbə qulunlara, dayçalara gəlirdi.

Atların içində hələ ana qoxusu burnunda, ata əzəməti yerişində olan bir Qara at da vardı. Ağzı cilov, beli yəhər görməmiş Qara atın yerişinə, duruşuna, oynaqlığına, çaparına hamı heyran idi. Elə bil təbiət Qara atı cıdırda çapmağa, döyüşdə düşmən qabağına çıxmağa yaratmışdı.

Nəhayət, növbə Qara ata çatdı. Onu quyudan çıxarmaq üçün qoşquya apardılar. Boynuna ağır

kündə qoyub quyunun başına dolandırdılar. Qara ilan dəhşətli qara günə çevrilmişdi. Bir az da belə getsə Şimşatda hənirti qalmayacaqdı. Qara at qara ilanı görən kimi gözlərindən od çıxdı, yalını oynadıb şahə qalxdı. Elə bir kişnərti qopardı ki, dağ-daş titrədi, sonra qoşa ayaqlarını zərb ilə qara ilanın başına vurdu. Başı əzilən ilan tezliklə murdar oldu.

Bulaq yenidən cana gəldi. Onun həyat verən seli-suyu hər yana car oldu. Hamı əzab-əziyyətdən qurtardı. Qara at ilanı öldürməklə Şimşat camaatına ağ gün gətirdi. O vaxtdan bəri bu bulaq «Qara at bulağı» adlanır.

## *61.Pərvanə gölü*

Bir oğlanla bir qız bir-birini çox sevirmiş. Hərəsi də ayrı-ayrı kənddən imiş. Kəndlər çox yaxın olsa da, arada bir göl var imiş.

Gənclər gündüz görüşə bilmirmişlər. Axşam görüşmələrinə isə aradakı göl mane olurmuş. Çox fıkirləşəndən sonra, onlar axşam görüşünə çarə tapırlar.

Axşam olan kimi qız çırağı yandırıb göl tərəfdəki pəncərənin qabağına qoyarmış. Oğlan da çıraq işığına, üzə-üzə göldən keçib, qızın yanına gələrmiş. Beləliklə, onlar hər axşam görüşüb söhbət edərmişlər.

Bir gün qızın atası bu sirri anlayır. Qız çırağı yandırıb bayıra çıxan kimi kişi üfürüb keçirir. Oğlan qabağı görmür, yolu çaşır, nə qədər sağa-sola qol atıb üzürsə də, sahilə çıxa bilmir. Yorulub əldən düşür, boğulub ölür.

Qız sahildə çox gözləyir, oğlan gəlib çıxmır. Kor-peşman evə dönür. Sabaha qədər fikirdən yatmır. Səhər ertə yerdən durub gölün qırağına gəlir. Oğlanın öldüyünü anlayır, o da özünü gölə atır, suda boğulur. Qızın adı Pərvanə imiş. Həmin gündən bu gölün adı Pərvanə gölü adlanır.

### *62.Qanlı göl*

Bir kasıb kişi əkinçiliklə dolanırdı. Dağın başındakı gölün yanında əkin yeri vardı.

Kişi üzünü arvadına tutub dedi:

- Arvad, istəyirəm oğlumu da özümlə iş üstünə aparım. Mən məcgəlçi olum, oğlum da hodaxçı.

Kişi uşağı öz əli ilə boyunduruğa mindirir, öz əli ilə də yerə düşürürdü. Ata buna da çox sevinirdi: «Köməkdir, hayandır» - deyirdi.

Birdən öküzlərdən birinin samıbağı qırıldı. Kişi oturub samıbağı hörməyə başladı. Bir də başını qaldıranda gördü ki, öküzlər gölə çathaçatdı, uşaq da boyunduruqdan yapışıqlı qalıb. Kişi çatanacan öküzlər özlərini suya vururlar. Elə bil bu düzdə nə öküz varmış, nə də cüt. Kişinin başına hava gəlir, göllə danışır:

***Əzizinəm, qanlı göl,***
***Qanlı dərya, qanlı göl:***
***Qaytar mənim oğlumu,***
***Olma mənlə qanlı, göl!***

### *63. Qız gölü*

Qəbələ rayonunda kiçik bir göl var. Həmin gölə Qız gölü deyirlər. Söylənənlərə görə, həmin gölün

yerində bir varlı xanın sarayı var imiş. Olduqca qəddar, zalım xanın hökmü daşdan keçərmiş.

Bu elin ağıllı, kamallı, gözəl-göyçək bir qızı olur. O, gözəl olduğu qədər də qürurlu idi. Varlı-dövlətli, şövkətli aşiqlərin elçiləri Saraygilin qapısından kor-peşman geri qayıdırdılar. Sən demə, qız obasının sadə bir oğlunu –xanın çobanını sevirmiş.

Bir gün xan ova çıxanda qızı bulaq başında görür, bir könüldən min könülə aşiq olur. Qıza elçi göndərir. Qız xanın təklifini rədd edir. Xana xəbər verirlər ki, qız sənin çobanını sevir. Xan qəzəblənir, çobanı tutub zindana saldırır, qızı da zorla sarayına gətirdir. Lakin qız əsir olsa da, xana könül vermir. O, dönə-dönə xanın qarşısında diz çökərək fikrindən əl çəkməsi üçün yalvarıb-yaxarır. Ancaq bu yalvarışlar xanın qəlbinə təsir etmir. Qız yeganə çıxış yolunu özünü öldürməkdə görür. Bunu qabaqcadan duyan hiyləgər xan qıza möhkəm güdükçü qoyur. Əlacsız qalan qız göz yaşlarına güc verir. Gecə-gündüz ağlayır. İsti, duzlu göz yaşları yanağını yandırıb axır, torpağı yandırıb axır, bir çuxur yerdə göllənməyə başlayır. Bu əzaba göydə buludlar dözmür, yağışa çevrilib göz yaşlarını ovutmağa gəlir. Yer altından bulaqlar kədərli nəğmələrini ona bəxş edir. Çaylar dözə bilmir, məcrasını dəyişib yazıq göz yaşlarına qovuşur. Nəhayət, burada duzlu bir göl əmələ gəlir. Amma zalım-qəddar xan insafa gəlmir, qızla evlənmək fikrindən əl çəkmir. Bu göl qızın ah-naləsi kimi böyüyüb-böyüyüb Sarayı özündə qərq edir.

### *64.Qızıl məcməyi əfsanəsi*

Kəlbəcər rayonunun ərazisində, Şahbaz yaylağının yaxınlığında Qalaça adlı bir yer var.

Qalaça böyük bir kahadan və onun ətrafında olan çoxdan uçub-dağılmış hasar qalıqlarından ibarətdir. Kahanın ağzı dardı. İçərisi isə getdikcə genişlənir. Bu kahanın tavanında cürbəcür rənglərlə işlənmiş, çox məharətlə çəkilmiş bir məcməyi şəkli var. Bu məcməyinin naxışları o qədər gözəl, təbii işlənib ki, ilk nəzərdə adam bunun daş üzərində çapıldığına inanmır. Bu haqda belə bir əfsanə var:

Keçmiş bir bəyin çox gözəl bir qızı varmış. Qıza çox adam elçi gəlirmiş, ancaq qız heç kəsə getmirmiş. Sən demə, onun gözü atasının çobanında imiş. Qızın atası qızının ərə getməməsindən narazı imiş. Ona görə də deyir ki, bu dəfə qıza kim birinci elçi göndərsə, qızı ona da verəcək. Bunu eşidən qız xəbər göndərir ki, kim mənim qızıl məcməyimin şəklini olduğu kimi çəksə, ona da ərə gedəcəyəm. Qız gizlincə məcməyini oğlana göstərir.

Çoxdan qızı sevən çoban cəld həmin kahaya gəlir. Sürü dağılmasın deyə kahanın ətrafına hasar çəkir. Sonra kahanı çaparaq genişləndirməyə başlayır. Qızıl məcməyinin şəklini təbii boyalarla kahanın tavanına çəkir. Bundan xəbər tutan bəy «sürünü oğurlayıb gizlətmisən»- deyə böhtan atıb gənc çobanı öldürtdürüb çaya atır. Günahsız çoban azğın bəyin qurbanı olur. Bu hadisəni eşidən qız gənc çobanın ölümünə səbəb olduğu üçün məcməyisi ilə bərabər özünü çayın burulğanına atıb məhv edir.

Qızla çoban həlak olur. Məcməyi suların qoynunda itir. Lakin saf məhəbbətin yadigarı olan məcməyinin şəkli bu gün də olduğu kimi qalır.

### *65.Qanlı gölün maralları*

Bir ana maralın bir cüt balası vardı. O balalarını Ağ gölün sahilində qoyub otlamağa getdi. Çəməndə xeyli otladı. Birdən maral yad nəfəsi duyub diksindi, ovçunu gördü. İnsafsız ovçunun atdığı ox maralın sinəsinə sancıldı. Maral birbaşa ac qoyub gəldiyi balalarına tərəf qaçdı. O, al-qan içində idi. Balaları heç nə başa düşməyib, al-qan içərisində olan analarını son dəfə doyunca əmdilər. Yaralı maral can verə-verə balalarını süzürdü, yavaş-yavaş göz qapaqları endi. Ağ göl maralın qanından qıpqırmızı oldu. O gündən gölün adı dəyişib «Qanlı göl» oldu.

Deyirlər ki, o vaxtdan həmin maralın nəsli «Qanlı göl»ü unutmur, onun sahilinə gəlir, çəməndə otlayır, gölün suyundan içirlər.

### *66. Dəniz və Qağayı*

Keçmiş əyyamda şan-şöhrətli bir şah varmış. Şahın gözünün ağı-qarası bircə qızı varmış. Onun gözəlliyinin, kamalının sorağı hər yana yayılıbmış. Çox yerdən qıza elçi düşür. Şah onların içində özünə kürəkən ola biləcək varlı-dövlətli aşiqlər görsə də, qız heç kimə könül vermir. Ata qızını nə qədər dilə tutur, nə qədər adam salırsa, heç kim qızı yola gətirə bilmir. Sən demə, qız kasıb bir oğlanı sevirmiş. Onlar xəlvəti görüşüb dərdləşir, vüsala yetmək üçün yollar axtarırlarmış. Oğlan kasıb olsa da mərd və cəsur imiş. O, ağ quşa oxşayan sevgilisini görəndə dəniz kimi coşur, dəniz kimi ləpələnir, dəniz kimi dalğalanırmış.

Bir gün şah istəkli qızının kasıb oğlanla sevişməsindən xəbər tutur. Bərk qəzəblənir. Əmr edir ki, harada olsa oğlanı tapıb hüzura gətirsinlər.

Çox axtardıqdan sonra şahın adamları comərd aşiqi tapırlar. Şah onun öldürülməsinə fərman verir. Oğlan xahiş edir ki, edam vaxtı qızı uzağa aparsınlar. Qız onun ölümünü görməsin. Şah oğlanın sözlərindən sevinir, ondan daha dəhşətli, daha da əzablı intiqam almaq üçün qızı edam yerinə gətirtdirir.

Cəlladlar şahın işarəsini gözləyirlər. Oğlan ölümünü mərdanə qarşılayır. İşarə verilir. Cəlladlar işə başlayanda qızın fəryadı eşidilir. Oğlan camaat arasında sevgilisini görüb tanıyır. O saat eşqin gücündən coşa gəlir, dəniz kimi dalğalanır, dəniz kimi hayqırır. Oğlan hamının gözü qarşısında əriyib suya dönür. Bu su böyüyür, dalğalı bir dənizə çevrilir. Şah və əyanlar bu dənizdə boğulub tələf olurlar. Oğlanın sevgilisi isə ağ qağayıya çevrilib coşan dənizin qoynunda üzür. Onlar belə qovuşurlar. O vaxtdan bəri qağayı dənizdən ayrılmır.

## *67.Göyçə gölü*

Rəvayətə görə, indiki Göyçə gölünün yerində, dağlar qoynunda böyük düzənlik və bu düzənlikdə xırdaca daşlı təpəliklər və mənzərəli bir yer varmış.

Burada maldar tayfalar arasında tez-tez basqınlar və dalaşmalar olardı. Bu səbəbdən bir ailənin bir gün cavan bir oğlu dalaşmalarda itkin düşür və tapılmır. Ailənin itkin düşmüş oğlunun çox gözəl bir bacısı qardaşının həsrəti ilə evlərində qəmgin halda yaşayırdı. Oğlan isə haradansa bir gün öz vətəninə-Göyçəyə qayıtmağı vəd edir.

Göyçə düzənliyindəki xalqın yaşayış kəndlərindən birinin ortasında böyük yeraltı bulaq var idi.

Bu bulağın bir sirri var idi ki, suyu götürəndən sonra bulağın daşmaq adəti çox qorxulu idi. Ona görə də bu bulağın ağzına qapaq hazırlanmışdı. Hər kəs suyu götürdükdən sonra qapağı möhkəm örtərdi. Qardaşı itkin düşmüş qız həmin quyudan su götürərkən bir uşaq qaça-qaça gəlib onun qardaşının gəldiyini xəbər verir. Çox sevincək olan qız suyu götürüb, quyunun qapısını örtmədən çıxıb gedir. Quyu isə gecə  daşıb çölə axmağa başlayır, gur su həmin mahalı alır və Göyçə gölünü əmələ gətirir.

## *68. Göy-Göl*

Şəhri-zərrin şəhərinin hər tərəfi sıldırım dağlar və qayalarla əhatə olunmuşdu.

Buranı Salsal adlı bir padşah idarə edirdi. Onun hökmü yerə-göyə sığmırdı. Bir gün padşahın qulluq-çuları gördülər ki, elçi daşının üstə üç ərəb oturub. Qulluqçular tez padşaha xəbər verdilər. Padşah elçilərin onun yanına buraxılmasını əmr etdi.

Ərəblər ədəb-ərkanla baş əyib gətirdikləri naməni padşahın qabağına qoydular. Padşah naməni oxumağı əmr etdi.

Orada yazılmışdı: - Ey Salsal, gəl müsəlmanlığı qəbul et, əgər qəbul etməsən hazırlaş, sənlə dava eləyəcəm.

Bu sözlər Salsalı elə götürür ki, az qalır hirsindən başı partlasın.

İstəyir ərəblərin başını vurdursun. Amma vəzir ağıllıydı, qoymayıb dedi:

- Qibleyi-aləm sağ olsun, elçiyə zaval yoxdur, bunların nə təqsiri var?

Padşah bu sözdən sonra ərəblərə bir məktub yazıb verir və yola saldırır.

Ərəblər bir neçə gündən sonra gəlib öz ölkələrinə çıxırlar və məktubu xəlifəyə verirlər.

Xəlifə məsələni biləndən sonra yol alıb Salsalın ölkəsinə gəlir. Salsal sərhəddə o qədər qoşun yığmışdı ki, otun-suyun sanı varıydı, amma qoşunun sanı yoxuydu.

Ərəb qoşunlarını görəndə Salsalın bir qədər rəngi qaçır. Xeyli fikir edir.

Salsalın Zərəngiz adlı gözəl-göyçək bir qızı var idi. Onun 17 yaşı yenicə tamam olmuşdu. Rəmmalığı da çox yaxşı bilirdi, həm də cadugər idi. Padşah qızı yanına çağırtdırıb dedi ki, ey mənim mehriban qızım, bir rəml at, görək bu işin axırı necə olacaq?

Qız bir rəml atır, amma rəngi saralır.

Atası soruşur:

- Hə, mehriban qızım, de görək rəngin niyə saraldı?

Zərəngiz cavab verir ki, atayi-mehriban, deyəsən ərəblər bizə qalib gələcəklər.

Elə bil Salsalı ildırım vurur. «Ey çəpəl, sən də ərəblərin sehrinə uydun», - deyib qıza bir şillə çəkir. Qız bihuş olub yıxılır.

Padşah əmr edir ki, bu çəpəlin boynunu vurun.

Vəzir qabağa yeriyib deyir: - Şah sağ olsun, hələlik əlini saxla, qoy görək bu işin axırı necə olur.

Salsal qızı zindana saldırır. Ertəsi gün Salsalın qoşunu ilə ərəblərin qoşunu qabaqlaşır. Qızğın dava başlanır. Hər gün ərəblər qalib gəlir. Salsalın qoşunu artıq davam gətirə bilmir. Onlar Şəhri-

zərrinə tərəf çəkilirlər. Axırda ərəblər lap qalaya yaxınlaşır. Salsal qoşunla bərabər qalaya girib qapını bağlayır.

Bir gün padşah əmr edir ki, qızı gətirin.

Zərəngizi gətirirlər. Bu dəfə Salsal üzünü qıza tutub deyir ki, bir rəml at, görək iş nə yerdədi.

Qız bir rəml atdıqdan sonra atasına deyir:

- Ata, istəyirsən məni tikə-tikə doğra, yenə sözün düzünü deyəcəyəm. Ərəblər sənə qalib gələcək və üç günə kimi şəhəri alacaqlar.

Şah qıza heç nə deməyərək fikrə gedir. Sonra başını qaldırıb soruşur:

- Ey mənim mehriban qızım, bəs indi tədbirin nədi?

Zərəngiz bir qədər fikirləşdikdən sonra deyir:

- Ata, sən bilirsən ki, mən həm rəmdar, həm də sehrkaram. İndi əmr et, üç günə kimi bir böyuk gəmi qayırılsın. Bütün lazım olan şeyləri o gəmiyə yığdır. Mən də bir sehr duası oxuyaram, qalanın içindəki tilsim qırılar. Orada böyük bir çay kimi bulaq əmələ gələr.

Elə də edir. Bu bulağın suyu yavaş-yavaş qalxaraq şəhəri basır. Elə bu vaxt qala qapısı ərəblər tərəfindən qırılır.

Qalaya daxil olan xəlifə nə görsə yaxşıdı. Görür ki, su yavaş-yavaş qalxıb şəhəri basır. Salsal isə böyük bir gəmidə əyləşib, günbatan tərəfə gedir.

Bir müddətdən sonra su böyüyüb bir dərya əmələ gətirir.

İndi o dərya Göy-Göl adlanır. Bax, Göy-Göl bu cür əmələ gəlib.

Ərəblər bu işə çox təəccüb edirlər.

### *69. Ağ dəvə gölü*

İki istəkli qardaş varmış. Böyük qardaşın Şahmar adlı oğlu, kiçik qardaşın Pərnaz adlı qızı varmış. Belə olur ki, kiçik qardaş ölür. Onun var-dövləti və külfəti böyük qardaşın ixtiyarında qalır. Uşaqlar böyüyür. Pərnaz fəhminən loğman kimi bir qız olur. O, çiçəklərin, güllərin, suların hansının hansı dərdin dərmanı olduğunu bilirmiş. Qızın gözəlliyi, ağlı, kamalı haqqında mahalda çox danışılır. Kəndin cavanları, o cümlədən öz əmisi oğlu Şahmar da qıza müştəri çıxır. Pərnazın dünyada zəhləsi getdiyi bir adam vardısa, o da əmisi oğlu Şahmar idi. Bu xəbər Pərnazın əmisinə də çatdı. Qəzəbləndi:

- Necə yəni, öz daşım, öz divarım; öz ocağımızı qoyub özgə ocağını yandırası deyilik ki?!

Bu sözlər Pərnaza təsir etmədi. Pərnaz öz anasına bildirdi ki, getsə bu kənddə Elyar adlı çobana gedəcək, getməsə də heç kəsə.

Əflan bu sözü eşidəndən sonra doğrudan da əfi ilana döndü.

Bir gün Əflan mahalda carçı səsi eşitdi:

- Camaat, İran şahı xəstədir. Kim onun dərdinə çarə etsə, şah onu dünya malından qəni edəcəkdir!

Elə Əflan bu sözü göydə axtarırdı, yerdə tapdı. Carçıya yaxınlaşıb dedi:

- Mənim qardaşım qızı Pərnaz loğmandır. O, otun da, suyun da, çiçəyin də dilini bilir.

Carçı şahın adamları ilə Pərnazın yanına gəldi. Pərnaz dedi:

- Ləzran kəndi yaxınlığında Abıdərdə çeşməsi var. Onun suyu doxsan doqquz dərdin dərmanıdır. İki kuzə su doldurun, ağzının tıxacını bulağın

ayağındakı yarpızdan edin. O suyu bir həftə içsə şahınız şəfa tapar.

Şahın adamları iki kuzə su götürüb İrana qayıdırlar. Doğrudan da Abıdərdə suyu şahın gözlərinə işıq gətirir.

Şah deyir:

- O qız mənim sarayıma gətirilməlidir.

Bu xəbəri eşidən Pərnaz deyir:

- Atamın var-dövləti əmimdədir. Mən şah sarayına cehizsiz gedə bilmərəm. Əmim Ağ dəvəni qızılla yükləsin, bu şərtlə ki, Ayna gölə qədər dəvənin ovsarın əmim oğlu Şahmar çəksin.

Qız xəlvətcə Elyara tapşırır ki, Ağ dəvəni möhkəm yemlə, duz ver, su vermə!

Elyar tapşırığa əməl edir.

Ağ dəvəyə iki tay qızıl yüklənir, üstündə də ağ donlu Pərnazı mindirirlər. Şahmar fikirli-fikirli Ağ dəvənin ovsarın çəkir. Ayna gölə çatanda susuz dəvə onları dartıb gölə salır. Ağ dəvə də, Pərnaz da, qızıl tayları da suyun dibində qalır, ancaq göl ləpələnib Şahmarın meyidini sahilə çıxarır.

Elə o gündən Ayna gölün adı dəyişib Ağ dəvə gölü olur.

### *70. Murana gölü*

Dağıstanda Murana adlı bir dağ var. Həmin dağın zirvəsində isə bu dağın adı ilə bağlı olan Murana gölü var. Gölün suyu h.əmişə göy rəngdə olur. Heç vaxt su azalıb, artmır. Suyu içməyə yararsızdır.

Bu göl haqqında müəyyən əfsanələr söylənilir:

Deyilənə görə həmin göldən dəfələrlə bir qoç sahilə çıxmış, sürüyə qarışıb otlamış və yenə gölə düşüb gözdən itmişdir.

Belə bir əfsanə söyləyirlər ki, qoyun otaran çoban, gölün sahilində əlində dəyənək dayanıb tamaşa edərkən dəyənəyi əlindən gölə düşür. O, dəyənəyi heç cür götürə bilmir.

Bir gün Şəkinin Babaratma kəndindəki bulaqdan bir dəyənək çıxır. Həmin dəyənəyi götürüb orada saxlayırlar. Bu xəbər hər tərəfə yayılır. İki il əvvəl dəyənəyi göldə batan çoban bu xəbəri eşidib bulağa gəlir. Çoban dəyənəyə baxan kimi tanıyır. Həmin dəyənək özünün gölə duşən dəyənəyidir. Deyilənə görə gölü əhatə edən dağ az-az aralanır. Əgər gölün suyu, dağın bir tərəfinin uçması ilə əlaqədar dağılarsa, ətraf mühiti dəryaya döndərər, tamam su basar.

### *71.Qırxqız gölü və Şahbulaq*

Gözəl yay günlərinin birində qoca bir çoban qoyun sürüsünü arandan yaylağa aparırdı. Sürü otlaya-otlaya güllü-çiçəkli bir yamaca qalxdı. Qoyunlar yaman susamışdı. Çoban yaxınlıqda qayaların arasında suyu göz yaşı kimi şəffaf, buz kimi sərin olan bir göl tanıyırdı.

Bu göl Qırxqız gölü adlanırdı. Sürü göldən su içməyə yönəldi. Qoyunlar sudan doyunca içib, otlağa daraşdılar. Çoban suda əl-üzünü yuyanda əlindən çomağı gölə düşdü. Nə qədər çalışdısa çomağı göldən çıxarda bilmədi. Çobanın çomağının toppuzu qurğuşundan, dəstəyi gümüşdən idi. Çoban kor-peşman ordan uzaqlaşdı.

Bu əhvalatdan iki il keçmişdi. Bir gün qoyunlar dağdan arana enəndə çoban öz çomağını başqa bir çobanın əlində gördü. Yaxınlaşıb dedi ki, əlindəki çomaq mənimkidir. Çoban dedi ki, bu çomaq heç vaxt sənin ola bilməz. Mən sürünü Şahbulaqda sulayıb otlağa ötürdüm. Sonra bulaqda əl-üzümü yuyanda suyun üzündə bir çomaq üzdüyünü gördüm. Özümü tez suya vurub çomağı götürdüm, sənin çomağın hara, Şahbulağı hara. İkinci çoban dedi ki, mən bu çomağı Qırxqız dağında Qırxqız gölündə əl-üzümü yuyanda gölə salmışam.

Bu əhvalat hər yerə yayıldı. Sonradan məlum oldu ki, Qırxqız gölü ilə Şahbulağın arasında yeraltı çay olubdur.

### *72. Qanlı çay*

Deyilənlərə görə, Teymurun və sevgilisi Fatimənin qanı ilə qızarmış suların adı həmin dövrdən Qanlı çay qalır.

İki aşiq görüşüb söhbət edəndən sonra Fatimə sabah yaylağa yola düşəcəyini deyir. Teymurun ürəyi sıxılsa da tezliklə yaylaqda görüşəcəklərini, toy vədəsini yadına salıb Fatiməyə təsəlli verir:

- Get, əzizim, gözlə məni. Ulu dağlar köməyin olsun!

Səhər günəş al üfüqdən boylananda yaylaq yolu ilə bir köç irəliləyirdi. Yaylaqda çadırlar quruldu, binələr salındı. Sərin yaylaq havasında hamı rahat nəfəs aldığı halda, sanki Fatimənin havası çatışmırdı. Fikirli halda Fatimə su səhəngini çiyninə salıb, saf suları ayna kimi şəffaf olan dağ çayına səmt aldı. Sevgilisindən ayrı düşməsi onun fikrini-huşunu tarmar etmişdi. Qaya cığırı sanki ayağı

altından qaçdı. Qayadan qoparaq köpüklü dağ çayının ağzına nə vaxt düşdüyünü hiss etmədi. Oba sakinləri Fatiməni ağır vəziyyətdə selin ağzından aldılar. Fatimə son nəfəsində aran yoluna göz dikib titrək dodaqlarında belə bir bayatı pıçıldadı:

***Əzizim, gözü yolda,***
***Dağ yolu gözü yolda;***
***Mən köçürəm dünyadan,***
***Yar qaldı gözü yolda.***

Bu vaxt heç nədən xəbəri olmayan Teymurun gözlərində sanki dünya qan rəngində görünürdü. Nədənsə bu dəm onun ürəyində Fatiməni görmək arzusu baş qaldırdı. O, yaylağa getmək istədiyini yoldaşlarına bildirib yola düşdü. Uzun yolu qısa elədi, yorğunluq hiss etmədən özünü yaylağa yetirdi. O, indi yalnız Fatimənin pıçıltılarını eşitmək arzusu ilə yaşayırdı. Ancaq alaçığın qarşısında toplaşmış qara geyinmiş oba əhlini görəndə beynində elə bil ildırım çaxdı. Su gətirən qızların dəstəsinə baxıb:

***Əzizim, şeh dumanı,***
***Yel əsdi, meh dumanı;***
***Hamının sonası burda,***
***Bəs mənim sonam hanı?-***

deyə fəryad çəkdi.

Onun fəryadına sanki müqəssir qayalar, daşlı dağ çayı əks-səda verdi. Fatimənin yoxluğundan xəbər tutan Teymur sevgilisinin qatili olduğu qayadan özünü çaya atdı. Bu vaxt ildırım çaxdı, göy gurladı, köksü qana boyanmış çayın suyu

köpüklənib daşdı, ətraf torpaqları öz qanlı dili ilə yalayıb apardı. Oba sakinləri Teymurun cəsədini qana boyanmış dağ çayının sularından xilas edə bilmədilər. Baharın bu şən çağında vaxtsız həyatdan getmiş bu iki nakam gəncin yasını tutudular.

Həmin bu dağ çayı o vaxtdan «Qanlı çay» adı altında bu günə qədər yaşamaqdadır.

Hər bahar çayın suyu aşıb-daşanda oba sakinləri iki gəncin nakam məhəbbətinə bais olan «Qanlı çay»ın axarına baxıb «Fatimə və Teymur» faciəsini yada salaraq dərindən köks ötürürlər.

### 73. *Mincivan bulağı və Tərtər çayı*

Belə deyirlər ki, dədə-babalarımız qədim zamanlardan at belində dəstə-dəstə gəzərmişlər. Əksər hissəsi cavanlardan olan bu dəstələr vətəni düşmənlərdən qoruyar, lazım gələndə həmvətənləri üçün xeyirli iş tutarmışlar. Belə igidlərimiz harada olurmuşlarsa yaxşı işləri ilə nəsillər üçün yadigar bir ad qoyarlarmış.

Hələ çox qədim zamanlarda vətənimizin ərazisində min igid cavandan ibarət bir dəstə çox məşhur imiş. Həmin cavanların yolu bir vaxt Şatırlıdan düşür. Öyrənirlər ki, kənd əhli içməli suyu çox uzaqdan gətirirlər. Min igid cavan kəndin kənarında, münasib yer seçib böyük dərə qazır. Dərənin dibindən bir neçə gur sulu bulaq çıxır. Deyirlər ki, camaatın hamısı gəlib buraya yaxın yerdə yaşayırlar. Yerli əhali bulağı qazanın adı ilə yeri Mincivan, bulağı isə Mincivan bulağı adlandırır. Həmin bulaq indi Mincivan bulağı kimi azacıq dəyişikliklə qalmaqdadır (Bərdənin Nazırlı kəndində).

Min cavandan ibarət olan igidlər, sonra başqa bir yerə getməli olurlar. Bu zaman da içməli su onlardan bir qədər uzaqda olub. Suyu qaldıqları yerə gətirənə qədər təbiiliyi dəyişirmiş, cavanların başçısı bir dəfə özü suyun ilk götürüldüyü yerə gəlib su içir. Su bu dəfə ona çox xoş gəlir. Ona görə də bulağın gözündən götürüb içdiyi suyu beləcə tər-tər adlandırıb. Çayın da adı dəyişdirilib, Tərtər deyilib.

### *74. Cirgiz çayı*

Deyilənə görə Cirgiz çayı çox böyük imiş. İndiki Cənyataq meşələri isə oralarda yox imiş. Bir dəfə bir dəstə quş çayın yaxınlığı ilə uçurmuş. Quşların hərəsinin ağzında bir meyvə tumu var imiş. Gözlənilmədən güclü qasırğa qopur. Qasırğa quşlara qanad çalmağa imkan vermir. Quşlar yerə enməyə məcbur olur. Quşların duman kimi yerə endiyini görən hiyləgər tülkü onların üstünə hücum çəkir. Quşlar yerdən tumları götürməyə macal tapmır. Güclü və amansız qasırğa nəticəsində tumlar hərəsi bir tərəfə düşür. Aradan bir neçə il keçdikdən sonra orada olduqca böyük bir meşə əmələ gəlir. Meşənin ağacları çayın suyunu özünə çəkir.

Çayın suyu get-gedə azalmağa başlayır. Bunu görən Cirgiz adlı bir şəxs çayın suyunun qurumasının səbəbini öyrənmək məqsədi ilə gəzə-gəzə meşəyə tərəf gedir. Oradan kəndə doğru uzun arx çəkə-çəkə gətirir. Susuzluqdan cadar-cadar olmuş torpaq sudan içdikdən sonra artıq qalan hissəsini arxla aşağı ötürür. Kənd camaatı birağızdan deyir: «Allah, sən Cirgizi anası Nabata

çox görmə». O vaxtdan həmin çayın adı «Cirgiz çayı» olaraq qalmaqdadır.

### *75.Fatma axan çay*

Qazax rayonunda Qaymaqlı kəndində «Fatma axan çay» adlı bir çay var. Onun haqqında bir əfsanə danışırlar.

İmran bəyin gözəl-göyçək bir qızı vardı. Qızın adı Fatma idi. Bir gün Fatma qızlarla meşəyə moruq yığmağa çıxır. Qızlar moruq yığa-yığa Fatmadan uzaqlaşırlar. Meşədə Fatmanı bir ovçu oğlan görür, bir könüldən min könülə aşiq olur. Fatma da oğlanı sevir. Onlar əhdi-peyman bağlayırlar ki, ölənəcən bir-birlərinə sadiq qalacaqlar. Fatma hər gün moruq yığmaq bəhanəsi ilə atasından icazə alıb qızlarla meşəyə gedər və özünün seçib sevdiyi oğlanla görüşərdi.

Qonşu bəyin oğlu Mahmudun da Fatmaya gözü düşür. Fatma nə qədər ağlasa da, onun sözünə baxmırlar. Fatma öz dərdini söyləmək üçün meşəyə Bəhramın yanına gedir.

Fatma onu bildirir ki, qalsam sənin, ölsəm qara torpağınam. Heydər bəyin oğlu da meşəyə ov etməyə çıxır; meşədə Bəhramla Fatmanı görür və deyir ki, necə olursa-olsun Bəhramı aradan götürməliyəm. Fatma Bəhramla vidalaşıb gedəndən sonra Mahmud gizləndiyi yerdən çıxıb Bəhramı arxadan vurub öldürür.

…Fatma çarəsiz qalmışdı, nə edəcəyini bilmirdi. Səhər Fatma qonşu kəndə gəlin köçməliydi. Kəndləri bir çay ayırırdı. Səhər açılır, Fatmanı gəlin aparmalı olurlar. Həmin gün də Bəhramın ölüm xəbərini Fatma eşidir. Fatma necə olursa-olsun

özünü öldürməyi qərara alır, evdən çıxıb çayın yanına gəlir və özünü çaya ataraq boğulub ölür. Həmin gündən bu çayın adı «Fatma axan çay» adlanır.

### *76. İlahi izin vermədi*

Kürün qırağında bir qardaş, bir bacı yaşayırdı. Bir gün oğlan xəyalını dəyişir və bacısına deyir:

- Mən səninlə evlənməliyəm. Qız nə qədər öyüd-nəsihət edirsə, oğlan yoluna düzəlmir. Nəhayət, qız oğla-nın qarşısına şərt qoyur. Əkdiyiniz bostandan qarpızın bi-rinin tağını ayır, Kürdən keçir, həmin qarpız çiçəkləyib bar gətirsin. O zaman ilahi bu işə icazə vermiş olar. Doğrudan da, oğlan tüngü ilə qarpız tağını o tay keçirir. Qarpız çiçəkləyir, bar gətirir. Oğlan gəlib bacısına deyir:

-İndi sözün nədir?

Qız deyir:

- Hələ qarpızları kəs görək.

Oğlan qarpızları kəsəndə birindən qan, birindən irin çıxır.

-Qardaş, sənin bu sevdan qan-irindir. Oğlan bu möcüzəyə baxıb, bacısından üzr istəyir, həmişəlik bu sevdadan əl çəkir.

### *77. Həmzə bulağı*

Rəvayətə görə, Qubadlı rayonunun Cijimli kəndində Həmzə adında bir oğlan yaşayırmış. Bir gün Həmzə yuxuda görür ki, onu Tərtərin Qarağaci kəndinə dəvət edirlər. Dəvət olunan məclisdə bir qız görür, bu qız Həmzənin çox xoşuna gəlir. Həmzə

ikinci gecə də yuxuda bir kişi görür. Kişi Həmzəyə deyir:

«Sən Qarağacı kəndinə get, orada oxu dərs al. Ziyandan çox-çox uzaq, xeyirə isə qat-qat yaxın olarsan».

Həmzə səhər yuxudan oyanan kimi heç fikirləşmədən kəndə yola düşür. Gəlib qızı gördüyü həmin evə çatır. Qızın adı Nigar idi. Sən demə Nigar da oğlanı, yəni Həmzəni yuxuda görübmüş. Nigarın da Həmzədən xoşu gəlmişdi. Nigarın atası mahalda tanınmış molla idi. Həmzə Nigarın atası ilə görüşüb hal-əhvallaşdıqdan sonra, bura gəlməyinin əsas səbəbini deyir. Molla Həmzənin fikri ilə razılaşır. Həmzə mollanın yanında qalıb oxumalı olur. Həmzə Nigargildə qaldığı müddətdə Nigarla sevişirlər. Hər iki gənc bir-birlərini görməyəndə dəli olmaq dərəcəsinə çatırdılar.

Ancaq bu sevinc uzun çəkmir. Nigarın yalvarış və etirazlarına baxmayaraq onu Nuru adlı bir oğlana ərə verirlər. Həmzənin eşqi ilə yaşayan Nigarın Nurudan oğlu və qızı olur.

Günlərin bir günü Həmzə səbəbini özü də bilmədən yolun kənarına çıxır və orda oturur. Sən demə, Nigar da qızlarla birgə obadan çox-çox uzaqda olan bulaqdan gəlirmiş. Qızlar Həmzənin bərabərinə çatanda qızlardan biri Həmzəyə deyir: «Həmzə, sən Nigarı çox istəyirsənsə, bu yaxın yerlərdən bir bulaq çıxart. Nə biz, nə də xəyalı ilə yaşadığın Nigar uzağa getsin». Gözünü Nigardan çəkməyən Həmzə Nigarın yolunda ölümə getməyə hazır idi. Odur ki, o əlindəki ağacı yerə vurur. Su ağaca bənd imiş kimi yerin dərinliklərindən fəvvarə vurub qaynamağa başlayır.

Nigarın əri Nuru bilirdi ki, Həmzə ilə Nigar bir-birini sevir. O, Həmzəni öldürmək, asudə nəfəs almaq üçün münasib vaxt axtarırdı. Nuru nə qədər çalışırsa, bu hissdən özünü xilas edə bilmir. Bütün vücudunu bürümüş bu qısqanclıq hissinin əlində əsir idi. Bir gün Nuru bir neçə adamla Həmzəni pusur ki, onu öldürsün. Onlar çayın yaxınlığında dərin bir uçuruma girib gözləyirlər. Bu vaxt Nigar xeyli qız ilə birgə moruq yığmağa gedirmiş, pusquda duranların oturduğunu görürlər və artıq Həmzənin ölüm dəqiqəsinin çatdığını zənn edirlər. Qızlar gəlib Həmzənin yanında dayanırlar. Qızlardan biri deyir: «Ay Həmzə, nə olar, bizi çayın o biri sahilinə keçirt». Həmzə tərəddüd etmədən qızların əlindən tutub bir-bir çayın o biri sahilinə keçirməyə başlayır. Çayın kənarında yalnız Nigar qalır. Pusquda duranlar, xüsusən də Nuru Nigarın bu üzdə Həmzə ilə tək qalmasına başqa məna verirlər. Qısqanclıq hissi Nurunu bürüyür. Həmzənin üstünə hücuma hazırlaşan Nurunu yoldaşlarından biri bir az gözləməyə məcbur edir.

Həmzə üzünü həsrətilə yaşadığı, indi isə özgə malı olan Nigara tutub deyir: «Nigar, heç vaxt mən sənə əlimi vura bilmərəm. Get, bir ağac gətir». Bunun səbəbini bilməsə də, Nigar etiraz etmədi. Gedib bir əyri ağac gətirdi. Həmzə bir əyri ağaca, bir də Nigara baxıb dedi: -Yox, bu ağac əyri olduğu üçün yaramaz, get düz ağac gətir. Nigar heç bir söz demədən gedib bir düz ağac gətirir. Düz ağacın bir ucundan Həmzə, o biri ucundan isə Nigar tutub çayın o biri sahilinə keçirlər. Pusquda duranlar Həmzənin necə pak vicdanlı insan olduğunun şahidi olurlar. Onlar nahaq qan tökmədikləri üçün xeyli

sevinib, düşdükləri axmaq fikirdən əl çəkib geri dönürlər.

# Çiçək və gül əfsanələri

### *78.Lala xaş-xaş əfsanəsi*

Əmi qızı ilə əmi oğlu bir-birini sevirmiş. Bir günləri, bir dəqiqələri belə bir-birindən ayrı keçmirmiş. Əmisi hər dəfə görəndə qardaşı oğluna deyirmiş:

-Hər nə olursa olsun, qızımı sənə verəcəm.

Qız yekəlib həddi buluğa çatır. Əmisi yavaş-yavaş onun ayaqlarını qardaşıgildən kəsir. Hər iki cavan aşıq dərd-qəm içində alışıb yanır. Onlara heç kəsdən imdad olmur. Bir gün qız məktub yazıb çox çətinliklə əmisi oğluna çatdırır. Oğlan məktubu oxuyub görür ki, əmisi qızı onu dağın ətəyindəki görüş yerinə çağırır. Qız gün - günorta gəlib çıxır vədə yerinə. Oğlan orada onu gözləyirdi. Onlar söhbət etdikləri zaman qəfildən bir oğlan gəlir. Bu, atasının onu nişanlamaq istədiyi oğlan idi. Qız görür ki, araya qan düşəcək. Ona görə əmisi oğluna deyir:

- Əmioğlu, sən məni bu dərədən aşağı at, qoy mən ölüm, bununla da hər şey bitsin.

Oğlan razı olmur. Qız özünü atmaq istəyəndə oğlan onun saçlarından tutur. Amma, onlar özlərini saxlaya bilmirlər, hər ikisi dərəyə düşüb həlak olurlar. Araya girən oğlan tutduğu işdən peşiman olub, özünü onların dalınca atır. O da ölür. Gənclərin öldüyü yerdə qırmızı ləçəkli çiçək bitir. Ləçəklərin ortasında qara saçaqlı tellər və bir düyməcik olur. Rəvayətə görə, düyməcik və qırmızı ləçəklər qızla oğlanın, qara tellər isə onları bir-birinə qovuşmağa qoymayan oğlanın qanından yaranır. Bu gülün adına «Lala xaş-xaş» deyirlər və o, ən çox uçurumlarda bitir.

## *79. Gəlinbarmağı*

Bir cavan igid öz arvadını çox sevirdi. Gəlinin zərif, şümşad barmaqlarını hər şeydən çox xoşlayırdı. Həmişə sevgilisinin incə əllərini oxşayır, anasına məhəl qoymur, oğlanın anası bunu duyur və gəlini oğlunun gözündən salmaq istəyir.

Bir gün gəlin yuxuda olanda zalım qayınana onun bir barmağını kəsib çölə atır ki, oğlu arvadının əlini şikəst görüb ondan iyrənsin.

Səhər açılır. Oğlan hamıdan erkən oyanıb həyətə çıxır. Orada təzə açılmış çiçək görüb təəccüblənir. Sonra sevincək arvadının yanına qaçır ki, çiçəyi ona göstərsin.

Gəlin məyusluqla barmağını ona göstərir... Sən demə çiçək onun barmağı düşən yerdə bitibmiş. O gündən sonra oğlan arvadıyla birgə həmin çiçəyi də sevməyə başlayır.

Guya elə ona görə də bu çiçəyin adı «Gəlin barmağı» qalıb.

## *80. Qızılgül əfsanəsi*

Uzaq keçmişlərdə bir varlı kişi yaşayırmış. Amma bu kişinin övladı olmurmuş. Bu səbəbdən o həmişə dərdli gəzib dolanarmış. Dünyanı yorub yola salmış nurani bir el ağsaqqalı ona məsləhət görür ki, insanları arzusuna qovuşduran Arzu dağına çıxsın, ona yalvarsın. Dağ daş olsa da qəlbi var, bəlkə arzunu yerinə yetirdi.

Kişi arvadını da götürüb Arzu dağına çıxır. Dağa ağız açır, ondan nicat diləyir. Aradan xeyli

keçir, ay parçası kimi bir qızları olur. Adını Qızıl qoyurlar.

Qızıl gündən-günə böyüyür, gözəlləşir, boylu, buxunlu bir qız olur.

Qızılgilin qonşuluğundakı kənddə mərdliyi, əliaçıqlığı ilə tanınan kasıb bir kişi yaşayırdı. Onun da gözünün ağı-qarası bircə oğlu var idi. Oğlanın adı Bülbül idi. Gözəl qamətli igid Bülbülün olduqca məlahətli səsi vardı.

Bir gün oğlanla qız görüşür, aralarında məhəbbət yaranır. Bülbülün səsində, sözündə yanğı artır.

Məhəbbətin alovuna tab gətirə bilməyən oğlan atasını elçi getməyə məcbur edir. Qızılın atası oğlanın sənəti, var-dövləti ilə maraqlanır.

Bülbülün atası:

- Aşiqdir! Sehrli mahnılarıyla daş ürəklərə həyat verir.

Elçinin sözlərinə Qızılın atası gülür:

- Mahnı çörək deyil!… Mən kasıba qız verمərəm. Əgər oğlun çalışıb var-dövlət qazansa, bu sevdaya razı olaram.

Bülbülü ayrılıq həsrəti kədərləndirsə də, o bu şərti qəbul edir. Qızılla vidalaşıb uzaq səfərə getməli olur. Qızıl and içir ki, ölənəcən məhəbbətinə sadiq qalacaq, oğlanın yolunu gözləyəcək.

Aradan xeyli müddət keçir. Bülbüldən xəbər-ətər çıxmır. Qızılı zorla bir varlı oğlana nişanlayırlar. Toya hazırlıq görürlər. Qızılın ağ əllərinə zorla xına yaxırlar.

Əlacı kəsilən Qızıl, əlləri xınalı Arzu dağına çıxır, üzünü ona tutub yalvarır:

- Ey arzusundan yarandığım Arzu dağı! Mən yanıram, sən də yan. Bu insafsızların, qəlbidaşların başına daş yağdır.

Dağ Qızılın dərdini başa düşür, onun halına yanır, tüstülü, dumanlı başı ağzını açıb od püskürür, zalımların, ürəyidaşların başına od ələyir.

Qızıl gözlərindən yaş axa-axa indi dağdan başqa rica edir:

- Bir sözümü də eşit. İndi mənim nə elim var, nə obam. Ata-anamı da itirdim. Bundan sonra mən insan kimi yaşamaq istəmirəm. And verirəm o sönməyən oduna-alovuna, məni məhəbbət qoxulu bir gül ağacına döndər. Bülbülün həyətində bitir.

Qızıl bir topa qızılgül koluna çevrilir. Bülbülün həyətində bitir. O, sevgilisi Bülbülün eşqi ilə hər bahar gözəl ağ çiçəklər açır, ətrafdakıları hicran qoxulu məhəbbətilə yandırıb-yaxır.

Vaxt olur bir gün Bülbül gəlib çıxır. O, kədərli, yanıqlı nəğmələrilə Qızılı axtarır, axtarır, amma tapa bilmir. Həyətlərindəki məhəbbət qoxulu qızılgülün ətri onu şübhələndirir. Qızılgül Qızılın ətrini verir. Tanıyıb bilənlər əhvalatı başdan-ayağa ona danışırlar.

Bülbül bundan çox qüssələnir. Bir neçə dəfə gül kolunun başına dolanır, sonra da xəncəri öz sinəsinə sancır, onun qanı gülün təzəcə açmış ağ ləçəklərini qırmızı rəngə boyayır. Ancaq Bülbülü ozünü öldürməyə qoymurlar.

Bülbül də başı alovlanan Arzu dağının görüşünə gəlməli olur:

- Ey Arzu dağı, daha nə qaldı, sən də yanıb Kuhi-pəz oldun! Bundan sonra mənim üçün insan kimi yaşamaq artıqdır. Məni bir quşa döndər, qoy

daim sevgilimin başına dolanım, ona nakam məhəbbət haqqında mahnılar oxuyum.

Bülbülün arzusu yerinə yetir. O, incə səsi, incə nəğməsi ilə cəh-cəh vuran quşa çevrilir. O vaxtdan bəri Qızılgül kolu qırmızı rəngdə çiçəklər açır.

### *81. Bənövşə əfsanəsi*

Bənövşə gözəl-göyçək bir qız idi. Mahaldakı cavanlar onun gözəlliyinə vurulmuşdular. Qış adlı soyuqqanlı, baxışında şaxta, gülüşündə sazaq oynayan bir oğlan ona sahib olmaq üçün dəridən çıxırdı. Qız isə heç nəyə məhəl qoymurdu, heç kimə öz qəlbini vermirdi. O, Bahar adlı bir gənci sevirdi. Bahar da onu. Onlar hər səhər günəşi birgə qarşılayırdılar. Ayın batmasına birgə tamaşa edirdilər.

Bənövşə bəy qızı idi. Bahar isə yoxsul bir ailədə böyümüşdü. Baharla Bənövşənin sevgisi səsə düşdü. Ay gecənin qulağına, Günəşin şəfəqləri səhərə onların məhəbbətindən danışdı. Çiçəklər çəmənə, bülbüllər güllərə onların məhəbbətindən söz açdı. Cavanlar tay-tuşuna, qarılar qocalara, onların məhəbbətindən danışdı. Bənövşənin qardaşları bunu eşidib onların məhəbbətinə mane olurlar. Qızı zorla Qışa nişanlayırlır və Qışın təkidilə Baharı bu mahaldan didərgin salırlar. Hər iki gəncin məhəbbəti payız gülləri kimi saralıb-solur. Qarlı-boranlı günlər isə onların görüşlərinə mane olur. O gündən Baharın ayrılığına dözməyən Bənövşənin boynu bükülür.

Deyirlər ki, hər il Bənövşə öz sevgilisi Baharın görüşünə hamıdan pünhan gəlir. Bahar isə öz gözlərindən leysan yağışı axıdaraq sevgilisini isladır.

Zalım Qış nə qədər onların görüşünə maneçilik törətsə də, heç vaxt Bənövşəni görə bilmir.

### *82. Şehli güllər içində*

Bir bağbanın cavan bir oğlu vardı. Oğul atasının sənətindən xoşlanmayıb tamam başqa peşəni, ovçuluğu seçmişdi.

Bir gün adətilə oğlan meşəyə ova çıxır. Xeyli gəzib-dolaşdıqdan sonra dincini almaq üçün oturmaq istəyir. Bu vaxt böyük ağacın altında gün kimi şölə saçan cavan bir qızın yatdığını görür. Oğlan yaxına gəlib qıza tamaşa edir. Qızın gözəlliyi onu valeh edir. Bir azdan qız oyanır. Görür ki, qarşısında bir cavan oğlan dayanıb aşiqanə nəzərlərlə ona baxır. O, xilaskarını tapmış kimi sevinir, cəld oğlandan soruşur:

- Sən kimsən? Burda nə gəzirsən?

Oğlan:

- Mən ovçuyam, ov əvəzinə sizi tapmışam.

Onlar bir qədər söhbət etdikdən sonra ayrılmalı olurlar. Oğlan görür ki, qızdan ayrılmaq ona asan olmayacaq.

Deyir:

- Biz bir də haçan görüşə bilərik?

Qız kədərli bir səslə dillənir:

- Mən ancaq sizinlə gecəyarı görüşüb, dan ulduzu doğandan sonra ayrılmalıyam.

Oğlan elə bilir qız kimdənsə ehtiyat edir, ona görə də onunla razılaşır. Bir müddət cavanlar gecə görüşür, səhərə yaxın ayrılırlar. Nəhayət, oğlan məhəbbətini qaranlıqdan işığa çıxartmaq qərarına gəlir, qıza onu sevdiyini, onunla evlənmək istədiyini söyləyir. Qız pərişan halda deyir:

- O xoşbəxt gün bizə nəsib olmaz…

Oğlan:

- Yoxsa məni sevmirsən?

Qız indiyə kimi oğlandan gizli saxladığı sirri açır:

- Mən tilsimliyəm. Bu meşədə bir qızılgül kolu var, üstündə də beş qızıl gül açıb. Mən sənin yanından gedəndən sonra həmin güllərə qoşuluram, oluruq altı gül. Bu güllərin üstündəki tikanlar, yarpaqlar eyni saydadır. Ləçəklərimiz də eyni rəngdədir. Bizi seçib ayırmaq çox çətindir. Əgər sən hünər sahibi olub məni o güllərin içindən tapıb üzsən tilsim sınar. Yalnız biz bundan sonra bir-birimizə qovuşa bilərik.

Oğlan hər dəfə dan ulduzu doğandan sonra meşəyə gəlir, nə qədər çalışırsa gülə dönmüş sevgilisini tapa bilmir. Axırda əlacsız qalıb başına gələn əhvalatları atasına-qoca bağbana danışır. Dünyagörmüş, ömrünü güllərin, çiçəklərin, ağacların yolunda kül eləmiş qoca bağban çətinlik çəkmədən müşkül işin açarını tapır:

- Oğul, dan ulduzu doğanda güllərə, çiçəklərə şeh düşür. Sən isə ulduz doğandan sonra ayrılırsan. Deməli, sənin gülün şehsiz qalır. Daha seçməyə, onu üzməyə nə var ki…

Oğlan ertəsi gün dan ulduzundan sonra gül kolunu tapır. Görür həqiqətən güllərin beşi şehli, biri isə şehsizdir. Oğlan öz gülünü tanıyır, sevincək onu üzür. Tilsim sınır, gül insana çevrilir. Bundan sonra onlar arzularına qovuşurlar.

### *83. Çobanyastığı çiçəyi*

Keçmiş zamanlarda bir varlı ağanın gözəl bir qızı olur. Ona hər yerdən elçilər gəlir, amma heç birinə getmir. Ağanın buna acığı tutur. Sən demə qız bir çobanı sevirmiş. Onlar əhd-peyman edirlər. Sevgililər gizlincə görüşürlərmiş.Qızın atası bir gün bundan xəbər tutub bərk qəzəblənir. Qızı yanına çağırıb deyir:

- Qızım,  bu nə işdir? Mən dediyimə getmirsən, çoban hara, sən hara?

Qız isə atasına deyir:

- Xeyr, ata, getsəm ancaq o çobana gedəcəyəm!

Ata qəzəblənir. Çobanı qovdurur. Qızı da heç yana buraxmır, bağlı yerdə saxlayır.

Çoban sevgilisindən uzaq diyarda ahu-fəğan içində gün keçirir. Nə rahatlıq, nə də yuxu bilməyən çoban getdikcə üzülüb əldən düşür. Onun əhvalatına yananlar, halına acıyanlar nə qədər dava-dərman edirsə, çoban yata bilmir. Onun bu niskili dildən-dilə düşüb sevgilisinə də çatır. Neyləsin, uzaqda olan sevgilisinə necə kömək əli uzatsın? Yalnız bir çarə qalır. İki diyarı birləşdirən çay onun köməyinə çata bilərdi. Qız onun sevdiyi, ilk dəfə dəmət bağlayıb çobana bağışladığı çiçəkdən gündə bir dəstə bağlayıb axar suya buraxır.

Çobanı havasını dəyişmək üçün çayın kənarına çıxarıblarmış. Birdən o dirçəlir. Gözlərinə işıq gəlir. Çayla axıb gələn çiçəyin ətri- sevgilisinin ətri onu cana gətirir. Çobanın xahişi ilə çiçək dəstəsini tutub ona verirlər. Çoban-aşiq çiçəkləri sevgilisi əvəzi bağrına basıb o ki var qoxlayır. Sonra onu başının altına qoyub dərin yuxuya gedir. Günlər keçir, sevgilisi tərəfdən yola salınan çiçək dəstələrini

gündüzlər iyləyir, gecələr yastıq əvəzinə başının altına qoyub yatır. O, tamamilə sağalıb ayağa qalxır.

Bir gün çoban çay kənarına gəlir. Gözləyir, gözləyir görür çiçək dəstəsi gəlmədi. İki gün keçir, çiçək dəstəsi gəlmir. Çoban bilir ki, sevgilisinin başında qəza-qədər var. Yol alıb doğma obalarına qayıdır. Sevgilisinin hicrana dözməyib tələf olduğunu görür. Çoban bu ağır dərdə dözə bilmir.

Deyirlər ki, o vaxtlar güllər solduqca çoban təzəsini dərib başı altına qoyar, yatarmış.

Həmin vaxtdan o çiçək «Çobanyastığı» adlanır.

### *84. Lalə əfsanəsi*

Deyirlər ki, Lalə gözəl, boylu-buxunlu, tayı-bərabəri olmayan bir qız imiş. Dərd, kədər, nə olduğunu bilməzmiş.

Günlər keçdikcə Lalə böyüyüb boya-başa çatır –onların da qapısını tez-tez elçilər döyür. Nəhayət, Laləni ürəkdən sevdiyi bir oğlana nişanlayırlar.

Vaxt çatır. Laləyə toy edirlər. Günlər ötdükcə Lalə daha şən, daha gözəl, daha qəşəng olur.

Bir gün Laləgilin yaşadığı şəhərin hökmdarı adamları müharibəyə aparır. Hökmdar carçılarla hər yana bəyan edir:

- Xoşbəxtlik, səadət, var, dövlət müharibədədir. Kim böyük sərvət sahibi olmaq istəyirsə, ömrünün axırına kimi firavan yaşamaq istəyirsə, hökmən qılınc götürüb qan tökməlidir.

Minlərlə Lalələr irəli durub ərlərini, sevgililərini vermək istəmir:

- Müharibə ancaq fəlakət, səfalət gətirir, ananı oğulsuz, arvadları ərsiz qoyur. Bizə yazığınız gəlsin,

rəhminiz olsun, gözümüzü yaşlı, bağrımızı qanlı qoymayın.

Hökmdar xalqın səsini eşitmir. Laləni sevgilisindən ayırırlar. Son anda Lalə deyir:

- Mən Baharın qızıyam. Geri qayıdanda məni tapmasan əlini üzmə, Baharda çəməndə axtar məni.

- Hökmən Baharda qayıdacağam!

Lalə həsrətlə Baharı gözləyir. Nəhayət, güllü-çiçəkli Bahar gəlir. Lalə sevgilisini düzənliklərdə, yolların kənarında qarşılamaq üçün qıpqırmızı donunu geyinib həsrətlə gözlərini uzaqlara dikir.

Lalə çox gözləyir, göz yaşları axıdır. Lakin sevgilisini gördüm deyən olmur. Dərd əlindən Lalənin bağrı qapqara qaralır. O, ayrılığa dözmür, göylərə yalvarır. Lalə qıpqırmızı donundaca çiçəyə dönür.

Bir gün Bahar vaxtı Lalənin sevgilisi miskin və yaralı halda qayıdır. Müharibə onu ömürlük bədbəxt, şikəst etmişdir. Oğlan nə qədər axtarırsa, Laləni tapmır. Görür başqaları da onun kimi öz lalələrini axtarır. Əlacsız qalıb çəmənə gəlir. Dizləri qatlanır, gözlərindən yaş axır. Görür ki, çəməndə minlərlə bağrı qapqara yanmış lalə ona baxır.

Bahar gələndə Lalə düzənliklərdə, yol kənarında, dağların döşündə bitərək sevgilisinin yolunu gözləyir.

## *85. Qızboyu çiçəyi*

Qızboyu sarı rəngli gözəl bir çiçəkdir. Bu çiçək haqqında rəvayət eləyirlər ki, guya Qızboyunu öz əmisi oğluna nişanlayırlar. Qızboyu isə atasının

çobanına könül verir. Ancaq valideynləri buna heç cür razı olmur. Çobanın eşqi Qızboyunu divanə eyləyir.

Qızboyu yaxşı duyur ki, onun saf məhəbbətini heç kim başa düşməyəcək. O, çox fikirləşir, çox götür-qoy edir, amma çobanla qovuşmağın yolunu tapa bilmir. Əlacsız qalıb özünü öldürmək istəyir. Birdən yadına düşür ki, çoban daim dağda, daşda, güllərin, çiçəklərin qoynundadır. Sevgilisi əlvan çiçəklərlə həmişə təmasdadır.

Qızboyu baş götürüb evdən – zülmün əlindən qaçır. Gözəl bir çəmənzarda oturub göylərə yalvarır ki, onu bir ətirli, rayihəli, əlvan çiçək eyləyib çəmənlikdə bitirsin, bəlkə bu yolla çobanla qovuşa.

Gözəl Qızboyu çiçək olub o vaxtdan çəmənlikdə bitir. Ətrindən sevgilisi olduğunu bilən çoban hər gün bu çiçəyin boynunu sevib, ətrini qoxlayır.

## 86. *Ağ gül və Bülbül*

Deyirlər ki, Ağgül güllərin ən gözəli, ən ətirlisi imiş. Bahar fəsli nazənin bir xanım kimi onu yuxudan oyadarmış. Torpağa söykənən, günəşin şəfəqlərinə bürünən, qoynu dolu buludların gürşad yağışlarını əmən Ağgül pardaqlananda bütün çəmənzar ona valeh olarmış.

Bir gün Ağgülün budağına xallı kəpənək qonur. Hələ o vaxt Ağgülün budaqlarında tikan yox imiş. Çünki baharın tacı hamıya inanırmış. Kəpənək dilini işə salıb Ağgülün sadə qəlbini ələ alır:

- Mən ala kəpənəyəm. Bütün güllərin, çiçəklərin rəngi məndə olsa, özümü xoşbəxt

sanaram. Həmişə budağına qonub, ətrinə məst olub sənə sədaqətimi bildirərəm. Səxavətini əsirgəmə.

Ağgül ona inanır, ağ rəngindən Kəpənəyə də pay verir. Məqsədinə çatdıqdan sonra Kəpənək Ağgülü unudur.

Bir müddətdən sonra xırda bir arı vızıldayıb onun tikansız budağına qonur. Arı da kəpənək kimi şirin dilini işə salır.

- Mənim şakərim bütün çiçəklərin, güllərin şirəsini dadmaqdır. Əgər belə olmasa, mən o saat ölərəm. Mənə rəhm edin, qısa ömrümə qıymayın, şirənizdən bir az əta eləyin. Sizin yaxşılığınızı unutmaram. Həmişə buda-ğınıza qonub vızıldayaram – sədaqətimi bildirərəm.

Ağgül arının da xətrinə dəymir. Onu razı yola salır. Ancaq işi düzələn arı bir daha geri qayıtmır.

Xallı kəpənəyin və arının vəfasızlığı Ağgülə bərk təsir edir. Özünə söz verir ki, bir daha heç kimə inanmayacaq, şümal budaqlarında tikanlar bitirəcək. O, dediyi kimi də edir.

Necə olursa, şeyda bülbül çəmənzarda Ağgülə rast gəlir. Yaraşıqlı, boy-buxunlu, ətirli və ağ çiçəklərini görən kimi şeyda bülbül ona bir könüldən min könülə aşiq olur. Çağırır, Ağgül başını qaldırmır. Budağına qonmaq istəyir, tikanları yaxın buraxmır. Əlacsız qalan şeyda bülbül Ağgülün başına fırlanır, ona yanıqlı ürəyindən gələn məhəbbət mahnıları oxuyur. Xallı kəpənəyin və arının vəfasızlığını görən Ağgül şeyda bülbülün məhəbbətinə, sədaqətinə inanmır.

Sevdalı bülbül daha da cuşə gəlir, özünü sevgili-sinin ağuşuna atır. Tikanlar onun eşq ilə çırpınan qəlbini qana boyayır. Ağgül öz amansızlığından peşman olursa da, artıq gec olur.

Şeyda bülbülün məhəbbəti olan al qanı Ağgülə hopur. O vaxtdan çiçəkləri qırmızı açılır. Qızılgül olur.

### 87. Şeşənbülbül çiçəyi

Bu çiçək Xaldanda Əlcən çayının sahillərində bitir.

Belə deyirlər ki, Şeşən adlı bir gənc oğlan gül-çiçək vurğunu imiş. O, Əlcən çayının sol sahilində bir bağça düzəldir, orada növbənöv güllər, çiçəklər əkir. Oğlan güllərə, çiçəklərə nə qədər bağlı imişsə, sevgilisi Küsərə belə şeylərdən bir o qədər uzaq imiş.

Şeşən öz könlünü bir çiçəyə veribmiş. O, eyni vaxtda hər gün bağçada oturub həmin çiçəyə tamaşa edərmiş. Bu çiçəyə o qədər vurğunluqla tamaşa edərmiş ki, sanki canlı aləmi unudarmış.

Sevgilisinin bu gözəllik aləminə biganəliyi onu üzərmiş.

Bir dəfə Şeşən yenə də bağçada təkcə oturub həmin çiçəyə tamaşa edirmiş. Onun gözləri heyrətdən böyüyür, çiçək dönüb bülbül olur. Bülbül bir neçə dəfə cəh-cəh vurduqdan sonra yenə dönüb çiçək olur.

Bundan sonra Şeşənin əhvalı dəyişir. Nə vaxt ki, bağçaya tək gəlir, çiçək dönüb bülbül olur, cəh-cəh vurub oxuyur, Şeşənin qəlbi açılır, şadlanır. Elə ki, sevgilisi ilə gəlir, çiçək tərpənmir, dönüb bülbül olmur. Bu hal Şeşəni qəmləndirir, məyus edir. Bunu bildiyi üçün Küsərə bir daha Şeşənlə bağçaya gəlmir.

Şeşən hər gün bundan sonra bağçaya tək getməyə başlayır, yenə də çiçək gözündə bülbül

olur, xoş mahnılar oxuyur. Oğlan sevgilisini tamamilə unudur, öz qəlbini birdəfəlik bu çiçəyə verir.

Çox çəkmir ki, el-oba bundan xəbər tutur. Həmin çiçəyin adını «Şeşənbülbül çiçəyi» qoyurlar.

### *88. Bənövşə əfsanəsi*

Deyirlər ki, gözəl, güllü-çiçəkli bir çəməndə bənövşə adlı bir çiçək bitir. Bənövşə nə zarafatcıl qızılgülə, nə də çox danışan sarmaşığa bənzəmirdi. O, çox ağıllı, tədbirli bir gül idi. Bir gün çəmənə səs düşdü ki, quşların ən gözəli olan bülbül bənövşəyə vurulub. Bütün güllər mat qaldı. Axı, bülbül qızılgülün aşiqi idi. Xəbər bütün laləzara yayıldı. Həmin vaxt bənövşəni qara kol da sevirdi. Bənövşə qara kolu bəyənməyib ona həmişə istehza edərdi. Öz gözəlliyi ilə fəxr edən bənövşənin gözündə kol laləzarı pis göstərən alaq idi. Xəbər bənövşəyə çatdı. Bənövşə bülbülün sevgisinə sidq ürəklə razılıq verdi.

O, qara kolun acığına bülbülü daha çox sevməyə başladı. Kol bütün bunları seyr etdikcə qəlbən bənövşənin halına yanırdı. Axı, o bülbülün vəfasızlığına bələd idi. O, öz saf məhəbbətini qəlbində boğub bütün bu sevdanın axırını gözləməyə başladı. Hər gün bənövşə ilə bülbül gəzintiyə çıxırdılar. Bir gün onlar yenə gəzməkdən gəlirdilər. Güclü külək başlamışdı. Onlar özlərini çəmənə çatdıra bilmədilər. Bənövşə artıq əldən düşmüşdü. Külək də getdikcə güclənirdi. Bunu görən bülbül özünü çiçəklərin arasına verdi və

küləkdən qorundu. Ucsuz-bucaqsız çəməndə tək qalan bənövşə kökündən az qalırdı ki, qopsun.

Külək onun zərif ləçəklərini yolur, bənövşə köməyə çağırır, ancaq onun harayına heç kim gəlmirdi. O, son gücünü toplamışdı. Bunu uzaqdan seyr edən qara kol özünü bənövşənin harayına yetirdi. Bənövşə başını aşağı əyib onun köksünə sığındı. O vaxtdan o, xəcalətindən başını da qaldırmır, həmişə başıaşağı kola söykənir.

### *89. Köksü qaralan lalə*

Bir dəfə Lalədən soruşurlar:

- Lalə, sənin ki, rəngin qırmızıdır, bağrın nə üçün qaradır?

Lalə onlara belə cavab verir:

- Bir gün bir maral ətrafına boylana-boylana mənə tərəf gəlirdi. Nə üçünsə maral hürkmüşdü. Mən ona heyranlıqla baxırdım. Bu vaxt bir inilti eşitdim, zalım ovçu ox ilə maralı yaralamışdı. Onun qanı mənim ləçəyimin üzərinə tökülürdü. Ləçəklərim al qana boyanmışdı. Mən ləçəyimə tökülən qanı silməyə hazırlaşırdım. Onun qəlbindən ürəkləri yandırıb-yaxan bir ah qopdu. Mən ona baxdım və təəccübdən yerimdə donub qaldım. Qarşımda can verən, bayaqkı çöllər gözəli yox, bir gözəl qız idi. Onun çəkdiyi ahdan köksüm yanıb qaraldı.

### *90. Lalədə qara xal*

Keçmiş zamanlarda kasıb bir kişinin övladı olmurmuş. Bir arzusu varmış, o da övlad imiş.

Vaxt olur ki, kişinin bir qızı olur. Qız gündən-günə böyüyür, həm də gözəlləşir. Qızın adını Lalə qoyurlar. Bu da ona təsadüfən qoyulmamışdı. Qızın yanaqları qırmızı imiş. Qıza çox yerlərdən elçi gəlir. Lalə onların heç birinə razılıq vermir. Öz kəndliləri bir oğlana könül verir. El adəti ilə toy edib Laləni sevdiyi oğlana verirlər. Lalə xoşbəxt olur. Lalə altı uşaq anası olur. Onun sevinci yerə-göyə sığmır. Ancaq bu sevinc uzun sürmür. Davalar başlayır. Ananın dörd oğlu döyüşə gedir. Müharibə qurtarır. Oğulların heç biri geri qayıtmır. Buna baxmayaraq ana ümidini kəsmir, hər bahar çağı dağlara, yollara çıxır, oğullarının yolunu gözləyir. O, dərdini kimə desin. Çöldəki qırmızı çiçəklərdən başqa özünə pənah yeri tapmır. Ana sızlayır, ağlayır, onun gözlərindən axan yaş əlindəki lalənin üstünə düşür və qara xal əmələ gətirir. Elə o vaxtdan lalə qara xallı olur. Bu qara xal ananın ürəyindən qopan ah-naləsi, dərdi-qəmi idi.

### *91. Yeddi il solmaz çiçək*

Belə rəvayət edirlər ki, Kəsəmən kəndində çox zalım bir xan yaşayırmış. Xanın var-dövləti həddini aşmışdı. Xanın Natəvan adlı gözəl və ağıllı bir qızı varmış. Xan da öz qızını çox istəyirmiş, onun bir sözünü iki eləməzmiş. Deyirlər xan qəzəblənəndə qızının sözlərinə qulaq asıb sakitləşərmiş.

Xanın qızını Əsəd adlı bir kasıb oğlan sevirmiş, qız da onu sevirdi. Bir gün xan bu məsələdən xəbərdar olur. Oğlanı tutdurub öldürmək istəyir. Xanın vəziri məsləhət görür ki, oğlanı öldürməkdənsə gedər-gəlməz bir səfərə göndərsin. Məsləhət xanın ağlına batır. Oğlana deyir ki, Sevan

gölündə qızıl bir balıq var, kim bu balığın ətindən yesə, heç vaxt qocalmaz, həmin balığı tutub gətirsən Natəvanı sənə verəcəm.

Oğlan xanla razılaşıb balığın dalınca gedir. Aylar, illər ötür, oğlansa geri qayıtmır. Xan qızı Natəvan yeddi il oğlanı gözləyir. Yeddi il tamam olduqdan sonra xan qızını zorla öz əmisi oğluna ərə verir. Toy gecəsi qız Allaha yalvarır ki, onu gülə döndərsin və o, bundan sonra da yeddi il sevgilisinin yolunu gözləsin. Allah onun sözlərini eşidib qızı incə bir çiçəyə çevirir ki, bu çiçək yeddi il solmur.

Qızın yoxa çıxmasını eşidən xan çox peşman olur və Allaha yalvarır ki, ona ən ağır cəza versin. Allah xanı şahmar ilana döndərir. Həmin gündən şahmar ilan kimin evində həmin çiçəkdən görürsə ona ziyan vurmur və həmin ailəyə toxunmadan gedir.

Deyilənlərə görə, indinin özündə belə ilanlardan ziyan çəkməmək üçün xalq yeddi il Solmaz gülü saxlayır.

### *92. Bənövşə əfsanəsi*

Qədim zamanlarda bir zalım padşah var imiş. Çox qəddar adam imiş. O, istədiyi adamı özünə nökər edərmiş, işgəncə verərmiş, istədiyi qızı, gəlini öz sarayına gətirdərmiş. Bu mahalda bir qız yaşayırmış. Adı Bənövşə imiş. Bircə qoca anası var imiş. Çox kasıb dolanırmışlar. Qız qənirsiz gözəl olduğundan anası həmişə onun dərdini çəkirmiş ki, şah görsə onun da qızını əlindən alacaq. Qapı döyüləndə ananın ürəyinə od düşürmüş. Dərd çəkməkdən ananın başı ağappaq idi. Bir gün şah vəziri ilə yoldan keçəndə həmin qızı görür. Bir qədər

durub baxır. Vəzirindən bu qızın kim olduğunu öyrənir. Qız da başa düşür ki, şah onu gördü. Həmin gündən qız bikef hərlənir, gizli-gizli ağlayır. Anasının boynunu qucaqlayır. Bu dəqiqə gəlib onu aparacaqlar qorxusu ilə yaşayır. Gecələr Allahdan kömək diləyir. Anasına bildirmir ki, o da dərd-qəm çəkəcək.

Bir neçə gündən sonra şahın adamları gəlib qızı zorla anasının əlindən alıb aparırlar. Ana dərdə dözə bilməyib ölür. Qız da gününü göz yaşı ilə keçirir. Bir gün şahın kənizləri gəzməyə çıxanda qız da onlarla getməyə icazə istəyir. Şaha söz verir ki, bundan sonra onun bütün dediklərinə əməl edəcək. Qızın gözəlliyi şahı yumşaldır və onlarla getməyə icazə verir. Bənövşə kənizlərdən gizlin ayrılır. Gəlib anasının qəbrini tapır. Oturub doyunca ağlayır. Anasının qəbri bir kolun yanında idi. Qız oturur kolun dibində, Allaha yalvarır ki, məni ya daş elə, ya da bir gülə çevir, həmişə bu kolun dibində qalım, anama doyunca baxım. Qız gülə çevrilir. Boynubükük bənövşə o gündən kolun dibində bitir. Yenə də anasına baxmaqdan doymur.

### *93.Ceyrançöl əfsanəsi*

Belə deyirlər ki, keçmişdə lalələr ağ bitərmiş, yaz gələndə çəmənlər ağ örpəyə bürünərmiş. Külək vuranda ağ laləzar düzən ağ dalğalı dənizi andırarmış. Hər şeydən əvvəl ağ laləzarın vurğunu ceyranlar imiş. Ağ laləzar günahsız ceyranın ağ dünyası, əmin-amanlığı, rahatlığı, pənah yeri imiş.

Bir gün zalım bir ovçu balasını otlağa çıxaran ana ceyranın izinə düşür. Təhlükə hiss edən ceyran

balası ilə birlikdə ağ laləzara pənah aparır. Ovçu da ceyranların arxasınca döşənir. Lalələr qovulan ceyranları gördükdə onları ovçunun iti gözlərindən gizlətməyə çalışırlar. Amansız ovçu hərisliyindən əl çəkmir, inadla ağ lalələri bir-birinə vurub ceyranları axtarır. Ana ceyran balasını lap təhlükəsiz yerdə gizlədib, həmin səmti yayındırmaq üçün ovçunu çaşdırmağa çalışır. Nəhayət, ovçu ana ceyranı tapır. Fürsəti fota verməyib dərhal atəş açır. Bilir ki, bala ceyran anasının iniltisinə, ah- fəryadına, faciənə ölümünə dözməyib, üzə çıxacaq. Lakin ana ceyran ovçunun arzusunu gözündə qoyur. O, balasının xatirinə hər cür əzablara, ağrılara dözür, ancaq inildəmir, səsini çıxarmır. Səssiz- səmirsiz başının üstündə duran ovçuya nifrətlə, qəzəblə baxan ceyranın yaralarından qan fışqırıb ağ laləri qırmızı rəngə boyayır. Ana ceyranın fədakarlığına, dözümünə, dərdinə dözməyən laləzar yanıqlı bir ah çəkir. Bu ahdan qırmızı ləçəklərin bağrı yanıb, qaralır. O vaxtdan lalələrin ahdan bağrı qara, ləçəkləri ceyran qanından al olur. Bundan sonra onlara «bağrı qara- al lalələr» deyirlər. Ana ceyranın bala dərdi ilə düşüb, öldüyü yer isə «Ceyrançöl» adlanır.

# Quş və heyvanlar haqqında

### *94. Qızılquş əfsanəsi*

Padşah səyahətə çıxır. Səyahətdə onun diqqətini ən çox cəlb edən Qızılquş olur. Öz-özünə deyir: «Bütün heyvanlar içərisində Qızılquşdan gözəl ömür sürən başqa bir heyvan yoxdur».

Padşah səyahətdən qayıdan kimi ovçulara əmr edir ki, onun üçün bir Qızılquş tutub gətirsinlər.

Ovçular padşahın əmrini yerinə yetirirlər. Padşah Qızılquşu qəfəsə saldırır və ona nəzarətçi təyin edir.

Bir müddətdən sonra padşah quşlarda etibar olub-olmadığını yoxlamaq məqsədilə onu qəfəsdən açıb buraxdırır.

Qızılquş gəlib dəstəsinə qovuşur. Quşlar soruşur ki, padşah nə əcəb səni açıb buraxdı? Qızılquş cavab verdi:

- Padşah mənim etibarımı yoxlayır. Mən mütləq onun yanına qayıtmalıyam. Özü də ona dünyada tayı -bərabəri olmayan bir hədiyyə aparmalıyam.

Dostları Qızılquşa deyirlər ki, Əlçatmaz dağın başında bir alma ağacı var. Onun meyvəsini qoca adam yesə, dönüb on beş yaşında oğlan olar. Həmin ağacın bir budağını padşaha hədiyyə ver.

Qızılquş Əlçatmaz dağına qanad çalır, alma ağacının bir budağını qırıb padşaha gətirir. Padşah deyir:

- Ay Qızılquş, bu gətirdiyin hədiyyə nədir?

Qızılquş cavab verir:

- Bu alma ağacının budağıdı, özü də sirlidi. Ağac ildə üç dənə alma verir. Yaşlı adam onu yeyən kimi on beş yaşında oğlana dönür. Bu ağacı bağçanın elə bir guşəsində əkməlisən ki, heç kəs onu görə bilməsin .

Padşah Qızılquşdan razı qalır. Budağı bağbana verir, gizli bir yerdə əkməsini məsləhət görür.

Nəhayət, vaxt gəlib çatır. Budaq böyüyüb ağac olur. Ağacda üç dənə alma yetişir. Bağban almalardan birini dərib padşaha aparır. Yolda ona vəzir rast gəlir, bağbanı dilə tutub deyir:

- Bağban, bir gör bu alma necə də yaraşıqlı, gözəl, ətirlidi. Arvadım xəstədi, əgər aparıb ona göstərsəm, bil ki, o saat ayağa durar.

Vəzir bu fel ilə almanı bağbanın əlindən çıxarıb evinə aparır. Orada almanı iynə ilə zəhərləyir, sonra qaytarıb bağbana verir. Bağban da padşaha gətirir. Padşah almanı diqqətlə nəzərdən keçirir. Baxır ki, bu qeyri- adi almadı. Ona görə şübhələnir, almadan bir az kəsib ev heyvanına verir. Heyvan dərhal ölür. Padşah qəzəblənir və Qızılquşun boynunu kötüyün üstünə qoydurur. Qorxuya düşən bağban tez bağçaya qaçır, yerdə qalan almanın birini yeyir ki, ölsün. Amma əvəzində on beş yaşında cavan oğlana dönür və dərhal padşahın yanına qayıdır. Padşah arada xəyanət olduğunu anlayır, Qızılquşu öldürtdüyünə heyfsilənir. Məsələdən hali olmaq üçün bağbandan soruşur ki, bağçadan onun yanına gələndə qarşısına kim çıxmışdı. Bağban cavab verir ki, vəzir. Padşah Qızılquşun intiqamını ondan almaq üçün vəziri zindana saldırır.

### *95. Ovçu Pirim və Xan Kəlbi*
### (birinci variant)

Ovçu Pirim bütün canlıların, hətta bitkilərin, ağacların dilini bilirmiş. Bütün quşları və heyvanları səsindən tanıyırmış. Onun qardaşı Xan Kəlbi (ikinci adı Kərənədir) bütün heyvanların səsini çıxara bilirmiş.

Bir gün Xan Kəlbi qardaşı Ovçu Pirimə deyir ki, gəl, birlikdə meşəyə ova çıxaq. Ovçu Pirim bildirir ki, qardaş, oturduğun yerdə otur, qəlbimə dumanlı

şeylər gəlir. Xan Kəlbi bildirir ki, olan şey deyil, mən bu gün səninlə ova getməliyəm. Xan Kəlbi qardaşından xeyli aralanıb, cəngəlliyə girir. O, meşə xoruzunun ətinə tamarzı imiş. Tüfəngi nişanlayıb atır və qardaşı Kərənənin səsini eşidir. Gəlib görür ki, qardaşını güllə ilə vurub öldürüb. Ovçu Pirim burada üç bənd şeir söyləyir. Heyf ki, bizə onun iki bəndi gəlib çatmışdır:

***Bu gün nəs günüdü, mən çıxdım ova ,***
***Ruzigar çevrildi, bəd oldu hava,***
***Çaxmağı çəkəntək od düşdü qova,***
***Hayıf oldu, Xan Kəlbini öldürdüm!..***

***Tüfəng, səni zərgərlərə düzdürdüm,***
***Boğazına qızıl üzük saldırdım ,***
***Tərifini ucalara qaldırdım,***
***Hayıf oldu, Xan Kəlbini öldürdüm!..***

### 96. *Bülbül və qızıl.*

Bir varlıya bildirdilər ki, bir bülbül peyda olub, bədənində iki kiloqram qızıl var.

Bir tamahkar tələ qurub bülbülü tutdu. Bülbül gördü ki, onu öldürəcəklər, dilə gəlib dedi:

- Mənim heç 200 qram çəkim yoxdur. Amma mən qızılın yerini bilirəm. Məni burax. Hansı ağaca qonsam bil ki, qızıl onun dibindədir.

Bülbül əldən çıxan kimi bir ağaca qonub dedi:

-Məndən sənə bir nəsihət, hər deyilənə inanma.

### *97. İlan və bağban*

Şahın bağında yaşayan qızıl ilanın balasını bağban bel ilə kəsib öldürdü. Şahın qapıçısı həyəcanla bildirdi ki, hökmdar sağ olsun, möcüzə baş verib, sizə şikayətə qızıl ilan gəlib. Şah dedi ki, burax gəlsin. İlan daxil olub şaha bildirdi ki, qibleyi-aləm sağ olsun, bizim nəslimiz əyyami -qədimdən şah bağında yaşayır. Qızıl güllərin ətri bizə bəsdir. Biz bir bəni–insana toxunmuruq ki, şah bizim nəslimizi yer üzündən silər. Lakin sizin bağbanınız mənim balamı heç bir günahı olmadan öldürüb. Şah bağbanı çağırtdırıb, ilanın dediklərinin həqiqət olduğunu biləndən sonra dedi:

- Sənə rüsxət verirəm, bunun harasından çalırsan, çal.

İlan dedi:

- Mən onu öldürməyəcəyəm. Qoy o yeddi qapıdan dilənçi payı alsın.

Bağban altı qapıdan dilənçi payı aldı. Yeddinciyə çatanda ilan onu çaldı. Şah ilanı hüzuruna çağırtdırıb dedi:

-Axı sən dedin ki, o, yeddi qapıdan dilənçi payı alsın və belə olsa, onu çalmayacaqsan.

İlan bildirdi ki, hörmətli hökmdar, mən onu sizə demədən də çala bilərdim. Ancaq onun üzündə o qədər həya, nur var idi ki, o nurdan gözüm qamaşırdı. Lakin yeddi qapıdan dilənçi payı alandan sonra onun üzündə bir damcı nur qalmamışdı. Ona görə də mən onu asanlıqla çaldım.

### *98.Bülbül və qoca*

Belə deyirlər ki, bir bülbül ağacın budağına qonubmuş, bir cavan da ağacın dibində tələ qururmuş.

Bülbül cavandan soruşur:

-Nə iş görürsən?

Cavan cavab verir:

-İstəyirəm bir quş tutam.

Bülbül gülür, deyir:

-Məgər quş sənin dənindən ötrü özünü toruna salacaq?

Cavan köksünü ötürüb deyir:

-Ay bülbül, qəzavü -qədər elə gətirər ki, sən özün də bu tora düşərsən.

Bülbül:" Ay düşdüm ha..."- deyib uçur, gedir.

Cavan tələni qurur, dənləri səpir. Xəlvət bir yerə çəkilir. Bu söhbətdən az sonra həmin bülbül şığıyıb yerə qonur. Ağacın dibinə gəlir. Başlayır dənləri dimdik-ləməyə. Birdən ayaqları tələnin gözlərinə düşür. Ha çır-pınır çıxsın, canını qurtarsın, lakin o dartındıqca tələnin gözləri daralır, onun qılçalarını daha bərk sıxır.

Cavan gəlib onu tutur. Görür ki, həmin bülbüldür.

Deyir:

-Ey bülbül, bayaq dedimmi, qəzavü-qədər elə gətirər gözün bağlanar, sən özün də bu tora düşərsən? İndi bəs necə oldu, o xırda dənləri gördün, amma bu yekəlikdə tələni görmədin?

Bülbül çox yalvarır, cavan vecinə almır, onu qəfəsə salıb, bazara gətirir, yaşlı bir kişiyə satır.

Kişi onu götürüb evinə apararkən, bağdan keçəndə Bülbül deyir:

-Ey insan, mənim balalarım var, onların ruzi-sindən ötrü bu qəfəsə düşmüşəm. Əgər məni

buraxmağa söz versən sənə üç nəsihət söz deyərəm.

Qoca ondan "balalarım var" sözünü eşidən kimi istəyir qəfəsi açıb, bülbülü buraxsın, lakin fikirləşir ki, bəlkə xeyirli bir şey deyəcək, qoy danışdırım.

Bülbül öz şərtlərini bildirir:

- Birinci qəfəsdə, ikinci sənin əlində, üçüncünü budaqda deyərəm.

Qoca yenə etiraz etmir.

Bülbül deyir:

-Əgər qəzavü-qədər əlindəkini-əlindən alsa, ona heyfsilənmə, çünki geri qayıtmaz.

Qoca şərtə görə bülbülü qəfəsdən çıxardıb, ovcunda saxlayır.

Bülbül ikinci nəsihətini deyir:

- Hərgah bir adamdan havayı söz eşitdin, ona inanıb ümidli olma.

Qoca bülbülü buraxır.

Bülbül budağa qonub üçüncü nəsihətini söyləyir:

-Hər şeyə tamah salma, tamahın bəlasına düşər, xar olarsan, el içində xar olmaq ölümdən betərdir.

### *99.Qarğa öyüdü*

Qarğa öz balasını pərvazlandırmaq istəyəndə ona dedi:

-İnsan ki, var, bizim qənimimizdir. Gərək həmişə özünü ondan qoruyasan. Elə ki, gördün əyilir, gərək qaçasan, əyilirsə, deməli, yerdən daş götürür.

Bala qarğa deyir:

- Əyiləndə nədi, olmaz ki, insanın qaraltısını görən kimi qaçım?

Ana qarğa sevincək:

- Mənim ağıllı balam, düz deyirsən, sən məndən çox yaşayacaqsan, insanın elə qaraltısını görən kimi qaçmaq lazımdır.

### *100. Səməndər quşu*

Səməndər guya qarlı-buzlu ölkələrdə yaşayan qar quşudur. Özü də gödək ömürlü quşdur… Bu quşun dimdiyi polad, caynaqları çaxmaqdaşı, tükü isə qovdur. Səməndər quşunun iki balası olur. Balalar bir ilə pərvazlanır. Səməndər quşu balaları pərvazlanıb uçan gün sevincindən hər şeyi unudur, dimdiyini caynağına vurub od saçır, onun qov tükü həmin oddan alışır. Səməndər quşu yanıb kül olur.

### *101. Səməndər əfsanəsi*

Şirvan mahalında Səməndər adlı igid bir oğlan vardı. Ovu gözündən, vururdu. Yerişinə at çatmazdı, qaçarağına quş. Bircə saatda dağlara qalxıb buz, arana enib mer-meyvə gətirərdi. Xəstələrin ürəyi bir şey istəyəndə çapar göndərməzdilər, Səməndərə deyərdilər, o, yelə dönər, göz açıb-yumanacan özünü çatdırardı. Səməndər elin gözü olan Qönçə adlı bir qızı sevirdi. Qız da meylini ona salmışdı, elə bilirdi dünyada varsa da, yoxsa da bircə Səməndərdir. Qönçəni Elat bəyinin oğlu da istəyirdi,

amma Səməndərdən qorxur, diləyini ata-anasına açmırdı. O, tay-tuşları ilə fikirləşib Səməndərə bir tələ qurur: kasıb bir kişinin aman-zaman bir inəyi vardı, onu tövlədən çıxartdılar, aparıb bir dərədə kəsdilər, ətini, gönünü də gətirib Səməndərgilin ot çardağının altına yığdılar, səhər tezdən kəndə hay düşdü ki, bəs filankəsin inəyi oğurlanıb. Bəyzadənin dostları hamıdan çox əl-ayağa düşdülər, axtarmadıqları yer qalmadı, axırda Səməndərgilin çardağına girdilər, əti, gönü tapıb çıxartdılar. Kəndə car çəkdilər ki, halallığına, qoçaqlığına bizim hamımızın bu günə kimi inandığımız Səməndər oğru imiş, quldurbaşı imiş, dünya üzü hələ belə insafsız adam görməyib.

Adətə görə, kəndin ortasında neçə araba odunu üst-üstə qalaqlayırlar. Səməndərin andına inanmırlar, oduna od vurub Səməndəri də alovu göyləri yandıran bu tonqalın içinə atırlar.

Qönçə özünü saxlaya bilmir, «Səməndər! Səmən-dər!..» - deyib alov başından ərşə çəkilə-çəkilə tonqalın dövrəsində fırlanır, o da özünü bu odun-alovun içinə atıb yanmaq, sevgilisi ilə bir yerdə külə dönmək istəyir.

Bəyzadə və onun dostları Qönçənin əl-ayağından tutub kənara çəkirlər. Bu vaxt Qönçə pərvanəyə çevrilir, ocağın dövrəsində fırlanmağa başlayır. Odur ki, pərva-nələr alovun içində, alovun ətrafında hey dolanırlar.

### *102. Şanapipik quşu*

Şanapipik əvvəllər gəlin imiş. Bir dəfə başını yuyurmuş. Bu vaxt onun qayınatası içəri girir. Gəlin utanır. Allaha yalvarıb, deyir:

- Ay Allah, qayınatam saçlarımı gördü, mən xəcalətdən onun üzünə baxa bilmərəm, məni ya daş elə, ya da quş.

Gəlin quşa çevrilir. Darağı başında qalır, şanapipik olur. Şanapipik çöldə yaşasa da, abadlıqdan çox uzağa getmir, axı onun gözü istəkli ərində, doğma evində qalıb…

### *103. Vaqif, Nəsim və Bülbül*

Vaqif Nəsimdən, Nəsim də Bülbüldən böyük idi. Amma bu üç qardaşın üçü də bir gücdə, hünərdəydi. Ağıllarının itiliyinə, kamallarının dərinliyinə, mərifət-qanacaqlarına söz ola bilməzdi; ona görə də el-oba başlarına and içirdi. Ağır oturub-durmaları, hamının dadına-köməyinə çatmaları yaxşı sədalarını bütün mahala yaymışdı. Onların dərd-sərini heç kim bilmirdi, onlar müşkül arzularını ürəklərində pünhan saxlayır, utanırdılar ki, açıb-ağartsalar camaat onların bu diləklərinə gülər, özlərinə də sərsəri təki baxar.

Bir axşam onların qapısını bir qoca döydü, bircə gecə yatmağa, dincəlməyə bir bucaq istədi.

Qardaşlar qocanı hörmətlə qarşıladılar: evin ən yaxşı döşəyini onun altına saldılar, ən yaxşı mütəkkəni onun dirsəyinin altına qoydular, ən yumşaq yastığı onun başının altına rahatladılar. Çörəyin, xörəyin, çayın ən dadlısını, tamlısını onun süfrəsinə düzdülər. Qoca gördü ki, bu qardaşların

hər işi düzdür, heç bir kəsirləri, ehtiyacları yoxdur, amma yenə də ürəkdən gülmürlər. Soruşdu:

- Balalarım, sizin dərdiniz var, məndən gizlətməyin, bəlkə çarə tapdım.

Qardaşlar hiss etmişdilər ki, bu qoca onların indiyənə kimi gördükləri kişilərin tayı deyil, üz-gözündən bilik yağır.

Vaqif dedi:

- Baba, dünya bir rəngdədir. Bombozdur. Havası bir, suyu birdir. Belə də dünyamı olar?

Qoca böyük qardaşa aman vermədi; fikrini havadan aldı. Dedi ki, balalarım, bu sözləri ağıllı adamların çoxundan eşitmişəm. Amma ağıllılar tək olurlar, tək əldən də səs çıxmır. İndi görürəm, siz üçsünüz, üçünüz də birinizin daş qoyduğu yerə baş qoyar. Dünyanı dəyişmək üçün üç tilsim sındırmalısınız. Hərənizə biri düşür. Birinci tilsim sınanda hər yer belə dümdüz olmayacaq, dağlar, dərələr görünəcək, çaylar, bulaqlar axacaq, göllər, dəryalar yaranacaq. İkinci tilsim sınanda nəsimlər gələcək. Birinci nəsimdə göylərə, çöllərə, dağlara, düzlərə rəng gələcək, hər yan güllə, çiçəklə örtüləcək. Hər yaşıllığın bir rəngi, bir ətri olacaq, cənnət mehi əsəcək, o diyarın ətrini bu diyara, bu diyarınkını da o diyara çiləyəcək. Meşələr, ağaclar bitəcək, çiçək açacaq, hər çiçək bir meyvəyə çevriləcək, dadı damaqlardan getməyəcək. İkinci nəsimdə hər kolun dibində bir çörək yatacaq, dünya bolluq yuxusu içində mürgüləyəcək. İkinci nəsimdə çöllər naxış-naxış saralacaq, qızaracaq, əlvanlaşacaq, bu əlvanlıqda tala-tala yerlər əkiləcək, taxıl səpiləcək, göylərin qar yorğanı yerə enəcək, hər yana layla çalacaq.

Üçüncü tilsim sınanda dünyaya quşlar gələcək, hamısı bülbül nəğməsi oxuyacaq. Çaylar da, bulaqlar da bu nəğməni oxuyacaqlar. Dünya nəğmələrlə yatacaq, nəğmələrlə oyanacaq.

Qoca susdu. Qardaşlara bir də baxdı. Qardaşlar sevindilər: Bu qoca nə yaxşı gəldi!... Tilsimləri sındırarıq, dünya dəyişəcək, dünya cənnətə dönəcək.

-Balalarım, -deyə qoca bu işin ən qorxulu çətinliyini aramla, özü də xeyli ehtiyatla, çəkinə-çəkinə danışmağa başladı, - tilsimləri ağılla sındıracaqsınız, amma siz bir də bu el-obaya indiki şəkildə qayıt-mayacaqsınız.

Qardaşlar heyrət etdilər.

Böyük qardaş xəbər aldı:

- Bəs nə şəkildə, baba?

-Siz dəyişdiyiniz dünya ilə dünyada qalacaqsınız, balalarım. Heç bilirsinizmi bu nə deməkdir?

Qardaşların sorğulu nəzərləri qocanın üzünə zil-ləndi, dillənmədilər, amma baxışları ilə soruşdular: «Nə deməkdir, baba?»

Qoca üzünü bürüyən nurlu bir təbəssümlə pıçıl-dadı:

-Dünya durduqca durmaq deməkdir, balalarım!...

Qardaşlar bir-bir diz çöküb, qocanın sağ əlindən öpdülər.

Qoca onlara tilsimləri sındırmağın sirrini açdı.

Qabaqca böyük qardaş Vaqif getdi. Aradan bir il keçdi. Dünya dağlaşdı, dərələndi.

Sonra ortancıl qardaş Nəsim getdi. Bir il ötəndən sonra dünyanın rəngi dəyişdi.

Axırda kiçik qardaş Bülbül getdi. Bir ilin tamamında dünya quşlarla, nəğmələrlə doldu.

### *104. Bülbül və Gül*

Uzaq keçmişlərdə Gül adlı qənirsiz gözəl bir qız varmış. Yer övladından bir kimsə onun könlünə yol tapa bilməzmiş. Sən demə, Gülün ürəyində eşq odu donubmuş. Sevdanın istisi, məhəbbətin günəşi Gülün könül otağına boylana bilməzmiş. Odur ki, ay kimi camalın şöləsinə aldananlar buz kimi ürəyin soyuqluğundan üşüyüb qaçarlarmış.

Günlərin birində qonşu oymağın adlı-sanlı igidi Bülbül Gülün bağçasının yanından keçərkən gözü qıza sataşır. Bir könüldən min könülə ona vurulur. Səhər sevdiyi qız qarşısına çıxanda deyir:

- Ey Gül, mən səni sevirəm! Sənsiz dünya mənim üçün cəhənnəm əzabından başqa bir şey deyil.

Axşam sevdiyi qız qarşısına çıxanda deyir:

- Ey Gül, mən səni sevirəm! Sənsiz dünya mənim üçün cəhənnəm əzabından başqa bir şey deyil.

Amma Gül ona məhəl qoymur. Bülbül gündən-günə Gülün xiffətini çəkməkdən saralıb solur. İncəlib sapa dönür. Bülbül çox götür-qoydan sonra dərdinə dəva üçün müdrik qocaların məsləhətini dinləyir. Ağzı fal bir ağsaqqal ona deyir:

- Sən dərdini, eşqini sözlə deyirsən. Söz onun buza dönmüş ürəyini isindirməyə qadir deyil. Bu əsarətdən qurtarmaq üçün həqiqi aşiqin odlu-alovlu nəğmələri lazımdır. Ancaq belə nəğmələr buza dönmüş məhəbbəti oyada bilər.

Bülbülün elə əzəldən gözəl səsi varmış. Gülə vurulduqdan sonra səsin yanğısı artır. Müdrik qocanın məsləhətinə qulaq asan Bülbül dərdini bundan sonra sözlə deyil, odlu-alovlu nəğmələrlə Gülə çatdırır. Ürəyin buzu qaynar bulaq kimi çağlayıb üstünə tökülən mahnıların hərarətindən əriyir, məhəbbət tilsimdən xilas olur. Gül Bülbülün nəğmələrinin mənasını anlayır, öz ürəyini ona verir.

### *105. Göyərçin*

Keçmiş əyyamda Şərq ölkələrinin iki qüdrətli şahı arasında düşmənçilik münasibətləri daha da gərginləşir. Gündə bir-birinə hədə-qorxu gəlirlər. Nəhayət, şahın biri o biri ölkənin şahına müharibə elan edib, onu təkbətək meydana çağırır. Elçilər müharibənin baş-lanacağı günü dəqiq müəyyənləşdirirlər. Təcili son hərbi hazırlıq işləri görülür.

Döyüşə çağırılan şah 15 il idi ki, müharibə etmirdi. Odur ki, döyüş papağını əl-ayaqdan uzaq, köhnə otaqlardan birinə qoymuşdu. Vuruşmaya bir gün qalmış şah anasından döyüş papağını gətirməsini xahiş edir. Anası gedir, lakin çox çəkmir ki, əliboş qayıdır. Oğlu anasından soruşur:

- Nə üçün papağımı gətirmədin?

Anası oğluna müəmmalı cavab verir:

- Papağı gətirə bilmədim…

- Ana, mən səni başa düşmürəm. Meydanda ölüm-itim olar. Yaxşısı budur ki, döyüş papağımı gətirib qələbə xeyir-duası verəsən.

- Yanılırsan, bala, igid meydanda ölər. Ancaq döyüş papağın o qədər sirli-sehrli idi ki, onu yerindən tərpətməyə gücüm çatmadı.

- Mənim gücüm çatar.

Ana şah oğlunun ayaqlarına döşənir:

- Səni and verirəm halal südümə, papağa dəymə!…

- Anacan, mən şaham! Şah meydanına papaqsız, dəbilqəsiz necə çıxım?

Ana oğlunu inadından döndərmək üçün gördük-lərini deməli olur:

- Bala, sənin döyüş papağının içində indiyənədək heç kimə ziyan vurmayan, dünyada ən dinc heyvan olan ağ göyərçin yuva bağlayıb. Özünün də üç dənə ətcə balası var. Biaram özünü çölə vurub balalarını yemləyir. Onları təhlükəsiz bir yerdə boya-başa çatdırmaq istəyir. Mən bu günahsız balalara toxunsam, ağ göyərçin bizdən küsüb gedər, yetim balaların ah-naləsi ölkəmizə bəlalar gətirər. Gəl, bu dəfə papağını qoyma.

Bu sözləri eşidən oğlu heç nə demir. Şahlıq tacını ağ göyərçinə tapşırıb başıaçıq düşmənin meydanına çıxır. Döyüşə gələn şah rəqibin döyüş papağı olmadan döyüşə gəldiyinə təəccüblənir. Bu sirli oyunun səbəbini soruşur. Dəbilqəsiz şah deyir:

- Mənim papağımda ağ göyərçin üç bala çıxardıb. Anam südünə and verdi ki, onlara toxunmayım, insanları yersiz bəlalara düçar etməyim.

Rəqib şah sözə inanmır. Vəzirini göndərir ki, gedib bunun düzgünlüyünü yoxlasın. Bir azdan vəzir qayıdır. Hər şeyin doğru olduğunu söyləyir. Bunu eşidən şah dərin fikirlərə dalır. Əlini düşməninə uzadıb deyir:

- Gəl, barışaq, sülh bağlayaq! Sənin anan bir quşun – ağ göyərçinin evini dağıtmaq istəmir. Bəs biz niyə nahaq qan töküb minlərlə insanların evini dağıdaq.

Onlar sülh bağlayırlar. O gündən ağ göyərçin sülh quşu hesab olunur.

### *106. Hophop*

Deyirlər ki, bu quş əvvəllər bir gəlin imiş. Həmin gəlin bir dəfə başını yuyan zaman qayınatası gəlib onu görür. Özünü itirən gəlini həya təri basır, üzünü göylərə tutub yalvarır:

- İlahi, sən məni bir quş elə, uçum gedim çöllərə. Bir daha qayınatamın gözünə görünməyim.

Həmin vaxt gəlin quş olur. O uçub qalxır göylərə. Gəlinin iki uşağı varmış. Biri oğlan, biri qız. Oğlunun adı Hophop, qızının adı isə Gültop imiş. O vaxtdan bəri ana övlad həsrəti çəkir və onları təkrar-təkrar öz adları ilə çağırır:

- Hophop, Gültop…

### *107. Kəklik*

Deyirlər ki, qədimlərdə çox gözəl, ağıllı və qeyrətli bir qız varmış. Bu qız öz əmisi oğluna adaxlı imiş.

Qızın toy günü çatır. Onun əl-ayağına xına qoyurlar, bir azdan oğlan evinə aparacaqlarmış. Hamının başı həyət-bacada toy işlərinə qarışır. Qız təkcə yengə ilə evdə oturubmuş. Elə bu zaman çoxdan bəri qızı izləyən, onu ələ keçirməyə can atan

dövlətli oğlu öz başının dəstəsi ilə içəri soxulur. Onlar yengənin əl-ayağını, ağzını bağlayıb yerə yıxırlar. Qızı da götürüb dağlara qaçırlar. Qız nə qədər dartınır, qışqırır, yalvarır ona qulaq asan olmur. Hər yerdən əlacı kəsilən, əli üzülən köməksiz qız üzünü göyə tutub deyir:

***Tanrı məni quş elə.***
***Qanadı gümüş elə.***
***Eldə rüsvay eləmə,***
***Dağda günüm xoş elə,***
***Daşlara yoldaş elə.***

Qız bunu deyən kimi dönüb kəklik olur, pırıltı ilə uçub qayalığa düşür.

Qızın əl-ayağı xınalı olduğu üçün, kəkliyin də ayağı xınalı olur.

## *108. Turac quşu*

Bir gün qulluqçu qız xanımın darağını alıb başını darayır. Darağı boxçaya, paltarın arasında taxçaya qoyur.

Aradan xeyli keçir. Xanım başını yuyurmuş, darağı istəyir. Qulluqçu qız darağın yerini unudubmuş.

Nə qədər çalışırsa darağın yerini yadına sala bilmir.

- Xanım, vallah darağın yerini unutmuşam.

Xanım qulluqçu qızdan şübhələnir.

- Darağı oğurlamısan! – deyir.

Qız xəcalətindən tər tökür.

- Xanım, mənim əlim əyri deyil, daraq buralardadır. Hara qoyduğumu yadıma sala bilmirəm.

Xanım hirslənir:

- Onda qonşuya, ya qohuma vermisən.

Qız görür xanımı inandıra bilmir. Əliəyri qulluqçu kimi bu evdə yaşamaq, ya da qovulmaq ona ağır gəlir. Deyir:

- İlahi, xəcalət məni öldürər, ya məni daş elə, ya da quş.

Qız quş olur, Turac quşu.

Qız quş olandan sonra darağın yeri yadına düşür. Bağçaya qonub oxuyur, darağın yerini xanıma bildirir:

***Taxçadadır,***
***boxçadadır.***
***Boxçadadır,***
***taxçadadır.***

## *109. Quş qeyrəti*

Sirab kəndində Xanməmməd kişinin həyətindəki qarağacda bir cüt hacıleylək yuva qurub, mehriban yaşayırdı. Hacıleyləklər payız vaxtı başqa ölkələrə köçər, yazda öz yuvalarına qayıdardı.

Leyləklər yenə də adətləri üzrə köçməyə hazırlaşırdı. Gözlənilmədən bir qəza baş verdi. Quzğun leyləklərin üzərinə hücum etdi. Ata leyləyi caynağına alıb, yerə çırpdı. Leyləyin qanadının biri, qıçının da biri sınmışdı. Elə oldu ki, ana leylək tək uçub başqa ölkəyə getməli, ata leylək isə Sirab kəndində qalmalı oldu. Ev sahibi ata leyləyi evə gətirib, dava-dərman

elədi. Leyləyin qanadı, qıçı bir neçə aya çox çətinliklə sağaldı.

Ata leylək yazın gəlməsinə çox darıxırdı. O gündüzlər həyət-bacada gəzər, şamın-şərində evə dönərdi.

Artıq yaz idi. Ev sahibi leyləyi içəridə qoyub çıxmışdı. Qayıdanda gördü ki, ata leylək çox vurnuxur, özü də boynunu həyətdəki qarağaca tərəf uzadır. Ev sahibi dönüb baxanda gördü ki, ana leylək gəlibdi, tez qapını açıb ata leyləyi buraxdı. Ata leylək sevinclə çırpındı, qanad çalıb, havaya qalxdı, dövrə vurub ana leyləyin yanına qondu. Elə bu vaxt yad bir leylək ana leyləyin sol tərəfinə qondu. İşin nə yerdə olduğunu duyan ata leylək əbəs yerə hicran əzabı çəkdiyini görüb, şığıyıb özünü göy daşa çırpdı, yaralandı, ölmədi, bir də şığıyıb özünü qarının təzəcə odladığı təndirə saldı və yanıb kül oldu.

### *110. Təmənnalı yaxşılıq*

Şərur düzündə öz zəhmətilə güzəran keçirən bir qoca əkinçi yaşayırdı. Yazın ılıq nəfəsi duyulurdu. Qoca xışı yenicə qoşub bir-iki cız əkin etmişdi. Gördü ki, bir quzğun caynağına aldığı hacıleyləyi sal bir daşa çırpdı. Quzğun leyləyin üstünə bir də şığımaq istədi. Ancaq qocanı görüb, havada bir neçə dövrə vurdu. Ona qədər qoca özünü hacıleyləyə çatdırdı. Baxdı ki, leyləyin qanadının biri sınıb, qıçının da biri. Axşam evə dönəndə hacıleyləyi də gətirdi. Bir müddət dava-dərmanla hacıleyləyin qanadını və qıçını müalicə etməklə məşğul oldu. Hacıleyləyin qanadı və qıçı sappasağ oldu. Qoca

əkinçi buna çox sevindi. O, hacıleyləyi gətirib çölə buraxdı.

Aradan xeyli keçmişdi. Qoca əkinçi şuma toxum səpirdi. Bir də gördü ki, budur ha hacıleylək gəldi, onun başı üstündə çırpınıb qanad çaldı. Axırda da ağzından yerə bir toxum salıb getdi. Qoca bildi ki, bu xeyirli şeydi. Onları səliqə ilə torpağa basdırdı. Vaxt-vədə gəlib keçdi. Bu toxumdan iri qarpızlar əmələ gəldi. Qoca, qarpız-lardan birini kəsdi. Baxdı ki, qan qırmızı olan bu qarpızların beçə balı kimi şirinliyi var.

Qoca xeyli fikirləşəndən sonra dedi:

- Bu ölkənin şahı çox əzazil bir adamdır. Bunun birini onsuz bazara çıxarıb satsam, dərimə saman təpər.

Bunu qabaqcadan hiss edən qoca bağban tağdan bir-iki qarpız üzdü, məcməyiyə qoyub üstünə yaylıq örtdü və şaha hədiyyə apardı.

Şah əkinçinin hədiyyəsinə heyrətlə baxırdı, nə olduğunu bilmirdi. Qarpızı kəsəndə içindən süfrəyə bir ətək qızıl töküldü.

Qocanı heyrət bürümüşdü ki, bu necə olan şeydi?

Şah dedi:

- Bu sirdən məni agah et!

Qoca əkinçi hacıleylək əhvalatını danışdı.

Şah əmr edib dedi:

- Sənə üç gün möhlət verirəm, hər necə olur-olsun həmin hacıleylək quşunu tutub mənə gətirməlisən.

Ağır cəzadan qorxan qoca əkinçi tələ qurdu, tor qayırdı. Çox çətinliklə hacıleyləyi tutub şaha gətirdi.

Şah hacıleyləyin əvvəl qanadının birini, sonra da qıçının birini öz əli ilə sındırdı. Quşa xüsusi yer ayırdı. Onu böyük qayğı ilə sağaltmağa başladı. Quşun qanadı və qıçı gözəl xidmət nəticəsində sağaldı. Şah quşu əlləri üstə alıb havaya uçurdu. Hacıleylək bir an içərisində uçub görünməz oldu, çox-çox uzaqlara uçdu. Şah hər gün pəncərədə oturub quşun yolunu gözləyirdi. Quş həqiqətən bir səhər qayıtdı və ağzında bir neçə toxum gətirdi. Quşun güllü bağçaya atdığı toxumu bir-bir yerdən yığdılar.

Şahın əmri ilə bağçanı tərtəmiz etdilər. Qızılgül kollarını çıxarıb kənara atdılar. Əvəzində torpağa quşun gətirdiyi toxumu əkdilər. Bir neçə gündən sonra bağçanı qaratikan kolu ağzına götürdü. Qaratikanı nə qədər kəsdilər, atdılar, kökünü kəsə bilmədilər.

Şaha agah oldu:

- Qoca bağbanın quşa etdiyi yaxşılıq təmənnasız, onunku isə təmənnalı yaxşılıq idi. Bunu bilən quş hər kəsə öz payını çatdırıb.

## *111. Xoruz və Tovuz quşu*

Rəngarəng, gözəl paltarı olan bir xoruz vardı. Əlvan libas Xoruzun təşəxxüslü yerişinə, ucadan ban vurmasına çox yaraşırdı. Xoruz həm də qorxmaz idi. Onun başına həmişə zərif, köməksiz-həyansız toyuqlar  cəm olardı. Xoruz onları başqa quşlardan qoruyar, qayğı göstərərək boğazının dənini toyuqlara yedirərdi. Toyuq-lar da bunun əvəzində qəşəng-qəşəng yumurtalar verər-di. Ev sahibi həm xoruzundan, həm də toyuqlarından razı qalardı.

Tovuz quşu isə özünü bədbəxt hesab edərdi. O, xoruza baxdıqca ürəyindən qara qanlar axırdı. Tovuz quşuna elə gəlirdi ki, zərif toyuqlar təşəxxüslü xoruzun başına yalnız gözqamaşdıran paltarına görə yığılıblar. Onun isə belə paltarı olmadığı üçün heç kim saymır. Tovuz quşu xoruzun paltarını ələ keçirmək qərarına gəldi. O, qonaqlığa getmək bəhanəsilə xoruzun libasını bir günlüyə istədi. Xoruz bir qonşu kimi onun sözünü yerə salmadı, paltarını soyunub Tovuz quşuna verdi. Tovuz quşu xoruzun paltarını bir daha geri qaytarmaq istəmədi. Əvvəlki kimi olmasa da, xoruz yenə də özünə bəzəkli paltar düzəltdi. Yenə zərif toyuqlar onun başında idi. Xoruz gündə üç-dörd dəfə tara çıxıb ucadan banlayır, tovuz quşunu səsləyirdi:

- Ey tovuz quşu, mənim paltarımı gətir!

-

### *112. Qu quşu əfsanəsi*

Ananın çox da körpə olmayan dörd uşağı var idi. Ana uşaqlarını qayğısız böyüdür, onlara hər cür qulluq edirdi. Günlərin bir günü ana bərk xəstələnir. Ananın hərarəti artır. O, su deyə yanır, ancaq ananın durub su içməyə imkanı olmur. O, böyük övladını çağırır ki, gəlib ona su versin. Uşaq anasına su verməyib oynamağa gedir. Su deyə dili, dodağı yanan ana o biri övladlarını çağırır. Etibarsız, fərsiz övladların heç biri su deyə yanan xəstə anaya su vermir. Bunu görən ana bərk qüssələnir. O, belə övladların üzünə baxmaq istəmir. Arzu edir ki, göylər onu bir quşa çevirsin. Zümrüd sulardan içsin, azad göylərə qanad çalsın.

Ana öz arzusuna çatır, o, bir qu quşu olur. Uçmağa başlayır. Uşaqlar ananı uçan görüb onun dalınca qaçır, ağlayırlar. Ana uşaqlarını istəsə də, onlar üçün ürəyi yansa da uça-uça uzaqlaşmağa başlayır. Uşaqları daşlara, yerə dəyə-dəyə, kola-kosa çırpıla-çırpıla bir müddət ananın dalınca qaçırlar. Lakin artıq gec olur, ana çox uzaqlara uçub gedir. Anadan ümidləri üzülən uşaqlar anasız buz kimi soyuq olmuş evə qayıdırlar. O gündən övladından bir etibar görməmiş qu quşu yuva qurub bala çıxarmır.

Ancaq özgə quşların yuvasında yumurtlayır. Onun balasını da özgə quşlar çıxarıb bəsləyirlər.

### *113. Qu quşlarının kədəri*

Belə rəvayət edirlər ki, çox-çox qədim zamanlarda Rafen adlı bir padşah yaşayırmış. Bu padşahda şəhvət hissi, şorgözlük həddindən ziyadə imiş. O, subay qızlarla kifayətlənməz, hətta xoşuna gələn ərli arvadları da hərəmxanasına apararmış. Hökmdarın belə hərəkəti hamıda nifrət oyatmışdı.

Bir gün səyahətə çıxanda padşah bulaq başında bir dəstə qıza rast gəlir. Onlar səfalı yerə ərləri ilə gəzməyə çıxıblarmış. Cavan gəlinlər padşahın şəhvət hissini coşdurur. O saat əmr edir ki, gəlinləri ələ gətirsinlər. Ərlər padşahın bu hərəkətini qeyrətlərinə sığışdırmırlar. Qeyri-bərabər mübarizə başlayır. Çox çəkmir ki, silahlı qoşun silahsız cavanların əllərini arxadan çatırlar. Padşah arvadlara bildirir ki, əgər onlar könüllü surətdə onunla getsələr, ərlərini öldürməyəcəkdir. Qoçaq

gəlinlər öz aralarında sözləşdikdən, danışdıqdan sonra şərtə razılaşırlar.

Öz yerlərinə yaxşı bələd olan gəlinlər padşahın dəstəsini cəngəllikdə azdırıb aradan çıxırlar. Onlar birbaşa bulaq başına üz tuturlar. Bulağa çatanda ərlərini görmürlər. Orada yalnız qana bulaşmış çiçəkləri və yeddi kəməri görürlər. Gəlinlərdən biri hamısından əvvəl işi başa düşür və göz yaşlarını leysan kimi axıdır. Bir azdan o biriləri anlayır ki, rəfiqəsinə vurulan yara onlara da vurulmuş, igid ərləri padşahın silahlı əsgərləri tərəfindən doğranmışdır. Hamısı eyni dərdli olduğu üçün, bir-birinə təsəlli verməyib eyni fəryadla göz yaşı tökürlər.

Ərlərinin günahsız həyatına, onların ucbatından fəlakətə düçar olan həyatına o qədər ağlayırlar, o qədər yanırlar ki, axırda yeddisi də qu quşu olur. Quşlar oğlanların kəmərlərini dimdiklərinə alıb havaya qalxır-lar. Elə o zamandan etibarən qu quşlarının həmişə birinə fəlakət üz verəndə hamısı ağlayır.

### *114. Bülbülün son nəğməsi*

Bir kasıb oğlan dövlətli bir qızı sevirmiş. Qızın da meyli yoxsul, ancaq məhəbbət aləmində sədaqətli, səxavətli, şücaətli olan oğlanda imiş. Bu sevgidən xəbər tutan ata qəzəblənir, qızını özünə bab olan varlı bir kişinin oğluna vermək istəyir. Atasının təkidinə bax-mayaraq, qız heç kimə könül vermir, öz sevgilisinin həsrətindən günü-gündən saralıb xəstələnir.

Ayrılıq dərdi oğlanı bülbül kimi dilə gətirir. O, gecə-gündüz sevgilisinin eşqilə yanıqlı nəğmələr oxu-yub, daş ürəkli adamları insafa gətirmək istəyir.

Qızının vəziyyətinin ağırlaşdığını görən ata həkimin məsləhətinə qulaq asmalı olur. Kişi dərin fikrə gedir. Axı, dərman dərddən müşkül idi. Qırmızı qızılgülün rəngi, ətri qızın dərmanı sayılırdı. Ancaq o vaxta qədər qızılgüllərin hamısı ağ rəngdə idi.

Kişi çox fikirləşdikdən sonra oğlanı hüzuruna çağırtdırır, öz-özünə deyir: işdir, qırmızı, ətirli qızılgülü gətirər, qızım sağalar, gətirə bilməyib bu yolda məhv olsa, qızım yenə sağalar. Kişi vəziyyəti oğlana başa salır, deyilənə əməl etsə, qızı ona verəcəyini söyləyir.

Oğlan oxuya-oxuya hər yanı gəzir, axırda ağ gül kolunu tapır. Ürək yaxan nəğmələr ilə aydan, ulduzdan, əsən küləkdən, uçan quşlardan kömək istəyir. Bir də başını qaldırır ki, yanıqlı nəğmələr ilə onun səsinə səs verən var. Onun səsi, onun dərdi, onun eşqi ancaq şeyda bülbülə tanış ola bilərdi.

Bülbül soruşdu:

- Ey oğlan, səbəb nədir ki, atəşli nalələrinlə dağları, daşları yandırırsan?

Oğlan:

- Daş ürəkləri insafa gətirib sevgilimlə vüsala yetmək istəyirəm. Bəs sən niyə alışıb yanırsan, qəmli nəğmələrinlə çiçəklərin, çəmənlərin bağrını qana döndərirsən?

Bülbül:

- Bilirsən ki, mən də ləçəkləri ağappaq bir gülün əsiriyəm. Nə müddətdir onun eşqi məni divanə edib. Ancaq vüsala yetmək mümkün olmur. Qara qəlbli qara tikanlar iki sevgilinin qovuşmasına

mane olur. Mən də onları rəhmə gətirmək üçün oxuyuram.

Bu sözlərdən sonra iki aşiq ağız-ağıza verib oxudular. Oxuduqca coşmağa, vüsal həsrətilə qovrulmağa başladılar. Nəhayət, bülbül özünü gül koluna vurdu. Bülbülün vüsal niyyətini başa düşən tikan dərhal onun ürəyinə sancıldı. Sevgilisi ilə dodaq-dodağa, nəfəs-nəfəsə dayanan bülbül qətiyyən bunu hiss etmədi. Bülbülün odlu qəlbindən qopan həzin nəğmələr pərdə-pərdə ətrafa yayılırdı. Tikan isə onun qanını sorub ağ gülün rəngini dəyişdi. Bir azdan kollarda təzə tumur-cuqlar əmələ gəldi. Bu tumurcuqlar bülbülün son nəğ-mələrinin gücündən al-qırmızı – qan rəngində açıldı. Bülbülün məhəbbətindən aşiqlərə ətirli, qırmızı qızıl-güllər yadigar qaldı.

Oğlan heyrət içində qızılgüldən bir dəstə bağlayır. Qız məhəbbətin rəngini görən kimi, məhəbbətin ətrini duyan kimi sağalır. Onlar qovuşub xoşbəxt yaşayırlar.

### *115. Bülbül niyə görmür*

Rəvayətə görə, keçmiş zamanlarda bir padşah varmış. Padşah o qədər zülmkar, o qədər qısqancmış ki, hərəmxanasında olan incəbel qızları heç kim görməsin deyə qalanın altında saxlayırmış.

Günlərin bir günü güclü yağış yağır. Hər yanı ağzına götürən sel qalanın dibini yuyur və buradan iri bir deşik açır. Bir azdan sel-su çəkilir, onun açdığı xəlvəti yol isə qalır.

Hərəmxanadakı qızlardan biri padşahı sevmirmiş. O, gecə-gündüz bu qaladan çıxmaq

üçün fürsət axtarırmış. Belə bir yolu tale ona qismət edir. Qız həmin yolla bayıra çıxarkən cavan bir çobanla rastlaşır. Onlar xeyli söhbət etdikdən, başlarına gələn qəzavü-qədərdən halı olduqdan sonra bir –birinə könül verib əhd-peyman bağlayırlar. Bu minvalla qız həmin yolla gəlib vədələşdiyi yerdə çobanla görüşür.

İşdən xəbərdar olan padşah onun cavabsız məhəbbətinə xəyanət edən qızı dara çəkdirmək istəyir. Lakin hərəmxana qızlarının heç biri öz sevgilisi ilə qovuşmağa can atan qızı nişan vermir. Əlacsız qalan padşah çobanı çağırtdırır. Nə qədər çalışırsa çobandan söz qopara bilmir. Qəzəblənmiş padşah deyir:

- Atın zindana! Sabah onu gözəllərlə üz-üzə, göz-gözə qoyacağam. Özü deməsə də gözləri deyəcək.

Ertəsi gün padşah hərəmlərini səfə düzdürür. Çobanı onlarla bir-bir qarşılaşdırır. Nə qədər fikir verirsə, görür ki, çobanın baxışı heç bir gözəllə danışmadı, rəngi dəyişib haldan-hala düşmədi. Özünü zorla saxlayan qız da çobanın dəyanətinə, iradəsinə, soyuqluğuna heyrət edir. Əlacsız qalan hökmdar çobanı azad edir.

Çoban dağa, öz sürüsünün yanına yollanır. Ara sakitləşəndən sonra, qız da fürsət eləyib özünü çobana yetirir. Qız soruşur:

- Biz həmişə üz-üzə gələndə sən coşub bülbülə çevrilər, mənə, öz qızılgülünə nəğmələr qoşmaqdan doymazdın. Padşah sınağından mən yaman qorxurdum. Deyirdim göz-gözə gələndə sən yenə coşub bülbülə dönəcəksən. Nəğmələr ikimizi də məhv edəcək. Necə oldu ki, sən susdun?

Çoban başını aşağı dikib kədərlə dilləndi:

- Sən mənim bircə qızılgülümsən. Mən həmişə sənin üçün həvəslə oxuyar, sən isə lal-dinməz dinləyərdin. Bilirdim ki, baxışlarımız qarşılaşanda özümü saxlaya bilməyəcəyəm, gözdən-gözə axan məhəbbət tuğyana başlayacaq. Bu isə zalım padşahı arzusuna çatdırar, bizi məhv edərdi. Mən səni xilas etmək naminə özümü qurban verdim. Gözlərimə mil çəkdim ki, baxışlarım sənin baxışlarınla görüşməsin.

Qız sevgilisinin fədakarlığına birə min heyrət etdi. Çoban dedi:

- İndi mən səni görməsəm də eşqinlə həmişə bülbül kimi ötəcəyəm.

- Mən də səni həmişə yana-yana dinləyəcəyəm.

Oğlan sevgilisi üçün oxumağa başladı. Oxuya-oxuya bülbülə çevrildi. Qız isə dönüb qızılgül oldu.

Deyirlər, o vaxtdan bülbül sevgilisi qızılgülün şəninə mahnılar qoşa-qoşa onu axtarır. Ancaq gözləri görmədiyi üçün tapa bilmir. Həmişə aşiqini dinləməyə adət etmiş qızılgül isə lal olduğundan bülbülü səsləməyi bacarmır.

### *116. Xarı-bülbül*

Azərbaycanın qədim şəhərlərindən biri olan Şuşada belə bir gül var ki, hamı onun adına xarı-bülbül deyir.

Rəvayətə görə, bir gün bülbül öz sevgilisi gülün görüşünə getmək istədiyi vaxt bərk külək əsir. Küləyin məqsədi gülü bülbülün gözləri qarşısında alçaltmaq imiş.

Külək öz gücünə, qüvvəsinə həddindən artıq inanırmış. O əsəndə, hərəkətə gələndə, aləmi tozanağa bürüyəndə bütün canlılar onun qarşısında əyilərmiş. Müqavimət göstərmək istəyənləri neçə yerə şaxbudaq edib, yerlə-yeksan edərmiş.

Bir gün külək var qüvvəsi ilə əsirdi, nəhəng çinarlar, uca sərvlər, salxım söyüdlər onun qarşısında dönə-dönə əyilirdilər. Yalnız zərif, gözəl, ətirli gül küləyin azğınlığına, yekəxanalığına tabe olmurdu. Bunu görən külək heyrətə gəldi:

- Ay zərif, ay zəif gül, sən hansı cəsarətlə mənə baş əymirsən? Sən bu gücü hardan alırsan?

Gül inamla cavab verdi:

- Məhəbbətdən! Məhəbbətin gücü yenilməz olur. Sevən vüqarlı olur, o heç kəsə baş əymək istəmir. Mən bülbülü sevirəm. Onun saf məhəbbəti məni baş əyməyə qoymaz.

- Baxarıq!… Sən məhəbbətini sına, mən də gücümü…

Külək bu sözləri deyib kükrədi. Elə bu vaxt bülbül sevgilisi gülün görüşünə gedirdi. Küləyin qəzəbi yerə-göyə sığmırdı. Zərif otlardan tutmuş fil gövdəli ağaclara qədər ona baş əyirdi. Gül isə onun zorakılığı qarşısında əyilmirdi. Artıq gül son qüvvəsini toplayırdı. Onun müqaviməti tükənməyə başlayırdı. Çünki o tək qalmışdı. Əgər bülbül yanında olsaydı…

Gül bir yarpaq əyildi. Külək qələbəsindən sevinərək daha bərkdən uğuldadı. Bir az da keçəcək, külək gülü öz gücü qarşısında ikiqat edəcəkdi. Bülbül özünü vaxtında gülün harayına çatdırır. O, sinəsini yavaş-yavaş əyilən gülün köksünə söykəyir. Külək daha da hiddətlənir. Bülbül gülün azacıq əyilən qamətini düzəldir. Ancaq gülün

xarı (yəni tikanı) onun sinəsinə sancılır. Bülbül məhv olur, bir addım geri çəkilib gülü əyilməyə qoymur. Elə həmin vaxtdan özünü məhəbbəti uğrunda fəda edən bülbülün adı xarı bülbül qalır. Gül xarı-bülbül görkəmində çiçək açır. Həmin xarı-bülbül gülü heç bir qızılgül koluna və gülünə bənzəmir.

## *117. Qaranquş əfsanəsi*

Deyirlər ki, qədimdə bir padşah var imiş. Həmin padşahın gözünün ağı-qarası, ciyərparası Bahar adlı bir qızı varmış. Nə gözəllikdə, nə ağılda onunla bəhsə girməyə heç kim cəsarət etməzmiş, hökmdarın sarayına bir-birindən hörmətli, bir-birindən dövlətli elçilər gəlir. Onlar padşahla qohum olmaq arzusunda olduqlarını bildirirlər. Ancaq padşahın qızı heç kimə könül vermir. Hökmdar haçandan-haçana öyrənir ki, Bahar onun qoyun sürüsünü otaran çobanla sevişir. Qızının şahlığa ləkə gətirən hərəkəti padşahı qəzəbləndirir. Vəzir ağıllı tədbiri ilə hökmdarını sakitləşdirir:

- Qibleyi-aləm, səni yandıranı sən dondurmalısan. Öz yerini, öz həddini, öz tay-tuşunu tanımayan layiqli cəzaya çatmalıdır. Amansız qışın lap oğlan çağıdır. Geciksən Bahar onu xilas edər.

Şahın əmrilə qoşundan bir dəstə ayrılır. Başda padşah və vəzir olmaqla yola düşürlər. Axşamdan yağan qar hər tərəfi ağ yorğana bürümüşdü. Dəstə çətinliklə gəlib uca bir dağa yetişir. Birdən qorxulu bir çovğun başlayır. Çovğun getdikcə güclənir. Padşahın əmrilə çobanı sarıqdan açıb uca zirvədən dərin yarğana atırlar. Bu vaxt sevgilisi Baharın səsi onun qulağına gəlir. Bu səs ona istilik, hərarət, cəsarət verir. O, Allahdan bir quşa çevrilməsini,

qanad açıb sevgilisi Bahara qovuş-masını arzu edir. Oğlan ağ qışla üz-üzə dayanan qara bir quşa çevrilir. Bahar qışın da qənimi idi. Ona görə onun sevgilisi qara quşu sağ buraxmaq istəmir. Gərgin mübarizə başlayır. Qış çovğunu və şaxtanı daha da qüvvətləndirir. Padşahın dəstəsi tab gətirməyib məhv olur. Qara quş isə Baharın eşqi ilə amansız qışa qalib gəlir. Atıldığı zirvənin başına qonub məğlub olmuş qışa son dəfə baxır.

Qalib quşun sinəsində qarın bir damcısı qalır. Qara quş Bahara doğru qanad açmaq istəyəndə qış son qüvvəsini toplayıb əlini onun quyruğuna atır, iki lələk qopardır.

O gündən sinəsi ağ, quyruğu haça olan qara quşun adı qaranquş qalır.

### *118. Göyərçinin ayağı niyə qırmızıdır*

Belə rəvayət edirlər ki, çox-çox qədim zamanlarda bir hökmdar yaşayırmış. Hökmdar dinc və mehriban olan göyərçinləri çox istəyirmiş. O, həm də göyərçinlərdən rabitə kimi istifadə edərmiş. Uzaq səfərlərə çıxanda özü ilə birlikdə çoxlu göyərçin gətirərmiş. Nə sözü, nə hökmü olsa bir kağıza yazır, göyərçinin ayaqlarına bağlar, sonra göyərçini geriyə –saraya yola salarmış. Məktub gətirən göyərçinlərin hamısı əmanəti yalnız şahın arvadına verərmiş.

Bir gün başqa hökmdar bu hökmdarın ərazisinə soxulub, tutduğu yerlərdə rəiyyətə zülm edir. Göyər-çinləri, dincliyi, əmin-amanlığı sevən hökmdar vətəni qorumaq üçün xalqı müqəddəs müharibəyə çağırır. Özü isə həmişə olduğu kimi silaha qurşanıb qoşunun önündə gedir. Şah

işğalçılarla xeyli qanlı müharibələr aparır. Hər döyüş haqqında arvadının göndərdiyi göyərçinlə saraya ətraflı qələbə xəbərləri göndərir. Hökmdarın və qoşunun igidliyi sayəsində düşmən doğma torpaqdan təmizlənir. Lakin sonuncu döyüşdə hökmdar bərk yaralanır. Taqətsiz halda torpağa sərilir. Hökmdar baxır ki, yara çox dərindir, həyat işığı onun gözlərində yavaş-yavaş sönür.

Bu vaxt arvadının göndərdiyi göyərçin onun çiyninə qonur. Hökmdar yaxşı bilir ki, göyərçin onun vəziyyəti barədə arvadına xəbər aparmağa gəlmişdir. Ancaq kağız-qələm tutmağa halı qalmayan şah əlacsız qalıb sözünü sevimli arvadına başqa yolla çatdırır. O, sinəsinin qanı ilə göyərçinin ayağını qırmızıya boyayır.

Özünü sarayın pəncərəsindən içəri çırpan göyərçin təlaş içində çırpınır. Ayaqlarını bir-birinə sürtüb xanımın diqqətini qırmızı rəngə cəlb edir. Xanım o saat başa düşür ki, əri döyüşdə həlak olub. O, ağır itgidən sarsılmır, hakimiyyəti əlinə alıb qoşuna məharətlə başçılıq edir. Həmin vaxtdan isə göyərçinlərin ayaqları qırmızı qan rəngində olur.

### *119. Sarı bülbül əfsanəsi*

Belə nəql edirlər ki, Alı adlı bir oğlan gözəl bir qız sevirmiş. Bunlar bir-birini dəlicəsinə istəyirmişlər. Payız keçir, qarlı qış gəlir. Bu vaxt qız oğlandan qızılgül istəyir. Oğlan qalır mat-məəttəl ki, qışın oğlan çağında mən bu gülü necə tapım.

Alı o gündən başlayır gül axtarmağa. Çox ölkələr gəzir, nəhayət, uzaq bir ölkədən ağ rəngli bir gül tapıb gətirir. Amma qız ağ gül yox, qırmızı gül istəyir. Oğlan həmin ağ gülü götürüb çox gəzir. Nəhayət, bir gün o, bərli-bəzəkli bir bülbülə rast gəlir. Oğlan dərdini açıb bülbülə danışır. Bülbül oğlanın əlindəki ağ gülə baxır-baxır və vəcdə gəlib başlayır oxumağa. Bir neçə ağız oxuduqdan sonra özünü çırpır ağ gülün tikanlarına. Bu vaxt bülbülün sarı köksü al qana boyanır və ağ gül tez bir zamanda qırmızı rəng alır.

Oğlan böyük həvəslə gülü gətirib qıza təqdim edir. Qız isə gülə etinasız yanaşır və onu ayaqlar altına atır. Oğlan bundan bərk hirslənir və deyir ki, bu gül adi gül deyil, o elə bir güldür ki, qışın oğlan çağında sarı bülbülü eşqə gətirdi və sarı bülbül özünü gülə vurdu, sarı köksü al qana boyandı. Gülə olan məhəbbətindən sinəsindəki bütün qanı gülə verib özü məhv oldu. Deməli, sən bülbül kimi sevməyə qadir deyilsən. Böyük əziyyətlə tapılmış bu gülün, qana boyanmış sarı bülbülün qədir-qiymətini bilməyən qız sevginin, məhəbbətin də qədrini bilməz.

Guya o gündən oğlan qızdan üz döndərir. Gül isə elə ağ rəngində qalır.

## *120. Göyərçin*

Bir vaxtlar imamlarımızla gedən qanlı müharibələrdə yezidlərlə peyğəmbərlərimiz vuruşurlarmış. Bu vuruşma günlərlə, aylarla, illərlə davam edirmiş. Vuruşma su üstündə imiş. Peyğəmbərlər öz şəyirdlərini su üçün göndərirlər. Yezidlər gah onların

gözünü çıxardır, gah başını kəsir, gah da şaqqalayıb peyğəm-bərin üstünə göndərirmişlər. İşi belə görən peyğəm-bərlər özləri məcbur olurlar su arxasınca getməyə. Peyğəmbərlərdən Məhəmmədin çiynində imam quşu göyərçin var imiş. Bu quş onu çox ölümlərdən qur-tarmışdı. İndi də bir neçə dəfə Məhəmməd Peyğəmbəri öldürmək istəyənin gözlərini çıxardır.

Bunu görən yezid başçısı sərrast ox atıb, göyərçini gözündən vurur. Bu vaxt peyğəmbər əlini onun gözünə tutur, onun gözü kor olmursa da, daha əvvəlki kimi görmür, qızarıb qan çanağına dönür. Peyğəmbərin başı buna qarışır, o özünü unudur. Yezid fürsətdən istifadə edib peyğəmbəri öldürür. Göyərçin onun çiynindən düşür. Bu vaxt peyğəmbərin ölüb-ölmədiyini yoxlamaq məqsədi ilə göyərçin onun ətrafında fırlanır, qanı ətrafa yayılır, göl əmələ gətirirdi. Göyərçin gəzərkən ayağı Məhəmmədin qanına bulaşır. Göyərçin peyğəm-bərin qanına gözlərini də sürtür. Artıq gözləri görməyə başlayır. Həmin vaxtdan illər keçib, yenə də göyərçinin ayağı və gözləri qırmızı rəngdədir.

### *121. Bəy quş*

Deyilənlərə görə qədim zamanlarda quşlar arasında «ümumi hökmdar quşlar» olarmış. Belə «hökmdar quşlar»ı bütün quşlar razılaşıb seçirmişlər. Elə ki, onlar öz hökmdarlarını seçdilər, onun əmrlərini danışıqsız icra edərlərmiş. Ən mühüm məsələləri onların hamısının iştirakı ilə keçirilən yığıncaqlarında həll edərlərmiş.

Bir dəfə «hökmdar quş» vacib bir iş üçün bütün quşları yanına çağırır. Həmişə olduğu kimi bütün quşlar bu çağırışa vaxtında gəlir. Ancaq, təkcə bir quş gəlib çıxmır. Onun arxasınca iki dəfə elçi gedir, nəhayət üçüncü dəfə gəlib məclisə çıxır.

«Hökmdar quş» çox qəzəbli idi. O, bu itaət etməyən quşdan məclisə nə üçün gec gəldiyini xəbər alır. Quş isə cavab əvəzinə hoppanıb yerini dəyişir. İkinci sorğuda da yerini dəyişməklə kifayətlənir. Bu hərəkət hökmdara çox müəmmalı bir iş görünür. Ona görə də onun bu hərəkətinə marağı daha da artır. «Hökmdar quş» üçüncü dəfə quşun məclisə gəlmə-məsinin səbəbini deyil, nə üçün quşun hoppanıb yerini dəyişdiyini xəbər alır. Nəhayət, məclisə gəlmək istəməyən quş xilas yolunun tapıldığını hiss edərək müdrikanə bir görkəm alır və sözə başlayır:

- Mərhəmətli hökmdar, mən məclisə gələndə siz çox qəzəbli idiniz. Bildim ki, cəzadan çıxış yolum yoxdur. Ona görə yerimi  üç dəfə dəyişdim ki, bəlkə bu üç yerin biri mənə düşdü. Əgər düşərsə, deməli cəzadan xilas olaram.

### *122.Bülbül və qaratikan kolu*

Bir xan qəfəsdə bir bülbül saxlayarmış. Bülbül üçün hər cür şərait yaradılmışdı. Hər cür güldən onun qəfəsinin ətrafında var imiş. Ancaq o, bahar fəslinin gəlməsinə baxmayaraq, bir dəfə də gözəl səsi ilə oxumurmuş. Elə məyus-məyus durub baxırmış.

Xan deyir mən ki, onu o cür bəsləyirəm, yenə oxumur. Buraxın onu, çıxıb getsin. Ancaq onu izləyin, görün hara gedir. Xanın adamları görürlər ki,

bülbül uça-uça bir qaratikan kolunun üstündə bir bülbül yuvasının yanına qonur və «vətənə gəldim, imana gəldim» deyərək, cəh-cəh vurmağa başlayır.

Bütün bunları xana çatdırırlar. Xan öz-özünə fikirləşir. Mən ona o cür baxırdım, bütün bunlar qara-tikan kolunun yanında heç nə imiş.

### *123. Qarğa haqqında əfsanə*

Qədim zamanlarda bir yetim qız var imiş. Bu qızın bir analığı, bir də ögey anası varmış. Qız çox gözəl imiş, buna görə də analığı da, ögey bacısı da onun paxıllığını çəkirlərmiş. Bütün işləri yetim qız görürmüş. Həmin mahalda bir oğlan həm olduqca varlı, həm də çox gözəl imiş. Ögey ana öz qızını bu oğlana vermək istəyir. Oğlan isə yetim qıza aşiq olur və onu almaq qərarına gəlir. Ögey ana nə qədər çalışırsa bir şey çıxmır. Belə qərara gəlir ki, qızı şərləsin, atası onu incitsin və oğlandan ayırsın. Gözləyir oğlan onların evləri tərəfə gələndə, qızı bulağa su gətirməyə göndərir. Qız getmək istəmir. Analığın qorxusundan əlacsız qalıb gedir.

Qız su doldurub qayıdanda, oğlanı görür. Tez-tez gəlir ki, atası görər və onu öldürər. Birdən ayağı ilişib yıxılır. Oğlan tez gəlib onu qaldırmaq istəyəndə analığı yandan çıxır. Qızı da, oğlanı da hədələyir.

Qızı evə gətirir və deyir ki, bacın xəstələnib, həkim ona qar yeməyi buyurub. Mən ona qar axtarmağa getmişdim. İndi sən ona qar tapıb gətirməsən atana deyəcəyəm səni öldürsün. O, bilir ki, yayda qar tapa bilməyəcək və özünü qorxudan öldürəcək.

Qızın həm ögey bacısına yazığı gəlir, həm də atasından qorxur. Hava bərk isti idi. Qız bilirdi ki, indi

qar tapmaq qeyri-mümkündür. Əyninə qara paltar geyib oturur bir təpənin üstündə ağlayır. Allaha yalvarır ki, məni ya daş elə, ya da quş. Onsuz da analığım atama deyəcək, atam məni öldürəcək. Qız quşa dönür. «Qar-qar» deyərək o gündən fəğan eləyir. Qarğanın adı o vaxtdan yaranıb.

### *124. Simurğ quşu*

Məhəmməd peyğəmbər həftədə bir dəfə məscidin həyətində öz bəndələri ilə Allah, din və şəriət haqqında söhbətlər aparardı. Söhbətini «Allahın yazısına pozu yoxdu» kəlamı ilə yekunlaşdırardı. Hamı onun dedik-lərinə ürəkdən inanar və itaət edərdi. Simurğ quşu da məscidlərdə əyləşər, peyğəmbərə maraqla qulaq asardı.

Bir gün Simurğ quşu bildirir ki, ya peyğəmbər, sənin dediklərinə inanmıram. Mənə isbat ver. Məhəm-məd peyğəmbər quşa cavabında ərz eləyir ki, Allahın yazısına pozu yoxdu. Mənə indicə əyan oldu ki, Allah-təala Gündoğan hökmdarının təzə doğulmuş qızının taleyini Günbatan hökmdarının oğluna yazdı. Şübhən varsa, izləyə bilərsən.

Simurğ quşu özündən çıxır:

- İzləmək nədir, mən bu yazını mütləq pozacağam!

Simurğ quşu qanad açıb özünü Gündoğan ölkəsinə yetirir. Hökmdarın qızını oğurlayır, heyvan dərisinə bükür və insan yaşamayan bir adaya aparır. O qədər də uca olmayan bir ağacın başında ona ev düzəldir. Qıza elə meyvələr seçib verir ki, həm yeməyi, həm də suyu əvəz eləsin.

…Günbatan hökmdarının oğlu həddi-buluğa çatmışdı. Adətilə tay-tuşları ilə iti axan çayda çimirdi.

Birdən sel güclənir, oğlanı ağuşuna alıb düz qız olan adaya gətirib çıxarır. İnsan yaşamayan bu adada oğlanın ah-naləsi aləmi başına götürür. Bəni-insan səsi qıza da çatır. Qız evindən çıxıb ətrafına boylanır. Onlar bir-birini görürlər. Qızın işarəsi ilə oğlan ağaca dırmaşıb Simurğ quşunun düzəltdiyi evə daxil olur. Xeyli söhbətdən sonra onlar bir-birinə dəlicəsinə vurulurlar. Elə həmin gündən ər-arvad kimi yaşamağa başlayırlar. Vaxt çatanda bir oğulları da olur. Bir gün Simurğ quşu Məhəmməd peyğəmbərin məclisinə gəlib deyir ki, mən Gündoğan hökmdarının qızını insan yaşamayan bir adaya saldım. Beləliklə, sənin Allahının yazdığını pozdum.

Peyğəmbər deyir:

Ola bilməz. Uç get, o qızı buraya gətir. Onda mənim Allahımın qüdrətinə bələd olarsan.

Simurğ quşu geri uçur. Qızın evinin qabağında səs eləyib göstəriş verir ki, heyvan dərisinə bürünsün, onu aparacaq. Qız oğlanı da, uşağı da, özünü də dəriyə bükür. Simurğ quşu bükülmüş dərini peyğəmbərin məclisinə gətirib qürurla deyir: - Bu da Gündoğan hökmdarının qızı!

Peyğəmbər deyir ki, sən bağlamanı aç, sonra öyünərsən. Simurğ quşu göstərişə əməl eləyir. Gözlənilmədən dərinin içindən qız, oğlan, bir də uşaq çıxır. Simurğ quşu elə yerindəcə donub qalır. Allahın və onun Peyğəmbərinin qüdrətinə şəkk elədiyi üçün xəcalət çəkir. Peyğəmbər deyir:

- Üst kirpiklərin uzanıb ayağına düşsün. Kirpiklərin səni dünya işığına həsrət qoysun. Yurdun Qaf dağının arxasında insan yaşamayan bir məskən olsun. Köhnə dostluğumuza görə dünyanın sirrini sənə verirəm. Kim tilsimləri qırıb yanına gəlsə,

kirpiklərini hörük kimi çiynindən at, doyunca işıqlı dünyaya bax. Bəni-insan sifətini gör və ona dünyanın sirrini anlat.

Deyilənə görə, həmin gündən Simurğ quşu Qaf dağının arxasında tilsimləri sındıran insanları gözləyir ki, göz qapaqlarını qaldırıb dünya işığına baxa bilsin, dünyanın sirrini bəni-insana söyləsin.

### *125. **Dağda Maral xoş mələr.***

Ovçu Murad səhər ertə evdən çıxıb gedəndə arvadı Sona dedi:

- Ömrünü-gününü dağda-daşda keçirirsən, axı sənin külfətin var, gül parçası kimi övladın var. Bəs bizə kim bir gün ağlayacaq? Ata, ər olan kəs də həftələrlə çöllərdə qalarmı? Un-dənimizdən xəbərin olmur, geyim-kecimimiz vecinə gəlmir. Murad ona çımxırdı:

- Bu saat mənim gözümə nə sən nə də sənin oğlun görünür!

Sona ağlaya-ağlaya dedi:

- Axı, belə də olmaz. Birdəfəlik ya üz, ya düz.

- Daha mən getdim, bir də geri qayıdan deyiləm! – deyib ovçu Murad evdən çıxdı.

Ovçu Muradın başı ova elə qarışdı ki, arvadını oğlunu büsbütün unutdu.

Əslində o elə bunu istəyirdi.

Ovçu Murad Çiçəkli dağa çatmışdı. Aralıda bir maral gördü. Tüfəngini üzünə götürüb nişan aldı. Elə birinci güllə də marala dəydi.

Maral yerindən tərpənmədi. İkinci gülləni atdı, yenə də maral yerindən tərpənmədi. Üçüncü güllə açılanda maral yerə yıxıldı.

Maralın qaçmaması Ovçu Muradı çox təəccübləndirmişdi. Gəlib gördü ki, maral təzəcə bir cüt bala doğub.

Güllələr sinəsindən keçsə də, balalarını darda qoyub qaçmayıb.

Bunu görən ovçu Murad öz-özünə dedi: «Heyvan heyvanlığı ilə ölüm ayağında da balasını atıb qaçmır. Mən axı insanam!: Sənətim də nədir? Ananı baladan, balanı anadan ayırmaq!:»

Ovçu Murad maralın balalarını da götürüb evə gəldi.

Sona heyrətlə soruşdu:

- Murad nə yaxşı tez qayıtdın?

Murad heç bir söz deyə bilmədi, onu yaş boğdu, yanıqlı bir bayatı çəkdi:

Dağda maral xoş mələr,
Xoş inildər, xoş mələr,
Mənim ahu-zarımdan,
Dağ yıxılar daş mələr.

Ovçu Murad and içib tövbə etdi. O gündən ovçuluğun daşını atdı, əkinçiliklə məşğul olmağa başladı.

### *126. Xilaskar ilan*

Bir kişi bir bəyə dəvə aparırmış. Günlərin bir günü nər onun acığını tutdurur. O, nəri ağacla döyür. Sonra el ağsaqqalları onu belə işi nahaq gördüyü üçün danlayırlar və bildirirlər ki, o dəvə mütləq səndən qisas alacaq. Bunu nökər özü də hiss etmişdi (dəvələrin hərə-kətindən). Doğrudan da belə

olur. Bir gün nökər yenə dəvələri örüşə aparır. Amma görür ki, nər elə hey onu axtarır. Çıxılmaz vəziyyətdə qalan nökər kürdüsünü kolluğa atıb qaçır. Nər əvvəl elə bilir ki, kolluqdakı nökərdir. Kolluğa yaxınlaşıb onu təpikləyir, ancaq onun kol olduğunu görüb daha da əsəbləşir. Nökər elə qarşıdakı dağa çatanda dağda ilan görünür. Kişi qor-xusundan (ilan qorxulu olduğundan) huşunu itirir. Nökərin yıxıldığını görən nər tez özünü ona çatdırır. Elə bu vaxt ilan nərin burnunun ucundan necə vurursa, nər bir-iki metr kənara düşür, sonra ölür.

Nökər ayılıb görür ki, ilan yoxdur, amma bir az aralıda dəvə yıxılıb. Dəvə o qədər şişibdi ki, onu tanımaq mümkün deyil. Nökər tez durub dəvənin yaxınına gəlir və onu təpiklə vurur. Elə bu vaxt kişinin ayağı dizəcən dəvəyə batır. Sən demə ilanın zəhəri o qədər güclü imiş ki, onu tez bir vaxt ərzində çürüdübmüş. İndi həmin zəhərdən kişinin ayağına da dəyib. Həmin kişinin ayağı dizdən aşağı çürüyür.

### *127. Qızıl ilan*

Əfsanəyə görə keçmiş zamanlarda yoxsul bir qoca var imiş.  Bu qocanın dörd gözəl qızı varmış. Qoca bunları dolandırmaq üçün hər gün meşəyə gedib odun qırarmış, sonra odunları satarmış. Bir gün qoca həmişəki kimi odun yığmaq üçün meşəyə gedibmiş. Birdən qocanın gözü kolun dibində bir qutuya sataşır. Qoca qutunu gördükdə çox sevinir, elə bilir ki, qızıl tapıb. Tez qutunu götürür, açıb baxanda görür ki, qutunun içində bir qızıl ilan var. İlan dil açıb qocaya deyir ki,  ey yoxsul qoca, sənin

dörd gözəl qızın var, sən kiçik qızını mənə verməlisən. Get, sənə bir də meşəyə gələnədək vaxt verirəm. Nə vaxt gəlsən qızını da gətirərsən.

Qoca narazı halda başını tərpədib kor-peşman evə qayıtdı və bu barədə qızlarına heç bir söz demədi. Qoca səhərədək gözünü də yummadı, götür-qoydan sonra belə fikrə gəldi ki, daha o meşəyə getməsin. Bir daha ilanla rastlaşmasın. Qoca sübh açılan kimi başqa cığırla meşəyə yollandı. Başı aşağı odun yığmağa başlayanda gördü ki, ilan yenə kolun dibindədir. Qoca təəccübləndi, ilan qocaya tərəf qıvrılaraq deyir: «Yoxsul qoca, əgər mənə üçüncü dəfə qızını gətirməsən, səni tas-tas edə-cəyəm». Qoca yenə bir söz deməyib evinə qayıdır. Qızlarının dördünü də başına yığıb əhvalatı olduğu kimi söyləyir. Qızları da atalarına deyirlər ki, sən həlak olsan bizi kim dolandıracaq. Yaxşısı budur, hansımızı deyib, onu da apar. Qoca əlacsız qalıb kiçik qızı ilanın yanına aparır. İlan qızı görəndə qocaya razılığını bildirir və qıza deyir: - Mən bu qutuda dığırlanacağam, harda dayansam sən də orda dayanarsan. Qız ilan deyən kimi edir. Qutu bir daxmanın yanında dayanır, qutudakı ilan bir gözəl oğlan olur. Qoca qızın və ilanın arxasınca həmin daxmaya gəlir və ilanın oğlan olduğunu gördükdə çox sevincək evinə qayıdır və əhvalatı qızlarına danışır. Qızlar çox sevinirlər və bacılarını görmək üçün meşəyə gəlirlər. Daxmanı tapır və görürlər ki, bacıları var-dövlət içində yaşayır. Oğlan öz sevgilisinə tapşırıbmış ki, nəbadə mənim ilan libasında olan paltarımı yandırasan. Qızlar bacılarını öyrədirlər ki, sən sevgilinin ilan pal-tarını yandır, yoxsa birdən o paltara girib səni çalar. Qız bunların sözlərinə baxıb həmin paltarı yandırır.

Oğlan qıza əvvəldən deyibmiş ki, əgər mənim ilan paltarımı yandırsan, mən yox olacağam, gərək ayağında dəmir çarıq, əlində əsa məni gəzəsən, çarığın ucu nə vaxt dağıldı məni onda tapacaqsan. Qız bir neçə gün oğlanı gözləyir, oğlan gəlib çıxmır. Axırda ayağına bir dəmir çarıq, əlinə də bir əsa alır. Bütün ölkələri gəzir, bir bulağın yanına gəlib çıxır. Qız əldən düşdüyü üçün bir az su içir. Bir də görür ki, bir qız suya gəlir. Qıza yalvarır ki, onu qonaq aparsın, qız razı olmur və deyir ki, qərib eldən qonağım var, ona su aparıram. Qızın ürəyinə damır ki, bu qonaq onun nişanlısı olacaq. Fürsəti əldən vermir. Tez oğlanın verdiyi üzüyü cürdəyə atır. Qız evə gəlir, oğlan suyu içib qurtarandan sonra görür ki, cürdəyin dibində bir şey parıldayır, çıxardıb baxanda öz üzüyünü tanıyır və qızdan soruşur ki, sən bulağın başında kimi gördün? Qız danışır ki, bir dilənçi var idi, ayağında çarıq, əlində də əsa.

Oğlan bilir ki, bu, nişanlısıdır. Qıza deyir ki, get, o dilənçini çağır.

Qız bulağın başına gəlir və oğlanın nişanlısını evlərinə aparır.

Oğlan öz nişanlısı ilə görüşür və bir-birlərinə qoşulub öz ölkələrinə qayıdırlar. O gündən xoşbəxt yaşayırlar.

### *128. Keçi südü və ilan zəhəri*

Çox keçmiş zamanlarda bir kişi möhkəm xəstə-lənir. Onun xəstəliyi gündən-günə artır. Bütün tanınmış loğmanlara müraciət edirlər. Dərdinə əlac tapılmır.

Nəhayət, onu məşhur bir loğmanın yanına apa-rırlar. Loğman onun xəstəliyinin əlacı olmadığını söyləyir. Ümidsiz xəstə artıq öləcəyini yəqin edib,

yaşadığı yerdən baş götürüb gedir. Gəlib bir xarabalığa çatır. Yerə uzanıb inildəyir.

Görür ki, bir qara keçi peyda oldu. Haradansa bir arvad gəlib keçini sağdı və südü əlində gətirdiyi qaba töküb, oradaca qoyub getdi. Azacıq sonra bir ilan gəlib həmin südü içir və qaba qusub gedir.

Əziyyət çəkən xəstə həmin ilanın zəhər qarışıq qusduğu südü içib bu əziyyətdən birdəfəlik qurtarmaq istəyir. Bu niyyətlə sürünüb qaba yaxınlaşır. Gözünü yumaraq həmin zəhəri başına çəkib içir. Uzanır, öləcəyi anı gözləyir. Günlər keçir. Vəziyyətinin yaxşılaşdığını görən xəstə yavaş-yavaş qalxıb evlərinə tərəf üz qoyur. Gəlib evlərinə çatır. Çox keçmir ki, tamamilə sağalır. Xəstənin ilan zəhərinin köməyi ilə sağaldığı hər tərəfə yayılır. Belə söyləyirlər ki, ilan zəhərinin dərman kimi istifadə edilməsi təbabət aləminə elə o vaxtdan məlum olmuşdur.

## *129. İlan oğlan*

Biri var idi, biri yox idi, bir qoca qarı var idi. Bu qarının nə oğlu, nə də qızı var idi. Bir gün qarı evdə tək oturmuşdu. Qapı döyüldü, qarı durub qapını açdı, onun qarşısında bir qara ilan dururdu. Qarı qorxub geri çəkildi. Bu vaxt ilan dil açıb dedi ki, ana, sən məni oğulluğa götür.

Bu gündən ilan oğlan qarının oğlu oldu. Qarı və oğlan çox yaxşı yaşayırdılar.

Bir gün oğlan qarıya dedi: - Ana, get padşahın yanına, de ki qızını mənim oğlum istəyir.

Qarı gəlib elçi daşının üstündə oturdu. Padşah vəzirə dedi ki, get gör o qarı nə istəyir, onu yola sal.

Qarı dedi ki, onun padşahla işi var. Padşah qarını yanına çağırtdırdı və nə istədiyini soruşdu. Qarı oğlunun onun qızını istədiyini bildirdi.

Padşah qarıya söylədi ki, gərək onun oğlu padşahın imarəti kimi bir imarət tikdirə və onun evi ilə öz evi arasında bir yol saldıra, yolun kənarında yaşıl ağaclar əkdirə, sonra qızı ona verər.

Qarı gəlib bunu oğlana dedikdə, oğlan dedi ki, heç qəm yemə, anacan. Hər şey düzələcək.

Padşah səhər durub gördü ki, gündoğanda bir imarət var, onun imarətindən də gözəldir. Qarı gəlib padşaha bildirdi ki, imarət hazırdır. Daha padşah heç bir söz deyə bilmədi. Qırx gün, qırx gecə toy eləyib qızını ilan oğlana verdi.

Toydan sonra atası qızını qonaq çağırdı. Oğlan qonaqlığa gedə bilmədi. Çünki o, gündüz ilan, gecə isə oğlan olurdu.  Buna görə də qıza tapşırdı ki, heç kəsə bu haqda bir söz deməsin, ancaq necə oldusa qız qonaqlara bu sirri dedi və tez evə qayıtdı. Oğlan evdə yox idi. Qız əlinə dəmir əsa alıb yola düşdü, düz yeddi il yol getdi. Axırda dağın başında bir oğlanın dana otardığını gördü. Gedib gördü ki, ilan oğlandır. Oğlan qızı evlərinə apardı, oğlanın anası qızı görcək dedi ki, bu padşah qızı oğlumu aparıb gedəcək. Qız susamışdı. Arvaddan su istədi, arvad kasaya zəhər töküb qıza uzatdı. Qız içmək istədikdə oğlan vurub kasanı saldı.

Oğlan qıza dedi ki, gəl qaçaq. Üz tutdular qaçmağa. Bu vaxt onlar arxaya baxanda gördülər ki, bir qara bulud gəlir. Oğlan tez qızı yovşan kolu edib, özü isə ilan olub kola dolandı. Qarı gəlib gördü ki, düzənlikdə bir yovşan kolu var, üstündə də ilan ancaq bilmədi ki, hansı oğlandı, hansı qız. Sonra geri qayıtdı. Oğlanın anası gedəndən sonra yenə

başladılar qaçmağa. Az getdilər, üz getdilər, dərə, təpə, düz getdilər. Yenə arxaya baxdılar, bu vaxt yenə buludun gəldiyini gördülər. Oğlan düzdə bir bağban olub, qızı isə alma ağacı etdi. Yenə də arvad bilmədi ki, hansı qızdır, qızı öldürsün. Dedi ki, sonra oğlum olar, yenə də geri qayıtdı. Bunlar yenə üz tutdular qaçmağa, qaçıb tilsimli torpaqdan çıxdılar və gəlib qarı ilə şad və xoşbəxt yaşamağa başladılar.

### *130. Ağ ilan əfsanəsi*

Keçmiş zamanlar Ərəş mahalında Dərgah adlı bir kişi olur. O, mahir bir ovçu imiş. Quş ovlamaq məqsədi ilə bir gün Arça dağına gedir. Çoxlu quş ovlayır, ancaq qaranlıq qovuşduğundan geri qayıtmır və dağda gecə-ləyir. Səhər tezdən durarkən, bir ağ ilanın onun başı üstündə duraraq dilini çıxartdığını görür. Ovçu əvvəlcə qorxur, sonra fikirləşir ki, bu ilan məndən kömək istəyir. İlan ovçunun fikrini anladığından çevrilir. Bu zaman ovçu görür ki, ağ ilanın bədəni tamamilə yaradır. Bundan sonra ilan getməyə başlayır. Tez-tez dönüb geri baxır. Bu zaman ovçu tüfəngini də götürüb ilanın arxasınca gedir.

Bir qədər getdikdən sonra ilan bir quyunun yanına gəlir və bərkdən səs çıxardır. Bu zaman quyudan qara bir ilan çıxaraq ağ ilana hücum edir. Bunu görən ovçu qara ilanı tüfənglə öldürür. Ağ ilan bunu görcək sürətlə quyuya girib bir muncuq gətirir və ovçuya verir. Ovçu muncuğu da götürüb evə gəlir. Rəvayətə görə, bundan sonra muncuq daim evi və həyəti işıqlandırırmış.

### *131. Zümrüd quşu və ilan*

Bir gün Zümrüd quşu səhrada gəzirdi. Gördü ki, bir ilan sürünür. Dedi: – Ey ilan, mən çox yer gəzmişəm, amma sənin kimi ilan görməmişəm. İlan dedi: - Mən şahmaram (yəni, ilanların şahıyam). Zümrüd quşu soruşdu: - Ey ilan, sənin ləyaqətin nədir? – İlan dedi:

- Mən qara daşa nəfəs salsam daş alışıb yanar.

İlan soruşdu ki, bəs sən kimsən?

Zümrüd quşu dedi ki, mən də Simurğam.

İlan dedi ki, bəs sənin ləyaqətin nədir?

Zümrüd quşu dedi ki, mənim çox iti görən gözüm var. Göyün yeddi qatından baxsam tükü tükdən seçərəm.

İlan dedi ki, mən yerdə sürünürəm, sən bilirsən ki, mən göyə qalxa bilmərəm.

Zümrüd quşu dedi ki, mən səni qanadımın üstünə alıb ora qaldıraram.

Zümrüd quşu ilanı qanadının üstünə alıb göyə qalxdı. Bir qədər qalxandan sonra ilan dedi: - Ya Simurğ, mənim nəfəsim çatmır, bəsdi.

Zümrüd quşu bir qədər də qalxdı.

İlan dedi: -Ya Simurğ, sən mənim həyatımın məhvinə bais olmaq istəyirsən.

Zümrüd quşu dedi ki, indi bu tuşdan yenəcəyik ki, aşağıda bir nəş var. Vəhşi heyvanlar onun ətrafına yığılıb. Amma heç biri o nəşdən yemir.

Zümrüd quşu ilanla birlikdə aşağı endi və həmin nəşin yanında ilanı yerə qoydu. Dedi ki, ya şahmar,  mən gedim, o nəşdən yeyim.

Zümrüd quşu getdi, nəşə çatar-çatmaz bir şahə çəkdi. İlan gördü ki, Zümrüd quşu tora duşub.

İlan dedi ki, ay evin yıxılsın, göyün yeddi qatından bu nəşi gördün, burdan-bura toru görmədin? – Zümrüd quşu dedi:

- Ya şahmar, bu qəza torudur, bunu görmək olmaz.

### *132. Gülzarı ilan da sevir*

Nəbi adlı bir kişinin Gülzar adlı olduqca ağıllı, tədbirli, gözəllikdə tayı-bərabəri olmayan qızı var imiş. Gülzar on beş yaşına çatan gündən Nəbinin evindən bir gün də elçi ayağı kəsilmir. Amma gözəl Gülzar könlünü heç kimə vermirmiş. Buna həm ata-ana, həm də mahal camaatı təəccüb edirmiş.

Ata qızının yanına dəfələrlə adam salır ki, qızın fikrini öyrənsin, heç kimə könül verməməsinin səbəbini aydınlaşdırsın. Amma bir nəticə hasil olmurmuş ki, olmurmuş. Hər dəfə Gülzar dindirilən zaman onun dərindən ah çəkdiyini, heç nə demədiyini söyləyirmişlər. Bu dərd Nəbinin arvadı Bəstinin belini kaman kimi əymiş, saçını vaxtsız-vədəsiz süd kimi ağartmışdı. Anasında baş verən dəyişiklik Gülzarın nəzərindən yayınmırmış. Anasının düşdüyü bu acınacaqlı hal da Gülzarı dilləndirə bilmədi. Gülzar nə dinir, nə də danışırdı. Günü-gündən də şam kimi əriyirdi.

Bəstinin özündən böyük Mina adlı bir bacısı var idi. Minanın da Gülzarla yaşıd Südabə adlı bir qızı var idi. Südabə xalasıgilə az-az gəlirmiş. Südabə xalasıgilə gələndə Gülzarda kəskin dəyişiklik baş verirmiş. Südabə hər dəfə Gülzargilə

gələndə, aylarla evdən çıxmayan Gülzar onunla birgə həyətə çıxar, hətta evlərindən xeyli aralıda yerləşən gül bağına da gedərmiş. Bu dəyişiklik ata-ananın nəzərindən qaçmazmış. Onlar nə qədər çalışırlarsa, heç nə öyrənə bilmirlər.

Bəsti bacısından xahiş edir ki, Südabəni tez-tez onlara göndərsin, çünki Südabə onlara gələndə ev dustağı olan Gülzar evdən bayıra çıxır, heç olmasa gözü ilə gülə, çiçəyə, çölə-çəmənə baxır. Dərddən saralıb-solmuş bacısının sözunu yerə salmaq Minaya ağır gəlirdi. Yeganə qızından ayrılmaq anaya ağır gəlsə də, bacısına yox deyə bilmədi, istər-istəməz razı oldu. Həmin gündən Südabə Bəstigildə qalırdı. Bəsti bir şeyə təəccüb edirmiş. Südabə ilə Gülzar hər gün birgə bağ-bağçanı gəzər, sonra evə dönər, hər ikisi heç bir söz danışmaz, susarmışlar. Çıraqlar yanan zaman Südabə nə isə əlində bükülü bir şey evdən çıxar, əlindəkini evdən xeyli aralı bir yerə qoyar və Gülzar olan evə yox, o biri evə keçərmiş. Hər dəfə bunu görən ananı fikir götürərmiş. Axı Südabə Gülzar olan evə yox, başqa evə keçir, bu nə üçündü? Bu sualı ana dəfələrlə öz-özünə vermiş, amma cavab ala bilməyərək susmuşdu.

Səhər tezdən Südabə yataqdan qalxar, Gülzar yatan evin pəncərəsinə iki dəfə toxunar, Gülzar başını qaldırıb başı ilə gəl işarəsini verməyincə içəri keçməzmiş. Ana da bu anlaşılmaz mənzərəni seyr edər, heç nə anlamayaraq geri çəkilər, gözlərinə dəm verərək partlamaq dərəcəsinə çatan ürəyini sakitləşdirməyə çalışarmış. Ağlayıb yorulduqdan sonra ağlına gəlir ki, Gülzar yeməsə də axı, Südabə səhərdən acdır, heç nə yeməyib. Taqətsiz halda qızlar olan otağa gəlir. Amma qızları orada tapmır.

Fikirləşir ki, onlar yalnız gül bağında ola bilər, çünki Gülzarın uzaq getdiyi yer gül bağı olardı. Əvvəl istəyir ki, qızların yanına getməyib onları evdə gözləsin, sonra nə fikirləşirsə, bağa doğru addımlayır. Bağın qapısı ağzına çatanda heyrətdən donub qalır. Qaçmaq, bu dəhşətli mənzərədən uzaqlaşmaq istəyir, qıçları yerimir, qışqırmaq, düşdüyü bu əlacsız dərdi hamıya bildirib əlac istəmək istəyir, səsi çıxmır, yerində heykəl kimi donub tərpənməz olur. Bəsti arvad baxıb görür ki, Südabə Gülzardan xeyli aralıda dayanıb. Gülzar da əli qoynunda ayaq üstə durub, üstündə saysız-hesabsız əlvan rəng və naxışları olan bir ilan da onun üz-gözünü yalayır. Ana əvvəlcə qorxur ki, ilan qızına bir ziyan yetirər. Sonra bu işin sirli bir hadisəylə bağlı olduğunu güman edib susmağa məcbur olur. Xeyli bu qorxunc mənzərəni seyr etdikdən sonra evə yollanır və bu gördüyü hadisə haqqında ərinə bir kəlmə də demir.

Bir gün Nəbi kişi çıraqlar yanan zaman evə gəlirmiş. Evlərindən xeyli aralıda olan qoz ağacının dibinə çatar-çatmaz bir ilanın onların evinə doğru şütüdüyünü görür. Əlində olan iri zoğal ağacı ilə ilanı öldürmək istəyir. Nəbi kişi nə qədər güc verirsə, qolu yuxarı qalxmır. İlan onların həyətinə daxil olur. İlan həyətə girən kimi Südabə nə isə əlində gətirib evdən xeyli aralı bir yerdə qoyur. İlan çatıb həmin yerə qoyulmuş şeyi iyləməyə başlayır. İlan həmin şeyin başına pərvanə şamın başına dolanan kimi dolanır. Bir xeyli dolanıb qoxladıqdan sonra irəli, evə doğru gedir. O, elə sakit, elə asta irəliləyir ki, elə bil bayaqkı külək kimi ötən bu deyilmiş. Nəbi kişi cansız bir heykəl kimi bu dəhşətli hadisənin axırının necə olacağı haqqında düşünməyə başlayır.

Qorxusundan irəli yeriyib Südabənin həyətə qoyduğuna baxa bilmir ki, görsün o nədir ki, ilan onun başına elə dolanır. Nəbi kişi bir müddət gözləyir ki, görsün içəridən səs gəlirmi. İçəridən heç bir səs-səmir gəlmir. O, bilir ki, qorxulu bir şey yoxdur. Nə isə burada sehirli, sirli bir iş var. Həmin gecə necə deyərlər, ilan vuran yatır, Nəbi ilə Bəsti yata bilmir.

Səhər açılan kimi ilan həmin evdən çıxır və Südabənin axşam həyətə qoyduğu şeyin başına fırlanıb sakit-sakit gəldiyi yolla uzaqlşır. O, getdikdən sonra Südabə yatan evin qapısı açılır, o gəlib həyətə qoyduğu şeyi götürür və pəncərəni döyərək Gülzarın yanına gedir.

Bir gün gecənin oğlan çağında Südabənin möhkəm çığırtısı onsuz da yuxu üzünə həsrət olan biçarə ata-ananı diksindirdi. Səsə Nəbi kişi bayıra çıxır və bu hadisənin ilanla bağlı olduğunu zənn edərək əlində ağac içəri yüyürür. İçəri girən zaman Gülzarın çarpayıdan yerə yıxıldığını və hərəkətsiz qaldığını görür və çığırıb özünü onun üstünə atır. Gülzarın qapanmış vəziyyətdə qalan gözlərini və buza dönmüş bədənini nəzərdən keçirdikdən sonra dəhşətli vay-şivən qoparır. Səsə Bəsti də gəlir.

Bu necə şey olduğunu bilməyən yazıq arvad gah Südabəyə, gah da Nəbi kişiyə baxırdı. Birdən özünə gəlirmiş kimi «Vay, balam, bədbəxt balam, yaranan gündən üzü gülməyən balam, sənə nə oldu?» -deyib özünü Gülzarın buza dönmüş cəsədinin üstünə salıb iniltili bir səslə qışqırmağa başladı. Biçarə ərlə-arvad qızı götürüb çarpayıya uzatdılar.

Səhər açılır. Qonum-qonşu, dost-aşna yığılır. Heç kim yazıq qızın həyatdan vaxtsız getməsinin

səbəbini bilmir. Heç biçarə ata-ana da qızlarının birdən-birə ölməsinin səbəbini aydınlaşdıra bilmirlər. Çox ağladılar, yanıb-yaxıldılar, amma nə etməli, nə qədər vay-şivən qoparsalar da ata-anaya dəyən bu ağır zərbəni yüngülləşdirə bilmədilər. Onsuz da qəm-qüssədən gözləri açılmayan ata-anaya bu da lap dözülməz müsibət oldu. Günortaya yaxınlaşanda Gülzarı dəfn etmək üçün cənazəni çiyinlərinə qaldırdılar. Cənazəni aparanlar həyətdən çıxa-çıxda bir ilanın yaydan çıxmış ox kimi, həmin həyətə doğru gəldiyini görürlər. İlan onlara yaxınlaşanda quyruğu üstə dik qalxıb sanki cənazəni aparanlarla döyüşə girişir. O, yumru kündə şəklini alıb gah adamların başı üstən sağa, gah da sola atılırdı. Bu ilanın hərəkətinə üç adamdan başqa hamı mat qalmışdı. İlan adamların arasından şütüyüb Südabənin qıçlarına dolanır, başını onun ayaqlarına sürtür, sanki Gülzarı ondan istəyir, Gülzarın ölümündə onu təqsirləndirirdi.

Birdən ilan cəld hərəkətlə cənazəni aparanların lap qabaq cərgəsinə keçdi. Yola nabələd olan adamlara bələdçi kimi onların qabağı ilə qəbiristanlığa getdi.

Qəbiristanlığa çatanda özünü qəbirə tullayır, torpağı duz kimi yalayır. Gülzarın əbədi boş qalası yerini dönə-dönə qoxlayır. Sonra qəbirdən çıxıb cənazənin başına dolanır. O, heç kimə aman vermir ki, canəzəni qəbirə endirsin. Birdən adamların içindən kiminsə çıxıb kəndə doğru getdiyini gördülər. Bu, Südabə idi. Evə nə məqsədlə getdiyini heç kim bilmirdi. Bircə ilan onun nə məqsədlə getdiyini duyduğu üçün dönüb onun ardınca baxdı və insan kimi göz yaşı axıdaraq, heç kimin başa düşüb anlamadığı bir tərzdə nə isə yanıqlı-yanıqlı səsləndi.

Xeyli vaxt keçdikdən sonra Südabə əlində nə isə bükülü bir şey gəldi və əlindəki şeyi qəbirdən xeyli aralıya qoydu. İlan son dəfə Gülzarın cənazəsinin başına dolanıb Südabənin gətirdiyinə doğru getdi və büküyün arasına girib görünməz oldu. Adamlar bir azdan tufan qopacağından qorxurmuş kimi tez təşviş içərisində Gülzarı dəfn etdilər.

Demə, həmin o ilan Gülzar altı yaşında olan zamandan ona meylini salıbmış. O, hər gün Gülzarın yanına gələr, qeyri-adi bir hənirti duyan kimi, utanırmış kimi xəlvətə çəkilərmiş. Südabənin hansı xüsusiyyətisə ona xoş gəlmişdi. Ona görə də o nə Südabədən çəkinmir, nə də Gülzarı ona qısqanmırdı, onun yanında özünü sərbəst hiss edirdi. Hər gün görüş zamanı Gülzar özünü saxlaya bilməyib ağlayarmış, ilan da onu sevib oxşaya-oxşaya göz yaşlarını yalayarmış. Gecələr isə bütün gecəni Gülzarın qoynunda keçirərmiş. Südabənin çıxarıb onun qabağına qoyduğu isə Gülzarın köynəyi imiş. Əgər Südabə o köynəyi onun qabağına çıxarmasa, o təşvişlə özünü otağa salar və qeyri-ixtiyari bir fəlakət törədərmiş. Südabə hər dəfə köynəyi çıxarıb həyətə qoyar, o isə gəlib onu qoxlayar, bir az rahatlaşdıqdan sonra isə sakitləşib otağa daxil olarmış.

Gülzar öləndən sonra ilan Südabə ilə birlikdə qəbrin keşikçisi olur. Gülzarın qəbrini bürümüş qızılgül kolunun yaz, yay, qış, payız üstü zərif çiçəklərlə dolu olur və o heç vaxt təravətini, gözəl qoxusunu itirmir. Çünki onu Gülzarın vəfalı sevgilisi qoruyur. O, gündüzlər pərvanə kimi məzarın başına dolanar, gecələr isə sevgilisinin qoxusunu verən köynəyə bürünüb başını qəbrə söykəyib yatarmış.

Görüb eşidənlər deyir ki, çox oxşayıb, toyun görməyən, nəvə sevib, əlində oynatmayan Nəbi kişinin qəbir üstünə gələn zaman dilindən yalnız bu söz eşidilir: - Of! Pərvərdigara, Gülzarım necə mehribanmışsa, onu ilan da sevirmiş...

### *133. Qarpız*

Keçmiş zamanlar öz sənəti ilə hamının hörmətini qazanmış bir dülgər yaşayırmış. Dülgər peşəsinin mahir ustası imiş. Onun gördüyü işlər, açdığı naxışlar baxanı heyran edirmiş.

Bir gün usta xəstələnir. O, gecə-gündüz qızdırma içində yanır. Suya olan təşnəliyi sönmək bilmir. İçdikcə içir. Həmişə də sərin, buz kimi su istəyir. Yenə atəşi sönmür.

Dülgərin xəstələnməsi, mərəzinin tapılmaması camaatın işini ağırlaşdırır. Neçə-neçə tikilən evlər yarımçıq qalır. Ustaya nə qədər dava-dərman gətirirlərsə, bir xeyri olmur. Bir gün ustanın qapısından bir ilan içəri girir. O, xəstənin yanında şahə qalxaraq dönə-dönə dil çalır. Xəstə başa düşür ki, ilan onun üstünə köməyə gəlmişdir. Deyir:

- Allahın heyvanı, görmürsən qızdırmadan dilim ağzımda yanır. Bu halımda mən sənə necə kömək edim?

İlan əl çəkmir. Dil çalmaqda, yalvarmaqda davam edir. Əlacsız qalan dülgər birtəhər yerindən durub geyinir. Alətlərini götürüb ilanın arxasınca düşür. Yol onları qalın meşəliyə doğru aparır. Bir qədər gedəndən sonra meşədə maralı udmuş bir əjdahanı görürlər. Sən demə əjdaha bu ilanın anası imiş. İlan anasını xilas etmək üçün dülgərin qapısına

gedibmiş. Əjdaha son nəfəsində idi. Çünki maralın buynuzları onun boğazında ilişib qalmışdı. Dülgər cəld mişarı çıxarıb, maralın buynuzlarını kəsir və əjdahanı ölümdən xilas edir.

İlan dülgərin işindən razı qalır, yaxşılığın qa-bağında dilinin altından bir toxum çıxardıb xilaskara ve-rir.

Dülgər evinə qayıdır. İlanın verdiyi sirli toxumu torpağa əkir. Bir müddət sonra toxum bar verir. Qızmar günəşin altında ilan kimi uzanan tağda çox da böyük olmayan yumruvari meyvələr yetişir.

Usta amansız qızdırma və yanğı əlindən zinhara gəlmişdi. Artıq onun taqəti də tükənmişdi. O, belə əzabla yaşamaqda bir məna görmürdü. Odur ki, ölümü qabaqlamağı qərara alır.

- İlanın meyvəsi də özünə oxşayır. – Torpağın üstündə sürünə-sürünə gedir. – Yəqin meyvəsi də ölümdür. Qoy yeyim, xəstə canım biryolluq əzab-əziyyətdən qurtarsın.

Dülgər həyətə çıxıb yumru meyvələrdən birini tağdan üzür. Başına yığışan qonşular onu niyyətindən döndərməyə çalışırlar. Dülgər heç kimə əhəmiyyət vermədən bıçaqla meyvəni iki hissəyə bölür. Meyvənin üstünün göy olmasına baxmayaraq içi qan kimi qırmızı idi. O, meyvədən bir dilim kəsib yeməyə başlayır. Hamı gözləyir ki, usta bu saat öləcək. Meyvə isə elə sərin, elə dadlı idi ki, ləzzətindən doymaq olmurdu. Dülgər yedikcə deyirdi:

- Elə bil qar-buzdur. Bir işə bax, ölmək əvəzinə, canımın qızdırması səngiyir, ürəyimin atəşi sönür.

Bir-iki gündən sonra usta tamam sağalıb, ayağa qalxır. Qəribə meyvənin adı isə «qarbuz» (sonralar «qarpız» deyirlər) qalır.

### *134. İlan məhəbbəti*

Qədimlərdə Ərəş mahalında nəqqaşlıq sənətilə şöhrət tapan nurani bir qoca yaşayırdı. Qocanın üç oğlu və Tuti adlı bir qızı vardı. Qız dünya gözəli idi. Onun yerlə sürünən qoşa hörükləri gözəlliyini qənirsiz eləyirdi. Elçilərin biri gəlib, biri gedirdi. Ancaq gözəllər gözəli heç kimə könül vermirdi. Qoca nəqqaş həm dolanmaq, həm də dinclik xatirinə Azərbaycanın başqa əyalətlərindən birinə köçür. O, burada da şöhrət qazanır. Adı dillər əzbəri olur. Bir çox ölkələrdən qocanın yanına gəlirlər. Qızın hörükləri burada da hamını valeh edir.

Məlik xan adlı birisi qıza elçi düşür. Qız isə yenə könlünü heç kəsə vermək istəmir. Xandan başqa bu hörüklərin başqa vurğunu da var imiş. Bu iri başlı bir gürzə idi. Tüti hər gecə yatağına girib yuxuya gedəndən sonra həmin gürzə onun hörüklərinə dolanıb yatardı. Səhər isə heç kimin xəbəri olmadan çıxıb gedərdi.

Bu minvalla xeyli vaxt keçir. Qocanın ailəsi şad və xürrəm yaşayırdı. Əli hər yerdən üzülən Məlik xan fənd edir, adam göndərib qocanın xəbəri olmadan Tutini aparır. Səhər gürzə Tutini yatağında görmür. Duyur ki, qızın başında bir fəlakət var. Hirsindən şahə qalxıb aramsız dil çalır.

Gecdən-gec xəbər tutan qoca oğlanları ilə birlikdə Tutini axtarmağa başlayır. Ancaq qızın sorağını ilan onlardan tez alır. O, gündüzü gecə

edib, xanın sarayına girir, bir örtüdə yatmış Məlik xanı və Tutini çalır. Sonra da sürünə-sürünə bir qayanın başına çıxır. Tutinin həsrətinə dözməyib özünü qayadan atır.

### *135. Qız və ilan*

Qızlar bulaq başına gəzməyə çıxırlar. Bir qədər gəzdikdən sonra Murada tay-tuşlarının gözündən yayınaraq bağın bir küncündə olan gözəl bir qızılgül kolunun yanına uzanaraq yatır. Bir müddət keçdikdən sonra qız gözlərini açır və ona zillənmiş iki gözü görüb qorxur. Ancaq qız get-gedə bu baxışlardan o qədər şövqə gəlir ki, əl uzadıb yanında yatdığı güldən bir çiçək qoparıb ilana vermək istəyir. Ancaq göz gəzdirəndə qızılgül kolunun ətrafında olmadığını görür və başa düşür ki, elə həmin kol bu ilandı.

Qızların şübhələnməsindən ehtiyat edərək ilandan ayrılıb onların yanına gəlir. Beləliklə, Murada hər gün qızlardan yayınaraq ilanın yanına gəlir. Qız ilandan ayrılmaq istəmir.

Qıza hər yerdən elçi gəlirlər. Qız isə onların hamısına yox cavabı verib geri yola salır. Atası elçiləri geri qaytarmasından və hər gün eyni vaxtda qızın harasa getməyindən şübhələnərək onu güdməyə başlayır. O, qızın arxasınca gizli gəlib görür ki, qız bir kolun altında uzandı və həmin kol bir ilan olaraq onun boyun-boğazına sarıldı, daha sonra sinəsi üstündə qıvrılıb yatdı.

Ata bunu görüb qəzəblənir və qılıncı çəkib ilanın başını bədənindən üzür. Qız şaqqıltıya oyanır və atasının əlində qılınc başı üstündə dayandığını

görür. Yanına baxanda ilanın başının üzüldüyünün şahidi olur. Qız qıyya çəkərək özündən gedir. Sonralar qız hər gün ilanın öldürüldüyü yerə eyni vaxtda gəlib ah-nalə edərək ağlayır.

Qız məhəbbətin sarsıntılarına dözə bilməyib ilanı basdırdığı yerdə özünü xəncərlə öldürür. İndi onların dəfn olunduqları yerdə bir qızılgül kolu bitib.

### *136. Qızıl ilan*

Bir əkinçinin bir dənə öküzü olur. Əkinçi bu öküzlə yer şumlayır. Bir dəfə əkinçi öküzü çöldə qoyub günorta yeməyinə evə gəlir. Nahar elədikdən sonra çölə işə gedir. Əkinçi öküzə yaxınlaşanda görür ki, bir qızıl ilan öküzün ayağının altındadır. Qızıl ilan əkinçini görən kimi dilini çıxarıb əkinçiyə yalvarır. Əkinçinin ilana yazığı gəlib, onu azad edir, qızıl ilan isə sevinmiş yola düşür. Sonralar əkinçi yer əkəndə bir də həmin ilanın ağladığını görür. Əkinçi ilanın yanına gələndə ilan geri çevrilib gedir. Bunu bilən əkinçi ilanın dalınca gedir. Gedib görür ki, həmin qızıl ilan başqa bir ilan ölüsünün üstündə durub daha da bərk ağlayır. Əkinçi bunun ağladığını görəndə özü də ağlayır.

Əkinçi sabah gedib görür ki, həmin ilan başını ölən ilanın üstünə qoyub ölüb.

Əkinçi sonra başa düşür ki, bu qızıl ilanlar bir-birlərini sevirlərmiş ki, iki sevgilidən biri öləndən sonra o biri də onun üzərinə başını qoyub ölüb.

### *137. İlanların müharibəsi*

B i r i n c i  ə f s a n ə. Qədim zamanlarda bir kişi Kür çayında gəmiçi işləyirmiş. Onun işi, peşəsi camaatı bu taydan o taya keçirməklə çörək pulu qazanmaqmış. Gəmiçi bir səhər görür ki, Kürün sağ sahili ilə nizamla saysız-hesabsız ilan sürüsü gəlir. Dəstəyə başında bəzəkli tac olan ilanlar padşahı başçılıq edirdi. İlanlar hirsindən, qəzəbindən fıs-fıs fısıldayırdı. Hamısının gözündə bir intiqam hissi alışıb yanırdı. Bu görkəmdə, bu nizamda, bu çoxluqda onlar ancaq amansız düşmən üstünə gedə bilərdi. Kişi əvvəlcə bərk qorxuya düşür. Ancaq ilanların padşahı işarə ilə başa salır ki, onlar Kürün o biri sahilinə keçmək istəyir. Gəmiçi gəmini rahatlayır. İlanlar gəmiyə dolmağa başlayır. Kişi ilanların hamısını o taya keçirir. İlanlar düz yeddi gəmi yarım olur.

Aradan bir neçə gün keçir. Bir də gəmiçi görür ki, o taya keçirdiyi ilanların bir qismi qayıdıb gəlib. Qayıdan ilanların əksəriyyəti quyruğundan, belindən, başından yaralı idi. Sən demə ilanlar hardasa başqa ilanlarla müharibə edibmiş. Başında tac olan ilan yenə də gəmiçini başa salır ki, onları o biri taya keçirsin. Dəstənin azalmasına, yaralıların çoxluğuna baxmayaraq, ilanlar padşahının gözlərində zəfər sevinci parlayırdı. Deməli onlar düşmənlərinə qalib gəlmişdilər. Gəmiçi ilanları o biri sahilə keçirir. Vur-tut iki gəmi ilan olur. O taya keçdikdən sonra ilanların başı taclı padşahı gəmiçiyə ağzından bir ləl çıxarıb verir. Ləl çox qiymətli imiş. Deyirlər, elə həmin hadisədən sonra gəmiçi kasıblığın daşını atıb varlı-dövlətli bir adam olur.

İ k i n c i  ə f s a n ə. Keçmişdə Mahmud adında bir bərəçi Salyan şəhərinin kənarında ev tikib

bərəçiliklə məşğul olurmuş. Günlərin bir günü bərəçi Mahmud Kür qırağındakı komasında yavan çörək yeyir və sonra da kürkünə bürünüb yatır. Gecə yarı Mahmudun üstünə saldığı kürk çəkilir. Mahmud yuxudan ayılıb hər tərəfin işıq olduğunu görür və elə zənn edir ki, səhərdir. Sən demə gecənin aydınlığı imiş. Mahmud təzədən yatmaq istərkən iki ilan kürkünü bir də dartır. Mahmud kürkün bir ucunu əlində tutaraq öz komasından çıxır. Hər tərəfin ilanlar tərəfindən tutulduğunu görür. Mahmud bərəni açır. Bərə ilə quru yer arasına taxta qoyur. İlanlar həmin taxta vasitəsilə bərəyə dolurlar. Mahmud bərəni Salyanın alt hissəsinə sürür, Kürün sahilində saxlayır. Bütün ilanlar, bərədən düşərək taclı bir ilanın işarəsini gözləyirlər. İlanın göstərdiyi istiqamətə doğru gedən yüzlərlə ilan bir an içində görünməz olur. Mahmud bu hadisə ilə maraqlanır. Öz gördüklərini qonşusu Nəsirə söhbət edir.

Nəsir deyir: - Sənin bərə ilə keçirdiyin ilanlar müharibəyə gedirlər.

Nəsir öz atını yəhərləyib Mahmud ilə birlikdə Kür qovuşan şoranlığa gedir. Orada iki böyük ilan dəstəsi bir-biriylə vuruşurdu. Tamaşa edəndə görürlər ki, ilanlar bir-birinə sarmaşaraq dişləri ilə didişirlər. Mahmudun bərə ilə keçirdiyi ilanlar qalib gəlir.

Xeyli tamaşa etdikdən sonra Nəsirlə birlikdə geri qayıdırlar. Mahmud bərəni həmin yerə yaxınlaşdırır. Gecə yarıda ilanların gəldiyini görür. Yenə bərə ilə quru arasında uzun taxta qoyur. Müharibədən qayıdan ilanlar taxta üzərindən keçib bərəyə dolurlar.

Mahmud ilanlara fikir verir. İlanların bəzisinin yaralı olduğunu görür. Ancaq bu ilanlar içərisində iri,

qara ilanlarla əhatə edilmiş iki ağ və bir neçə gözəl ilan görür. Bu ilanlar müharibədə əsir alınmışdır. Mahmud bərəni saxlayır. İlanlar bərədən tökülür, taclı ilan isə ağzından ləl salıb gedir. Bu, ilanlar padşahının Mahmuda hədiyyəsi idi.

İlanların həmin müharibəsi indi də el arasında «İlanların Sarı dağ davası» adı ilə məşhurdur.

### *138. Qızı əjdaha udur*

Təzə nişanlanmış iki sevgili güllü-çiçəkli çəməni gəzir, məhəbbətdən, sədaqətdən şirin-şirin söhbət edirlər. Oğlan danışır, qız isə qulaq asırdı. Oğlan:

-Mənim üçün həyatda sevgilimdən, onun məhəbbətindən qiymətli bir şey yoxdur. Mən bu məhəbbətin uğrunda ölümə gedərəm. Canım qədər istədiyim bu məhəbbəti ömrümün sonuna kimi yandıran atəşdən, donduran şaxtadan, öldürən qorxunc əjdahalardan qoruyacağam.

Oğlan çox danışdı, məhəbbətin sərrafı, qəhrəmanı oldu –qız dinmədi. Sevgilisinin dediklərinə sakitcə qulaq asdı. Oğlan incidi:

- Sən heç mənə olan məhəbbətindən danışmırsan. Görünür, məni o qədər də sevmirsən.

Qız oğlanın narahatlığını yaxşı başa düşürdü:

- Mən məhəbbət haqqında danışa bilmərəm. Sağlıq olsun, yaşayarıq görərsən.

Sevgililər çox gəzib, çox dolanırlar. Axırda yorulub əldən düşürlər. Dincəlmək üçün səfalı bir

yerdə otururlar. Hər ikisini yuxu tutur. Xeyli keçdikdən sonra qız vahiməli bir hənirtiyə oyanır. Görür dəhşətli bir əjdaha oğlanı udmaq istəyir. O, qışqırır. Sevgilisini xilas etmək üçün özünü əjdahanın üstünə atır. Əjdaha dərhal qızı yarıya qədər udur. Oğlan yuxudan ayılıb vəziyyəti belə görən kimi qorxusundan uçunur. Qaçmaq istəyir. Qız qorxmayıb əlini yana açdığı üçün əjdaha onu tamam uda bilmir.

Qız oğlana deyir:

- Əjdahanı xəncərlə doğra. Onu cəhəngindən üzü aşağı yar.

Oğlan qorxusundan yaxın durmur.

Qız deyir:

- Sənin kimi qorxaqla ömür sürmək əjdahaya qismət olmaqdan daha qorxuludur..

Qız hirsli-hirsli qollarını yuxarı qaldırır. Əjdaha asanlıqla onu udur.

### *139. İlan və qaranquş*

İlanla arı qonşu idi. Arı çiçəkdən-çiçəyə qonur, şirə sorur, şan düzəldir, qışda da yuvasına çəkilib baldan şirin-şirin yeyir, təzə yaza kefi kök, damağı çağ çıxırdı. İlan aylarla ov dalınca sürünür, girinə keçəndən də bir həzz, bir ləzzət duymur, çox zaman ağzının acısını almağa heç bir şey tapa bilmirdi.

Bir gün arıya deyir:

- A qonşu, boş-boşuna sürünməkdən canım yerdə, daşlarda, qayalarda qalır, tapdığım da heç bir şeyə yaramır. Məni bu əzab-əziyyətdən qurtar.

- Nə kömək istəsən, mən hazır!

İlan dedi:

- Bircə günündən mənə görə keç. Gör hansı canlının qanı şirindir.

Arı şən-şən güldü:

- A qonşu, elə bildim məni müşkül işə buyuracaqsan. Bundan asan nə var ki!..

Qaranquş öz yuvasını hörürdü. Bu qonşuların söhbətini eşitmişdi. İlandan zəhləsi gedirdi, çünki bu ilan neçə dəfə onun balalarını yemişdi.

Qaranquş arının dalınca düşdü.

Arı gah qoyunun, gah keçinin, gah cüyürün, gah da maralın boynuna qondu. Vızıldayıb uçdu. Axırda yol gedən bir qoca kişinin alnına yapışdı. Geriyə doğru uçanda Qaranquş bildi ki, arı xəbərə qaçır. İlana deyəcək ki, ən şirin qan insanın qanıdır. Bundan sonra ilan yer üzündə salamat insan qoymayacaq, hamısını çalacaq. Qaranquş insanlardan razı idi, çünki insanlar onun yuvasını dağıtmır, balalarına toxunmurdular.

Qaranquş arını qabaqlayıb onu dilə tutdu:

-Xoş gördük, a ellər yaraşığı, neçə vaxtdır səni görmürəm, necəsən, necə dolanırsan?

Arı:

-Çox sağ ol, -dedi, -yaxşıyam, yaxşı dolanıram.

Qaranquş onun ağlını oğurlamağa başladı:

-O gün qarğa yaman öyünürdü ki, hamı mənim səsimi tərifləyir. Deyir, səsim yox, dilim şirindir.

Mən də ona dedim ki, heç öyünmə, mənim qonşum arının dilinin şirinliyinə şirinlik çatmaz. Dilini çıxaran kimi yerə bal damır. Qarğa gəlməmiş dilini göstər görüm düzmü demişəm, yalanım çıxmasın.

Arı dilini çıxaran kimi Qaranquş onun dilini dimdiyi ilə kökündən qopardı, qaçdı.

Arı lal oldu, vızıldaya-vızıldaya qaldı. İlana heç bir şey başa sala bilmədi.

İlan işin niyə belə olduğunu duydu. Qaranquşu tutmaq istədi, ancaq dişi onun quyruğundan bircə lələk qopardı. Qaranquşun quyruğu o vaxtdan haça qaldı. İnsanlar bu işdən xəbər tutdular. Qaranquşun yuvasını öz evlərinə köçürdülər.

### *140. Maralın göz yaşları*

Ovçunun atdığı ox ana maralın balasını yaralayır. Dağı o biri üzə aşan kimi körpə maral yerə yıxılıb can verir. Ana maral balasının başı üstündə durub göz yaşları axıdır. Bunu görən yolçunun ürəyindən qara qanlar axır, insafsız ovçuya lənətlər yağdıra-yağdıra yanıqlı bir bayatı çəkir:

***Maral durduğu yerdə,***
***Boynun burduğu yerdə;***
***Ovçunun qolu sınsın,***
***Maral vurduğu yerdə.***

Səhər tezdən həmin ovçu yenə də ova getməyə hazırlaşır. Onun aman-zaman bircə oğlu var imiş. Uşaq atasından əl çəkmir. «Mən də səninlə ova gedəcəyəm», -deyib, durur. Ata başqa bir bəhanə ilə evdən çıxıb gedir. Oğlu da onun dalınca yollanır. Ovçunun bundan xəbəri olmur. Uşaq xeyli yol gedəndən sonra yorulur, bir dağdağan ağacının dibində xəzəlin içinə girib yatır.

Ovçu indi də ana maralı qova-qova gətirir. Maral dağdağan ağacına çatanda ovçu oxu atır. Ox marala deyil, xəzəlin arasında yatmış oğluna dəyir.

Uşaq bircə dəfə «Uf, ata!...» -deyib qışqırır və canını tapşırır.

Dünən həmin yolla keçən yolçu qayıdanda görür ki, ovçu bu gün də oxla öz oğlunu öldürüb. Maral o tayda balasının üstündə, ovçu da bu tayda oğlunun başı üstündə göz yaşı tökür.

Yolçu uşağın göllənmiş qanını görəndə qəlbi od tutub yanır, elə bir bayatı çəkir ki, dağlara, dərələrə səs salır:

***Əzizim, dağda qanı,***
***Qan gördüm dağdağanı.***
***Ovçu vurdu balasın,***
***Göl oldu dağda qanı.***

## *141. Hərşənin maralları*

Əhməd kişi səkkiz nəfərlik ailəsini çox çətinliklə dolandırırdı. Ovçuluq onun yeganə peşəsi idi. Ətraf meşələrdə maral dəstələri yaşayırdı. Hansı rastına çıxsa, nişangahdan yayınmasa, barmaqları titrəmir, atırdı.

Əhmədin arvadı Hərşə xoşxasiyyətli, işgüzar, insaflı bir adam idi. O, ərinin ovçuluğuna heç cür dözə bilmirdi:

-Kişi, tüfəngi tulla, bu günahsız maralları qanına qəltan eləyib uşaqlarımıza ruzi gətirəndə elə bilirsən savab iş görürsən? Güzəranın ağırlığı külfətin çoxluğundan deyil, ovçuluqdandır. Ovçunun insafı olmaz. Onu bil ki, insaf olmayan yerdə çörək də olmaz.

Tez-tez baş verən deyişmələrdə Əhməd kişi Hərşəyə deyirdi:

- Öldürməsəm, axı acından ölərsiz.

- Sən tüfəngi yerə qoy, mən də işləyəcəyəm, sənə kömək edəcəyəm. Marallardan xof elə, onları günahsız qanlarına bələmə, acından ölmərik.

Hərşə onun-bunun yununu yığıb darağa çəkir, iplik edirdi. Darağın iti dişləri Hərşənin əllərini xına kimi qana boyayırdı. O, bundan incimirdi. Təki maralların qanı tökülməsin.

Bir gün Əhməd körpə bir maral gətirmişdi. Ağzında süd qana qarışmışdı. Hərşə bunu görəndə elə bil ürəyinə dağ çəkildi, əri ilə bərk dalaşdı. Gecə xəl-vəti ovçunun tüfəngini ağlagəlməz bir yerdə gizlətdi. Səhəri Əhməd kişi tüfəngi tapmadı, arvadından soruşdu. O, da xəbəri olmadığını bildirdi. Ovçu hirsləndi:

- Bilirəm, tüfəngi sən gizlətmisən. Arxayın ol, bir də maral vurmaram. İndi acından ölün. Üç gündən sonra özün yalvaracaqsan. Əhməd, al tüfəngi, səhv eləmişəm, get maral ovla, acından ölürük – deyəcəksən.

Hərşəni ağır günün qara kölgəsi bassa da, sevincini gizlətmədi:

- Naümid olma, ay kişi ölmərik!

Hərşə məqsədinə nail olmuşdu. Amma, doğrudan, onlar bu qədər uşağı necə saxlayacaqlar? Bu fikirlə yuxuya getdi. Yuxuda ona dedilər: «Hərşə, uşaqların fikrini çəkmə, ac qalmazlar. Sabah alatoran «Maral kalafası»na gedərsən. Marallar süd gətirəcəklər. Onları sağarsan. Onlar heç vaxt Hərşəni darda qoymazlar».

Hərşə yuxudan dik atıldı. Qab-qacaq götürüb «Maral kalafası»na yollandı. Çatanda gördü ki, doğrudan da döşü südlə dolu üç ana maral onu

gözləyir. Hərşə onları sevəliyə-sevəliyə sağdı. Oradaca ocaq çatıb, südü bişirdi. Yarısını qatıq çalıb geri qayıtdı. Bu hadisə hər gün təkrar olmağa başladı. Marallar Hərşənin ocağına alışmışdılar. Gecə yarıdan keçmiş «Maral kalafası»nda ocaq yanan kimi onlar gəlirdilər. Ailə acından ölməkdən xilas olmuşdu.

Əhməd kişi gördü ki, evdə qatıq-süd ayaq tutub yeriyir. Şübhələndi:

- Arvad, bu dövlət haradandır?

- Sənin vurduğun marallar verir. Sən onların balasını öldürsən də, onlar sənin balanı darda qoymurlar.

Əhməd kişi heç cür arvadın sözünə inanmadı. Maral da insana süd verərmi? Onu güdməyə başladı. Gördü arvadı hər gecə yarıdan sonra yoxa çıxır, işıqlaşanda süd-qatıqla geri qayıdır.

Ovçu axtarıb tüfəngini də tapdı. Gecəni yatmadı. Hərşə geyinib yola düşəndən sonra, kişi də qarabaqara onun arxasınca düşdü. Gəlib kalafaya çıxdılar. Əhməd xeyli aralıqda özünü rahatlayıb gizləndi. Hərşə ocaq qalayıb maralları çağırdı. Xeyli ötdü, marallar gəlmədi. Uzaqlarda onların kölgələri vurnuxurdu. Marallar qatilləri ovçu Əhmədin kalafanın kənarında pusquda yatmağını hiss etmişdilər. Ona görə Hərşə «çağır-mağına» baxmayaraq, gələ bilmədilər.

Yorulub əldən düşmüş Hərşəni ocağın kənarında yuxu tutdu. Paltarına nə vaxt od düşdüyünü bilmədi. Birdən ocağı gur alov bürüdü. Dağ-daş işıqlandı. Marallar da göründü, çiyni tüfəngli ovçu Əhməd də. Marallar da, ovçu Əhməd də özünü ocağa yetirdi. Amma gec idi. Hərşənin külü ocağın külünə qarışdı.

Hərşənin ocağı, «Hərşənin küllüyü» indi də durur. Hər il marallar bu ocağa ziyarətə gəlir, ağlayır, onun külündən yalayıb gedirlər.

Bu hadisədən sonra Əhməd tüfəngini atmadı, əlində daha möhkəm saxladı. Maralları qıran tüfəng, maralların keşikçisinə çevrildi. «Hərşənin marallarına toxunmaq olmaz» -dedi.

### *142. Maral qayası*

Bir vaxt Şəmsəddin meşələrində maral sürü ilə gəzirmiş. Meşənin gözəlliyi, bəzəyi olan marallar nə qədər ki, top-tüfəng səsi eşitməmişdi, insanlardan qaçmaz, hürkməzdilər. Vaxt gəldi, vədə yetişdi, insan odlu silah yaratdı. Çox çəkmədi bu silah heyvanın, insanın qənimi oldu.

Belə danışırlar ki, var-dövləti aşıb-daşan Əhməd adlı bir şah varmış. Bu şahın Ceyran adlı bir qızı varmış. Qızın gözəlliyinə hamı heyranmış. O, gözəl olduğu qədər də ağıl sahibi imiş. Qonşu məmləkətlərdən gələn şah elçiləri əliboş qayıdırlarmış. Parıltılı nadir daşlar, qiymətli əşyalar onun gözlərini qamaşdırmır. Atasının istəyi xilafına olaraq Ceyran yad ölkələrin adlı-sanlı şahzadələrinə məhəl qoymur.

Ceyranın qəlbini ələ almaq üçün igidlər hünər meydanı açır. Kimi üzükdən ox keçirir, kimi daş oynadır, kimi də var-dövlətinə şülən çəkir. Əhməd şah çox istəyir ki, qızı heç olmasa öz ölkəsinin əlverişli, layiqli aşiqlərdən birini bəyənsin.

Şahın nökərləri içərisində ağlı, cəsarəti, sədaqəti ilə seçilən Zaman adlı birisi də vardı. Yazıq kasıblığının ucundan nökərçilik edirdi. Zaman göydə

Allahdan, yerdə Əhməd şahdan xof eləməyib, Ceyrana mehr salmışdı. O, ürəyini gilə-gilə əridən məhəbbətini şah qızına bildirdi. Artıq Zaman şah üçün itaətkar nökər, qızı üçün aşiqlərin şahı idi.

Günlər keçirdi. Elçilərin kor-peşman qayıtması şahı məyus edirdi. Nəhayət, o, qızı ilə üz-üzə dayandı:

- Gözümün ağı-qarası! Gənclik bir tər çiçəkdir, nə qədər ki, təravətlidir, onu dərmək istəyənlər çox olur. Vaxtı keçib soluxanda hamı üz döndərir…

Ceyran atasının hansı simə vurduğunu o saat anladı.

- Düzdür, ata. Ancaq həqiqi aşiq gülü təravətinə görə yox, qoxusuna, ətrinə görə ömrü boyu atmır.

- Qapımıza payəndaz kimi döşənən aşiqləri niyə bəyənmirsən, onların nəyi çatmır.

-Ata, sənin qapına payəndaz kimi döşənən elçilərin, aşiqlərin qılıncı-tüfəngi var, nəsli-nəcabəti var.

- Qızım, daha nə istəyirsən?

- Ata, ürək istəyirəm, ürək! Mənim məhəbbətimə layiq olan ürək! Onların hamısı mənə yox, sənin xəzinənə, sənin şan-şöhrətinə vurulub.

Əhməd şah qayğı və fikirlər içərisində soruşdu:

- Bəs sənin böyük, müqəddəs, ülvi məhəbbətinə layiq ürək varmı?

Ceyran bütün cəsarətini topladı. Fürsəti əldən qaçırmaq olmazdı:

- Var, atacan! Zaman…

«Zaman» sözünü eşitcək elə bil zəlzələ qopur, vulkan püskürür, dağ-daş Əhməd şahın başına uçur. Lakin ata birdən-birə qızının qəlbinə dəyməyə qorxur. Nökər ola-ola şah qızına məhəbbət yetirən

bir gədaya tədbir görmək qərarına gəlir. Zamanı yanına çağırıb mehribancasına söhbət edir:

- Şaha kürəkən olmaq istəyən aşiq hökmən bir sınaqdan çıxmalıdır. Səni yüngül bir imtahana çəkəcəyəm. Yaxınlıqdakı meşədən mənim Ceyran qızıma yaraşan diri bir maral tutub gətirərsən, toyunuzu vurduraram.

Sevgililər sevinirlər. Bu peşədə səriştəsi olmayan Zaman kəmənd götürüb meşəyə üz tutur. Necə olur-olsun, nəyin bahasına olur-olsun, eşqini sübuta yetirməlidir. Zaman çox gəzir, çox dolaşır, yorulub əldən düşür, ancaq inadından dönmür. Onu görən marallar duyuq düşür, qaçırlar.

Bir gün belə keçir, iki gün belə keçir, heç bir murad hasil olmur. Axırda Zaman duz götürüb açıq talada yastı daşın üstünə səpir, özü isə yaşıl otların arasında gizlənir. Marallar duzlağa gəlir. Qəfildən kəmənd atılır. Marallardan biri buynuzundan kəməndə ilişir. Zaman çox çətinliklə diri maralı Əhməd şahın hüzuruna gətirir. Ondan əhdə vəfa istəyir:

- Ceyrana layiq hədiyyəni gətirmişəm, qibleyi-aləm!..

Əhməd şah kələyinin baş tutmadığını görüb yeni tədbirə əl atır:

- Bu marala bir tay da gətirsən, daha sözüm yoxdur, qız səninkidir.

Zaman sonsuz həvəslə yenə maral dalınca düşür. Az dolanır, çox dolanır, marallara rast gəlmir. Duzlağa qayıdır, günlərlə oturub maral gözləyir. Yaz çıxır, yay gəlir; yay çıxır, payız gəlir, maral görünmür.

Nəhayət, amansız qış fədakar aşiqin başına qar ələyir. Birdən narın qar üstündə maral izi görür.

Sevinir. Cəld izə düşür. Bir qayanın başında maralın otladığını görür. Sürünə-sürünə marala tərəf gedir. Kəməndi atdığı ilə maralın duyuq düşməsi bir olur. Başı kəməndə düşən bir maral ürküb özünü qayadan atır. İpin bir ucunu belinə bağlayan Zaman da maralla birlikdə qayadan uçur.

Maral qayası adı belə yaranır. Deyirlər ki, Əhməd şah sözünə əməl etmədiyinə, günahsız bir aşiqin qa-tilinə çevrildiyinə görə gözləri tutulub, əzab-əziyyət içərisində ölür. Ceyran da ömrünün sonuna qədər maral dalınca gedən Zamanın yolunu gözləyir. Sevgilisinin iyini evdəki maraldan alır.

### *143. Ana maral*

Kənddə məşhur ovçu kimi tanınan Nurəli kişi çox pərişan halda meşədən evlərinə qayıtdı. Arvadı Fatimə, oğlu Behruz kişini qarşılamağa çıxdılar. Əliboş geri dönən ovçunun halı hal deyildi. Kişi fikir dəryasına qərq olmuşdu. Fatimə bir addım irəli atılıb ərinin çiynindən lüləsi aşağı sallanan tüfəngi götürmək istədi. Nurəli kişi ona mane oldu. Ağır addımlarla evin dalına keçdi. Tüfəngi çiynindən aşırdı. Arvadının və oğlunun gözləri qabağında neçə il yoldaşlıq etdiyi tüfəngin lüləsindən tutub onu daşa çaxdı.

- Daha günaha batmaq istəmirəm!.. Oğlum, Behruz, indi növbə sənindir, bundan sonra sənin qazancını yeməli olacağıq. Mən daha ovçuluğu atdım. Bir də əlimə tüfəng almaram. Meşədən elə utanıram, elə xəcalət çəkirəm ki, bir də ora dönməyə üzüm gəlməz. Sən isə, ay bala, çörəyi

tüfəngdən yox, torpaqdan çıxartmalısan. Təkcə torpaq onu öldürənlərdən razı qalır.

Behruz atasının dərdinə şərik olmaq istədi:

- Atacan, sənin qərarın səbəbsiz deyil, sən hər saat fikrindən dönən adam deyilsən.

Ata dərindən nəfəs alıb başına gələn əhvalatı danışmağa başladı:

- Altmış ildir ovçuluq eləyirəm. Altmış ildir marala, ceyrana, əniyə, turaca, kəkliyə–meşənin sərvətinə, dövlətinə güllə atıram. Hamı bilir ki, kefimdən yox, sizi yaşatmaq üçün güllə atıram. Altmış ildə bir dəfə də olsun meşə mənim xətrimə dəyməyib, məni əliboş qaytarmayıb. Bu gün isə…

Fatimə hövsələsini basa bilmədi:

- A kişi, tez ol, mətləb üstə gəl!

- Arvad, bu gün bir ana maralı xallı bəbir qova-qova mənə tuş etdi. Bəbirə güllə atdım, aralandı. Onun ovuna özüm yiyələndim. Maral qaçdı, mən qovdum, mən atdım, o sindi, nişangahdan yayındı. Yalnız bir səmtə can atırdı. Hiss edirdim ki, balaları var, özünü onlara çatdırmaq istəyir. İkimiz də üzülüb əldən düşmüşdük. Nə o qaçıb canını qurtara bilirdi, nə də mən əl çəkirdim… Axırda maralı qovub çıxılmaz bir qayalığa saldım. Lap yaxına gəlib xeyli tamaşa etdim. Gördüm yox, maral heç özündə deyil, tez-tez həmin səmtə boylanır. Dolmuş yelinindən, şüşələnmiş məmələrindən hiss olunurdu ki, balaları lap körpədir. Tüfəngi gözümün tuşuna qaldırdım, niyyətimi başa düşən maral yanıqlı bir mələrti ilə mənə yalvardı. Tüfəng gözlərimdən enmədi. Birdən möcüzə baş verdi. Maralın şüşələnmiş məmə-lərindən soyuq daşlara isti süd fışqırdı. Elə bil maralın südü gözümü tutdu. Dünya gözlərimdə zülmətə döndü. Peşmançılıq var gücü ilə əllərimə

vurdu. Tüfəng nişangahdan düşdü. İllərin qəflət yuxusundan ayıldım. Tüfəng lüləsini çiynimə keçirib marala yol göstərdim. Yazıq heyvan məni anladı. Qabağıma düşüb yola düzəldik. Amma gözlərindəki təlaş çəkilib getmirdi. Bilirdim ki, xallı bəbirin zəhmi onu titrədir. Ana maralı bu məskəndə tək qoymaq olmazdı. Birdən bir şaqqıltı qopdu. Qayanın arasında duran xallı bəbir ox kimi süzüb maralı süpürlədi. Tüfəngin nə vaxt açılmasından xəbərim olmadı. Onu gördüm ki, xallı bəbir qorxunc bir nərilti ilə yerdə, maralın ayaqları altında qıvrılır. Maralı düz balalarının yanına qədər ötürüb geri döndüm. Bundan sonra acından ölsəm də ovçuluq eləmərəm, nahaq qan tökmərəm.

Fatimə ərinə təsəlli verdi:

- Ay kişi, sən ki, ən böyük xeyirxahlıq eləmisən, daha niyə qəm dəryasına batırsan?

- Bəs, indiyə kimi?

Aradan bir az keçəndən sonra Nurəli kişi fikirdən xəstəliyə düşdü. Nə qədər dava-dərman elədilər, nə qədər çiçəklərdən məlhəm düzəltdilər, xeyri olmadı, kişi şəfa tapmadı ki, tapmadı. Ovçu günü-gündən əriyirdi. Bir gün Behruz Loğman kimi bir el həkiminin sorağını aldı. Çətinliklə də olsa, həkimi tapıb atasının üstünə gətirdi. Həkim qoca ovçuya baxan kimi dərdinə aşina oldu:

- Ay bala, heç bilmirəm necə deyim xəstənin dəvası əlacsız yerdədir. O, bir kasa maral qatığı içsə anadangəlmə olar.

- Həkim, maralın südünü tapmaq müşkül məsələdir, o ki qaldı qatığı ola…

Həkim hamını ümidsiz vəziyyətdə qoyub çıxıb getdi.

Xəstə lap ağırlaşmışdı, dinib, danışmırdı. Ana-bala onun yasdığının qırağından çəkilmirdilər. Gecənin bir vaxtı xəstə dil açdı:

- Arvad, qab götür eşiyə çıx, maral mənə süd gətirib.

Fatimə elə bildi ki, ərinin son nəfəsidir, sayıqlıyır. Ancaq özünü sındırmadı, sərnici götürüb bayıra çıxdı. Təəccübdən yerində dondu. İri buynuzlu, qumral ana maral astanada dayanmışdı. Onun məmələrindən süd axırdı. Fatimə tez sərnici bulaq kimi qaynayan südün altına tutdu. Sərnic ağappaq köpüklü südlə doldu. Arvad baxıb-baxıb ah çəkdi:

- Həkim qatıq demişdi, ay maral, sən süd verirsən…

Fatimə südlə dolu sərnici götürüb içəri keçmək istəyəndə maral ona mane oldu. Hər gözündən bir damla yaş isti südün içinə sağıldı. Süd o saat uyuşub qatıq oldu. Fatimə maralın üzünü, gözünü tumarlayıb yola saldı.

Deyirlər, qoca ovçu qatığı başına çəkən kimi sağaldı. Etdiyi yaxşılıq itmədi, onu yenidən yaşatdı.

## *144. Qızıl beşik*

Nurlu kəndində xoş güzəran keçirən bir ailə vardı. Bunların varı aşıb-daşsa da, övladları yox idi. Ən şən məclisin sonu bu evdə kədərlə qurtarardı.

Bir gün tale bu ailənin də üzünə güldü. Zaman kişiyə xəbər verdilər ki, arvadın Yaxşı hamilədir. Kişi sevincindən az qaldı qanad açıb uçsun. Dövlətinin bir qismini ayırdı. Oğlu olsa, səxavətini göstərəcəyini bəyan elədi. Ağalar, yoxsullar, qərib adamlar arzu

edirdilər ki, Zaman kişinin oğlu olsun. Vaxt yetişdi. Yaxşı ərini gözəl-göyçək bir oğlanla sevindirdi. Ancaq nə bir acın qarnı doydu, nə də bir yetimin könlü alındı. Zaman kişi fikrini dəyişib ayırdığı pula qızıl bir beşik düzəltdirdi. Yaxşı ərini əhdinə vəfa göstərməyə çağırdı, xeyri olmadı. Zaman kişi dedi:

-Arvad, aman-zaman bir oğlum var. Mən onu qızıl beşikdə böyüdəcəyəm. Özü də hökmən ovçu edəcəyəm. İndidən zağlı bir tüfəng alacağam. Gərək mənim oğlumun gülləsinin səsi dərələri, təpələri, meşələri lərzəyə salsın. Gərək o qədər maral vura ki, dərisi ilə evi-eşiyi bürüyəm.

Kişi dediklərini elədi. Amma camaat arasında uşaqdan çox qızıl beşikdən və divardan asılmış zağlı tüfəngdən söhbət gedirdi. Bu xəbər oğrulara da çatdı.

Bir gecə oğrular fürsət tapıb qızıl beşiyi uşaq da içərisində aradan çıxartdılar. Onlar özlərini sıx bir meşəyə saldılar. Ancaq bir də gördülər ki, kimsə onları qarabaqara izləyir. Qorxuya düşdülər. Gözdən yayınmaq üçün qızıl beşiyi bir daşın dalına qoyub qaçdılar. Dedilər: buradan uzaqlaşaq, sonra gələrik.

Səhər açıldı. Zaman və Yaxşı qızıl beşiklə, uşağın oğurlandığını bilib, ah-fəğan elədilər. Onların şivəni bütün elə yayıldı. Hamı uşağı və qızıl beşiyi axtarmağa başladı. Hətta qızıl beşiyi qoyduqları yerdə tapmayan oğrular da təəccüblə camaata qoşulmuşdular. Qızıl beşik tapılmadı ki, tapılmadı.

Bu hadisədən üç-dörd il keçdi. Bir gün Nurdu kəndinin ovçusu «Qalalı meşəyə» ova çıxmışdı. Onun gözünə bir maral göründü. Marala neçə dəfə güllə atdısa da, güllə süzüb yan getdi. Maral nişangahdan yayınmaq üçün yanındakı uşaqla

qaçmağa başladı. Ovçu bu sirrə mat qaldı, ancaq gözü qızıl beşiyə sataşanda işin nə yerdə olduğunu anladı. Dərhal yadına üç-dörd il bundan əvvəl olmuş hadisə düşdü. Necə olsa uşağı tutmağa çalışdı. Qorxusundan daha güllə atmadı ki, birdən marala dəyməz, uşağa dəyər. Ovçu haldan-dildən düşdü. Axırda uşağı tuta bildi. Uşağın tutulduğunu görən maral da ovçuya təslim oldu. Ovçu qızıl beşiyi və uşağı kəndə gətirdi. Maral da onlardan ayrılmadı.

Maralın hərəkəti Zaman kişini sarsıtmışdı. O, arvadı Yaxşıya dedi:

-Zağlı tüfəngi quyula, oğlumuza ayrı sənət seçək. Bundan sonra o, maral vura bilməz.

Deyirlər ki, ana maral ömrümün sonuna qədər uşaq olan qapıdan getməmiş, uşaq da maraldan ayrılmamışdır.

### *145. Maralyan*

Qocalar deyirlər ki, keçmişdə Maralyan kəndinin camaatı əkinçiliklə məşğul olurmuş. Ancaq əkin sahəsi azlıq etdiyindən yaxındakı kiçik meşəni yandırmağı qərara alırlar. Kənd camaatının ağsaqqalı dünyagörmüş bir adam idi. Nahaq işə yol verməyən, gücsüzü güclüyə döydürməyən, ədaləti insaf tərəzisi bilən bu qoca ehtiyatla yeriyirdi ki, ayağının altında bir günahsız qarışqa belə qalıb əzilməsin. Ona görə el ağsaqqalı rəiyyətinə deyir:

-Onsuz da ağacı yandıranda günaha batacağıq. Barı elə eləyin heyvanat aləmindən bir canlı qalmasın, hamısını qovub böyük meşəyə köçürün.

Camaat ağsaqqalın məsləhətini can-başla yerinə yetirir. Sonra meşəyə od vururlar.

Yeri şumlayıb taxıl əkirlər. O ili yaxşı buğda yetişir. Oraqlar işə düşür, sarı buğda şırmanlarda tayalanır. Hamı bol məhsula sevinir.

Camaat məhsul bayramına toplaşıb şənliyə başlayır. Bu ara kəndlilərdən biri yanıb kösövə dönmüş bir maral balasını ağsaqqalın hüzuruna gətirib, günahkarın tapılmasını tələb edir. Elə bil şənliyə su səpilir. Hamı yanmış maral balası üçün heyfsilənir. İşbilənlər aydınlaşdırır ki, heç kim maral balasına qəsd etməmişdir. Sən demə körpə dərəyə sıçrayarkən burxulub ayaqları sınmış, qaçıb canını alovdan qurtara bilməmişdir.

El ağsaqqalı kədərlə köksünü ötürüb deyir:

- Bilmədim, maral yana!

O gündən həmin kənd ağsaqqalın sözüylə «Maralyan» adlanır.

### *146. Maral qayası*

Qışın qarlı-çovğunlu günlərindən biri olur. Cəfər kişi səhər yuxudan oyananda görür ki, buxarı ocağının yanında yanı balalı bir maral yatır.

Bu təkcə Cəfər kişinin ailəsi üçün yox, bütün kənd üçün bir möcüzə olur. Buna baxmayaraq, Cəfər kişi yanı balalı maralı aparıb, Çanqı dağına ötürür.

Maral gündüz örüşdə otlayıb axşam yenə də geri qayıdır. Cəfər kişi deyir:

-Yox, bunlara toxunmaq olmaz. Maral bu ocağı müqəddəs bilib gəlib.

Cəfər kişi onu da deyir ki, bu evdə heç bir əyri iş ola bilməz. Onda marallar dönüb gedər, təkcə bizim ev yox, bütün kənd bundan ziyan çəkər, göydən bəla enər.

Beləcə marallar bu ocağa öyrəşir, ilin dörd fəslində çöllərdə otlayıb, yenə də bu ocağa gəlir. Cəfər kişinin ailəsi maralları sağıb qatıq çalmağa, yavanlıq düzəltməyə adət edir. Bir neçə il ərzində Cəfər kişinin var-dövləti həddən artıq çoxalır.

Hətta qonşulardan buna paxıllıq edənlər də olur.

Bir gün bu kəndin ovçu oğlu Qara, qonşu kənddən bir qız istəyir. Qız da oğlanı görüb sevibmiş. Lakin qızın atası o qədər də yaxşı adam deyilmiş. Nazar kişini hamı şər adam kimi tanıyırmış. O, elçilərə deyir:

- Heç kəs bilməsin. Ovçu Qara Cəfərin qapısındakı ana maralı örüşdən diri tutub bu kəndə gətirməsə, o maral bu həyətdə sağılmasa çətin ki, bu sevda baş tutsun.

Bu xəbəri ovçu Qaraya çatdıranda deyir:

- O maralı çöl heyvanı hesab etmək düz deyil. Neçə ildir ki, o maral öz sürüsü ilə Cəfər kişinin qapısındadır.

Oğlan çarəsiz qalıb səhər Çanqı dağına çıxır, maralları Eynəltaxtının qənşərindəki qayalığa qədər qovur, atdığı kəmənd ana maralın buynuzuna keçir. Ancaq ovçu Qaranın gücü çatmır. Ana maral onu sürüyüb qayadan salır. Maral da ölür, ovçu da.

Ovçu Qaranın sevgilisi Mərcanın ürəyinə xof düşmüşdü. Ona elə gəlirdi ki, bu gün nəsə bir bədbəxt hadisə olacaq. O daha çox sevgilisi Qaradan qorxurdu. Qız Çanqı dağından keçib, Qıyğar dağına gəldi. Bir qıy vurdu. Marallar bu

səsdən hürküşüb yastanaya toplaşdı. Qız ana maralı görmədi. Marallara tərəf qaçdı. Gəlib gördü ki, oğlan ana maralın buynuzuna kəmənd atıb, ovçu Qara da onunla bərabər dağdan düşüb ölüb. Qız elə bir yanıqlı bayatı çəkdi ki, bütün el yerindən tərpəndi.

***A dağlar, uca dağlar,***
***Qar belin quca dağlar.***
***Ovçusu cavan ölmüş,***
***Maralı qoca dağlar.***

Adamlar kimi maralların da gözləri yaşlı idi. El dağılanda marallar da birdəfəlik bu yerlərdən baş götürüb getdilər. Bu dağlarda marallardan nişanə «Maral qayası», iki gəncin odlu məhəbbətindən isə bir bayatı yadigar qaldı.

### *147. Gülqədəmin əfsanəsi*

Sadıq adlı bir çobanın Gülqədəm adlı uzunsaç, hündür boylu, gül rəngli qızı olur.

Gülqədəm uşaqlıqdan atası ilə dağları, meşələri qarış-qarış gəzmiş, güllərin ətrini almış, çayların nəğməsinə doyunca qulaq asmışdı. Çoban qızı saz çalıb, söz qoşanda bütün mahal ona heyran olarmış. Onun sazında, avazında günəş işıqlanar, istilənər, dağlar ucalar, qürurlanar, çiçəklər ətirlənər, gözəlləşər, çaylar nəğmələnər, bir də yamyaşıl meşələrin bəzəyi olan marallar oynaşardılar.

Gülqədəm sazı yaşıl meşənin başında durub çalarmış. Onunla bir maral balası mehribanlıq edərmiş. Maral ağlayanda Gülqədəm qəmli

olurmuş. Onun ayrılığına dözməzmiş. Bir ilan maralla düşmənçilik edirmiş. O, maralın anasını sancıb öldürmüş, indi isə balasını zəhərləməyə fürsət axtarırdı. İlan həmişə ehtiyatlı olan marala yaxın düşməyə o qədər də cürət eləmirdi. Nəhayət, ilan bu fikrə gəlir ki, Gülqədəmi sancsa, onun sazını, özünü susdursa, maral bir ay da yaşaya bilməyəcək.

İlan belə də edir. Gülqədəm vəfat edən kimi sazı da yoxa çıxır. Maral gələndə Gülqədəmin məftunedici nəğməsinin əvəzinə, camaatın ürəkyandıran ağısını eşidir. Maralın gözləri dolur. Qəmli halda geri qayıdır. Bir daha nəğməli yerə gəlmir.

Üç gündən sonra səs eşidilir ki, maral buynuzunda həmin ilanın cəsədi və saz Gülqədəmin qəbri üzərində daşa dönüb.

Bunu eşidən aşıqlar və camaat Gülqədəmin qəbri üstünə getdilər. Həmin yerə gedənlər deyirlər ki, həqiqəti görmək istəyirlərsə, gərək sazı elə çalalar ki, Gülqədəm sazının havasını versin.

### *148. Ovçu Pirim və üç ceyran*

Ovçu Pirim kəmənd atıb bir ceyran tutur. Ceyran ağlayıb deyir:

- İnsaf elə, Pirim baba biz üç gün olar ki, evlənmişik.

Ovçu Pirim ceyranı buraxır.

Ovçu Pirim dağın o biri üzündə kəmənd atıb başqa bir ceyran tutur. Bu ceyran da ağlayıb deyir:

- Pirim baba, mən də o apardığın ceyranın yoldaşıyam. Muradımız gözümüzdə qaldı. Biz bir

qayanın dibində durmuşduq. Səni görüb hərəmiz bir tərəfə qaçdıq. Əvvəl kəmənd atıb onu tutdun. İndi də mən ilişdim.

Ovçu Pirim ceyranı buraxıb deyir:

- O biri yoldaşını da azad etmişəm, gedin xoşbəxt yaşayın.

Ovçu Pirim başqa ovlağa gedir. Örüşdə bir ceyrana rast gəlir və bunu da kəməndə salır. Ceyran zülüm-zülüm ağlayıb deyir:

- Özümün ölməyim üçün demirəm. Bir cüt bala qoyub gəlmişəm. Bax, yelinim südlə doludur. Otlayıb onların yanına qayıdırdım. Ah, yazıq balalarım!

Ovçu Pirim bu ceyranı da buraxır, evə əliboş qayıdır. Arvadı boş gəlməyinin səbəbini soruşduqda deyir:

- Mən əvvəllər heyvanların dilini bilmirdim, istədiyim kimi ov eləyirdim. İndi onların dilini bilirəm, anlayıram ki, heyvanların dərdi bizimkindən də çoxdur. Mən daha onları ağlada bilmirəm.

### *149. Maral sağına gəlir*

Qışlaq Kür çayının sol sahilində, meşənin içərisində yerləşirmiş. Bir gün Məhəmməd bəy öz qoyun sürüsünə baş çəkməyə gedəndə onun qarşısına bir maral çıxır. Məhəmməd bəy ovun ona qarşı gəlməsindən xoş bir əlamət görür və tez tüfəngi nişana qaldırır. Maral ovçudan qaçmaq əvəzinə dayanıb kimisə, nəyisə gözləyir. Məhəmməd bəy canından qorxmayan maralın hərəkətinə təəccüb edir. Tətiyi çəkməyə ləngiyir. Bir də görür ki, bir bala maral kolun dalından çıxıb nişan

aldığı maralın yanına yüyürdü. Hələ tüfəng səsi eşitməyən, təhlükənin nə olduğunu bilməyən bala maral şirin-şirin anasını əmməyə başlayır.

Məhəmməd bəy ovun hərəkətinə sevinir: «Allah mənimkini gətirir. Bayaq tüfəngimə təkcə anası gəlmişdi, indi balası da özünü yetirdi. Uşaqlar yaxşı kabab çəkərlər. Belə qismətdən əl çəkmək olmaz».

Ovçunun niyyətini duyan maral dal ayaqları üstə qalxır. Özü üçün, balası üçün aman istəyir. Məhəmməd bəyin heyrəti daha da artır: «Bilirəm, yalvarırsan, vaxtsız ölümdən, qəfil ölümdən aman istəyirsən. Sənin də öz qayğın var. Hələ körpə, köməksiz balanı böyütməlisən. Buna görə səni bağışlamaq olar. Amma sən heyvansan. Mənim yaxşılığımı başa düşə biləcəksənmi?»

Məhəmməd bəy yanı balalı marala atəş açmır. Tüfəngini nişandan endirib çiyninə salır. Bu hadisədən 10-12 gün sonra Məhəmməd bəy axşam evdə oturubmuş. Arvadı Şərəf xanım içəri girib qapıya balalı maral gəldiyini söyləyir. Kişi çölə çıxıb həmin maralı gördükdə qəhər onu boğur, gözlərindən yaş axır.

Məhəmməd bəy oğlanları Gəray və Cəfərquluya tapşırır ki, marala toxunmasınlar. Şərəf xanıma da tapşırır ki, maralı incitməsin, ona xidmət etsin. Bu minvalla maral hər gün axşamlar gələr və südünü sağdırıb balası ilə birlikdə çıxıb gedərmiş.

### *150.Göyün qəzəbi*

Bir gün arvad sacda fətir bişirirmiş. Körpə uşağı yanına gəlir, ana fətirin birini yerə sərir ki, uşaq onun üstündə otursun, əyin-başı toz-torpağa bulaşmasın. Göy qəzəblənir, yerdən yeddi qat uzaqlaşır. Buğda sünbülü də fəryad qoparır, aşağıdan yoluna-yoluna çağırır, heyvanlar mələşir, atlar kişnəşir, itlər ulaşır. Sünbülün harayı kəsilmir, başında bir az dən saxlayır, onu da çörəyin qədrini bilənlərə…

### *151. Günəş və Ay haqqında əfsanə*

B i r i n c i  ə f s a n ə. Belə rəvayət edirlər ki, bir kişi ova çıxır. Əlinə bir şey düşmür. Axır gəlib kiçik bir gölün kənarına çıxır. Görür ki, gölün o tayında gözəl bir qız əyləşib gölə tamaşa edir. Qız o qədər gözəl imiş ki, şövqündən ovçu ona baxa bilmirmiş. Axır ovçu birtəhərlə ona yaxınlaşıb soruşur ki, sən kimsən?

Qız cavab verir ki, mənim adım Günəşdir. Ovçu ilə Günəş bir az söhbət edirlər, axşamın qaranlığı ətrafı bürüyür. Ovçu Günəşə təklif edir ki, onlara qonaq getsin. Günəş razı olur. Onlar birlikdə

ovçunun evinə gəlirlər. Ovçu qonağı böyük hörmətlə qarşılayır. Günəş ayrıca bir otaqda yatır. Sabah açılır, hamıdan qabaq qonaq durur. O, həyətə çıxan vaxt ətraf nura boyanır. Bu zaman ev yiyəsi də yuxudan oyanır. Günəşə baxanda gözləri qamaşır. Ovçu Günəşə yaxın gedə bilmir. Bu vaxt Günəş öz gözəlliyindən utanıb, yenidən otağa qayıdır. Ovçu öz qonağının gözəlliyi haqqında qonşulara danışır. Bildirir ki, ona yaxın düşmək çətindir.

Qonşuluqda olan bir kişi deyir. Mən onu tuta bilərəm. Günəş yenə ovçunun evində qalır. Səhər ovçu və onun qonşusu Günəşi görmək və tutmaq üçün bayırda gözləyirmişlər. Günəş çölə çıxan kimi yenə aləm nura boyanır. Ovçunun qonşusu görür ki, doğrudan da ona yaxın düşmək mümkün deyil. Ondan süzülən işıq ox kimi adamın gözünə sancılır. Axır qonşu təngə gəlib onu yayı-oxu ilə vurur. Bu ox Günəşi sinəsindən yaralayır. Günəş yaralı-yaralı qaçır. Günəş göyün üst qatına qalxır və öz donunu soyunub səpir. Donundakı qan izləri qurşaq şəklində göyün üzündə yağışdan sonra görünür.

Ovçu tutduğu işdən peşman olur və bir at minib onu axtarmağa gedir. Ancaq ona çata bilmir.

Deyirlər, həmin ovçu Ay imiş, qonaq isə aləmə nur saçan, dünyaya gözəllik verən, həyat verən Günəş imiş.

Bəzən görürsən Ay sabaha qalır ki, Günəşlə görüşüb günahını boynuna alsın, ondan üzr istəsin, ancaq bu mümkün olmur, Günəş ondan qaçır.

İ k i n c i ə f s a n ə**.** Deyirlər, Ay və Günəş bacı-qardaş imiş. Bir gün onların anaları yuxa bişirmək üçün hazırlıq görürmüş. Anası Ayı çağırır ki, get oxlovu gətir. Ay oxlovu gətirmir, deyir: - Günəş gətirsin.

Günəşlə Ay bir-biri ilə savaşır. Bu zaman ana sacı külləyirmiş. Nə qədər təpinir ki, savaşmanı qurtarsınlar, ancaq onlar eşitmirlər. Ana acıqlı-acıqlı durur və Ayın üzünə bir sillə vurur. Günəş qorxusundan əsim-əsim əsir. Ay tutduğu işdən utanır. Hər ikisi evdən qaçırlar. Deyirlər, Günəşin günahı olmadığı üçün o gündüz, Ay isə utandığından gecə gəzməyə çıxır. Ana isə vicdan əzabı çəkir və heç birinin üzünə diqqətlə baxa bilmir.

### *152. Aldədə əfsanəsi*

Bağdadda ərəb xəlifəsinə belə bir xəbər çatır ki, Odlar ölkəsində Aldədə adlı bir şəxs peyda olub. Bu şəxs möcüzələr icad edir, özü də odda yanmır.

Xəbər xəlifəni bərk maraqlandırır, deyilənlərin doğruluğunu yəqin etmək üçün yanına üç ərəb çağırır:

- Elə bu gün Odlar ölkəsinə yola düşün. Orda Aldədə adlı bir şəxs peyda olub. Gedib yoxlayın. Əgər doğrudan da, möcüzələr çıxarırsa, ona toxunmayın. Yox, elə olmasa, onu məhv edin, yurdunda heç bir nəfər də salamat qoymayın.

Ərəblər Aldədəni Haça qaya deyilən yerin yaxınlığında ilxı ilə birlikdə tapırlar. Görürlər ki, geniş çöldə yalmanları qız hörükləri kimi hörülmüş at ilxısı otlayır, ilxıda iki dayçanın yalmanı hörülməyib. Onlar bunların sirrini hündür daş üstündə oturmuş Aldədədən soruşurlar. O deyir:

- Bu dayçalar Göysudan çıxıb, ilxıya özləri qarışıblar. Xeyli söhbətdən sonra ərəblər hiss edirlər ki, qoca çox hikmətli adama oxşayır.

Dünyanın əvvəlindən-axırından xəbər verir. Aldədəni yoxlamaq istəyirlər.

- Bəlkə bir ocaq çatasan, yaman acmışıq.

Aldədə o saat qonaqların niyyətini başa düşür.

- Bilirəm nəyə gəlmisiniz, marağınız nədir, istəyiniz nədir, hamısını bilirəm.

Ərəblər təəccüblənirlər.

- Biz ki, sənə hələ bir söz deməmişik.

- Bir kabab bişirim yeyək, sonra danışarıq.

Aldədə ayağa qalxıb ocaq çatır. Yaxındakı sürüdən bir quzu ayırıb kəsir. Quzunun qolunu, budunu, qabır-ğalarını çılpaq əlində közə tutub qızardır. Kabab bişir. Aldədənin əlinin tükü də qarsalanmır.

- Bu nə möcüzədir? – deyə, ərəblər heyrətlə dillənirlər.

- Möcüzə yoxdur. Mən Odlar diyarının övladıyam-od oğluyam. Od odu yandırmaz.

- Sən öz qaladığın odda yanmazsan, ancaq biz qaladığımızda əməlli-başlı bişərsən, heç külün də qalmaz, - deyə ərəblər onun möcüzəsinə şəkk edirlər.

Onlar bir qaragöz, qaradiz quzunu Aldədənin qucağına verirlər. Sonra da yurd yerindəki təndiri qalayırlar. Aldədəni alovu göyə dilimlənən təndirə salırlar, təndirin ağzını iri sal daşlarla örtürlər.

Ərəblər elə düşünürlər ki, Aldədə bu gecə təndirdə yanıb kül olacaq. Səhər onlar təndirin ağzını açanda gözlərinə inanmırlar. Aldədənin başının tükləri, bığları qarlı-qırovlu idi, saqqalından buz salxımları sallanırdı, qucağındakı qaragöz quzu isə qıpqırmızı bişmişdi.

Ərəblər dedilər:

- Bu əsl möcüzədir. Ey Aldədə, bizdən istəyin nədir?

Aldədə zəhmli xəlifənin elçilərinə cəsarətlə cavab verdi:

- Sizdən heç nə istəməyəcəyəm, amma məndən də istəməyin, qoyun hərə kəsinki özünün olsun.

- Başa düşmədik.

Aldədə yanındakı dörd ağac çubuğunu göstərib dedi:

- Bu ağacları dörd tərəfə atacağam, hara düşsə, o torpağa toxunmayın.

Ərəblər sevindilər ki, bir qocanın atdığı ağac o qədər də uzağa düşməz. Odur ki, dedilər olsun.

Aldədə birinci ağacı atdı, ağac göydə süzdü, görünməz oldu.

Ərəblər soruşdular: ağac hara düşdü?

- Savalan dağına, - deyə, Aldədə cavab verdi.

Aldədənin ikinci ağacı Şah dağına, üçüncü ağacı Alvız dağına, dördüncüsü Ağrı dağına düşdü.

Ərəblər dedilər:

- Bu ki, Odlar ölkəsi oldu.

Aldədə gülümsündü:

- Xeyr, Odlar ölkəsinin heç parası da deyil.

Ərəblər Odlar ölkəsində elə bil oda düşdülər, alışıb yanmağa başladılar. Tələsik Aldədədən ayrılıb birbaşa Bağdada üz tutdular.

### *153. Mahpeykər əfsanəsi*

O gecə ki, Aldədə evə qayıtmadı, arvadı Mahpeykər onu çox gözlədi. Sonra körpə uşağını belinə sarıyıb ərini axtarmağa başladı, dağlara ün saldı.

Gəzə-gəzə «Göyyurd» deyilən yerə gəlib çıxdı. Aldədənin at ilxısı burda idi. Özü isə yox idi.

Mahpeykər dağlara üz tutdu. Çox gəzdi, çox dolandı. Ancaq Aldədədən soraq tuta bilmədi. Belə getsə elin ağsaqqalı, başbiləni, yol göstərəni əldən gedərdi. El qara geyərdi. Necə olursa-olsun Aldədə tapılmalıydı.

Mahpeykər ona maneçilik edən, əl-qolunu çidarlayan ciyərparasını kürəyindən açıb Qızıl qayanın dibində xəlvət bir yerdə gizlədi. Dilində Aldədə, Haçaqaya dağına tərəf getdi. Ağçayın sahillərini gəzdi. Aldədəni dağlardan, daşlardan, çaylardan, otlardan, çiçəklərdən soruşdu, tapa bilmədi. O geri qayıdıb oğlunu dibində qoyduğu Qızıl qayaya gəldi. Artıq səhər idi. Mahpeykər gözlərinə inanmadı. Uşağın sarığı yerdə idi, amma özü yox idi. Mahpeykərin bir dərdi iki oldu. Oğlunu çox axtarandan sonra kor-peşman evə döndü.

Xeyli keçmiş Aldədə evə gəldi. Başına gəlmiş əhvalatı danışdı. Mahpeykər də oğlunu itirdiyini, başına gələnləri danışdı.

Həmin gündən Aldədənin, Mahpeykərin dərdi-kədəri artdı. Gözləri dağlarda, daşlarda qaldı.

Mahpeykər övlad həsrətinə dözə bilmirdi. Gecə-gündüz ağlayırdı. Yerə, göyə, əsən küləklərə, di-limlənən alovlara yalvardı, bir mətləb hasil olmadı, oğlunu ona verən bir qüvvə tapılmadı. Axırda əlacsız qalıb Ağçaya üz tutmalı oldu. Daha dözə bilmirdi. Mahpeykər ya balasına qovuşmalı, ya da həyatla vidalaşmalıydı. Çayın xasiyyəti belə idi: o yeddi ildən bir aşıb-daşırdı. Leysan yağışdan aşıb daşsa, zərər verər, ətrafında nə olsa, silib-süpürüb aparardı. Yox, elə ki, şimşək çaxdı, ildırım çaxdı, çay o qədər də daşmazdı, süd kimi köpüklənərdi. Kim bu köpüklü

sudan içsə dizlərinə, qollarına güc, qəlbinə qürur gələrdi. O bundan xeyir tapar, arzusuna qovuşardı.

Mahpeykər yenə də Ağçayın sahilinə çıxıb, ondan ümid diləyirdi. Leysan yağışlar başladı. Ağçay aşdı-daşdı, sahilləri su aldı. Mahpeykər sellərin qurbanı oldu.

### *154. Qurdoğlu əfsanəsi*

Aldədənin dərdi birə-min artmışdı. Bir tərəfdən yeganə oğlunun itməsi, o biri tərəfdən də Mahpeykərin Ağçayın sellərinin qurbanı olması onu rahat buraxmırdı. O, yeganə oğlunu axtarmağa, soraq etməyə başladı.

Aldədə belə bir xəbər eşitdi ki, Muradbəyli tərəflərdə bir boz qurd dağın başında oğlan uşağı üçün daşdan beşik düzəldib. Boz qurd uşağı nəvazişlə bö-yüdür. Aldədə bu yerlərə səfər etdi. Çox böyük çə-tinliklə uşağı tutdu. Uşağın sol dabanındakı xaldan öz oğlu olduğunu öyrənib sevindi. O, uşağı götürüb Haçaqaya dağının ətəklərinə gəldi. Boz qurd onlardan ayrılmadı.

Aldədə gözləyirdi ki, uşaq bir az da böyüsün, hər şeyi ona yerli-yataqlı danışsın və oğlunu boz qurddan aralasın, bir də fikirləşirdi ki, axı boz qurd ona yaxşılıq edib, oğluna döşündən süd verib.

Bir gün Aldədə oğlu ilə söhbətə başladı:

- Oğlum, sənin vətənin Odlar yurdu, anan Mahpeykər olub. Onu Ağçayın suları öz qoynuna alıb. Atan isə mən Aldədəyəm, möcüzəm odda yanmamaqdır. Deməli, sən qor oğlusan.

Uşaq qeyzlə:

- Yox, ata, mən qor oğlu deyiləm, qurd oğluyam. Mənə boz qurd döşündən süd verib.

Aldədə biləklənən, küreklənən, ürəklənən oğluna nələr danışmadı. Odlar diyarının xoş günlərindən, igidlərin, nazlı-qəmzəli, vəfalı gözəllərindən, hikmətli, bərəkətli torpağından danışdı. Aldədə oğluna vətənin başına gələn fəlakətlərdən dərdli-dərdli söz açdı, onu eli, obası üçün qeyrətli oğul olmağa çağırdı.

Uşağın gözlərindən ildırım çaxdı:

- Tapdalanan torpağımızın, oxlanan, qılınclanan igidlərimizin, al yanaqları solan analarımızın, bacı-larımızın, nəğməli bulaqlarımızın, ətri sovrulmuş güllərimizin-çiçəklərimizin qisasını düşməndə qoy-maram. Odlar ölkəsinin atəşinə and içirəm ki, qoyma-ram.

- Vətəni qorumaq üçün vətəndən güc-qüvvət almalısan, oğul!

- Qollarımızda kifayət qədər güc, qüvvə var. Qılınc vurmaq üçün bəs olar.

- Xeyr, oğul! Öz gücünlə sən düşmənin qabağında çox zəif olarsan. Gücü, dözümü sənə vətən verəcək.

- Necə?

Aldədə sözünə davam edib dedi:

- Mənim ömrüm-günüm Haçaqaya dağının, Qızıl qayanın, Ağçayın yan-yörəsində keçib. Aldədə yurdu, Aldədə çayı heç vaxt unudulmaz. Sənə son vəsiyyətim budur: Mən də qocalmışam, boz qurd da. Bizim dünyadan köçməyimizə az qalıb. Sənə bir sirr deyim: Bu yerlərdə Ağçay çox sirlidir. O, yeddi ildən bir təlatümə gəlir. Elə ki, gördün leysan yağışdı, onda şərdir, ona yaxın düşmə. Anan Mahpeykər kimi sellər səni aparar. Yox, gördün şimşək çaxdı,

ildırım şaxıyır, onda xeyirdir. Ağçaya yaxınlaş, ağ köpüklü suyundan doyunca iç, bax ilxıdan o Göysu atlarının balalarını da apar, qoy onlar da o sudan içsinlər. Onların da dizi, qolu, ürəyi qüvvətli olsun.

Yeddi il tamam idi. O, Göysu atlarının hərəsini bir qoluna bağlayıb, Ağçayın sahilinə gəldi. Xoşbəxtlikdən şimşək oynadı, ildırım çaxdı. Dünya qaranlıqlaşmışdı. Hər dəfə ildırım çaxanda Haçaqayanın zirvələri işıqlanırdı. Onun gözünə gah dağın bir tərəfində boz qurd, o biri tərəfində isə at ilxısı yanında Aldədə, gah da ağ suların qoynunda saçları çiyinlərinə dağılmış Mahpeykər göründü.

İldırım çaxır, dağlar, daşlar, otlar, çiçəklər, sular sanki dilə gəlib deyirdi:

- Qurdoğlu, bax o Aldədə, boz qurd, ana Mahpeykər bizi sənə tapşırıb. Bizi elə qoru ki, bu çəmənə düşmən ayağı dəyməsin, daşlarımı düşmən atının nalı yaralamasın, ağ köpüklü sularıma düşmən dodağı toxunmasın.

Göysu atlarının biri yuxarı tərəfdə, biri isə aşağıda, bir qədər lillənmiş sudan içdilər. Qurdoğlu Göysu atının birincisini mindi, lilli su içmiş atını da yedəyinə alıb, «Aldədə yurdu»na tərəf üz qoydu. O, hansı dağdan, çaydan keçirdisə qulağına bir səs gəlirdi: - Qurdoğlu, bizi qoru, axı bu yurdu sizə tapşırıblar. Bu Vətən səsi, Odlar diyarının səsi idi.

### *155. Naltökən*

Bağdad xəlifəsi bərk qəzəblənmişdi. Elçiləri göndərdi və dedi:

- Minin ərəb atları. O yerlərdə gedib gizlənin. Aldədəni qəflətən tutub, əl-qolunu bağlayın.

Nəbadə-, onun başından bir tük əskik ola. O möcüzəli qocanı mən görməliyəm.

Ərəb elçiləri kor-peşman yenə də Odlar ölkəsinə yola düşürlər.

Onlar neçə gün əziyyət çəkdilər, qayada-daşda gizləndilər. Elçilər Aldədənin oğlundan – kiminin Qoroğlu, kiminin Qurdoğlu adlandırdığı igiddən bərk ehtiyat edirdilər. Nəhayət, günlərin birində Aldədəni xəlvətcə gecə ikən yatağından oğurladılar. Onlar qocanın əl-ayağını bağlayıb, ata sarıdılar. Aldədə ərəblərin fikrini başa düşdü və dedi:

- Məqsədiniz nədir? Məni hara aparırsınız?

Elçibaşı dedi:

- İndi bizim əlimizdəsən. Qabaqda görünən aşırımı aşıb, asudəyə çıxaraq. Səni xəlifəyə sağ-salamat çatdırıb, əvəzində böyük ənamlar alacağıq.

Aldədə güldü:

- Qorxuram zəhmətiniz əlinizdə qala…
- Çətini bu alçaq aşırımı adlamaqdır.
- O aşırım sizə alçaq görünür?..

Elçilər qocanın sözünə əhəmiyyət verməyərək atları mahmızladılar. Onlar dan sökülənə kimi aşırımla vidalaşmaq istəyirdilər.

Ərəblər aşırıma çatdılar. Səhər açılana kimi ha yol getdilər, heç aşırımın yarısını qalxa bilmədilər. Gündüz gizləndilər, gecə yenə yol başladılar. Aşırım qurtarmaq bilmirdi. Atlılar neçə gün, gecə ayaq döydülər, bir nəticə hasil olmadı. Aşırım getdikcə uzanırdı. Daşlı yollarda ərəb atlarının nalları töküldü. Aldədənin atının nalına isə heç bir şey olmamışdı. Taqətdən düşən ərəblər əlacsız qalıb niyyətlərindən əl çəkdilər:

- Qoca, bu sirri bizə agah etsən, səni azad edəcəyik. Niyə bu alçaq dağı biz aşa bilmədik, niyə bizim atların nalı töküldü, sənin atının yox?

Aldədə dedi:

- Mən buna əvvəlcədən əmin idim ki, siz məni yad ölkəyə apara bilməyəcəksiniz. Bu yerin adı «Nal-tökən»dir. Vaxtı ilə İsgəndər Zülqədərin də qoşunu bu dağda ah- nalə çəkib, yunan atları da bu torpağa nallı gəlib nalsız gedib.

Bu torpaq doğmaları da, yadları da yaxşı seçir. Aldədəni aparanlara yol versəydi, dağlar xəcalətindən əriyib suya dönərdi. Belə alçaq aşırımlar ucalıb keçilməz zirvələrə çevrilirlər. Bizim torpaq yağıların niyyətini ayaqlarının səsindən də bilir. Yad adamların atlarının nalını salır ki, atlıların ağlı başına gəlsin.

Ərəblər torpağı da özü kimi möcüzəli olan Aldədənin əl-ayağını açıb azad etdilər. Onlar məyus halda Bağdada üz tutdular.

### *156. İldırım qılınc*

Xəlifə qəzəbindən yerə-göyə sığmırdı. O, bu dəfə Odlar ölkəsinə beş-on nəfər elçi deyil, böyük qoşun göndərir. Qoşun başçılarına bərk-bərk tapşırır.

- Aldədənin qüvvət aldığı bir sirr var. Bu sirr onun möcüzələrinə meydan açır. O sirr Qoroğludur. O, Aldədənin doğmaca balasıdır. Qoroğlunu mühasirəyə salıb əl-ayağını sarıyın, əsir edib qabağınıza qatıb gətirin. Onda Aldədə öz ayaqları ilə hüzuruma gələr.

Xəlifənin qoşunu elə həmlə etdi ki, hər tərəfdən yol kəsildi, təkcə qarşıda əlçatmaz bir qaya dayanırdı.

Qəfil həmlə Qoroğlunu mühasirəyə salmışdı. Qoroğlunun üç tərəfi qoşun, bir tərəfi isə sıldırım qayalıq idi.

Qoşun başçıları sevinirdilər ki, Odlar ölkəsinin yenilməz, basılmaz oğlunu keçilməz səddə salıblar. Tək adam böyük bir qoşuna neyləyə bilər. İndi onu doyunca ələ salıb güləcəklər, rahatca əl-ayağını sarıyıb xəlifəyə hədiyyə aparacaqlar.

Qoroğlu da sevinirdi. Sevinirdi ki, Göysu atının belindədir. Sevinirdi ki, ildırım qılınc əlindədir,

onun qabağını kəsməli olan mühasirənin dördüncü tərəfi doğma torpaq, doğma qayadır.

Qoroğlu ildırım qılıncı qınından çıxardı, qoşun geri çəkildi, elə bildilər ki, özünü qoşuna təpəcək. Lakin gözlənilməz, qeyri-adi bir hadisə baş verdi. Qoroğlu öz qılıncını sal qayaya endirdi.

Hamı heyrətdə qaldı. Bilən olmadı: Qoroğlu qayanı çapdı yoxsa, qaya aralanıb ona yol açdı?!

Qoroğlunun Göysu atı çapılmış qayanın arasından atılıb quş kimi çıxdı.

Ərəblər geri dönüb bu yeni möcüzəni gördülər və bu xəbəri xəlifəyə çatdırmağa tələsdilər.

### *157. Nəqşi-Nigar*

Xəlifə yanına üç ərəb çağırıb dedi:

- Aldədə dünyadan köçdü. Yurdunda Qoroğlu qaldı. Aldədə işığı oğlundan alırdı. Qoroğlu isə işığı Nəqşi-Nigardan alır.

Qoroğlunu sarsıtmaq üçün Odlar yurdunun gözəlini - Nəqşi-Nigarı onun əlindən alıb Bağdada gətirmək lazımdır.

Bir dəstə ərəb silahlanıb Odlar yurduna yola düşdü. Onlar Nəqşi-Nigarı kənddə tapmadılar. Öyrəndilər ki, Nəqşi-Nigar dağlara gül-çiçək yığmağa ge-dib.

Ərəb atlıları vaxt itirməmək üçün tez yola düşdülər. Məqsədləri Nəqşi-Nigarı ayrı yolda, Qoroğluna çatmamış yaxalamaq idi. Elə də oldu. Onlar Nəqşi-Nigara Haçaqayanın yanında çatdılar. Nəqşi-Nigar onları görən kimi qayanın sərt yerinə çəkildi.

Ərəbin biri pusquda idi. O, qəflətən Nəqşi-Nigarın qoşa hörüklərini tutub biləyinə doladı. Nəqşi-Nigar özünü qayadan atdı. Ərəb gördü ki, Nəqşi-Nigarın hörükləri onun əlindən çıxır, qılıncla qoşa hörükləri kəsdi. Nəqşi-Nigar o yerə düşdü ki, qayadan onun üzünə iki damcı düşürdü. Biri qan, biri su.

Vaxtı ilə Qoroğlu bu qayanı çapanda atının ayağı yaralanıb qanı torpağa sızmış, bunu görən Qoroğlunun gözündən iki damla yaş damlası düşmüşdü: biri qan, biri su.

Bu bir cüt qan və su damlaları dərdlərin dərmanı, məlhəmi idi. Nəqşi-Nigarı da bu qan və su damlaları ölümün pəncəsindən aldı, ona həyat verdi.

Qayanın başında isə möcüzə baş verdi. Qoşa hörüklər dönüb iki əfi ilan oldu. İlanlar ərəbləri məhv etməyə başladı. Biri burda çaldı, biri orda. Bir-iki nəfər qaçıb zorla canını xilas edə bildi. Onlar bu möcüzəni xəlifəyə çatdırmaq üçün Bağdada yola düşdülər.

### *158. Atanın od nəfəsi*

Üç ərəb yenə Odlar ölkəsinə –Pirqulu dağına- sözü-söhbəti günəş, od olan bir şəxsin –Dədə Günəşin peyda olduğunu eşidib, onun möcüzələri ilə tanış olmağa gəlmişdi. Qışın qarlı-boranlı bir günü idi. Onların yolu meşəli, qarlı dağdan keçirdi. Qar o qədər yağmışdı ki, addım atmaq mümkün deyildi. Amma necə olursa-olsun, ərəblər özlərini Dədə Günəşin evinə çatdırmalıydılar. Yoxsa, gecə hamısı dağın şaxtasında donub məhv olardı. Ərəblər kəndirlə bir-birinə çataqlanıb böyük ehtiyatla hərəkət edirdilər. Bir də gördülər ki, yaxındakı yarğandan zəif səs gəlir:

- Ay yolçular, mən Qoroğluyam! Ova çıxmışdım, qar uçqununa düşdüm. Darda qalanın hayına yetmək mərd işidir. Köməyinizi əsirgəməyin. Dədə Günəşin gözlərini yaşlı qoymayın…

Ərəblər qar altından gələn iniltinin Qoroğlu olmasına çox sevindilər: -Elə yaxşı oldu! Qoy qarın altında qalıb soyuqdan ölsün. Xəlifəyə müjdə xəbəri aparıb qiymətli ənam alarıq. Bir də ki, doğrudan da Dədə Günəşin möcüzələri varsa qoy oğlunu xilas etsin, - dedilər.

Ərəblər çox çətinliklə, əzab-əziyyətlə, birtəhər ağacların budaqlarından tuta-tuta qorxulu dağı aşdılar.

Axşam ərəblər Dədə Günəşə qonaq oldular. Qoca çox həyəcanlı idi. Qonaqlar əvvəlcə bunun səbəbini bilmədilər. Axşamdan xeyli keçmiş, şaxtanın bərkiyən vaxtı Dədə Günəş dedi:

- Mənim döşəyimi taxtın üstündən yerə endirin.

Ərəblər heyrətləndilər: «Deyəsən, qocaya nəsə bəlli olub, yəqin ki, bu saat möcüzə baş verəcək».

Dədə Günəş ağzını yerə dayayıb var gücü ilə nəfəs verdi. Qocanın ağzından rəngarəng od saçırdı. Gördük-lərinə heyranlıqla, təəccüblə tamaşa edən ərəblər soruşdular:

- Ey Dədə Günəş, bu nə haldır?

Dədə Günəş odlu nəfəsinə aram verdi, qonaqların sualını cavabsız qoymadı:

- Oğlum ova getmişdi. Başı ova qarışıb, uzaqlaşıb. Qar-boran üstünü alıb. Uçqunla üzləşib, yarğana düşüb. Quşbaşı yağan qar da bir tərəfdən döşəyib. Oğlum son nəfəsdədir. Odlu nəfəsimlə mən yeri isindirdim ki, Qoroğlu soyuqdan donmasın.

Qocanın dedikləri ilə ərəblərin gördükləri düz çıxırdı. Ancaq hələ də Qoroğlunun salamat qalmasına inanmırdılar.

Ərəblər səhərin açılmasını səbirsizliklə gözlə-yirdilər. Səhər erkən Dədə Günəş yatağından duran kimi, qonaqlar da yola düzəldilər. Gəlib dağa çatdılar. Dədə Günəş gülə-gülə qənşərdəki yarğanı göstərib dedi:

- Baxın, o qar tayasının başı necə tüstülənir?! Oğlum o qar tayasının altındadır. Nəfəsimlə yeri qızdır-mışam. Oğlum donmayıb, salamatdır.

Elə bu vaxt Qoroğlu qılıncı ilə qarı bölüb üzə çıxdı. Sanki günəş gecəni parçaladı.

Ərəblər bu son möcüzəni görüb, məyus halda Bağ-dada, xəlifənin yanına qayıtdılar.

### *159. Odlu məzar*

Dədə Günəşin ölüm xəbəri ərəbləri çox sevindirmişdi. Onlar təkcə Qoroğlunu aradan götürmək, ondan sonra Odlar ölkəsində öz məqsədlərinə tam nail olmaq istəyirdilər.

Ərəblərdən biri dedi:

- Qoroğlunun üstünə ərəb xilafətində şan-şöhrət qazanmış Qara pəhləvanı göndərmək lazımdır.

Qara pəhləvanı çağırdılar. Xəlifə dedi:

- Yaxşı fikirləş, Odlar ölkəsinə gedən pəhləvan gərək təkcə gücünə arxalanmasın, ağlı ondan da qüvvətli olmalıdır. Bir də ki, bu günə qədər Odlar ölkəsində Dədə Günəşi, Qoroğlunu yenən, sındıran olmayıb. Bu möcüzəli ölkənin möcüzələri ata ilə oğulun əlində olub, doğrudur, indi Dədə Günəş dünyadan köçüb, təkcə Qoroğlu qalıb. Mən Dədə Günəşin ölümünə yenə də inana bilmirəm. Bir də ki, Odlar ölkəsində dağ da, daş da, çay da, su da, torpaq da, meşə də Qoroğlunun köməyidir. Unutma ki, qırx pəhləvanla güləşə getmirsən, Qoroğlu köklü bir dağdır, alınmaz qaladır, o bir ölkədir.

Yoldaşları yolda Qara pəhləvana dedilər:

- Öyünmək yeri deyil, sən Qoroğlunu tək-tənha, silahsız, qəflətən yaxalamalısan. Üz-üzə döyüşdə sən ona bata bilməzsən.

Odlar ölkəsini çox axtardılar. Qoroğlunu tapa bilmədilər. Qoroğlunu Baba dağının həndəvərindən tapdılar. Qoroğlu da ərəbləri, onların öz yanları ilə gətirdikləri bədheybət Qara pəhləvanı gördü.

Ancaq Qara pəhləvan vaxt itirmədi, aman vermədi, qılıncı çəkib Qoroğlunun üstünə cumdu. Əli yalın, silahsız Qoroğlu qaçmaqdan başqa çarə tapmadı. Qara pəhləvan onu çox qovdu. Qoroğlu bir dağın zirvəsində çıxıb dayandı.

Bir möcüzə baş verəcəyindən qorxan Qara pəhləvan aralıda dayanıb dedi:

- Ey Qoroğlu, necə oldu ki, hər yandan qaçdın, burda dayandın?

Qoroğlu əli ilə bir məzarı göstərib dedi:

- Bu qarşıdakı atam Dədə Günəşin məzarıdır, mən onu tapdayıb keçə bilməzdim.

Qara pəhləvan hiylə ilə: -Qoy mən də gəlim o müqəddəs məzarı ziyarət edim, – dedi.

Qoroğlu dilləndi:

- Məzar yadları yaxına buraxmaz. Dayan, məhv olarsan.

Qara pəhləvan bir-iki addım atmamış məzardan od qalxdı, məzar alovlandı.

Qara pəhləvan dəhşətə gəldi, heyrətdən gözləri böyümüşdü. Qara pəhləvan təkcə bir söz deyə bildi:

- Ey Qoroğlu, gedim xəlifəyə nə deyim?

Qoroğlu:

- Ancaq gördüklərini.

### *160. Dədə Günəş*

Ərəblər Dədə Günəşi Baba dağında tuturlar. Haqqında az-çox eşitdikləri, ancaq gücünə bələd olmadıqları Dədəni gətirib dərin bir gölə atırlar ki, boğulub ölsün. Dədə Günəşin bədəninin hərarəti suyu buxarlandırıb qurudur. Ərəblər daha da qəzəblənirlər. Bu dəfə möhkəm ocaq çatıb onu alovun içinə atırlar ki, yanıb kül olsun. Amma düşmən arzusuna çatmır. Alov getdikcə soluxub keçir. Dədə Günəş başı qar-qırov, saqqalı sırsıra bağlamış halda ocağın içərisindən salamat çıxır.

Ərəblər üçüncü dəfə Dədə Günəşə yaxınlaşmaq istəyəndə göyün üzünə qara bulud gəlir, tez-tez şimşək çaxır.

Ərəblər qaçıb canlarını qurtarmağı qənimət bilirlər və Xəlifəyə bildirirlər ki, su da, od da, yer də, göy də, bulud da,şimşək də Dədə Günəşin tərəfindədi. O, adi bir insan deyil, bütöv bir vətəndi.

### *161. Əzrailin tora düşməsi*

Tomral Ağcaqalada yaşayırdı. Günü Küsmüş çayın üstündə qurduğu körpünün həndəvərində əkdiyi üzümlüklərdə, ya da Kəpəzdə, Murovda, Canbazda, Yeddiqardaş dağlarında torların yanında keçirdi. Axır zamanlar üzümlüklərin becərilməsini Tomral arvadına uşaqlarına tapşırmışdı. Özü tor qurub vəhşi heyvanları tutmaqla məşğul idi. Tomral tora düşən quşu, heyvanı tutar, ad qoyar, nişanlayar, sonra yenidən dağlara buraxardı. Tora yırtıcı heyvanlar, əcaib quşlar da düşərdi. Onlara aman olmazdı.

Bir axşam Tomral Canbazda tor qurub evə döndü. Səhər gedəndə nə görsə yaxşıdı? Gördü ki, tora insanabənzər bir şey düşüb, hətta bir cüt qanadları da var. Tomral vahiməléndi. Sümükləri çaxnaşdı. Öz-özünə düşündü: ”Bu nə əcaib ovdu? Nə insandan insana oxşayır, nə də heyvandan heyvana”.

Tomral uçuna-uçuna əlini ox-yaya atdı.Uzaqdan Tomralın niyyətini anlayan canlı dilləndi:

-Ey Tomral, əlini saxla. Mənə ox atma! Mən Əzrayılam.

Tomralın bədəni üşürgələndi. Dili tutar-tutmaz:

-Bəs burada nə gəzirsən?

-Tomral, xeyli vaxtdır sənin torunla maraqlanıram. Tor qurmaq mənim işimdir. Sənin torunun sirrini öyrənmək qəsdində durdum. Düşündüm ki, gərəyim olar. Bu məqsədlə qurduğum tora xeyli tamaşa elədim. Əlimi toxunduran kimi tor məni buraxmadı. Çox çalışdım, qurtula bilmədim. Axşamdan bədənimə dolanmış torun içindəyəm. Gəl məni aç, burax.

Tomral sevindi:

-Yox, Əzrayıl, bağrın çatlamasın. Darıxma, heç nə olmaz. Sözümə qulaq as, şərtimə əməl etməsən, səni buraxan deyiləm.

-Şərtin nədir, Tomral?

-Sən çoxlarına tor qurmusan. İndi əvəzini almalısan. Söz ver ki, mənim ölüm günümü bir həftə əvvəl xəbər verəcəksən.

-Çətin olsa da söz verərəm. Təki tordan azad olum.

Tomral toru açıb, onu buraxdı.

Aylar-illər keçdi. Tomral nəvəli-nəticəli, nurani bir qoca olmuşdu. Günlərin birində meyvə ağacı tinkləri basdırırdı. Bir də baxdı ki, bir adam uzaqdan tez-tez ona işarə edib irişir, dişlərini ağardır. Tomral əl saxlayıb soruşdu: Ay adam, kimsən, niyə gülürsən?

Mənəm, Tomral, Əzrayılam. Gəlmişəm xəbər verim ki, vaxtına bir həftə qalır.

Əzrayıl sabah yenə oradan keçirdi. Fikirləşdi ki, onun xəbərdarlığından sonra, yəqin Tomral yarıcan olub döşəyə yıxılıb. Bir də gördü ki, Tomral

həyətdə ağac əkməklə məşğuldu .Gözlərinə inanmadı. Dilləndi:

-Ey Tomral, bilirsən ki, ölüm ayağındasan. Bundan sonra ağac əkmək nəyinə gərəkdi? Sən ki onun barını yeməyəcəksən.

-Məndən əvvəl əkmişdilər, yeyib rəhmətlikləri yad edirik. Mən də əkirəm ki, məndən sonra gələnlər bu meyvələrdən yeyib məni yad eləsinlər. Mən adamlara bağ qoyub gedirəm, sənin kimi dağ qoyub getmirəm ki?!

Doğrudan da, insan ölər, məğlubolmaz. Onun sevən ürəyi, yaradan əli var. Ona görə də yer üzündən nə onun nəslini kəsmək olar, nə də nişanəsini itirmək. Hər nəsil ağacını yüz yaşıl pöhrəsi olur. Bu dünyada ağlayan da insandı, gülən də. Hər şey onun payına düşür.

### *162. Məleykə əfsanəsi*

Deyilənlərə görə bir oğlan yol gedirmiş, bir də görür ki, bir dəstə göyərçin gəlib, bir çarhovuzun kənarına qondu. Oğlan baxıb görür ki, bunların hərəsi dönüb bir məleykə oldu. Həmin məleykələr paltarlarını çıxarıb hovuzda çimməyə başlayırlar. Oğlan gəlib onlardan birinin paltarlarını götürüb əlində saxlayır. Məleykələr çimib çıxandan sonra hərəsi öz paltarlarını geyib, tezcə də göyərçin olub uçurlar. Paltarı oğlanda olan məleykə isə çarhovuzda qalır. Oğlana yalvarır ki, paltarını versin. Lakin oğlan paltarı vermir. Nəhayət, oğlan deyir ki, əgər mənə gəlsən, paltarını verərəm. Bu təklifin qarşısında məleykə oğlana deyir:

-Razıyam. Bir şərtlə ki, mən necə hərəkət eləsəm, nə iş görsəm, gərək onun səbəbini soruşmayasan. Əgər soruşsan daha səninlə yaşaya bilmərəm.

Oğlan razı olur. Onlar evlənirlər. Vaxt gəlib çatır, oğlanın anası ölür. Qaynanası can verəndə mələykə-gəlin çıxıb, yükün üstündə oturur, qorxunc bir səslə ağlayır. Meyit götürüləndə isə mələykə cənazənin arxasınca baxıb şaqqanaq çəkib gülür. Hamı dağılandan sonra oğlan arvadından nə üçün elə ağladığının, nə üçün elə güldüyünün səbəbini soruşur. Mələykə demək istəmir. Lakin oğlan əl çəkmir:

-Mən səndən ayrılmağa razıyam. Təki bu iki hərəkətin sirrini bilim.

Əlacsız qalan qız deyir:

-Mən ona görə yükün üstünə çıxıb o cür ağladım ki, Əzrayıl ananın başını kəsəndə ev qanla dolmuşdu. Cənazənin arxasınca ona görə güldüm ki, anan bu qədər ömür sürsə də, həyatda kimsəyə yaxşılıq eləməmişdi, bir çarıq, bir süpürgədən başqa. Bu iki şey də onun cə-nazəsindən asılmışdı. Anan bu dünyadan bu iki şeydən başqa heç nə aparmadı.

Mələykə bu sözləri deyir oğlandan ayrılır və quş olub uçub gedir.

### *163. Qəbələ qalası*

**Birinci əfsanə.** Belə danışırlar ki, qədim çağlarda Qəbələ qalasının dörd bir yanı su olub. Ona görə də qalaya birbaşa hücum etmək çətin imiş. Qonşu hökmdarın gizlicə göndərdiyi qüvvətli bir cavan da bu qalaya daxil ola bilmirmiş. O, qalanın sirrini öyrənmək üçün bir yerli qadınla evlənir. Qadın ona öyrədir ki, suya saman tök. Saman suyun burulğanına düşərək, oradan da axıb gedəcək. Onda bil ki, qalaya keçid oradandır.

Düşmən bu sirri biləndən sonra qalanı ala bilir.

**İkinci əfsanə**. Makedoniyalı İsgəndər çox cəhd göstərir, amma ətrafı su olan əzəmətli Qəbələ qalasını ala bilmir.

Qəbələ xanının qızı isə İsgəndəri görüb vurulubmuş. Qız İsgəndərə məktub yazır ki, əgər məni alsan, qalanın yolunu sənə deyərəm.

İsgəndər razı olur.

Qız İsgəndərə belə bir kağız yazır: Hökmdar, suya bir qucaq saman tök, izi ilə qalaya gir.

Bundan sonra İsgəndər qalanı ələ keçirir.

### *164. Pəri qalası*

Böyük torpaq sahibi olan varlı bir kişinin Güllər və Pəri adlı iki qızı olur.

Qızlar bir gün dağlara gül-çiçək yığmağa çıxırlar. Həmin gün uzaq obadan da bir dəstə adam bu yerlərə gəzməyə gəlir. Onlar qızları uzaqdan görüb, tutmaq istəyirlər. Qızlar məsələni duyub qaçırlar. Gələnlər atlı, qızlar piyada. Gülləri qovub tuturlar. Pəri isə qayalar arasında gizlənir. Atlılar çox axtarır, lakin Pərini tapa bilmirlər. Gülləri götürüb aparırlar.

Pəri bu xəbəri atasına çatdırır və deyir:

- Düşmən qapımızı tanıdı, onlar bir də gələcək. Ata, kəndimizin üstündəki dağın başında bir qala tikdir, düşməndən qorunmaq üçün. Bu düzdə bir güllük saldır, hər baxanda Gülləri yada salmaq üçün.

Ata qızının məsləhətini bəyənir. Dağda möhtəşəm bir qala tikdirir, düzdə isə güllük saldırır.

Dəstə başçısı Güllərlə evlənir. Bir gün oğlan soruşur:

- Görən, yer üzündə səndən gözəl, sənə bərabər ikinci bir gözəl varmı?

Güllər deyir:

- Bəli var. O mənim balaca bacım Pəri xanımdır. O məndən çox gözəldir, mən onun yanında nəyəm ki, ona bərabər gözəl olmaz.

Oğlanın kefi pozulur, əhvalı dəyişir. Öz-özünə deyir:

- «Hər necə olsa, onu ələ keçirməliyəm. Bu yolda öldü var, döndü yoxdur».

Oğlan bir qalayçı körüyü də götürüb həmin yerlərə gəlir. O, kəndbəkənd gəzə-gəzə güllüyə çatır. Bir qarıya qonaq olur. Gəlmişdən, keçmişdən çox danışırlar. Qarı söhbəti Pəridən salır, deyir:

- Bu kəndin ağsaqqalının iki gözəl qızı vardı. Qızlardan birini dağlardan apardılar. Kişi o biri qızını,

uca dağın başında qala tikdirib, oraya qoydu. Ata böyük qızın ayrılığına tab gətirməyib xiffətindən öldü. Bu güllüyü qızı Güllərə, dağdakı qalanı isə Pəriyə yadigar qoyub getdi. İndi bu el-obanın başçısı Pəridir. Pəri həm olduqca gözəl, həm də çox ağıllı qızdır.

«Qalayçı» səhər körüyünü də götürüb Pəri qalasına qalxır. Kənizlər Pəri xanıma xəbər verirlər ki, qapımıza bir qalayçı gəlib, razı olsan, qab-qacağı verək, qalay-lasın.

Pəri razılıq verir.

«Qalayçı» işə başlayır. Xeyli keçmiş birdən qış-qırır.

Kənizlər səsə gəlib soruşurlar:

- Nə oldu?

- Heç, dişim yaman ağrıdı, - əli ilə çənəsini tutur.

- Kənizlərdən biri deyir:

- Pəri xanımın belə şeylərdən başı çıxır. Gedib deyək, bəlkə kömək elədi.

Xəbər Pəri xanıma çatanda deyir:

- Qoyun gəlsin.

Pəri xanım oğlanın dişinə baxan kimi onu tanıyır. Bircə ağız qışqırır:

- Bunu tutun!

Gözətçilərə xəbər çatana qədər «qalayçı» quş kimi pırıldayıb aradan çıxır. Oğlan öz yerlərinə gəlib qoşun toplayır. Pəri qalasına hücum eyləyir. Qalanı ələ keçirir. Amma Pəri lağımla yaxınlıqdakı kahaya qaçır. Düşmən onu izləyə-izləyə bura da gəlir. Yaxa qurtara bilməyəcəyini görən Pəri özünü qayadan yerə atır.

## *165. Sumu qalası*

Bir kənddə Danyel adlı bir bəy yaşayırmış. Bu bəyin ev-eşiyi, oğul-uşağı ola-ola gözü yenə də kəndin gözəl qızlarındaymış. Kənd qızlarının isə bu Danyel bəyi görəsi gözü yox imiş. Ancaq qızlardan dördü ata-anasının narazı olmasına baxmayaraq, Danyel bəyə ərə getməyə razılıq verirlər.

Bu xəbər o mahalın Hökmdarı Sumuya çatır. Sumu bərk qəzəblənir. Adi yolçu paltarı geyib yola düzəlir ki, ayrı-ayrılıqda qızlardan Danyel bəyi istəyib-istə-mədiklərini öyrənə bilsin.

Sumuya aydın olur ki, qızlar, doğrudan da, Danyel bəyə ərə getməyə razıdırlar. Sumu həmin gündən hazırlıq görür, qala tikdirməyə başlayır. Həmin dörd qızın hərəsini qalanın bir küncünə qoydurur. Qala hörgüsü qalxdıqca daralır, axırda qalanın başı tamam bağlanır. Qızlar da qalanın içində qalıb həlak olurlar. O vaxtdan sonra kənddə heç bir qız övrəti-külfəti olan kişiyə ərə getməyə razılıq vermir.

## *166. Gülüstan qalası*

Belə deyirlər ki, yad bir hökmdar Azərbaycana hücum edən zaman Bərdənin hökmdarı Gülüstan adlı bir qız imiş. Gülüstan Murovdağın ətəyində, İncəçayın sahilində bir qala tikdiribmiş. Bu qalaya hökmdarın adı ilə «Gülüstan qalası» deyirmişlər. Düşmən qoşunu Bərdəni tutur. Gülüstan başının dəstəsi ilə Mu-rovdağdakı qalaya çəkilir. Qoşun bir neçə ay qalanı mühasirədə saxlayırsa da, ala bilmir. Axırda təngə gəlib çıxıb getmək istəyir. Çayı keçib

gedərkən əsgərlərdən biri çaylaqda bir qara it görür. Bunu qoşun başçısına xəbər verir. İti gözdən qoymurlar, görürlər ki, it İncəçaydan su içib geri döndü və yerin altına girib görünməz oldu. Beləliklə də, düşmənlər qala yolunu öyrənir, sirri aça bilirlər. Məlum olur ki, qaladakıların azuqə ehtiyatı içəridədir, suyu da yeraltı yol ilə gedib götürürlər.

Düşmən qoşunu bir şey hiss etdirmədən gecə yarısı qalaya daxil olur, Gülüstan isə düşmən əlinə keçməmək üçün özünü həlak edir.

### *167. Örənqala*

Keçmiş zamanlarda Beyləqan şəhərində bir qoca yaşayırmış. O öz qızıl pullarını şəhərin ətrafındakı me-şədə gizləyirmiş. Aylar, illər ötür, güclü bir zəlzələ olur. Şəhər camaatı qaçır, pərən-pərən düşür. Qorxudan gözləri tutulan qoca da ailəsi ilə qaçır.

Xeyli vaxtdan sonra meşədə gizlədiyi pullar onun yadına düşür, oğlunu yanına çağırıb deyir:

- Beyləqan meşəsində iri bir ağacın dibində qızıl küpəsi basdırmışam. Atları hazırla, gedib onu gətirək.

Oğlan dərhal iki at yəhərləyir. Ata-oğul atlara minib, yola çıxırlar.

Oğlan yolda bir qoca görür. Beyləqanın yolunu ondan xəbər alır. Ata ilə oğul bir gün yol gedirlər.

Ata oğlundan soruşur:

- Oğul, Beyləqanın ortasında uca bir qala var, hələ görünmür ki?

Oğlan ətrafda boz düzənlikdən başqa heç nə olmadığını bildirir. Onlar qoca bir qarıya rast gəlirlər.

Qarıdan Beyləqana nə qədər yol qaldığını soruşurlar. Qarı onlara yaxınlıqda görünən xarabalıqları göstərir.

Oğlan atını xarabalığa doğru sürür, atası da arxasınca. Oğlan atasına deyir:

- Mənzilə yaxınlaşırıq.

Oğlan dönüb arxaya baxanda görür atası başını aşağı əyir. O, atasından soruşur:

- Ata, başını niyə əyirsən?

- Qorxuram, ağacların qol-budaqları gözümə dəyər.

Oğlan təəccüblənir; öz-özünə: «Nə ağac? Burada ki heç ağac yoxdur», deyir.

Qoca yenə soruşur:

- Oğul, qala görünürmü?

Oğlan:

- Ata, hansı qala?

- Necə hansı qala, Beyləqanın tən ortasındakı hündür qala.

Oğlan deyir:

- Ata, burada xarabalıqdan başqa heç nə yoxdur.

Ata oğluna inanmır. Qoca öz-özünə düşünür: «Görəsən, o hündürlükdə qala necə olub? Bəs quş səkə bilməyən Beyləqan meşəsi hanı?»
Qoca dərindən köks ötürüb kədərli-kədərli deyir:

- Beyləqan da örəniyərmiş, qalası da örəniyərmiş.

### *168. Dərbənd qalası*

Dərbəndin yeddi qala qapısının- Bayat qapı, Carçı qapı, Orta qapı, Yengicə qapı, Qala qapı və

Quba qapılarının hərəsi bir məhəlləyə açılırmış. Bu daş tağlı, dəmirqapılı darvazaların, yeraltı yolların əhəmiyyəti hələ də dildə-ağızda dolaşmaqdadır.

Yeraltı yollar haqqında deyirlər ki, guya Dərbənd qalasına gələn hər bir elçi yeraltı yolun biri ilə içəri gözü bağlı aparılır, o biri ilə qaladan çıxarılırmış. Bu, qalanın sirrini möhkəm saxlamaq, onu düşməndən qorumaq üçün edilirmiş. Qaranlıq düşən kimi qapılar bağlanarmış. Şər qovuşandan sonra dərbəndlilərin özləri belə yeddi darvaza qapısından içəri buraxılmazmış. Çünki qa-ranlıqda içəri hansı bir qasidin soxulub, qalanın sirrini öyrənə biləcəyindən ehtiyat edirmişlər. Dərbənd qalasının qədim əzəməti, yerli əhalinin adət və ənənələri, xüsusilə bu qapılar haqqında yaranıb, yaşayan bir neçə əfsanə var.

B i r i n c i ə f s a n ə: Bir oğlan bir qızı, qız da həmin oğlanı ürəkdən sevirmiş. Qızın yeddi qardaşı varmış. Onlar bacılarını oğlana vermirlərmiş.

Amma oğlan ümidini itirmir, qıza xəbər göndərir ki, elə dərd yoxdur ki, ona çarə tapılmasın. Qız da ümidlə yaşayır.

Bir gün oğlan da, qız da çöldən gec qayıdırlar. Gəlib görürlər ki, Dərbənd darvazaları bağlanıb.

Qaranlıqda oğlan qızı, qız da oğlanı tanımır. Axşamdan xeyli keçir. Oğlan deyir:

- Məndən çəkinmə. And içirəm ki, bu gündən ölən günə qədər sən mənim bacımsan.

Bundan sonra qız oğlana inanır, onun yapıncısının altına girib yatır.

Sabah açılır. Yeddi qardaş gecə bacıları bayırda qalıb deyə, hamıdan tez darvazadan çıxır. Görürlər ki, bacıları oğlanla bir yapıncı altında qalıb,

deyirlər, daha verək getsin. Bu zaman oğlanla qız ayılır, bir-birini tanıyır. Oğlan deyir:

- Daha gecdir. And içmişəm, o mənim bacımdır.

Qız da görür ki, artıq hər şey bitdi.

Belə deyirlər ki, qız o gündən sonra dağlarda oğlanın: «elə dərd yoxdur ki, ona çarə tapılmasın» sözünü yada salıb bu bayatı-mahnını oxuyarmış:

***Dərbənd üstə qala var,***
***Ürəyimdə yara var.***
***Mən ölürəm dərmansız,***
***Bəs deyirlər çarə var.***

İ k i n c i  ə f s a n ə: Dərbənd qoşunları Sarıyalda keşik çəkirmiş. Qalaya da həmin dağın bulaqlarının suyu gətirilibmiş. Onlar suyu da düşməndən qorumalı imişlər.

Bir gün yadelli bir xan Dərbəndə basqın edir. Yad xan çox gənc imiş. O, atlıları ilə aralıda dayanıb Dər-bənd qalasına tamaşa edirmiş. Dərbənd xanı da qala bürcünün birində dayanıb öz sevimli qızı ilə ətrafa göz gəzdirirmiş.

Qız cavan, yad xanı görür, atasından ayrılıb, qalanın o biri bürcünə keçir. Atanın bundan xəbəri ol-mur.

Qız bir məktub yazıb oxa bağlayır, gənc xana tərəf atır. Xan məktubu açıb oxuyur, görür Dərbənd xanının

qızı yazır: «Əgər əhdinə düz çıxıb məni alsan, qalanın sirrini sənə deyərəm».

Xan vaxt itirmədən tez qıza məktub yazır, oxa bağlayıb ona tərəf atır. Qız gənc xanın əhdinə vəfa

edəcəyinə and içdiyini öyrənən kimi ona belə bir məktub göndərir:

«Atamın qoşunu Sarıyaldadır. Qalaya su da o dağ-dan gəlir. Oraya getməyin. Qaladan bir qədər aralıdakı dik daşı qaldırın, su tüngü oradan keçir. Suyun üstünü azca açın, yüz qoyun kəsib qanını su ilə axıdın. Yay günüdür, qan həm suyu zəhərləyəcək, həm də atam vahiməyə düşəcək ki, dağda bütün qoşunum qırılıb, qan su yerinə gedir».

Cavan xan fürsətdən istifadə edir.

Bu zaman Dərbənd xanı su istəyir. Ona deyirlər ki, hovuzun suyu tamam qandı. Xan bir-bir hovuzlara baxır, görür ki, doğrudan da hamısına al qan dolub, su arxı ilə elə hey qan axır.

Dərbənd xanı deyir:

- Hər şey bitdi. Dağda bütün qoşunum qırılıb.

Odur ki, xan ailəsi ilə birlikdə yeraltı yolla Dərbənd qalasından çıxır. Xanın qızı isə gizlənib qalada qalır.

Düşmən Dərbənd xanı və onun ailəsini məhv edir, qalanı da çox asanlıqla ələ keçirir.

Yadelli cavan xan Dərbənd xanının qızı ilə evlənir. Xan bir gün qıza deyir:

- Qalanın hansı bürcündən ox atıb mənə məktub göndərmişdin? Gəl həmin bürcə çıxaq, doyunca Dər-bənd şəhərinə baxaq.

Qız sevinir. Onlar qala bürcünə çıxırlar.

Xan deyir:

-Doğma diyarına doyunca bax. Bu sənin son baxışındır. Atasına vəfa qılmayan qız, mənə də vəfa eləməz. Dünən atasını satan qız, bir gün də məni satar.

Xan bu sözləri deyib qızı qala bürcündən atır.

Ü ç ü n c ü   ə f s a n ə. Dərbəndin hökmdarı yox imiş. Ağsaqqallar belə bir məsləhət edirlər. Deyirlər, gəlin Bayat qapısına bir papaq asaq. Kim çaparaqda oxla onu vurub yerə salsa, sonra da atdan düşmədən, yerdən papağı götürüb başına qoysa, Dərbəndin xanı olsun.

Yüz gənc meydanda at çapır, ox atır, amma heç biri nə papağı oxla vurub yerə salır, nə də yerdən götürüb başına qoya bilir. Bu işi üzü niqablı tək bircə gənc eləyir.

Cavan atlı niqabını götürəndə görürlər ki, bu Tuti-Bikədir.

Qəhrəman qız Dərbəndin xanı olur. Tuti-Bikə Dərbəndi yadellilərdən qorumaq üçün qoşun toplamağa başlayır. Belə bir vaxtda Fətəli xan Dərbəndə hücum edir. Vəziyyətin ağır olduğunu görən Tuti-Bikə at be-lində tək-tənha qabağa çıxır. Fətəli xana deyir:

- Niyə nahaqdan qan axsın, iki tərəfdən də çox adam ölsün? Gəl, ikimiz döyüşək, kim üstün gəlsə, o qalib hesab edilsin.

Fətəli xan deyir:

- Mən Dərbəndi almağa gəlmişdim. Amma məğlub oldum. Çünki qabağıma kişi qüdrətli qız çıxdı.

Onlar Dərbənd qalasının uca bürcündə qoşa dayanırlar. Tuti-Bikə belə deyir:

***Dərbənd üstü barıdı,***
***Əlçatmaz, yuxarıdı.***
***Düşmən gəlsə basılar,***
***Tək deyil, arxalıdı.***

### *169. Qanlı qala*

Qəmər varlı qızıydı, başında bir dəstə kəniz gəzməyə çıxırdı; Qənbər isə onun atasının çobanı idi, qabağında bir sürü qoyun, günü-güzəranı çöllərdə keçirdi. Dünyada bir neydən başqa heç nəyi yox idi. Qəmərə vurulmuşdu, dərdini bir kimsəyə danışa bilmirdi, çöllərdə ney çalır, qəmini, qüssəsini düzlərə, dağlara, daşlara söyləyirdi.

Qəmər hər gün bu neyin çöllərdə dolaşan hönkürtüsünü eşidirdi. Qənbərin ürək yanğısına qulaq asırdı. O da Qənbəri sevirdi, amma oğlanla görüşməyə, ona könül sözü deməyə qorxurdu.

Bir gecə Qəmərlə Qənbər gözdən oğurlanıb uzaqlaşdılar, ürək söhbəti elədilər, üzlərinə gələsi qara sabahlardan qurtarmaq üçün tədbir tökdülər.

Qənbər anası ilə bərabər sürünü yaylağa apardı. Gündüzlər hər qoyunun belinə bir daş bağladı, sıldırımın başına çıxartdı. Burada neçə xırman boyda yastana vardı, yastananın ortasından bir bulaq çıxmışdı. Fikirləşmişdi ki, bura yaxşı qala yeridir, suyun içində, hər tərəfi də uçqun, hər əlli-ayaqlı bura çıxa, bu sıldırımı yuxarı dırmaşa bilməz, hər ox bu qalaya çatmaz.

Qənbər oraya neçə karvan yükü yumurta da gətirdi. Yumurta sarısı ilə külü, gili bir-birinə qatdırdı, palçıq düzəltdirdi, barısının qalınlığı iki addım olan daşdan bir qala hördürməyə başladı. Qala başa gələr-gəlməz eşitdi ki, Qəməri bir bəy oğluna nişanlayıblar. Əl-ayağı soyudu. Üzünü arana tutub bir bayatı çəkdi:

***Yaşım üzümdə qaldı,***
***Axdı düzümdə qaldı.***

*Hər nə dilək dilədim,*
*Hamsı gözümdə qaldı*.

İlk görüş, son ayrılıq yadına düşdü. Qəmərin pıçıltılarını bir də eşitdi. Ürəyinə təzə təpər gəldi. Sürünü anasına tapşırıb, duz gətirmək adıyla arana yollandı. Qəmərlə görüşdü, bir-birinə qoşulub yaylağa qaçdılar. Qızın nişanlısı işdən agah olan kimi qoşun çəkib dağlara sarı yeridi.

Qəmər bir səhər duranda gördü ki, dalı arandan üzülməyən bir qara kölgənin qabağı çathaçatdadır, özü də kölgə deyil, qoşundur, sayı-hesabı yoxdur, torpaq kimidir.

Ustalara tapşırdı, Qənbəri qala divarının yarımçıq, hələ tam hazır olmayan qülləsinə qoyub böyür-başını hördülər, ona bir nəfəslik yeri də saxladılar.

Qəmər öz sevgilisinə:

- Ələ keçsəm də məni öldürməzlər, -dedi. Qorxum səndəndir, təki sən qal, sən yaşa, mən onsuz da səninəm. Məni dünyanın o başına aparsalar da, gəlib səni tapacağam.

Bəy oğlunun qoşunu qalanı dövrələdi. Qoşun həmlə etməmiş özü qalaya bir xəbərdarlıq oxu atdı. Ox süzüb qülləyə sancıldı. Qüllədən qan bulaq kimi qaynayıb sıldırıma süzüldü.

Qəmər qüllədə idi. İlk oxun Qənbərə dəydiyini görəndə divarı sökmək, sevgilisini çıxarmaq istədi.

Qənbər dedi:

*Bulud oynar, yolar saç,*
*Gəlmə yaxın Qəmər, qaç!*
*Sinəmdən yaralandım,*
*Üstünə qan damar, qaç!*

Qəmər onun sözünə baxmadı, qülləni içəri tərəfdən sökdü, oğlanı qolları arasına aldı, yanıqlı bir ah çəkdi:

*Əzizim, dağ başıdı,*
*Dağ üstü, dağ başıdı.*
*Qalada bir toy tutdum,*
*Şabaşı göz yaşıdı*.

Bəy oğlu sıldırımı boyayan qana baxa-baxa üzünü öz qoşununa tutdu:

-Gəlin qayıdaq. Bircə ox dəyəndən sonra bu qədər qan ağlayan qalanı dağıtsaq, qan seli yaranar, bizi sil-süpür edib aparar, birimiz də sağ qalmarıq.

Qoşun geri yeriyəndə Qəmər qülləyə çıxdı, gözlərində qalan kamını, qəzəbini dili odlana-odlana söylədi:

*Eləmi, Qanlı qala,*
*Qanlı dağ, qanlı qala;*
*Bu necə insafdı ki,*
*Yar ölə, qanlı qala?!*

### *170. Öncəqala əfsanəsi*

Atalarının vəsiyyətinə görə, Uluxan qardaşı Həzi ilə gözəl coğrafi mövqeyi olan bir yerdə qala tikdirir. Ancaq, atalarının ölümündən sonra Uluxanla Həzi arasında ərazi üstündə ixtilaf baş verir. İki qardaş uzun müharibədən sonra ayrılmalı olurlar. Qonşuluqda yer-ləşən Səməd xanın Uluxanla arası

yox idi. Qardaşların bu mübahisəsindən istifadə edən Səməd xan Həzini müxtəlif yollarla öz yanına gətirdir.

Uluxanın Töhid adlı oğlu, Həzinin Bətutə adlı qızı ilə sevişirmiş. Bu gizli görüşdən Səməd xan xəbər tutur. Uluxandan intiqamını doğma qardaşının əlilə almaq qərarına gəlir və təzə xəbəri sevincək Həziyə çatdırır. Qəzəblənən Həzi ona inanmır, dəlil-sübut istəyir.

Bətutə Nərmin adlı göyərçini ilə Töhidə yeni məktub yola salır: Sədaqətli quş iki aşiqin yeganə elçisi idi. Məktubda sevgililərin necə görüşəcəkləri yazılıbmış. Səməd xan hər şeyi diqqətlə izləyir. Zavallı göyərçin onun isti və hiyləgər gözlərindən yayına bilmir.O, Tərlan buraxıb göyərçini tutur. Məktub ələ keçir. Məktubun Bətutə tərəfindən yazıldığını görən Həzi Səməd xana tədbir görməyi tapşırır. Səmədə də elə bu lazım idi. O, bu iş üçün əncam çəkəcəyinə söz verir.

Məktubda yazılıbmış ki, Töhid qala ətrafındakı xəndəyə keçməli, böyük İstil deyilən gölə girməli, sonra yanan şam istiqamətində üzməlidir.

Göyərçini yenidən məktubla yola salır. Həzi ilə Səməd xan Bətutəni izləyirlər. Gecədən xeyli keçmiş qız pəncərə ağzına yanan şam qoyur. Töhid şamın köməyi ilə Bətutəni tapıb onunla görüşməli idi. Qızının xəyanətini görən Həzi onu zindana saldırır. Səməd xan Həzinin razılığı ilə yanar şamın yerini dəyişir. Onu  Böyük İstilə tökülən coşqun dağ çayı Viləşin isti-qamətində qoyur. Töhid işığa inanıb Viləşə doğru yan alır. Dəli dalğalı çayla üzür. Ancaq şama çata bilmir. Qəzaya uğrayıb həlak olur.

Üç gündən sonra Töhidin meyidi tapılır. Uluxan oğlunun ölümündən sarsılır. Qardaşına bu

fitvanı Səməd xanın verdiyini yəqinləşdirir. Onu təkbətək döyüşə çağırır. Bu döyüşdə Səməd xan öldürülür.

Bətutəni zindandan azad edirlər. O, başına gələnlərin hamısını Uluxana danışır. Vəziyyəti pis görən Həzi aradan çıxmaq istəyir, ancaq onu tutub haqq divanına gətirirlər. Bətutənin təkidilə Həzi etdiyi cina-yətlərə görə suda boğulur. Sonra Bətutə sevgilisinin məzarı üstə gəlir. Saç yolub, doyunca ağı deyir. Axırda Töhidə yalvarır:

- Qanlı fələk məni sevgilimə həsrət qoymaq istədi, ancaq gücü çatmadı. Yanında mənə yer elə, əzizim, səninlə qovuşmağa gəlirəm. Bunu deyib Bətutə məzarın üstündə xəncərlə özünü öldürür.

### *171. Surxay xan qalası*

Surxay xan Ağdaşı gəzməyə çıxır. O, bulağın başında Gülgəz adlı gözəl bir qıza rast gəlir. O, qızı zorla atın tərkinə alıb evinə gətirir.

Gülgəz nə qədər yalvarır, yapışır, göz yaşları axıdıb nişanlısı olduğunu deyirsə, bir şey hasil olmur. Surxay xan qızın sözlərini qulaq ardına vurur.

Surxay xan böyük tayfası olan zorlu bir pəhləvan idi. O, özünə Yanar dağda bir qala tikdirmişdi. Qalada tək yaşayırdı. O, Gülgəzi də həmin qalaya apardi.

Gülgəz bu tənha çöllərdə, insan yaşamayan Yanar dağda çox darıxırdı. Onun qəlbi nişanlısı Dəyanət üçün çırpınırdı. Dəyanət də neçə gün idi ki, rahatlıq tapa bil-mirdi.

Əvvəlcə bu hadisəni ondan gizlədirdilər, amma el ağzı-çuval ağzı. Söz yayılıb axırda Dəyanətin

qulağına çatdı. Dəyanət dərhal Yanar dağa üz qoydu. O, Surxay xanla hesablaşmaq istəyirdi. Xoşbəxtlikdən xan ova çıx-mışdı. Onu Gülgəz qarşıladı, göz yaşları içində Dəyanəti ovundurdu, nəticəsiz fikirdən döndərmək istədi:

- Bilirsən ki, bu elatda onun meydanına çıxan yox-dur. Zalım xan çox güclüdür. Səni göz qırpımında məhv edər. Onun zoru varsa, sənin də ağlın var. Ağıl zordan da güclüdür. Gülgəzin sözləri Dəyanətin ağlına batdı. Geri qayıdıb köhnə, nimdaş paltarda yenidən Yanar dağa gəldi. Surxay onu mehtərliyə götürdü. Dəyanət atla birlikdə birinci mərtəbədə, özü isə Gülgəzlə ikinci mərtəbədə qalırdı.

Surxay xan uzaq səfərə hazırlaşırdı. Dəyanət atın arpasına duz qatdı, üç gün ona su vermədi, susuz atı duzlu arpa daha da yandırırdı. Nəhayət, Surxay xan yola düşür. Dəyanətlə Gülgəz qala bürcünə çıxıb Surxay xanın dalınca baxırlar. At Surxay xanı

götürüb qaçır, o, cilovu yığa bilmir və at onu dəryaçaya qərq edir.

Gülgəz deyir:

- Ağıl zora güc gəldi. Surxay xan məhv olsa da, arxası, tayfası güclüdür. Onlar bu faciəni eşidib Yanar dağa gələcəklər. Qaladan çəkidən yüngül, qiymətdən ağır şeyləri götürək, qalanı isə yandıraq.

Bu alovu elat görür.

Adamlar deyirlər:

- Dağ da yanar?

Bir başqası:

- Yanar dağ.

Camaat gəlib görür, qala yanır, Surxay xan isə yoxdur. Onun da, atının da meyidini yaxınlıqdakı dəryaçadan tapırlar. Ondan yadigar Surxay xan qalasının xarabası, bir də Yanardağ qalır.

### *172. Ağca qala*

Bu qala Şəkinin Aydınbulaq kəndi yaxınlığındadır. Aşağı Daşağıl kəndi isə qalanın gündoğan tərəfindədir.

Bu möhtəşəm qala Ağca adlı bir qəhrəman qızın sifarişi ilə tikilibdir. Əfsanəyə görə, Ağca elin gözəl və cəsur bir qızı olubdur. Yaşlı bir xan qıza aşiq olur. Qız ona sifariş göndərir:

- Xan bir dağın başında möhtəşəm bir qala tikdirsin. Məni və elin qırx gözəl qızını o qalaya köçürsün, bir neçə müddət oxutdursun, ədab-ərkandan dərs alaq.

Bu təklif xanın çox xoşuna gəlir. Çay daşından möhkəm bir qala tikdirir. Ağcanı və daha qırx qızı ora köçürtdürür. Molla seçib göndərir ki, bu qızlara dərs desin.

Xan çox zülmkar imiş. Xalq ağır vergilər altında inləyirmiş. Qızların da xana nifrəti varmış.

Bir gün xan qalaya gəlir. Ağca qala bürcünə çıxıb deyir:

- Xan, düşmənlərindən qorunmaq üçün bizə silah ver, qılınc oynatmaq, tüfəng atmaq öyrət. Biz bu ellərə arxa ola bilərik.

Ağcanın bu təklifi də xanın xoşuna gəlir.

Qızlar bir müddət silahları işlətməyi öyrənirlər.

Axırda qırx qız, cariyə başında da Ağca üsyana başlayır.Ağca xanın qarşısına tələb qoyur ki,

kəndlilərin vergisini azalt, qızlara isə bu qalada tam azadlıq ver. Xan bununla razılaşmır. Qoşun çəkib, qalaya hücum edir. Qırx qız və Ağca mərdliklə vuruşurlar. Qala bürcləri dağıdılır. Ağca və qırx qız xanın adamları tərəfindən edam edilir.

Qala da qəhrəman qızın – Ağcanın adı ilə «Ağca qala» adlanır.

### *173. Qarı körpüsü*

Zibeydə el-obanın qənirsiz gözəli idi. Qonşuluqda olan çoban Məhəmmədi sevirdi. Məhəmməd bir Mə-həmməd idi, qoluna bəlgə dolayıb, əlinə də çomağı alıb bir qoşunun qabağında təkcə dayanırdı, atlılar çomağının zərbindən yerə yarpaq təki tökülür, piyadalar qırğı görmüş sərçə kimi pərən-pərən olurdular. Bu el-obada hələ Məhəmmədin qolunu qanıran anasından olmamışdı. Ağzının buğu arandan dağı vurur, nəfəsi, nərəsi yeri-yurdu göy gurultusu kimi titrədirdi.

Səlim ağa bir gün başının dəstəsi ilə mahalı oymaq-oymaq gəzməyə çıxmışdı. Bulaq başında Zibeydəni gördü. Bir könüldən min könülə ona vuruldu. Qızın atasına xəbər göndərdi ki, Zibeydəni mənə verməlisən. Ata necə «yox» deyəydi? Səlim ağa qoşun çəkib qızı zorla apartdıracaqdı, özünü də o ki var, döydürəcək, ilan kimi bir qat qabıqdan çıxartdıracaqdı. Ona görə də çaparlara «hə» dedi, amma bir neçə günlüyə möhlət istədi.

Zibeydə bu xəbəri eşidən kimi balağını əlinə alıb, çöllərə, Məhəmmədin yanına qaçdı, bu bəd xəbəri ona çatdırdı.

Səlim ağanın o qədər siyirməqılınc qoşununun qabağında Məhəmməd təkcə neyləyə bilərdi?! Dalı üzülməz selin qarşısında necə duruş gətirərdi?

Qaçmağa, bu vilayətdən uzaqlaşmağa üz qoydular. Dağlardan aşdılar, dərələri keçdilər, gəlib boz-bulanıq bir çayın qırağında gecələdilər. Fikirləşdilər ki, səhər açılar, işıq gözünə çayyuxarı-çayaşağı gedərlər, bir körpü, bir adlamac tapıb o taya keçərlər.

Çuğul həmin Zibeydə ilə Məhəmmədin bir-birinə qoşulub qaçdığını Səlim ağaya xəbər verdi. Ağanın qoşunu çöllərə, düzlərə səpələndi. Dağlar, dərələr hay-huyla doldu, daşdı. Nallı at ayaqlarının altından çıxan daşlar kar çöllərin qulaqlarında, ağ soyuq parıltısı zülmətdə şimşəklər kimi oynadı.

Zibeydə ilə Məhəmmədi tapdılar. Oğlanın əl-ayağını bağlayıb çaya atdılar. Qızı ata sarıdılar.

Zibeydə yedəkdəki atın üstündə yavaş-yavaş dartındı, qol-qılçasına sarınan xam kəndir uzandı, boşaldı. O, bu tilsimdən sivrilib ehtiyatla düşdü, yerdəcə qaldı. Dəstə uzaqlaşandan sonra baş götürüb ilim-ilim itdi.

Atlılar səhər gördülər ki, Zibeydə yoxdur, ha axtardılar, tapa bilmədilər.

Zibeydə yolda rast gəldiyi köçərilərə qoşuldu, heç bilmədi öz el-obası hayandadı. Tanınmalısı qalmamışdı. Köçərilərlə bir müddət gün keçirdikdən sonra bir dövlətliyə qaravaş oldu. Qazancını qəpik-qəpik yığdı, axtarıb həmin çayı tapdı, lap qoca vaxtında, başı gora titrəyəndə çayın üstündən bir körpü saldırdı. «Zülmdən, zalımdan qaçanlar qoy burda yaxalanmasınlar, - dedi, - qoy bu körpüdən keçsinlər, arzuları gözlərində qalmasın, diləkləri dillərində qurumasın…»

Həmin körpüyə o vaxtdan bəri «Qarı körpüsü» deyirlər.

### *174. Qızıl körpü*

Quşçu xanı bir qızla evlənmək istəyirdi. Qız hər dəfə bir bəhanə ilə elçiləri geri qaytarırdı. Bu da Quşçu xanına çox ağır gəlirdi. Axırda qız elçilərə dedi:

- Ürəyimdə bir həsrətim, arzum var, nə qədər ki, xan arzumu yerinə yetirməyib, bu sevda baş tutan deyil. Qohumlarımın yarısı Xram çayının bu tayında, yarısı da o tayında yaşayır. Xram çayını elə-belə keçmək olmur. Bir bədəni ikiyə bölüb bu çay. Əgər xan onun üstündən körpü saldırsa, həsrətlər bir-birinə qovuşsa, biz də o vaxt bir-birimizə qovuşa bilərik. Yox, əgər xan zor göstərsə, özümü çaya atacağam.

Elçilər məyus halda geri döndülər. Bu xəbər xanı da sevindirmədi. Amma düşünüb dedi:

- Çətin olsa da gec-tez Xramın üstündən körpü salınmalıdır.

Xan ölkəyə car çəkdirdi, neçə-neçə usta gəldi, bu çətin işi öhdəsinə götürən olmadı. Axırda bir usta gəlib «elərəm» dedi. Ona min nəfər köməkçi verdilər. Usta köməkçiləri ilə gecəni gündüzə qatdı. Çayın üstündən körpü salındı. Elat tamaşaya gəldi. Xan bir yanda, qız isə bir yanda durub bu əzəmətli körpüyə baxırdı. Körpünün üstündən ilk karvan keçməyə başladı. Qəfildən göz-lənilməz bir faciə baş verdi, körpü ortadan sındı, keçənlər çaya töküldü, karvan batdı.

Xan əmr edib ustanı çaya atdırdı.

Xan yenə qıza elçi göndərdi. Lakin qız inadından dönmədi. Xan çarəsiz qalıb yenə car çəkdirdi, usta axtardı. Adamlar arasından gənc bir oğlan çıxdı və dedi:

- Usta öz sənətini mənə əməlli-başlı öyrədib. Mən  körpünü tikərəm.

Gənc usta işə başladı, çayın içində və sahillərində daş sütunlar ucaltdı. Lakin bir səhər xəbər çatdı ki, gənc usta harasa qaçıb, yoxdur.

Çox axtardılar, gördüm deyən olmadı. Xan ustanı tapıb onun hüzuruna gətirənə yüz qızıl vəd etdi.

Lakin faydası olmadı, nə qədər axtardılar, cavan bənna tapılmadı.

Aradan yeddi il keçdi. Bir də gördülər ki, həmin usta gəlib yenidən işə başlayıb. Xana xəbər verdilər ki, usta özü gəlib çıxıb. Cavan ustanı iş başında görən xan soruşdu:

- İndi sənə cəza verim? Bu işi gecikdirdin, qara saçlarıma dən düşdü.

Gənc usta:

- Bil və agah ol, ey xan. Mən sənin aşiq olduğun qızın qardaşıyam. İndiyənəcən uzaq ellərdə bənnalıq eləyirdim. Kamil ustadım mənə kamil sənət öyrədib. Bacımsa mənə dedi ki, xanın qəzəbini tutdurmadan, ustalıqla onu başa salmaq lazımdır ki, məhəbbətdə tələsmək olmaz. Odur ki, mən körpünün təməlini qoyub aradan çıxdım. Bir evin ki binası möhkəm olmaya, oturub öz yerini tutmaya, o, zamanın sellərinə, sularına tab gətirməz, uçub dağılar. Məhəbbət aləmi də belədir. Çox tələsənlər axırda peşman olurlar.

İşi qurtardım, həm körpünün özülü, həm də sənin məhəbbətin sınaqdan çıxdı.

Gənc usta körpünü başa çatdırdı. Bu körpü neçə-neçə həsrətlini bir-birinə qovuşdurduğu kimi, Quşçu xanını da öz arzusuna çatdırdı.

Ellər o gündən bu körpünün adını «Qızıl körpü» («Məhəbbət körpüsü») qoydular. Ancaq el arasında o körpüyə «Sınıq körpü» də deyilir.

### *175. Qız qalası*

Sumu Sultan çox zülmkar imiş. Camaat onun özünə nifrət etsə də, gözəl qızını çox istəyirdi.

Qız hərdən külafirəngidə görünəndə elin qızı, gəlini onun tamaşasına çıxırdı. Qızın başındakı gülgəzi kəlağayını yel vurub yellətdikcə hamını heyrət götürür, çünki onlar ilk dəfə qız başında belə ipək, güllü kəlağayı görürdülər.

Günlərin birində Sumu Sultanın gözəl qızı ovçu oğlana qoşulub, Ağçay dağlarına qaçır. Oğlanla qız uca bir qayanın kahasında yaşayırlar. Onların bir qızı da olur.

İntiqam hissi ilə yaşayan Sumu Sultan oğlanı ələ keçirib, boğazından asdırır.

Oğlanın ölüm xəbəri qıza çatır. Qız beşiyi qoluna keçirib deyir:

***Oğlan qala, qız qala,***
***Qaya üstə qız qala.***
***Heç Allaha rəvadı,***
***Oğlan ölə, qız qala?***

Qız bayatını deyib, özünü qaladan atır.

## *176. Qız qala*

Qədim zamanlarda Balçılı dağlarında iki tayfa yaşayırmış. Bunlardan birinə talada yaşadıqları üçün talalılar, o birinə isə qalada yaşadıqları üçün qalalılar deyərmişlər. Bu qonşu tayfalar arasında torpaq, su üstündə tez-tez vuruşma olarmış. Talalılar çox, qalalılar isə az imişlər. Amma qalalılar çox cəngavər adamlarmış, həm də onlar uca qayaların zirvəsində məskən salıb-larmış.

Talalılara qoca bir kişi, qalalılara isə ox atmaqda mahir olan Ağca adlı cəsur bir qız başçılıq edirmiş.

Bir gün talalıların tayfa başçısının oğlu Ağcaya elçi göndərir.

Qız deyir:

-Sözüm yoxdu, amma bir şərtim var: tayfalarımız yola getmirlər, sudan da çox korluq çəkirik. Əkinimiz, biçinimiz az olur. Oğlan əgər məni sevirsə, Quşqaradan Quru Qobuya su arxı çəksin. Ora köçək, mən də onun olum.

Xəbəri oğlana çatdırırlar. O, razı olur. Quşqaradan Quru Qobuya su arxı çəkir. Oğlan çarəsiz qalıb, arx boyu şüşə düzür. Gün vuranda şüşə su kimi bərq vurur.

Bundan sonra oğlan Ağcanın yanına gəlib deyir:

- Suyu Quru Qobuya çıxartdım. Gör, arxda su necə işıldayır?

Qız diqqətlə baxıb deyir:

- Arxla su axmır, ora şüşə düzülüb, su kimi parıldayan da odur.

Oğlan kor-peşman atasının yanına gəlir və əhvalatı ona danışır. Qoca deyir:

- Qala çayının qırağına gözətçi qoyun, Ağca suya gələndə götürüb qaçın.

Ağca da talalıların hiyləyə əl atacaqlarını başa düşür. Elə həmin gündən suya getmir. Səhəngi uzun hörüklərinə bağlayır, Qala çayına sallayıb su götürür.

Sən demə, Ağcanı öz tayfalarından Qaya adlı kasıb bir oğlan da sevirmiş, amma qəlbindəkini aça bilmirmiş. Ağcanı qoşa hörükləri ilə su götürən görəndə ürəyi ağrıyır. Qaya gündüzlər yatır, gecələr Sarı bulaqdan qalaya, yerin altı ilə, gizlicə su arxı çəkir.

Sakitlik çox sürmür. Talalılarla qalalılar arasında vuruş başlanmalı olur.

Talalıların ağsaqqalı deyir:

- Qalalılara bir içim də su vermək lazım deyil. Ağca səhənglə su götürəndə onun qoşa hörüklərini kəsin!

Bunu bilən Qaya utana-utana Ağcanın yanına gəlib deyir:

- Talalılar pusqudadırlar. Su götürəndə sənin hörüklərini kəsəcəklər.

Xəbər Ağcanı sarsıdır, çox məyus olur, deyir:

- Bəs nə edim?

Qaya deyir:

- Mən qalaya su arxı çəkmişəm. Gündüzlər yatmışam, gecələr işləmişəm.

Ağca sevinir. O, Qayanı bərk-bərk bağrına basıb deyir:

- Sən mənim xilaskarım, gözlərimin işığısan.

Qayanın gözlərində bəxtiyarlıq çağlayır.

Ağca deyir:

- Talalılar hücüma hazırlaşır, gəl, biz onları qabaqlayaq. Atalar havayı deməyib ki, «vaxt bir

quşdur, onu unudan bihuşdur». Gecə yarı at ilxısını talalılara tərəf ötür. Elə biləcəklər ki, biz vuruşa başladıq. Yuxulu-yuxulu bir-birini qıracaqlar.

Belə də olur. Bir tərəfdən də Ağca talalıları səhərəcən oxa tutur. Talada qan su yerinə axır.

Çarpışmada qalalılar da az zərər çəkmir. Atışmada Qaya ölür. Ağca onu öz qızıl yəhəri ilə birlikdə qalanın başında dəfn edir.

Ağca qalanın gah bu, gah da o bürcünə qaçıb, ox atır ki, tək olduğu bilinməsin.

Ağcanın oxundan təngə gələn tala ağsaqqalları bir yerə yığılıb məsləhətləşir, deyirlər:

-Qalada susuz qalmaq olmaz. Yəqin haradansa yerin altı ilə qalaya su gəlir.

Bir qocanın tədbiri ilə quru arpa yemiş susuz qatırı qalanın dövrəsində gəzdirirlər. Ağca görür qatır Sarı bulaq tərəfə gedir. Anlayır ki, talalılar suyu tapacaqlar. Fürsət tapır, qaladan çıxıb qaçır.

Talalılar qatırın köməyi ilə su tüngünü tapıb dağıdırlar. Daha qalaya su gəlmir. Onlar bir neçə gün gözləyirlər. Görürlər ki, Ağca qaladan bir yana çıxmır, onda qalaya hücum edirlər. İçəri girəndə görürlər ki, Ağca yoxdur. Tayfa başçısı olan qoca:

-Tayfam qırıldı, oğlum öldü. Tala oldu qanlı tala, dağılmadı dağda qala, -deyib canını tapşırır. O gündən həmin yerin adı Axarca qalır.

### *177. Qız qala - Namərd qala*

Nəmrud və Əmir adlı iki qardaş var imiş. Qardaşlar bir gün ova çıxırlar. «Dağyanus təpəsi»nə çatanda Nəmrud kiçik qardaşı Əmirə deyir:

- Bərk yoruldum, bir az dincələk.

O, başını köhnə bir qəbir daşının üstə qoyub yuxuya gedir.

Əmir görür ki, ağ bir quş uçub gəldi, Nəmrudun başına qondu, sonra da qalxdı, bir ağ daşın üstə qanad çalıb oxumağa başladı. Elə bu vaxt Nəmrud yuxudan ayılıb qardaşına deyir:

- Yuxuda gördüm başıma bir ağ quş qondu, sonra başımdan uçub bir ağ daşın üstünə düşdü. Quş mənə dedi ki, mən bir qara daşın üstə qonacağam, dur məni qonduğum daşdan qov, bax, onun altında xəzinə var.

Əmir hiylə ilə deyir:

- Yat, qardaş, yat! Həmişə yuxunu tərsinə yozarlar.

Nəmrud özünü yuxuluğa vurur. Əmir yerindən qalxıb, ağ daşın üstünə qonmuş ağ quşu uçurur, quş bir qara daşın üstünə qonur. Əmir daşı qaldırıb görür ki, burada böyük bir xəzinə var. O, xəzinəni çıxarmağa başlayır. Nəmrud yerindən durub qardaşının yanına gəlir: «Gəl, yarı bölək», -deyir. Əmir buna razı olmur.

Nəmrud deyir:

- İndi ki, belə oldu, xəzinədən, atamızdan qalan var-dövlətdən əl çəkirəm, qardaşlıqdan da çıxıram. Sən qal, Şəmkirin bu tayında, mən keçirəm o taya. Ölər günəcən bir-birimizi axtarmayaq, daha biz qardaş deyilik. Əmir, var-dövlət sənin olsun .

Şəmkiri o üzə keçən Nəmrud əvvəl bir bənnaya şagird olub sənət öyrənir. Az vaxt içində bacarıqlı usta kimi ad-san qazanır, şöhrəti hər yana yayılır.

Aylar, illər ötür. Qardaşlar ayrıca güzəran keçirirlər, hər ikisi ailə qurur. Vaxt gəlir Əmirin oğlu, Nəm-rudun qızı olur. Oğlu böyüyəndən sonra Əmir

qardaşı ilə aralarında baş vermiş əhvalatı ona danışır; hündür bir qayanın başına çıxıb, Şəmkirin o tayında tək-tənha yaşa-yan əmisinin evini də nişan verir.

Oğlan əmisini görmək arzusuna düşür.

Bir gün oğlan fürsət tapıb Şəmkirin o tayına keçir. Görür gözəl bir qız qoyun otarır. Oğlan deyir:

- Niyə sən qoyun otarırsan?

- Qardaşım yoxdur, mən atamın təkcə balasıyam.

- Kimin qızısan?

- Usta Nəmrudun.

- Mən də Əmirin oğluyam.

Qız diksinir, soruşur:

- Deməli sən mənim əmim oğlusan:

Oğlan:

- Bəli! –deyə cavab verir.

Hər ikisi göy çəmənlikdə oturub atalarının heka-yətini bir-birinə danışırlar. Axşamacan bir yerdə qalırlar. Şər qarışanda ayrılırlar. Oğlan deyir:

- Əmiqızı, məni unutma!

Qız da həmin sözləri təkrarlayır:

- Əmioğlu, məni unutma!

Bundan sonra oğlanla qız tez-tez Güllü təpədə görüşür. Qızın anası məsələni bilən kimi Nəmruda da-nışır. Nəmrud deyir:

- İki dünya bir olsa, mənimki Əmirlə tutmaz.

Usta Nəmrud böyük zəhmətlə bir qala tikib, qızını orada saxlayır ki, Əmirin oğlu qızıyla görüşə bilməsin. Buna ürəyi qızmır, özü də qalanı gözətləyir. Qar ya-ğandan sonra arxayın olur ki, qalanın bircə yolu var, onu da mən bilirəm, bir də qızım. Qız da ki, qaladan heç ya-na çıxmır.

Qız oğlana xəbər çatdırır ki, iki atın ayağını tərs nalladıb qalanın səmtində dayansın. Oğlanla qız atlara minib Əmirvara gəlirlər.

Nəmrud qalaya girəndə qızını görmür. Axtarmağa başlayır. Bayıra çıxanda atların izinə düşür. Atlar tərsinə nallandığı üçün qoca ha axtarırsa, da tapa bilmir. Usta Nəmrud külüngünün ucu ilə qalaya bu sözləri yazır:

«Qız qala-Namərd qala».

## *178. Qız qalası*

Vaxtilə Yanar dağın ətəyində Human şəhəri yerləşirdi. Şəhərin padşahı nə iş görsə Surə adlı qızı ilə məsləhətləşərmiş. Hər yerdə olduğu kimi onların vila-yətində də qərib adamlar varmış. Onlar uzaq yerlərdən qaçıb burada sığınacaq tapmışdılar. Qəriblərin qəribə taleyi şah qızını çox düşündürür, onlara qəlbən acı-yarmış. Qız daim atasına qəribləri incitməməyi tap-şırarmış:

- Ata, qərib, kimsəsiz adamlara həmişə hörmət elə. Padşahın ədaləti saray əyanlarının yalançı tərifləri ilə deyil, qəriblərin, kasıb-kusubun razılığı ilə ölçülür.

- Qızım, sən qəriblərə nə yaman məftun olursan?

- Ata, qəriblər haqsızlıqla barışmayan, ona etiraz edən adamlardır. Onlar çox gəzir, çox görür, çox bilirlər. Bişmiş adam olurlar, ağı qaradan, yaxşını pisdən bacarıqla seçirlər.

- Bunlar düzdür, qızım! Ancaq qəriblərin vətəni olmur, onlara inanmaq olmaz.

Bir dəfə qəriblərdən biri gəzməyə çıxan qızları görür, onların başında kəklik kimi səkən şah qızına vurulur. Qız da ona könül bağlayır. Oğlan padşaha elçiliyə gəlir. Padşah qızını danışdıran kimi işin nə yerdə olduğuna bələd olur:

- Bilirəm ürəyin var. Ancaq qəribə inanmıram.

Qız atasından qabağa düşür:

- Onda sınağa çək. Məgər qəribin ürəyi, istedadı, igidliyi olmur?

Padşah məsləhətə yatır. Oğlana qızı üçün bir qala tikdirəcəyini şərt qoyur. Qərib aşiq razılaşır. Xeyli keçəndən sonra qala hazır olur. Lakin qərib sınaqdan çıxsa da, padşah sözündən qaçır. O, kimsəsiz, var-dövlətsiz bir adama qız verməyi şan-şöhrətinə sığışdırmır. Padşahın dönüklüyünü görən qərib elə bir yanıqlı ah çəkir ki, Human şəhəri yerlə yeksan olur. Amma şahın qızı qırx qızla salamat qalır. Qərib qızla evlənir.

### *179. Qız qalası*

Keçmişdə adilliyi ilə deyil, qatilliyi ilə «şöhrət» tapan bir padşah vardı. Bu zalım hökmdarın ağ buxaqlı, gül yanaqlı, incə belli, pəhləvan qüvvəli bircə qızı var idi. Həddi-buluğa çatmış qıza hər tərəfdən adlı-sanlı, varlı-dövlətli, şanlı-şöhrətli elçilər gəlirdi. Lakin qız hamısını geri qaytarır. Çünki o şərt kəsmişdi: kim güləş meydanında ona güc gəlsə, ona gedəcək. Şərti qəbul edən neçə-neçə pəhləvan-aşiq elçi daşının üstündə otu-rur rüsxət almış, meydan sulamış pəhləvanlarla güləş-mişdi, ancaq ona üstün gələn olmamışdı.

Bir gün hökmdar qızına dedi:

- Qızım, axı belə olmaz. Necə oldu ki, bu qədər oğlanlardan birini bəyənmədin. Axı, mən də kürəkənlə öyünmək istəyirəm.

Qız atasına belə cavab verdi:

- Ata, şərt bağlandıqdan sonra müqəddəsləşər. Onu pozmaq kişilikdən deyil.

- Axı, sən kişi deyilsən…

- Mən pozmuram ki, kişilər heç pozmasın.

Hökmdarın ağacların dilini gözəl bilən bir bağbanı var idi. Gözünün ağı-qarası bircə oğlu atasının yeganə köməkçisi idi. Oğlan hökmdar qızına bənd olmuşdu. Onlar bir dəfə qarşılaşmışdılar. Qız sayılmaz bağban oğlunun baxışından yerişini itirmişdi. Hökmdar qızının məhəbbətinə tab gətirməyən oğlan dərdini atasına açır.

Atası:

- Sənin ona gücün çatmaz, oğul, bizi el gülüncü eləmə.

Oğlan:

- Ata, mən onsuz yaşaya bilmirəm. Mənim məhəbbətim onun ürəyinə düşsə, hökmən qolları boşalacaq, ağlı ürəyinə tabe olacaq.

Ata oğluna xeyir-dua verib hökmdar qızının meydanına yola saldı.

Beləliklə, elçi daşı yeni aşiqin sifarişi ilə adamları meydana çağırır. Başda padşah olmaqla bütün saray adamları tamaşaya yığışır. Hökmdar qızı bağban oğlu ilə qarşılaşmalı olur. Nə qədər ki, onlar bir-birinin gözlərinə baxmır. Qız onu ora-bura çırpıb əldən salır. Elə ki, baxışlar qarşılaşır, sanki pəhləvan qızın ürəyinə od tökülür. Sirli bir xülya onu uzaqlara səsləyir. Hara baxırsa, bağban oğlunu görür, qolları boşalır, ona təslim olur.

Bağban oğlu güləşə tamaşa edən hökmdara deyir:

- Qalib gəldim, hökmdar, şərtə əməl edək.

Qız razı olduğunu bildirir. Hökmdar isə bərk pərt olur. Bu nə deməkdir? Zavallı, çılpaq, aciz bir bağban oğlu onun kürəkəni olmaq istəyir? Hökmdar qızını öldürər, ancaq bu sevdaya razı olmaz. Hökmdar şərti pozmaqdan çəkinərək hiyləyə əl atır. Oğlanı gedər-gəlməzə göndərməyi qərara alır:

- Filan şəhərdə uçan xalça var, onu mənə gətir, qızımı apar.

Oğlan razı olur. Bu iş üçün yeddi il möhlət istəyir. O, yola düşdükdən sonra qıza çox yerdən elçi gəlir. Atası nə qədər edirsə, qızı əhdindən dönmür. Axırda naəlac qalan qız elçilərdən canını qurtarmaq üçün imarətdən kənarda, şəhərin girəcəyində hündür bir qala tikdirir. Qala hazır olduqdan sonra qız öz kənizləri ilə oraya köçür.

Yeddi il tamam olur. Oğlan axırıncı gün gəlib çıxır. Qız bunu eşidib çox şad olur. Atası isə bağban oğlunu özünə kürəkən etməyə heç cür rəva bilmir, oğlanı başqa bir şey gətirmək adı ilə başqa bir çətin səfərə göndərmək istəyir. Lakin oğlan bu dəfə bunun kələyini başa düşür, qızın imarətinə yaxınlaşır. İşi belə görən hökmdar öz adamlarına əmr edir ki, oğlanı tutub öldürsünlər.

Oğlan qalaya çatanda görür ki, qız imarətdən ona baxır. Oğlan içəri girmək istəyir. Ancaq bu vaxt namərd oxu oğlanın ürəyini deşir. O, yıxılıb ölür. Bunu yuxa-rıdan görən qız özünü imarətdən oğlanın üstünə atır. O, da oğlanla birlikdə ölür. Zalım hökmdar sonra çox peşman olur.

O vaxtdan xalq möhtəşəm binanı «Qız qalası» adlandırır.

## *180. Qız qalası*

Qədim əfsanələrə görə, iki qardaş var imiş. Bu qardaşlardan biri şah, o birisi isə kasıb bir kəndli imiş. Şah qardaşın qızı, kasıb qardaşın isə oğlu var imiş. Şah qızı o qədər gözəl imiş ki, onun gözəlliyi bir çox igidləri heyran qoyurmuş. Yoxsul qardaşın da oğlu igid bir cavan imiş. Hətta əmisinin üstünə basqın edən işğalçılara həmişə qalib gələrmiş. Cəngavər oğlan bütün bunları əmisinin qızını sevdiyi üçün yox, ancaq vətəni müdafiə naminə eləyirmiş. Günlər keçdikcə oğlanın əmisi qızına olan məhəbbəti alovlanır. Qız da bu işə razılıq verir. İgid cəngavər qıza bildirir ki, bu məsələ atama çatdırılsın. Razı olar, olar, olmazsa qaçarıq. Oğlan bunu atasına söyləyir. Atası bu işin baş tutmayacağını bildirir. Oğlan isə deyir: «Öldü var, döndü yoxdur». Naəlac qalan ata məsələni qardaşına söyləyir. Qardaşı isə acıqlanıb deyir ki, sənin oğlun mənim qızıma tay ola bilməz. Şah qızının gözəlliyi qonşu padşahlara da çatmışdı. Odur ki, Göy-bənd şahı qıza elçi gəlir. Şah buna razılıq verir. Toyun tezliklə olacağını bildirir. İşi bu yerdə görən şah qızı oğlana deyir ki, axşamdan mən iki at hazırlayacam. Tez gələrsən.

Bəli, şah qızı atasının qiymətli daş-qaşlarından götürüb oğlanla bərabər qaçır. Qız oğlana bildirir ki, biz elə yerə getməliyik ki, onlar bizi tapa bilməsinlər. Sonra gəlib böyük bir dağın başına çıxırlar. Bu dağa çıxmaq o qədər də asan deyildi. Buranın ancaq bir yolu vardı. Qız oğlana bildirir ki, mən burda yaxşı bir qala tikdirəcəyəm. Oğlan da razı olur. Oğlan tez bir

zamanda usta tapıb gətirir. Qız əvvəlcədən ustaların xərcini ikiqat verir və deyir ki, bu qala elə bir qala olmalıdır ki, bu qalaya ancaq bir yolla çıxmaq mümkün olsun. Onu da deyir ki, gərək palçığın suyu ancaq yumurta sarısından olsun. Bəli, qala hazır olur. Qalanın qalınlığı bir metrə yaxındır. İndi isə qız ustalara bildirir ki, yaxınlıqdakı Soltan Heydər adlanan dağdan su çəkilməlidir. Ancaq bu su yerin altı ilə gəlməlidir. Şah qızının bu işi də düzəlir. Şah qızı hətta özünə qoşun toplayır və onları qalanın yaxınlığında yerləşdirir (hazırda həmin yerə «Qala kəndi» deyilir). Qalanın şöhrəti gedib qızın atasına da çatır. Odur ki, atası böyük bir qoşunla Göybənd düzünə gəlir. Həmçinin Göybənd şahı və onun adamları nə qədər çalışırlarsa qalaya çıxa bilmirlər. Odur ki, qalanı oxa basırlar. Bunun əvəzində padşah qızının adamları da cavab oxu qaytarır. İşi bu yerdə görən qoşun geri dönmək istəyir.

Bu zaman hiyləgər bir qarı onları başa salır ki, qalaya gedən suyu kəssəniz onlar təslim olarlar. Şah isə qoşunu ilə bərabər nə qədər axtarırsa qalaya gedən suyu tapa bilmir. Qarı bunların naşı olduğunu görüb deyir ki, siz bir qatır tapın və həmin qatırı qırx gün susuz saxlayın. Sonra da gecə ikən aparıb qalanın ətrafında hərləyin qatır haranı ayaqları ilə döysə bilin ki, qalaya su ordan gedir. Belə də eləyirlər. Qatır qaladan iki kilometr aralı bir yerdə dırnağı ilə yeri eşməyə başlayır. Şah əmr edir ki, həmin yeri qazsınlar. Görürlər ki, su buradan saxsı nohurla axır. Saxsı nohuru sındırıb suyu kəsirlər. Ancaq qala təslim olmur. Sonradan oğlan qaladan xəbər göndərir ki, nahaq yerə qoşunu qırdırmayın. Şah, əgər igidsənsə gəl təkbətək vuruşaq. Kim qalib gəlsə qız onundur. Göybənd şahı

hiylə yolu ilə razı olur. Oğlan yavaş-yavaş qaladan çıxıb düzə gəlir. Vuruş başlanır. Birinci həmlədə oğlan qələbə çalır. İkinci vuruş başlananda arxadan oğlanı vururlar. Oğlan arxaya çevrilərkən əlində qanlı qılınc tutmuş əmisini görür və yıxılır. Bütün bunları qaladan görən qız həmin dəqiqə qılıncı ürəyinə sancır. Qoşun sevinə-sevinə qalaya yaxınlaşır. Şah ürək eləmir içəri girsin. Sonradan özünü toplayıb qalaya girir və öz doğma qızını qan içərisində görür. Göybənd şahı təklif edir ki, qalanı uçursunlar. Lakin şah buna razı olmur. Şah deyir:

- Qızımı itirdim, barı qoy onun yadigarı olan «Qız qalası» yaşasın.

### *181. Lənkəran qalası*

Lənkəran torpağı düşmən hücumuna məruz qalmışdı. Xan itkilərin səbəbini torpağa sevginin, elliklə müdafiə işinin aşağı olmasında görürdü. Əhalini çağırıb məsləhətləşdi və qərara gəldi ki, alınmaz bir qala tikdirsin. Uzaq ellərdən adlı-sanlı ustalar çağırdı.

Xan ustalara tapşırdı ki, işə sübh tezdən başlasınlar və bu yerdən kim birinci keçsə onu qalanın himinə, özülünə hörsünlər. Xan deyilən vaxtda oğlanlarından birini qala tikilən yerə göndərdi. Lakin qapının iti də onunla gedəsi oldu. Ustalar xanın oğlunu tanıdılar, ölümünə qıymayıb onu buraxdılar. Əvəzində iti tutub saxladılar. Bu vaxt xan atla çaparaq gəldi və vəziyyəti soruşdu:

- İlk gələn adamı divara hördünüzmü?

Ustalar cavab verdilər:

- Xan sağ olsun, ilk gələn cavan sizin oğlunuz idi. Sizə görə onu buraxdıq. Lakin onunla gələn iti tutub saxladıq.

Xan dedi:

- İti buraxın. Binasına it basdırılmış qalanı heç kəs qorumaz. Mən oğlumu göndərdim ki, onu qalaya hörəsiniz. Xalq mənimlə birlikdə təkcə qalanı yox, həm də oğlumu qorusun. O, uzaq başı yüz il yaşaya bilərdi. Bu qala isə əsrlər boyu qalacaq. Mənim oğlum da bu qala qədər ömür qazanacaq. Yadda saxlayın ki, əzizini, oğlunu itirən bir il ağlar, Vətənini itirən ömrü boyu.

### *182. Cavanşir qalası*

Azərbaycan xalqının qəhrəman oğlu Cavanşirin adını daşıyan qalanın həyətində heç yanda tapılmayan nadir güllər və bəzək ağacları bitir.

Rəvayət edirlər ki, Cavanşirin qızları ağac, gül və çiçək dibçəklərini həyətə – açıq havaya çıxarıblarmış. Onlar gülləri götürüb evə gətirmək istəyəndə birdən atalarının ölüm xəbərini eşidirlər. Dibçəklər əllərindən düşüb sınır. Güllər, çiçəklər və bəzək ağacları yerə dağılır.

Deyirlər Cavanşir qalasının həyətində bitən nadir bəzək ağacları və gül-çiçəklər qəhrəmanın qızlarından qalmış yadigarlardır.

### *183. Dədəm qorxdu*

Dədə Qorqudu Əzrayıl qovurmuş. Dədə Qorqud qaça-qaça gəlib görür ki, uşaqlar bir gölün qırağında «Palçıqatdı» oynayırlar. Dədə Qorqud gözdən yayınıb uşaqların arasına girir ki, gizlənsin. Baxır ki, yox, budur, Əzrayıl onu uzaqdan görüb düz üstünə gəlir, Dədə Qorqud uşaqların arasından çıxıb qaçmağa başlayır. Uşaqlar elə bilir ki, Dədə Qorqud «Palçıqatma»dan qorxub qaçır. Bilmirlər ki, Əzrayıl onu çağırıb deyir:

-Ay qarabaldır, hara qaçırsan?

Uşaqlar özləri də bilmədən ulu babamızın iki adını üç edirlər: Dədə Qorqud, Dədəm Qorqud, Dədəm Qorxdu…

### *184. Xornaçı*

Xornaçı adlı azman bir adam olur. Onun da Qazan köşkü deyilən mahalda özü kimi nəhəng bacısı yaşayır. Azmanın adı ona görə Xornaçıymış ki, axşam yatanda xorultusunun səsi bacısına çatırmış. Bacısı da bu heybətli səsin vasitəsilə bilirmiş ki, qardaşı sağ-salamatdır.

Xornaçının iştahı işindən yeddi dəfə artıq imiş. Ona qazan-qazan isti xörəklər hazırlamaqdan, iş yerinə daşımaqdan bacısı cana yığılıbmış. Bacısı bu əzabdan qurtulmaq üçün onu evləndirmək istəyir. Ancaq heç kim Xornaçıya qız vermir. Bacısı

qardaşının taleyinə fal açdırır. Falçı buyurur ki, əgər Xornaçı yeddi torpaq təpə düzəldə bilsə, onun bəxti açılacaq. Xornaçı Mil düzündə torpaq təpələr düzəltmək üçün işə başlayır. Qolunun gücünə eldən-obadan cavan oğlanları yığıb pulsuz, muzdsuz özü üçün işlədir. Aylar keçir. Xornaçı bir ucdan özünə təzə köməkçilər axtarır. Bir gün Xornaçı Qazan köşkündə təzəcə evlənmiş bir oğlanı sevgilisindən ayırıb Mil düzünə təpə düzəltməyə aparır. Hamilə qalmış arvadı bir oğlan uşağı doğur. Uşaq böyüyüb on beş yaşına çatır, bir gün anasından soruşur:

- Mənim atam kimdi. Hardadı?

Anası deyir:

- Atanı Xornaçı aparıb, on beş ildi ki, Mil düzündə torpaq təpələrdə işlədir.

Oğlan deyir:

- Mən atamı azad eləməyə gedəcəm.

Anası deyir:

- Oğul, sənin ona gücün çatmaz. Bu dünyada çoxları Xornaçının əlində zəbun olub.

Oğlan sözündən dönmür. Yaraqlanıb atasını axtarmağa gedir. Gəlib görür ki, Mil düzündə adam yığnağı var. Kimi arx qazır, kimi torba ilə torpaq daşıyır, kimi də torpaq təpələr düzəldir. Oğlan soraqlaşa-soraqlaşa atasını tapır. Görür ki, atasının üzünü-başını tük basıb, yaman gündədir.

Oğlan deyir:

- Ata, nə üçün bu on beş ildə bircə dəfə olsun evimizə gəlməmisən?

Atası deyir:

- Oğul, Xornaçının qorxusundan təkcə mən yox, bütün bu gördüyün saysız-hesabsız adamlar

heç yana tərpənə bilmir, hamı öz canı üçün qorxur. Xornaçı çox güclüdür, zalımdır.

Oğlan deyir:

- Xornaçı hanı?

Atası əli ilə göstərib deyir:

- Odur, Xornaçı su arxının yanında yatıb. Eşitdiyin xorultu da onunkudur. İkinci gündür ki, yatır. Hər yatanda yeddi gün çəkir.

Oğlan ətrafındakı adamları yanına çağırıb deyir:

- Hamınız əlinizdəki torbanı torpaqla doldurub yanıma gəlin.

Hamı torbasını torpaqla doldurub hazır olur.

Oğlan deyir:

- Hamı birdən torbadakı torpağı Xornaçının üstünə töksün.

Elə də eləyirlər. Xornaçı altı torpaq təpəsi yaratmışdı. Yeddinci isə Xornaçının öz üstündə yaranır. Hamı dağılışıb sevinə-sevinə öz evinə dönür. Ata ilə oğul da Qazan köşkünə qayıdır.

Xornaçının bacısı görür ki, qardaşının xorultusu kəsildi. Anlayır ki, qardaşının başında bir qəza var. Dərhal Mil düzünə yola düşür. Gəlib görür ki, burda yeddi təpə var. Bilir ki, nə varsa, bu torpaq təpələrdədir. Uzun qolları ilə təpələri bir-bir qucaqlayır, əllərini iki tərəfdən salıb torpağı göyə sovurur. Yeddinci təpənin altında qardaşının meyidini tapır. Bacı deyir:

-Zülmlə xoşbəxtlik qazanmaq olmazmış.

### *185. Uzun qız*

Əsirlərin azad edilməsi Qazan köşkünə sevinc gətirir. Hamı cavan Körpəşi Oğuz ellərinin qəhrəmanı kimi alqışlayır. Lakin bu sevinc uzun sürmür. Hamısının ürəyində bir qorxu gəzir. El ağsaqqalı bildirir ki, Xornaçının bacısı Uzunqız Mil düzünə qardaşının arxasınca gedib, qayıdan kimi Qazan köşkünü bir-birinə qatacaq. Heç olmasa Körpəşin əsir dəstəsini Qarabağ tərəfə uzaqlaşdırın.

İnsan axını Ağdamın indiki Çullu kəndinə tərəf üz tutur. Bir də görürlər ki, Uzunqız torpağı əlləri ilə sovura-sovura gəlir. Körpəş deyir:

- Hərə yerdən bir daş götürüb, Uzunqıza atsın.

Atası deyir:

- Oğul, ağlın Xornaçıya getməsin, yatmış ola, sən də üstündə torpaq dağı yaratdırasan. O, azman oyaq olsaydı, yüz belə insan dəstəsi ona güc gələ bilməzdi. Bacısı da ondan geri qalmaz. Mənim bircə arzum var. Nə ola, Oxçu oğlu həndəvərdə ola. Bu ağır vəziyyətdən xəbər tuta. Uzunqızı sənin daşınla bahəm, Oxçu oğlunun oxu yıxa bilər.

Uzunqız da elə Oxçu oğlundan qorxurdu. Birdən qarşı təpənin başında Oxçu oğlu göründü. Ox dolu kimi yağmağa başladı. Uzunqız yaralandı. Bir dəli nərə çəkib özünü adamların arasına vurdu. Əli kimə çatırdısa başını üzürdü. Qardaşının qatili Körpəşdən intiqam almaq hissi ilə alışıb yanırdı. Körpəş də fürsəti fövtə vermirdi. Ucadan hayqırdı: «Hərə bir daş götürüb Uzunqıza at-sın!». Oxçu oğlunun oxlarından xeyli qan itirən Uzunqız zəifləmişdi. Bu tərəfdən də daşlar dolu kimi onun üstünə yağmağa başladı. Uzunqızın üstündə daşdan dağ yarandı.

O vaxtdan bəri bu səmtdən gəlib-gedən adamlar daş qalağının üstünə yenə də daş atırlar.

Çünki Uzunqız da qardaşı Xornaçı kimi çoxlarına zülm etmişdi. Həmin daşlıq hazırda «Uzunqız», yaxud da «Uzunqızın qəbri» adlanır.

### *186. Dədə Qorqud və Salmani-fars*

Salmani-fars Məhəmməd peyğəmbərin dostu idi. Ölkədə ən mühüm xəbərləri Salmani-farsın vasitəsi ilə Məhəmmədə xəbər verirdilər. Qorqud adlı bir ozan camaat arasında Quranın ayələrini nəzmə çəkib qopuzda oxuyur. Salmani-fars bu xəbərdən narahat oldu: «Kimin hünəri var ki, Allahın vəhylərinin, peyğəmbərin kəlam-larının şəklini dəyişsin?!». O, Qorqudu əlində qopuz Məhəmmədin yanına gətirir və peyğəmbərə bildirir ki, Quranı nəzmə çəkib qopuzda oxuyan bu adamdı.

Məhəmməd deyir:

- Ona toxunmaq olmaz. Dədə ozanın özü də, sözü də, niyyəti də müqəddəsdi. O, Allaha, onun peyğəm-bərinə və İslam dininə kömək eləyir. Oba-oba gəzib «İslam»ı yayır. Xalq ona qulaq asır, xalq ona inanır. Hər nə cür desə İslamın şərəfinə deyir. Dədə ozanın əməli ancaq tərifə layiqdir.

### *187. Qızıl bellə qazılan qəbir*

Dədə Qorqudu şirnikdirməkdən ötrü qızıldan bel, külüng düzəldirlər. Qorqud onlara yaxınlaşır. Adamlar tez qəbiristanlığa girib, qəbir qazmağa başlayırlar. Qorqud bu işə maraq göstərir və təəccüblə soruşur:

-Bu kimin qəbridir ki, qızıl bellə, külünglə qazırsınız?

-Qorqud, o böyük adamdır.

Bəs qəbri qazandan sonra bu qızıl beli, külüngü kimə verəcəksiniz?

-Heç kəsə, bu hörmətli insanın məzarı üstünə qoyub gedəcəyik.

Qorqud ayaq saxlayıb qəbrin qazılmasını gözləyir. Qəbir hazır olur. Qəbir qazanlardan biri deyir:

-Vay, yadımızdan çıxıb ölünün boyunu qamışla ölçüb gətirməmişik.

Qəbir qazanlardan biri dillənir:

-Bax, onun boyu, bu insan boyda olar, əlini Qorquda uzadır və ondan xahiş edir ki, bircə dəqiqəliyinə qəbrə uzansın ölçüsünü götürək. Qorqud təzə qazılmış qəbrə uzanır, boyuna tamam düz gəlir. Ona deyirlər:

-Qorqud, bu qızıl bel-külünglə qazılan qəbir sənindir, rahat uyu. Üstünü torpaqlayırlar.

# Nizami mövzuları ilə səsləşən əfsanələr

### *188. Nizami və Gəncə əmiri*

Rəvayətə görə, bir gün Nizami ilə Gəncə Əmiri ova çıxırlar. Çox gəzib dolaşdıqdan sonra gəlib bir xarabalığa çatırlar. Onlar burada üç quru kəlləyə rast gəlirlər. Əmir kəlləyə baxıb dərin düşüncələrə dalır, nəhayət, çevrilib Nizamiyə deyir:

- Nizami, əgər sən həqiqətən söz qoşununun sərkərdəsi, ariflər məclisinin bəzəyi, şahların xeyirxah məsləhətçisi, sirlərin açarı Nizamisənsə, bu kəllə sahiblərinin necə adamlar olduğunu bəyan elə.

Nizami xeyli fikirləşdikdən sonra yerdən bir çubuq götürüb kəllələrdən birisinə yaxınlaşır: o, çubuğu kəllənin bir qulağına toxunduran kimi, çubuq sürüşüb kəllənin o biri qulağından çıxır. Sonra ikinci kəlləyə yaxınlaşıb çubuğu qulağına tıxamağa çalışır. Lakin içəri daxil ola bilmir, elə bil daşa dirənir. Növbə üçüncü kəlləyə gəlir. Nizami bayaqkı hərəkətlərini təkrar edir. Kəllə çubuğu qəbul edir, amma buraxmır. Hər şey şairə aydın olur. Üzünü Əmirə tutub, kəllə sahiblərinin necə adamlar olduğunu izah edir:

- Əmir sağ olsun, çubuq birinci kəllənin bu qulağından girib dərhal o biri qulağından çıxdı. O kəllə sahibi ömür boyu gördüklərini, eşitdiklərini bu qulağından alıb, o biri qulağından ötürüb. Deməli, bu kəllə sahibi dünyadan bixəbər köçüb. Gördüyünüz kimi, ikinci kəllənin gen qulağına nə qədər çalışdımsa bu nazik çubuq girmədi. Bunun beyninə söz girməyib. Bir quru daş parçası kimi atılıb, bir küncdə qalıb. Bax, qibleyi-aləm, üçüncü kəllə adamı heyrətə gətirir. İlk nəzərdən o saat aqil adamın kəlləsinə oxşayır. Çubuğu tutub saxlayan bu kəllədə həyatın bütün keşməkeşləri iz salıb, həkk olunub.

Nizaminin həkimanə hərəkətlərini diqqətlə izləyən Əmir mahir sənətkarın təffəkürünə bir daha heyran olur.

### *189. Əsir padşah*

Bir ölkənin hökmdarı başqa birisinə hücum edib, oranı alır. Qaliblər xəzinəni tapa bilmirlər. Məğlub padşah isə əsir ola-ola qalib hökmdarla çox ürəkli, hökmlü danışırmış. Qalib hökmdarın ağıllı bir

vəziri varmış. Hökmdar vəziyyəti vəzirə danışanda, ağıllı vəzir məğlub padşaha çox fikir verir və öz hökmdarına deyir:

- Qibleyi-aləm, sabah onu dindirəndə, əmr elə durduğu yeri dəyişsin. Məncə onun ayağının altında xəzinə var, ona görə belə cürətli danışır.

Belə də edirlər. Bu dəfə məğlub hökmdar elə məğlub kimi də danışır. Yazıq, məzlum əsir görkəmi alır.

Padşahın əmri və vəzirin məsləhətilə məğlub hökmdarın əvvəl durduğu yeri qazıb, onun xəzinəsini tapırlar.

## *190. Şah və Qarı*

Şahın vəkili gedib-gəlib bir qarıdan vergi istəyirdi. Qarının nəyi vardı ki!… İki əli, bir başı olsa da, özünü güclə dolandırırdı.

Vəkil yaman insafsız idi, hər dəfə qarıdan bir şey qoparmamış əl çəkmirdi. Bir gün inəyini, bir ildən sonra keçisini də apardı, qarı quru yurdda qaldı. Vəkilin gözü yenə özünə yığılmadı. Qarı bu dəfə ona bir torba torpaq verdi. Vəkil də torbanı şahın hüzuruna gətirdi. Şah belə vergi görməmişdi, fikirləşdi ki, burda böyük bir sirr var, bu sirri açmaq lazımdır, ona görə də vəzirləri başına yığıb, soruşdu:

- Bu, nə deməkdir?

Vəzirlərin hərəsi bir söz söylədi. Biri dedi ki, qarının quruca torpaqdan başqa heç nəyi yoxdur, onu da əkib-becərə bilmir. Deyir ki, kimə istəyirsiniz verin, mənim də canım qurtarsın.

Digəri bu torba məsələsini başqa cür yozdu:

- Qarı bununla deyir ki, ey şah, öləndə gözümə tökməyə bircə torpağım qalmışdı, onu da kəmfürsət vəkilinə verdim. Gözlərimi nə yumacaq, öləndə üzərimi nə ilə örtəcəm?

Söz baş vəzirə verildi. O:

- Ey qibleyi-aləm, qarının bir torba qızılı, bir torba da göz torpağı var, dəyişik salıb, qızılın əvəzinə torpağı göndərib. Vəkil torpağı qaytarsın, qızılı gətirsin.

Vəzirlərin dedikləri şahın ürəyincə olmadı, qarını gətirtdi. Vəzir-vəkillərin hamısını saraya yığdı.

- Qarı nənə, - dedi, - özün vurduğun bu düyünü aç.

Qarı söylədi ki, bir vaxt mənim də gəlhagəlli günlərim vardı. Sürülərim sular bulandırardı. İlxılarım, naxırlarım düzü-dünyanı bulud kimi tuturdu. Qapımda nökərlərim, qaravaşlarım vardı. Bir bad əsdi, xoşbəxtlik taxtım döndü. İndi torpağa düşmüşəm. Hamıya axırda təkcə torpaq qalır. Ondan başqa sizə göndərəsi bir şeyim yox idi.

Sarayda bir pıçıltı gəzdi: hamıya axırda torpaq qalır – son yerin, son gedişin məkanı, son mənzilin – qəbir. Qarı zülmə dözməyib, çarəsi kəsilib, heç kimin əlindən alınmayan göz torpağını şaha göndərib.

Şahın da, vəzir-vəkilin də başı sinəsində idi. Bu pıçıltı isə sarayda hey gəzir, hey dolanırdı: sanki bayquş ulartısı xarabalığa düşmüşdü; xarabalıqsa bu bədbəxtlik çağırışını hey yaşadır, hey eşitdirirdi.

### *191. Ədalətli Ənuşirəvan*

Ənuşirəvan vəziri ilə ölkəni gəzirdi. O, üzünü vəzirə tutub dedi: «Görəsən, məmləkətimdə elə bir

ev tapılarmı ki, mənim ədalətimin işığı ora düşməmiş olsun?». Elə bu an bir qarı Ənuşirəvanın atının cilovundan yapışıb dedi:

- Siz bilərsiniz, mən ədalətsiz Ənuşirəvanı haradan tapa bilərəm?

Ənuşirəvan çevrilib vəzirin üzünə baxdı. Vəzir bir şey büruzə vermədən soruşdu:

- Ana, hər yan qibleyi-aləmin ədalətindən danışır, sən hansı cürətlə ona ədalətsiz deyirsən?

- Ədalətli şahın oğlu ədalətsizlik eləməz, namussuzluq eləməz…

Dünya Ənuşirəvanın başına fırlandı, qulaqlarına inanmaq istəmədi, soruşdu:

- Ana, nə namussuzluq? Kimdir onu edən?

- Ənuşirəvan mənim yeganə oğlumu davaya göndərib. Oğlum onun ədaləti yolunda canından keçərək döyüşür. Şahın oğlu isə mənim gəlinimin yanına gəlib-gedir.

Ənuşirəvanın canından od qalxdı:

- Ana, Ənuşirəvan mənəm! Mənim oğlum da təkdir. Əgər o, belə hərəkət etmiş olsa, mənim ədalətimə ləkə gətirsə, gözlərinin qarşısnda onun cəzasını öz əllərimlə verəcəyəm.

Qarı dedi:

- Oğlun bu saat gəlinimin yanındadır.

Ənuşirəvan dinməz-söyləməz atdan düşdü. Vəzirə işarə verdi. Vəzir yaxındakı komanın bacasından içəri baxdı. Gördü ki, doğrudan da şahın oğlu gəlinin yanındadır. Fikirlər, xəyallar içində geri döndü.

- Doğrudurmu?

Şahzadə tək olsa da, məmləkətin yeganə varisi sayılsa da vəzir həqiqəti gizlətmədi:

- Doğrudur, qibleyi-aləm!..

Bircə anda neçə il qocalan Ənuşirəvan qarıdan duz istədi. Duzu dilinə vurub içəri keçən kimi əlüstü çırağı keçirdi. Qılıncı çəkib, oğlunun başını üzəndən sonra saraya qayıtdı. Sarsıntılı, ibrətamiz hadisədən sonra dünyagörmüş, həmişə müşkül qıfılların açarı olmuş vəzir, şahın hərəkətləri qarşısında mat qalmışdı:

- Ey böyük Ənuşirəvan! Bildim ki, öz ədalətin naminə yeganə oğlunun başını kəsdin. Lakin məni iki şey heyrətləndirir. Siz nə üçün içəri keçməmiş qarıdan duz istədiniz?

- Qorxdum ki, qan başıma vura, qarını səbəbkar bilib onu öldürəm. Onun duzunu daddım ki, qarıya əl qaldırmaq mümkün olmasın.

- Bəs çırağı nə üçün söndürdünüz?

- Dünyada övlad məhəbbətindən güclü heç nə ola bilməz. Məhəbbət isə gözdə olur. Əgər oğlumun gözü mənim gözümə sataşsaydı, mən onu heç cür öldürə bilməzdim. Məhəbbət güzəştə aparardı. Nəticədə günahkar dünyada cəzasız yaşayardı.

### *192. Maral sədaqəti*

Bir dəfə Ovçu Pirim yol ilə gedərkən görür ki, bir yad ovçu bir maralı tutub əsir edib, bağlayıb: maralın gözlərindən yaş, döşlərindən süd damcılayır. Maralın bu halı yad ovçunun heç vecinə deyil. Ovçu Pirim dərhal başa düşür ki, maral körpəlidir, balasını əmizdirmək vaxtı çatmışdır. Ona görə də döşündən süd gilələnir. Yəqin bu saat ac, körpə maral həsrətlə anasının yolunu gözləyir. Ovçu Pirim yad ovçudan xahiş edir ki, maralı açıb buraxsın, balası acdır, qoy gedib körpəsini əmizdirsin, sonra qayıdar, yenə tutarsan. Yad ovçu

Ovçu Pirimin sözlərinə təəccüblənir, onun təklifini qəti rədd edir:

- Sən nə danışırsan? Min əzab-əziyyətlə əsir etdiyim maralı buraxım ki, nədir-nədir balası acdır, heyvan gedib balasını əmizdirəcək, sonra mənim adamlığımı başa düşüb, bir də geri dönəcək, heç elə şey olar?

Ovçu Pirim yad ovçunun fikrindən dönməyəcəyini görüb pul, mal, qiymətli şeylər təklif edir. Heç bir nəticə hasil olmur. Əlacsız qalan Ovçu Pirim deyir:

- Zalım ovçu, marala özüm zamin oluram. O, gəlməyincə mən sənin əsirinəm.

Yad ovçu soruşur:

- Mən sən Ovçu Pirimin sözünə inanmıram, sən hansı ağılla vəhşi heyvana inanırsan?

Ovçu Pirim deyir:

- Bir şeyə inamı olmayan min ilin ölüsündən betərdir.

- Yad ovçu əlverişli təkliflə razılaşır. Onların hərəkətlərini iztirablı göz yaşları içində seyr edən maralı açıb buraxır.

Maral gəlib öz oylağına çatanda görür ki, bir canavar onun balasının keşiyini çəkir. Maral belə fikirləşir ki, indi canavar tutub onu yeyəcək və bundan sonra Ovçu Pirim yad ovçunun əlində əsir qalacaq. Lakin maralın gəldiyini görən canavar yavaş-yavaş aralanıb gedir. Maral balasını əmizdirir.

Vaxt uzandıqca yad ovçu sevinir. Maral gəlib çıxmasa, deməli, Ovçu Pirim həmişəlik onun əsiridir. O, bu qüdrətli əsirin hesabına bütün arzularına asanlıqla çata biləcəkdir. Lakin bu xəyali sevinc çox çəkmir, bir də görürlər ki, həmin maral düz onlara doğru gəlir. Ana maral yetişdikdən sonra təşəkkür

əlaməti olaraq Ovçu Pirimin əllərini yalayır. Yad ovçu əməlindən və inadından çox peşman olur. Maralı yenidən azad edib Ovçu Pirimə deyir:

- Doğrudan da, inamı olmayan adam min ilin ölüsündən betərdir.

### *193. Gencə- Gəncə*

Deyilənə görə bir şah gəzməyə çıxıbmış. Gəlib bir düzə çatır. Baxır ki, bu düzdə hər gül, hər çiçəkdən var. Güllərin, çiçəklərin ətri adamı bihuşdarı kimi tutur. Bu düzdən dumduru bir çay keçir. Düzün yuxarısında meşəlik, qarlı dağlar var, buranın təmiz havası adama bir yüngüllük gətirir, ovqatındakı ağırlığı silib, aparır.

Orada qoyun otaran çobanı çağırtdırıb ondan soruşur:

- Buranın təkcə yazımı belə olur?

Çoban deyir:

-Buranın yayı, payızı yazından da gözəl olur.

Şah cavabında xəbər alır:

- Bura get-gəllidirmi?

Çoban cavab verir ki, uzağın karvanları buradan keçib gedir. Tacirlər, səyyarlar qış yorğunluqları çox vədə burada alırlar.

Şah çobana gənəşir:

- Burada şəhər salmaq istəyirəm.

Çoban da fəxrlə deyir:

- Gencə yerdir, yaxşı şəhər yeridir.

Şah orada şəhər saldırır, Adını Gencə qoyur, “Gencə” də yavaş-yavaş “Gəncə” yə çevrilir.

### *194. Xan yurdu*

Gəncə xanı hər ilin yaz, yay aylarında Kəpəzdə olardı. Xanın orada yurdu vardı. O, xəzinəsini də bu yurdun altında basdırmışdı.

Bir il payız elə gözəl keçir ki, hər yanı alısın basır, yurdlar itir. Xan bir də yaylağa çıxanda öz yurdunu tapa bilmir. Ünnüyə düşər deyin, bir yer seçib alaçıq qurur, lakin pünhan-pünhan yurdunu gəzir, tapa bilmir.

Xanın cavan bir çobanı vardı. O, gizli-gizli xanın qızı Maralı sevirdi. Bunu az-çox qız da hiss etmişdi. Lakin hər ikisi də bilirdi ki, bu, mümkün olan iş deyil.

Çoban tütək çalırdı, dərələrə səs salırdı. Xan bir gün qulaq asanda gördü ki, onun çobanı «xan, qızını mənə versən, yurdun hardadı deyərəm» çalır.

Xan arvadına deyir:

- Eşidirsənmi, o mənim yurdumun yerini bilir, onu dilə tutmaq lazımdır.

Xanın arvadı dedi:

- O, Maralı sevir. Onu ancaq bu vədlə yola gətirmək olar.

Xan qəzəbdən dodağını çeynəsə də , «olsun» –dedi.

Axşam bu barədə söhbət başladı.

Maral dedi:

- Mənim bir şərtim var. Kəpəzin sinəsində gözəl bir göl quruyur. Mən o oğlana ərə gedəcəyəm ki, həmin gölə dağdan bir bulaq çəkdirsin.

Çoban bu təklifi qəbul etdi. Dumanlı bir gündə xəzinədn xeyli qızıl götürüb,usta çağırdı, işə başladı.

Bulaq suyu gölə töküldü. Bu, hamını sevindirdi. Eşidən- bilən xan qızı Marala «əhsən!» – dedi. Elə o gündən bulaq «Xan qızının bulağı», göl də «Maral göl» adlandı.

### *195. Şirin qala*

Qədimlərdə bu yerlərdə bir ata ilə bir oğul yaşayırmış. Ata ilə oğul mahir bənna imişlər. Bir gün ata başa düşür ki, onun oğlu mahnıları «Şirin bulağı»n zümzüməsinə qarışan Ağcaqıza aşiq olub.

Ata deyir:

- Sizin toyunuz o vaxt ola bilər ki, biz burada elə bir qəsr-qala tikək, onun başı Pəmbək dağlarının zirvəsilə bərabərdə dayansın.

Şərtə görə, oğlan kəndin yeddi ağaclığındakı karxanada daş yonur, ata da həmin daşlardan binanı hörür. Səksən boyun öküzün, səksən boyun kəlin gözünə boz gəlir, yenə də bina başa gəlmir.

Hər gün Ağcaqız çiçək yığa-yığa, mahnılar oxuya-oxuya soruşur:

- Bina haçan qurtaracaq, toyumuz nə vaxt olacaq?

Ağcaqızın – gələcək gəlinin «Şirin bulağ»ın başında oxuduğu mahnılar qocanın qoluna qüvvət verərmiş.

İşin bu yerində bənnanın daş yonan oğlu ölür. Ağsaqqal, qarasaqqal bir yerə yığılıb məsləhətləşirlər ki, bu xəbəri qoca bənnaya bildirməyək. Çünki bilsə özünü öldürər, gözəl tikinti yarımçıq qalar. Odur ki, qonşu kənddən bir usta

tapıb gətirirlər ki, bənna üçün daş yonsun, tikinti dayanmasın.

Qoca birinci daşı əlinə alan kimi deyir:

- Oxuma, Ağcaqız, oxuma! Oğlum ölüb. Daş soyuqdur, bu daşı o yonmayıb…

Qoca əlindəki daşı binaya qoymayıb yerə atır, daşın dalınca da özü yıxılır, ölür. «Şirin qala» da yarımçıq qalır.

## *196. Şirin bulaq*

Qafqaz dağlarının ətəyində yerləşən Daşbulaq kəndinin yuxarı hissəsində şirin bir bulaq var imiş. Bulaq öz başlanğıcını sıldırım qayalardan götürərmiş. Bu qəribə bulağın sirri uzun müddət yerli əhali üçün açılmamış qalırdı.

Kəndə Zaman xan adlı varlı, pullu bir ağa hökmdarlıq edirdi. Xanın böyük təsərrüfatı vardı. O, münbit torpaqları şumladar, əkdirər, biçdirərdi. Məhsulun başa çatan vaxtı Şirin bulağın suyu birdən-birə qurudu. Adamlar, mal-qara, bütün təsərrüfat suya möhtac idi. Zaman xanın var-dövləti tamamilə tələf olmaq təhlükəsi qarşısında qaldı. Zaman xan suyun dalınca kimi göndərirdisə geri qayıtmırdı. Kəndin igid, adlı-sanlı adamları bu «gedər-gəlməz» yoldan bir daha geri dönmürdülər. Zaman xan elan verir ki, kim Şirin bulağın yolunu açsa, onu dünya malından qəni edəcək. Xanın Əmrah adlı igid, qorxmaz, cavan bir çobanı var idi. O, dəmirçi Muxtar kişinin oğlu idi. Neçə il idi ki, xana çobanlıq edirdi. Əmrah, xanın Güllü adlı gözəl bir qızını sevirdi. Qız da Əmrahı sevirdi. Ancaq onlar bu

məhəbbəti gizli saxlayırdılar. Güllü atasının xasiyyətinə yaxşı bələd olduğu üçün bilirdi ki, xana xəbər çatsa, qəzəbi tutacaq.

Əmrah xanın elanını eşidən kimi onun yanına gəlir və deyir ki, Şirin bulağın yolunu aça bilər, əvəzində xan qızı Güllünü ona verməlidir. Xan bir qədər düşündükdən sonra razılıq verməyə məcbur olur. Əmrah evə qayıdır. Atası ona bu yoldan geri dönməyi təklif edir. Amma Əmrah qohum-əqrabası ilə görüşüb yola düşərkən atası Muxtar kişi ildırım parçasından düzəltdiyi xəncəri oğluna verib deyir: - Oğlum, get tale sənə yar olsun. Bu xəncər səni darda qoymaz.

Əmrah üç gün yol getdikdən sonra böyük bir əzab-əziyyətlə bulağın başlanğıcına gəlib çatır. Görür ki, bulağın kəndə gedən yolunu iri bir daş parçası tutub. Çox çətinliklə bu daşı kənara tullayır. Kəndə gedən suyun ağzı açılır. Bu zaman bərk gurultu qopur. Nəhəng bir əjdaha Əmrahın üstünə atılır. Əmrahla əjdaha arasında əlbəyaxa döyüş başlanır. Son nəfəsdə Əmrah xəncəri əcdahanın kəlləsinə soxur və əjdaha nərilti qopararaq yerə sərilir. Əmrah isə bərk yaralanır. Bir müddətdən sonra tamam sağalıb ayağa qalxır. Suyun gəlməyi kənddə toy-bayrama səbəb olur. Deyilənə görə, kənd camaatı yeddi gün şadlıq edir.

Zaman xan verdiyi vədə əməl etmir. Qızı Əmraha vermək istəmir. Əmrah Güllünü kənddən göturub qaçmağa məcbur olur. Əmrah bu yerlərə yaxşı bələd olduğundan dar keçidlərlə, keçilməz yollarla gedirlər.

Zaman xan Güllünün qoşulub qaçdığını bilən kimi hər tərəfə atlı saldırıb onları mühasirəyə aldırır. Ancaq qoşun nə qədər gəzirsə, Əmrahla Güllünü

tapa bilmir. Bu vaxt Zaman xan əmr edir ki, Şirin bulağın suyundan kənara çıxılmasın. Xanın özü əjdaha olub bulağın gözünə yapışır. Günlər keçdikcə susuzluq Güllünü əldən salır. Gül dodaqlar çat-çat olub qan verir. Hər dəfə Güllü gözlərini Əmrahın üzünə dolandıranda zəif səslə: - Su, - deyir. Əmrah sevgilisini gizlətdiyi yerdə qoyub Zaman xanın yanına su dalınca gedir. Xan Əmrahın gəldiyini görüb ürəyində sevinir.

- Nəyə gəlmisən?

- Təşnəyik. Şirin bulağın suyundan bir içim su ver.

- Sənə su düşmür. Sən günah işləmisən.

- Günahı əhdini unudanlar işləyir, xan. Bulaq mənimdir, bulaq Güllünündür. Savaba bat, xan. Öz bulağımızdan bizə bir içim su ver.

Xan yenə hiylə işlədir. Qızı ələ gətirib sonra Əmrahı öldürmək istəyir.

- Suyu burada içəcəksiniz, orada yox, Güllünü gətir. Sənə zaval olmayacaq.

Əmrah geri qayıdır.

Günəş doğanda özünü Güllünü qoyduğu yerə çatdırır. Lakin gözlərinə inanmır. Güllü üzü qoylu, qolları irəli açılmış halda, yerdə hərəkətsiz qalmışdı. Ondan bir qədər aralıda göz yaşı kimi dumduru bulaq qaynayırdı. Bulağın dörd yanı güllük, çiçəklik idi.

Deyilənə görə Əmrah ömrünün sonuna qədər «Güllü bulağ»ın yanından heç yana getməmiş, öləndə Güllünün yanında ölmüşdür.

O gündən Şirin bulaq daşların, qayaların arasından sızıb gəldiyi üçün kəndin adı Daşdulaq, Güllünün öldüyü yer isə Güllübulaq adlanır.

## *197. Fərhad və Şirin əfsanəsi*

Hardansa Calud kəndinə Fərhad adlı cavan, daşyonan bir usta gəlir. Qərib daşyonan kəndin varlılarından birinin qızına aşiq olur. Varlının dünya gözəli olan qızı Şirin də oğlanı sevir.

Şirinin atası bu sevgiyə mane olmaq istəyir, mümkün olmadıqda oğlanın qarşısına ağır şərt qoyur.

Qoca deyir:

- Şərtimiz şərtdir. Uğan dağı var. Bu dağda böyük mağara var, Daşağıl mağarası deyirlər. Onun yanından Ulu çay axır. O çayın bir qolunu Qoşabulaq təşkil edir. Öz gücünü sınayıb, dağları çapıb, Qoşabulağın suyunu Calud kəndinə gətirsən Şirin sənindir. Qızım isə bu müddətdə sənin adına böyük bir xalı toxuyacaq.

Qoca öyrənir ki, Fərhad işi başa çatdırır. Onu öldürmək üçün insafsız bir qarı axtarır. Bu mahalda belə bir adam Əndəruş qarı ola bilərdi.

Əndəruş qarı əvvəlcə Fərhadın yanına gedir. Ona söyləyir ki, Şirin xana toxuyarkən həvə başına dəydi və onu öldürdü. Fərhad qarıya inanır, əlində işlədiyi külüngü öz başına çırpır və ölür.

Qarı sonra Şirinin yanına gedir, Fərhadın işləyərkən başına külüng dəydiyi və onun həlak olduğunu söyləyir.

Bu xəbəri eşidən Şirin onun həlak olduğu yerə gəlir. Fərhadla vidalaşır. Ağlayıb göz yaşı tökdükdən sonra əlindəki qəmə darağı ilə özünü həlak edir.

Onları Əndərən qobusu adlanan yerdə dəfn edirlər.

### *198. Fərhadın səsi*

Mahmud Qəznəvinin hökmdar olduğu ölkədə kasıb bir kişinin Pəri adlı bir qızı vardı. Qızın qənirsiz gözəlliyi cavanı da, qocanı da heyran qoyardı. Pərinin gözəlliyində əsrarəngiz bir hikmət vardı. Hər şey bu gözəlliyin qüdrətilə təzələnir, alovlanırdı. Buna görə də hamı ona İlham Pərisi deyirdi. Pəri qapılarına gələn saysız-hesabsız elçilərin heç birinə məhəl qoymurdu.

Həmin ölkədə Fərhad adlı adlı-sanlı, boylu-bu-xunlu, pəhləvan cüssəli, daş yonub ev tikən bir bənna yaşayırdı. Onun sənətinin şöhrəti xeyli uzaqlara yayılmışdı.

Bir gün Fərhad yenə daş yonurdu. Gördü ki, ətrafdakılar işini buraxıb, çarşı-bazara tərəf axışırlar. İstər-istəməz Fərhad da onlara qoşuldu. Sən demə İlham Pərisi bazara çıxıbmış. Hamı heyrətlə onun gözəlliyinə tamaşa edirdi. Fərhad Pərini görən kimi dünya başına fırlandı, qara daşlar gözlərinin qabağında qırmızı güllər açdı, sinəsində eşqin odu alovlanıb dilim-dilim dil açdı. O, bir də ayıldı ki, hamı dağılıb, bazarda özündən başqa heç kim yoxdur. Amma çiçəklərdən, ağaclardan, cansız divarlardan, əngin səmalardan İlham Pərisinin nəfəsi, qoxusu gəlirdi. Fərhadın sinəsindəki ocaq daha gur yanmağa başladı. İstədi İlham Pərisinin - sevgilisinin varlığı haqqında söz desin. Amma qüdrətdən söz səsə çevrildi, dalğa-dalğa havalandı, zənguləsi dağları-daşları lərzəyə saldı. Bu səda İlham Pərisini səsləyirdi.

Fərhadın sirli-sehrli səsi özünün elçisi oldu. Bu səs Pəriyə çatan kimi onun yanğısına alışdı, eşqin odu gözəlliyin məğrurluğunu əritdi.

İlham Pərisinin gözəllik sorağı oba-oba, oymaq-oymaq yayılıb, nəhayət, Mahmud Qəznəvinin qulağına çatdı. Hökmdar nə Fərhadın istəyinə, nə də Pərinin arzusuna məhəl qoymadan bir gündə dünya gözəlini sarayına aparıb özünə arvad elədi.

Nakam eşqin zərbəsi Fərhadın səsini yanğısını daha da artırdı, zənguləsini daha da gücləndirdi. O, hər gün oxuyub sevgilisini haraylayırdı. Səs Pəriyə çatan kimi o, sarsılır, bütün varlığı əsim-əsim əsirdi. Hökmdar Pərini nə qədər dərin yerlərə, nə qədər gizli otaqlara apardısa, səsdən qoruya bilmədi. Fərhadın səsi saray üçün qorxulu bir bəlaya çevrilsə də, xalq üçün çörəyə, suya bərabər idi. Bu səsi eşitməyənin əli iş, gözü yuxu tutmazdı.

Vəziyyəti başa düşən Mahmud Qəznəvi Fərhadın açıq küçədə, çarşı-bazarda oxumasını qadağan etdi. Hökmdarın göstərişilə onu zindana saldılar. Amma şah istəyinə nail ola bilmədi. Zindandan gələn səs İlham Pərisini havalandırır, haldan-hala salırdı.

Çıxılmaz vəziyyətdə qalan Mahmud Qəznəvi vəzir-vəkilləri, Sarayın başbilənlərini, dünyagörmüşlərini bir yerə yığıb Fərhadın səsinə əlac istədi. Əlac tapıldı: Fərhad Arran ölkəsinə sürgün edildi. Bundan sonra nə səs gəldi, nə Pəri havalandı.

Bir gün Mahmud Qəznəvi öz ölkəsini gəzirdi. Gördü ki, xalq başdan-başa qara geyinib. Hökmdar təəccübləndi, tez bunun səbəbini soruşdu. Dedilər ki, Fərhadın səsini itirən xalq matəm içərisindədir. Hökmdar bərk təşvişə düşdü. Əmr verib Fərhadı

Arrandan gətirtdi. Mahmud Qəznəvi maraqla Fərhaddan soruşdu:

- Arranda nə ilə məşğul idin?

Fərhad cavab verdi:

- Köhnə sənətimə qayıtmışdım, daş yonub saray tikirdim.

- Bəs niyə oxumurdun, mənim qəzəbimdən qorxurdun?

- Xeyr, hökmdar! Aşiqlərdə qorxu hissi olmur. Mənim səsim Pərinin nəfəsinə bağlıdır. Külək onun nəfəsini uzaq ölkəyə gətirib çatdıra bilmirdi. Bu səbəbdən də susmuşdum.

Mahmud Qəznəvi xalqın matəmdən çıxması xatirinə naəlac qalıb Fərhada orta meydanda ancaq həftədə bir dəfə oxumağa icazə verdi.

Günorta çağı idi. Mahmudla Pəri qabaq-qabağa oturub, qızıl piyalədə şərbət içirdilər. Birdən Fərhadın səsi gəldi. Pəri qeyri-ixtyari qızıl piyaləni əlindən saldı. “Odur!..Odur!..” deyə-deyə havalanmış halda səs gələn tərəfə qaçdı. Mahmud Qəznəvi heyrət içində öz-özünə dedi:

- Sən eşqin hökmünə bax! Qızıldan da, hökmdardan da, qoşundan da, qılıncdan da güclüdür...

### *199.Nəğməkar Fərhad*

Belə rəvayət edirlər ki, qədim zamanlarda Bazar meydanı yaxınlığında qoşa çinar ağacları var idi. Uzaq və yaxın kəndlərin sakinləri tez-tez bu çinarların altına yığışardılar. Onları buraya yığışmağa həvəsləndirən Fərhad adlı el nəğməkarının səsi, ürəkləri yandırıb yaxan mahnılarıdı.

Günlərin bir günü elin nəğməkar oğlu Fərhad bir daha bu yerlərə gəlmədi. Adamlar bundan çox nigaran olmağa başladılar. Bir müddətdən sonra el nəğməkarının sehrli səsi uzaq yerlərdən, uca dağlardan gəlməyə başladı. Camaat bu işə çox təəccüb qaldı. Dünyagörmüş qocalar belə qərara gəldilər ki, onun dalınca qasid göndərib geri çağırsınlar. Bu məqsədlə qasidlər yola düşdülər. Onlar el nəğməkarını Şərurda tapdılar. Lakin onu geri qaytara bilmədilər. Çünki el nəğməkarı artıq eşqin şərbətini içmişdi. Fərhad dağlara çıxıb qayalar arasında tək-tənha bir mağarada yaşayırdı.

El nəğməkarının sədası fars məmləkətinin şahına da çatır. Həm də şah öyrənir ki, bu nəğməkar onun sevgilisinə aşiq olmuşdur.

Şah el nəğməkarı Fərhadı hüzuruna çağırtdırır. Əsl aşiq olan el nəğməkarı Fərhad həqiqəti gizlətmir.

Şah deyir:

- Əgər sən həqiqi aşiqsənsə, sınaqdan çıxmalısan, eşqini əməlinlə sübuta yetirməlisən. Bizim bu yerlərdə uca bir dağ var. Hərgah onu çapıb arasından yol açsan, Şirin-şərbət gözəl sənindir.

Fərhad bu işdə qolunun gücündən çox, öz sehrli səsinə güvənirdi. Odur ki, Fərhad dağın başına çıxıb yanıqlı bir mahnı oxudu, eli, mahalı köməyə çağırdı.

Adamlar bu səsdən cuşa gələrək axın-axın əlləri belli, külünglü dağa hücum çəkdilər. Fərhad özü də qabağa düşüb əlindəki külüngü ilə qayaları parça-parça etməyə başladı.

Dağın qurtarmasına az qalmış el nəğməkarı Fərhad yuxuya gedir. Yuxuda görür ki, onun

butasına haram əl toxundu. Yuxudan ayılan kimi Fərhad külüngü başına çalıb özünü məhv edir.

El nəğməkarının səsinə valeh olan bülbüllər bu xəbəri onun vətəninə çatdırır. Deyirlər ki, həmin vaxtdan Fərhad ölən yerlərdən onun məlahətli səsini və külüngünün sədasını yellər onun vətəninə yetirir!

## 200*. Fərhadın əjdaha ilə vuruşu*

Fərhad «Oğlan qala»da, Şirin isə «Qız qala»da yaşayırdı. Fərhad «Qız qala»ya su arxı çəkib, orada Şirinin çimməsi üçün hovuz düzəltmişdi. Şirin Fərhadın qarşısında belə bir tələb qoymuşdu ki, Arpaçayından Sədərək düzlərinə su arxı çəksin, əkinlər su sarıdan korluq çəkməsin. Ancaq belə bir arx çəkiləndən sonra onların arzusu baş tuta bilər.

Fərhad işə böyük həvəslə başladı. Əvvəl bu uzun arxın yerini qazdı, sonra Arpaçayından birbaş su ayırdı, arxa caladı. Amma arx dolusu su «Oğlan qala»nı keçib, «Qız qala»ya çathaçatda yox olurdu. Gecələr arxla su axdığı halda, gündüzlər su kəsilirdi. Bir sözlə, Şirin bir dəfə də olsun, bu yeni arxla su axdığını görməmişdi.

Şirin də həsrətdən qovrulurdu, suyun gəlməsinə, muraza çatmasına tələsirdi. Fərhad da əldən düşmüşdü. Arx dolusu gələn su «Oğlan qala» ilə «Qız qala» arasında itib yox olurdu.

Sən demə, bir nəhəng əjdaha da Şirinə aşiq olubmuş. Əjdaha arx dolusu gələn suyu burnu ilə sorub öz kamına çəkirmiş ki, Fərhad arzusuna çatmasın.

Bir gün bu işə pərt olan Fərhad külüngünü əlinə alıb, arx aşağı, suyun axımına doğru arxın içi ilə gəldi ki, görsün, nə üçün su yolda itir, öz mənzilinə gedib çatmır. O, gəlib gördü ki, nəhəng bir əjdaha burnunu arxa soxub suyu öz kamına çəkir. Fərhad bir neçə dəfə külüngü əjdahanın başına endirdi. Əjdaha ilə Fərhad arasında döyüş başlandı. Fərhad alqan içərisində öldü. Əjdaha isə yarımcan olub qaldı, daha suyu kamına çəkə bilmədi.

Şirin gördu ki, arxdan qanlı su gəldi. O, qaça-qaça «Oğlan qala»ya tərəf gələndə Fərhadı ölmüş, əjdahanı isə yaralı gördü. Bildi ki, bu vaxta qədər suyun qarşısını kəsən əjdaha imiş. Şirin üzünü göylərə tutub yalvardı:

-İlahi, Fərhad öz murazına çatmadı, mən də nakam qaldım. Əcdhanı daş elə. Daşlara yoldaş elə.

Əjdaha «Oğlan qala» ilə «Qız qala» arasında daşa döndü. Ona indi «Əjdaha daşı», «Əjdaha burnu» deyirlər.

### *201. Sən Şirini ərdə bil*

Şah Xosrov, dağçapan Fərhadı yanına çağrıb deyir:

-Mən açıq görürəm ki, biz ikimiz də Şirinin eşqindən dönən deyilik. Şirin sənəmi qismət olacaq, mənəmi qismət olacaq, bu, sonranın işidir. İndi Şirinin qəsrinə süd arxı çəkilməlidir. Çünki yayın istisində süd ona çatanacan xarab olur. Əgər qəbul etsən bir şərtim var. Sən dağ çapmağı, arx çəkməyi bacarırsan, mənimsə əlimdən belə işlər gəlmir. Mənim dağçapanım var, hərəniz dağın bir tərəfi ilə Şirinin qəsrinə süd arxı çəkin. Kim arxı tez qurtarsa, tonqal yandırsın. Şirinin adamları əllərinə məşəl alıb

qalibi alqışlamağa gəlsinlər. Əgər mənim dağçapanım tonqalı əvvəl yandırsa, onda sən Şirini ərdə bil.

Fərhad razılaşır. Elə həmin gündən dağçapanlar işə başlayırlar.

Fərhadın külüngü dağları lərzəyə gətirir. Sərt qayaları çapıb arx çəkir. Xosrov öyrənir ki, Fərhad süd arxını sabaha qurtarır. Xosrov hiylə qurur. Gecə yarısı hamı yatandan sonra öz dağçapanı tərəfdə tonqal qalatdırır və o tərəfə əlləri məşəlli adamlar göndərir.

Fərhad tonqalın yandığını görür, ağlı başından uçur. Xosrovun son sözləri yadına düşür:

- Əgər mənim dağçapanım tonqalı əvvəl yandırsa, onda sən Şirini ərdə bil!

Fərhad buna dözmür, əlindəki külüngü başına vurub özünü öldürür.

Bu hadisədən sonra o yerdə salınan şəhərin adını Ərdəbil qoyurlar.

### *202. Şəbdizin ölüm xəbəri*

Xosrov Pərvizin hakimiyyət başında olduğu dövr idi. Hökmdar məşğuliyyəti çox sevirdi. Şəbdiz və Barbəd ona sonsuz həzz verirdi. Şəbdiz onun atı, Barbəd isə sehrli ud çalan idi. Xosrov Şəbdizi minəndə cavanlaşır, qüvvətlənir, basılmaz olur; Barbədin udunu eşidəndə dağlar, daşlar, laləli çəmənlər, zənguləli bülbüllər onunla danışırdı.

Bir dəfə Xosrov Pərviz harasa səfərə çıxır. Onun Şəbdizini gətirirlər. Şəbdiz bir yerdə durmaq bilmir. Alov kimi ora-bura sıçrayır. Xosrov onu sığallayıb, yumşaldır, kəhərin üstünə tullanır. O, atın belində oturandan sonra əlini tacına aparır. Bu vaxt

bütün camaat susur. Bu şahın onlara nə isə mühüm bir xəbərinin işarəsi idi.

- Camaat, kim birinci dəfə Şəbdizin ölüm xəbərini gətirərsə, onun boynu vurulacaq.

Bundan camaat qorxuya düşür. Hərə bir tərəfdən Şəbdizi qorumağa, əzizləməyə, tumarlamağa başlayır.

Atı o qədər əzizləyərlər ki, sonunda at, atlığından çıxıb, xəstələnir və ölür. Camaat bundan qorxuya düşür və heç kim bu xəbəri şaha çatdırmağa cürət etmir. Xosrov Pərviz isə hər gecə Şəbdizi soruşub sonra yatırmış. Şirin bu əhvalatı şaha demək istəyir. Ancaq baş vəzir deyir ki, o, tacına and içmişdir. Şirin də fikrindən dönməyə məcbur olur.

Hamı müşkül məsələ qarşısında aciz qalır. Birdən Barbəd yada düşür. Onun qapısına gedib yalvar-yaxar edirlər. Bəstəkar Barbəd udunu götürüb saraya yollanır. Şahın qarşısında baş əydikdən sonra Xosrov ona deyir:

- Hə, yenə hansı mahnıları bəstələmisən. Onlardan birini çal. Barbəd udu əlinə alıb, çalmağa başlayır. İndiyə kimi eşidilməmiş həzin musiqi sədaları hər tərəfi bürüyür. Hamı mahnıya həyacanla qulaq asırdı. Xosrovun rəngi ağappaq olur. Ud çalındıqca onun xəyalında Şəbdiz şahə qalxır, çapır, burun pərlərindən və nalından od çıxır, sonra səmum küləyi onu vurur. Şəbdizin dizləri bükülür, gözlərindən yaş axır və yıxılıb ölür. Mahnı qurtaran kimi Xosrov gözəllik aləmindən ayrılıb qışqırır:

-Yoxsa Şəbdiz ölüb?

Bunu eşidər-eşitməz Barbəd yerindən sıçrayıb deyir:

-Şahım, bunu birinci siz özünüz dediniz.

### *203. Çahargah əfsanəsi*

Qədim zamanlarda bir alim yaşayırdı. O öz gözəl əməlləri ilə xalqın rəğbətini qazanmışdı.

Alimin sorağı yaşadığı ölkənin hökmdarına da çatır. O, alimi sarayına cəlb etmək məqsədilə çağırtdırır və öz yanında qalmağı ona təklif edir. Alim qərara gəlmək üçün möhlət istəyir, hökmdar alimə üç gün möhlət verir.

Vaxt yetişəndə alim saraya gəlir və hökmdara deyir:

- Böyük hökmdar, sizin saray üçün dərin, dərrakəli alim lazımdır. Mən isə onların səviyyəsində dayana bilmirəm. Bu sözləri deyib alim qayıdır. Öz xeyirxah işləri ilə yenidən xalqa kömək etmək istəyir. Alimin cavabı, dikbaşlığı, açıq sözü hökmdarı hirsləndirir. Şah səxavətinin, firavan saray həyatının qiymətləndirilmə-məsini nankorluq hesab edir.

Hökmdar vəziri yanına çağırıb, ondan alimin hərəkətinə tədbirlə cavab verilməsini tələb edir.

- Alimin əvvəlcə cahilliyini sübut edib, xalqın gözündən salmaq lazımdır.

Vəzirin niyyəti çətin suallarla alimi çıxılmaz vəziyyətə salıb, xalqın gözündə kiçiltmək idi. Sualları hazırlamaq üçün vəzir qırx gün möhlət istəyir. Qırx gün keçdikdən sonra suallar hazır olur.

Hökmdar adamları meydana toplayır. Alimi çağırırlar. Hər şey hazır olur. Alim təmkinlə hökmdarı dinləyir.

Hökmdar alimə deyir:

- Sən öz əməllərinlə xalqı aldadırsan, sən heç də alim deyilsən. Sənə vəzirim suallar hazırlayıb. Sən bu suallara cavab versən alimliyini sübut etmiş olacaqsan.

Alim cürətlə deyir:

- Buyurun, suallarınızı verin.

Hökmdar vəzirinə işarə edir. Vəzir suala başlayır:

- Ulu dağın başından buraxılmış bir qoz Zümzümə bulağına qədər neçə dəfə fırlanar?

Alim gülə-gülə deyir:

- Mən sualın cavabını verməyə hazıram. Siz isə Ulu dağdan Zümzümə bulağına qədər olan yolun nə qədər olduğunu, dağın mailliyini, bir də qozun həcmini deyin.

Camaat alimin cavabını alqışlayır. Hökmdarla vəziri alimlə bacarmayacaqlarını görüb məyus olurlar. Artıq sual vermək fikrindən vaz keçirlər, biabır olmaq istəmirlər.

Alim evə yollanır. Ancaq onu evə getməyə qoymurlar. Başqa ölkəyə gedən karvana qoşurlar. Onlar yaxşı bilirlər ki, hökmdar bu heyfi alimdən çıxacaq.

Karvandakı hər dəvənin boynunda bir zınqrov var idi. Alim karvan başçısına bildirir ki, əgər təklifini yerinə yetirsə, onlarla səfərə çıxmağa hazırdır.

Karvan başçısı təklifini soruşur. Alim xahiş edir ki, dəvələrin boynundakı zınqrovların yerini dəyişməyə icazə versin.

Karvan başçısı alimin təklifinə can-başla razı olduğunu bildirir, ancaq səbəbini öyrənmək istəyir.

- Mən zınqrovların səsindən ecazkar musiqi yaradacağam. Bu bizi ölümdən qurtaracaq.

Bəli, alim zınqrovları dəvələrin boynundan elə asır ki, dəvə hər addım atanda, sanki mizrab bir neçə telə dəyir. Zınqrovlar səsləndikcə onlardan yaranan musiqi dalğa-dalğa ətrafa yayılır. Hamı alimin bu məharətinə heyran qalır.

Gecə öz yuvalarına çəkilən quşlar musiqinin səsindən vəcdə gəlib karvanın üstü ilə uçurlar. Musi-qinin səsindən, onun dalğasından ağacların yarpaqları rəqsə gəlir, axşamdan bükülən güllər yenidən ləçəklənib ətir saçır.

Sizə kimdən xəbər verim, hökmdardan. Sarayına çatan kimi alimin onun hüzuruna gətirilməsini tələb edir. Alimi nə qədər axtarırlarsa, tapa bilmirlər.

Hökmdar bir bölük atlını karvanın dalınca göndərir. Atlılar karvana yetişəndə gözəl musiqi səsi eşidirlər və bihuş olurlar. Dəvələrin yerişi ilə zınqrovdan çıxan musiqi sədaları alimi aparmağa gələn atlıları karvana yaxınlaşmağa qoymur, əsir aparmağa gələnlərin özləri alimin yaratdığına əsir düşürlər. Birdən atlılar yuxudan oyanan kimi görürlər ki, artıq başqa ölkənin ərazisindədirlər. Alimin geri qaytarılmasının müşkül bir iş olduğunu görüb əliboş geri qayıdırlar.

### *204. Şindan qalası*
### (I əfsanə)

Qədim zamanlarda, Sım kəndində Gülbuta adlı bir qız yaşayırmış. Gülbutanı öz kəndlərindən olan Şindan və Alı adlı iki oğlan istəyirmiş.

Qız belə bir şərt qoyur:

- Kim mənə tez bir qala tiksə, ona ərə gedəcəyəm.

Şindanla Alı da öz aralarında şərt kəsirlər ki, qalanı kim tez qurtarsa, ocaq çatıb tüstü qaldırsın, ləngiyibsə, özünü öldürsün.

Hər ikisi bu şərtlə razılaşır. Şindan kəndin ayağında, Alı kəndin başında qala tikməyə başlayır.

Gülbutanın eşqindən Şindanın qollarına qüvvət gəlir. O, qalanı sürətlə ucaldır. Alı görür ki, Şindan qalanı qurtarhaqurtardı. Alı hiyləyə əl atır: dostları ilə məsləhətləşir. Öyrənir ki, Şindan dan ulduzu doğanda gəlir.

Alı gecəni yatmır. Dan ulduzu doğanda tonqal qalayıb tüstü qaldırır. Bunu görən Şindan özünü qaladan atıb öldürür. Alı onun meyidini götürüb öz qalasının yanına qoyur. Özü isə Şindanın tikdiyi qalanın başına çıxıb Gülbutanı gözləyir.

Səhər Gülbuta gəlir və Şindanı həmişəki yerində görməyəndə təəccüblənir. Qız məsələni anlayır, el qabağında hiylənin üstünü açır, hamı Alıya lənət yağdırır. Gülbuta ömrünün sonunacan igid Şindana yas saxlayır

## ***Şindan qalası***
## **( II əfsanə)**

Sım hakiminin qızı Gülbutanı üç qardaş sevirmiş: Şindan, Əsminə və Nüdüzd.

Qız belə bir şərt kəsir, qardaşlardan hansı tez bir qala tiksə, ona gedəcək.

Qardaşlar hərəsi bir tərəfdə qala tikməyə başlayır. Şərt beləymiş ki, birinci kim qalanı tikib qurtarsa, ocaq qalayıb tüstü çıxarsın, o birilər isə özlərini öldürsünlər.

Gülbuta görür ki, Əsminə qalanı daha sürətlə hörüb qurtarmağa çalışır. Qız Şindanı sevirmiş.

Odur ki, Gülbuta xəlvətcə Şindanın yanına gəlir və deyir:

- Əsminə irəlidir. Mən isə onu yox, səni sevirəm. Qala yarımçıq olsa da, bu gecə ocaq qala, tüstü çıxar, sonra qalanı yavaş-yavaş arxayın tikərsən.

Şindan qızın məsləhəti ilə səhərə yaxın ocaq qalayıb, tüstü çıxarır. Bunu görən qardaşların: Əsminə və Nüdüzdün ürəyi partlayıb ölürlər. Şindan isə səbrlə, tələsmədən əzəmətli bir qala ucaldır.

Bunu görən Sım hakimi deyir:

-Ağ usta öz ölməzliyindən danışanda inanmadım. Onun şagirdi Şindan qala tikmədi, öz ustasına abidə ucaltdı.

Sım hökmdarı öz ədalətsiz işinə görə peşman olur. Ağ ustaya və şagirdi Şindana əhsən deyir.

### *205. Ustanın qarğışı*

Sultan xan eşidir ki, Talıstanda mahir bir daşyonan usta yaşayır. Bu usta Şirəxana yaylağından Cavanşir qalasına süd arxı çəkib, mal, qoyun dağda sağılır, südü düz oradan axıb qalanın qabağındakı daş hovuza tökülür.

Həmin ustanı tapıb xanın hüzuruna gətirirlər. Xan deyir:

-Fit dağından Gülüstan qalasına süd arxı çəkmə-lisən. Bu şərtlə ki, həmin süd arxı Şirəxanadan Cavanşir qalasına gələn arxdan gözəl olsun.

Usta işə başlayır. Gözəl bir arx çəkir. Süd dağdan saxsı kəmərlə axıb Gülüstan qalasından böyük hovuza tökülür.

Xan ustadan soruşur:

- Bu arx gözəldir, yoxsa Şirəxana yaylağından Cavanşirə gələn arx?

Usta tərəddüd etmədən:

- Şirəxanadakı arx! –deyə, cavab verir.

Xan qəzəblənir:

- Bəs sənə tapşırdım ki, bu arx ondan gözəl olsun!..

Usta deyir:

- Xan sağ olsun, gələndə məhəbbətimi o arxda qoyub gəlmişəm.

Qəzəbindən xanın dodağı əsir. Xanın belə bir qaydası var idi. Kimə qəzəbi keçsə, onu bir səbətə qoyub Fit dağından atdırardı. Bu ustanı da səbətə qoyub Fit dağından atmağa aparırlar.

Usta deyir:

- Xan, görüm bu arxdan heç xeyir görməyəsən, bu arxınla süd əvəzinə qan axsın. Fit dağın od tutub yansın.

Ustanı səbətə qoyub Fit dağından atırlar.

Xanın adamlarının arasında onun düşmənlərindən bir qasid varmış, ustanın qarğışnı eşidibmiş. O, tez Fit dağına çıxır, bir neçə keçi kəsib qanını süd arxı ilə axıdır. Xan geri dönəndə görür ki, süd hovuzu qıpqırmızı qandır. Tutduğu işdən çox peşiman olur. Amma nə fayda? Öz-özünə deyir: «Ustanın bir qarğışı məni tutdu, süd arxı ilə qan axır. Allah gerisindən saxlasın».

Şər qovuşub qaranlıq düşəndə qasid yoldaşlarının köməyi ilə beş yüz keçinin buynuzuna lopa bağladı, od vurub keçiləri Fit dağı meşəsinə buraxdı. Xan bir də başını qaldırıb baxanda görür ki, Fit dağı od tutub yanır. Xan baş götürüb harasa

qaçır, düşmən də çox asanlıqla «Gülüstan qalası»nı ələ keçirir.

### *206. Ağ körpü*

Haradansa bu yerlərə qərib bir usta gəlir. Adına Ağ usta deyərlərmiş, üzü gündüz kimi ağ imiş.

Bu ustaya Pensər çayı üstə körpü qurdururlar. Ağ ustanın üç nəfər yerli şagirdi var imiş: Şindan, Əsminə və Nüdüzd.

Usta yan tağları bir neçə aya qurub, üstünü bağla-mamış bir gecə harasa qaçır.

Usta yeddi ildən sonra qayıdır və körpünün üstünü bağlayır. Sım hakimi ustanın qaçmasının səbəbini soruşduqda o, deyir:

-Tağlar yeddi il ərzində yağışın, selin-suyun altında bərkiməsəydi tez uçardı. Daha bu körpü ömürlük oldu.

Sım hakimi ustaya çoxlu qızıl-gümüş verib razı salır. Ustanı yola salarkən soruşur:

- Bundan gözəl körpü tikə bilərsənmi?

- Əlbəttə, tikərəm. Yeddi tağlı elə körpü quraram ki, üstündən bütün aləm keçər.

Sım hakimi bundan qəzəblənir və ustanın əllərini kəsdirir.

Usta qürurunu pozmadan deyir:

-Sən mənim əllərimi kəsə bilməzsən. Mənim hər eldə-obada, mahalda neçə-neçə şagirdim var.

Əvvəllər ustanın adı ilə körpü «Ağ ustanın körpüsü», sonralar isə «Ağ körpü» adlanmışdır.

### *207. Xan sarayı*

Şəki xanı bir gün ustanı yanına çağırıb deyir:

- Qocalmışam, istəyirəm adımı əbədiləşdirən bir saray tikdirəm. Gərək dünyada ona bərabər ikinci bir saray tapılmasın.

Mahir usta xanın qabağına şərt qoyur:

- Əməyimi qiymətləndirsəniz tikərəm.

Xan dərhal razılığını bildirir:

- Əgər saray ürəyimcə olsa, o qurub yaradan əllərini qızıla tutaram.

Qoca usta xana etiraz edir:

- Qızıl qiymət ölçüsü deyil, xan. Mən istəyirəm siz sənətə, sənətkara qiymət qoyasınız.

Xan ustaya söz verir. Usta şagirdlərini başına toplayıb işə başlayır. Vaxt tamam olanda hamı gəlib saraya baxır. Xan görür ki, usta doğrudan da möcüzə yaradıb. İkimərtəbəli binada bir dənə də olsun mismar işlətməyib. Əlvan rənglər, heyrət doğuran şəbəkələr, divarlarında məhəbbət və qəhrəmanlıq dastanlarından götürülmüş süjetli şəkillər, günəş işığnda bərq vuran şüşə günbəzlər əsl sənət incisi idi.

Sarayın gözəlliyindən olduqca məmnun qalan xan ustadan soruşur:

- Əhsən əllərinə, usta! De görüm bundan da yaxşı saray tikə bilərsənmi?

- Xan sağ olsun, tikərəm!

**Xa**n marağını gizlədə bilmir:

- Bəs niyə mənim sarayımı bundan yaxşı tikməmisən, hansı cəsarətlə bütün bacarığını və məharətini əsirgəmisən?

Qoca usta qəzəbli xanın qarşısında susmur:

-Xan sağ olsun, insanın, sənətkarın əməyini qiymətləndirəndə yaradan əllər qara daşdan sədəf düzəldir.

Xan qəzəblənir:

- Bəs sənə verdiyim bir ətək qızıl?

- Siz mənə əmək haqqı vermisiniz, amma sənətimə qiymət verməmisiniz.

Xan qeyzini fərmana çevirir:

- Sən nankorsan, qədirbilməzsən. İndi sənin o yaradan əllərinin başına bir oyun açım ki, bütün ustalara, sənətkarlara dərs olsun.

Xanın əmrilə qoca ustanın yaradan əllərini, bir ölkəni yaraşığa mindirən əllərini kəsirlər.

- Sən zalımsan, zülmkarsan! Ancaq beləsi yaradanı kəsə bilər. Onu bil ki, mənim yaratdıqlarım intiqamı səndə qoymayacaq, onların arasında rahat nəfəs ala bilməycəksən. O binalar sənin deyil, mənimdir. Onlar səni qəbir kimi sıxacaq.

Xan ustaya istehza ilə gülür:

-Yaradan əlləri kəsdirmişəm, onlar bir də qurub-yaratmayacaq.

Qoca usta əllərinin ağrısını unudur, xandan betər istehza ilə gülür.

-Sənə elə gəlir ki, mənim əllərimi kəsmisən. Amma buna sənin gücün çatmaz. İndi mənim əllərim şagirdlərimdədir. Məndən sonra onlar qurub-yaradacaqlar.

- Gərək əvvəlcə dilini kəsəydim, sonra əllərini. Gec də olsa səhvimi düzəldərəm.

Xan böyük, tarixi abidələr yaradan bir sənətkarı öldürtdürür.

### *208. Acınohur*

Bir kəndin nə bir inəyi-camışı, nə də bir qoyun-keçisi vardı. Amma süddən, qatıqdan korluq çəkmirdilər, ağartıları bol idi. Çünki bu kəndin üstündəki meşədə bir sürü maral yaşayırdı. Hər günorta meşənin ətəyinə, kəndin üstünə enir, sağın yerinə yığışırdılar, hər gün bir arvad gedib maralları sağır, sərnic-sərnic südü tulumlara yığır, marallar meşəliyə çəkildikdən sonra kənddən gedən köməkçilərlə evlərə, komalara gətirirdi. Kimə nə qədər süd gərək olsa, o qədər süd götürür, bişirir, çalır, nehrə çalxalayır, evinə yağ-yavanlıq düzəldirdi. Heç kim tamahlanıb artıq süd aparmırdı. Bu qonşu o qonşunun paxıllığını çəkmirdi. Bu evdə o evin qeybəti edilmirdi. Burada «mənim», «sənin» sözü yox idi. Birinin ko-masında olan duz-çörək elə bil hamısının payı idi.

Günlərin bir günü bu kəndə bir dul arvad ərə gəldi.  Bu qadın ürəyi əyri, tamahkar idi. Bir damın altında iki-cə adam, yəni bir kişisi, bir də özü ola-ola, hər gün on adamlıq süd götürürdü. Yediyini yeyir, yemədiyini çölə, itə-pişiyə atırdı.

Bir gün bu arvadın da maralları sağmaq növbəsi çatdı. O, sərnici, tulumları götürüb sağın yerinə getdi. Sağına yığışmış marallar səksəndilər, fısqırışdılar, yelinlərinin südünü əmcəklərindən yerə axıtdılar, nohuru südlə doldurub meşəyə qaçdılar. Dul arvad bu süd gölündən çıxa bilmədi, boğulub öldü .O gündən el bu gölə «Acınohur» deyir.

### *209. Şah və bağban*

Şah öz tərlanını da götürüb ova çıxmışdı. Onun əyin-başında şahlıq nişanəsindən heç nə

qalmamışdı. Köhnə ovçu paltarı geyinmişdi, bir qoca, əldən düşmüş, zorla yortan yabıya minmişdi. O, həmişə başqa qiyafədə hər həftə bir kəndə gedir, öz rəiyyətinin dərd-sərindən xəbərdar olardı.

Göylə yerin birləşdiyi yerə qədər uzanan düzdəki kəndin qırağına çatanda tərlanı çiynindən havalanıb uçdu. Kəndin girəcəyindəki bağda qeyb oldu. Bağ hündür, adama boy verməyən hasara alınmışdı. Hasarın dibi boyu, içəridən qələmə ağacları gəlib göylərin bir qatına ucalmışdı.

Şah atdan düşdü. Darvazanı döydü. Darvazanı nurani bir qoca açdı. Ovçunu görən kimi mehman-nəvazlıqla geri çəkilib yol verdi, hər iki əlini sinəsinə qoyub təzim etdi:

-Yaradana da qurban olum, qonağına da!.. Ovçu qardaş, şükür ki, hər şeyimiz var, xəcalət olmarıq, mənzilimizə buyurun.

Ovçu həyətə girdi. İmarət nə imarət!.. İki göz istəyirdi ki, gecə-gündüz baxsın. Bağ nə bağ! Təzə bir cənnət! O, belə bir cənnəti heç yuxuda da görməmişdi. İçində dumduru göz yaşı kimi bulağı, çarhovuzu vardı. Çarhovuzda da yaşılbaş süzürdü. Güllərin, çiçəklərin ətri, bülbüllərin avazı adamı bihuş edidi. Ağacların budaqlarından meyvələr asılıb qalmışdı. Hərəsi bir rəngdə, bir lətafətdə. Bir cərgə ağacın budaqlarına isə elə bil közlər tökülmüşdü. Köz kimi parlayırdı.

Qoca gəvə gətirdi, güllərin, çiçəklərin dövrələdiyi bir çəmənliyə saldı. Yastıq, mütəkkə də gətirdi. Əlində məhraba müntəzir dayandı.

Ovçu yaraq-əsləhəsini yerə qoydu. Bulaqda yuyundu. Quşa döndü.

- Bağban, o nədir? – deyib budaqlarda köz kimi qızaran meyvələri göstərdi.

Qoca evə dönüb bir piyalə gətirdi. O, meyvənin birini budaqdan üzüb gətirdi, piyaləyə sıxdı. Piyalə qan qırmızılığında şirə ilə doldu. Piyaləni ovçuya verdi:

- Bu şirəni  için, onda bilərsiniz.

Ovçu piyaləni başına çəkdi. İçib, başını ləzzətlə yırğaladı. Qoca gedib bir-iki dənə də həmin meyvədən üzdü. Yenə sıxdı. Piyaləni yenə doldurdu:

- Bunu da için. Bu nardır, nar şirəsidir, adama can-qan verir. Günümüz-güzəranımız bundadır. Bu imarəti də narın qəpik-quruşu ilə tikdirmişəm.

Ovçu tərlanı çağırdı. Qoca ilə salamatlaşıb getdi. Yol boyu fikirləşdi ki, yəqin bu kənddə nar bağı çoxdur. Hər bağ yiyəsi də beləcə, xan kimi dolanır. Belə bir yassar kəndində neçə cənnət, neçə şah sarayı var. Bu cənnətləri, bu sarayları görənlər mənim şahlığımı gözdən salarlar.

Şah taxta çıxdı. Hökm etdi ki, o kəndin hər ağacından vergi alsınlar, həm də ayda bir dəfə.

Neçə vəkil atlandı. O kəndə sarı neçə ağ cığır düşdü, neçə yol ağardı.

Aradan illər ötəndən sonra şah yenə də ovçu paltarı geyinib həmin kəndə yollandı. Əvvəlki hasarı, bağ-bağatı, darvazanı görmədi. İmarət də uçub-tökülmüşdü. Yaxında bircə daxma vardı. Həmin qoca da daxmanın qabağındakı çardağın altında uzanıb yatırdı. Paltarına yamaq üstündən yamaq vurulmuşdu. Sir-sifətinə cəhənnəm sarılığı çökmüşdü.

Ovçu atdan qocanın yanında endi:

- Baba, necəsən?

Qoca oturdu. Baxdı. Ovçunu tanıdı. Onu, titrətmə tutdu. Sürünüb günün altına çıxdı. Bir də uzandı.

Gün göydən elə bil od ələdi, hər yanı yanğın başına aldı. Yer odda qızarmış dəmirçi kürəsinə döndü. Ovçunu yuxarıdan göy, aşağıdan yer yandırmağa başladı. Dili ağzında kösövə döndü. Boylandı, su axtardı. O bulaq da qurumuşdu, o çarhovuz da dağılmışdı. Bir ətək nar yığıb özünü çardağın gölgəsinə verdi. Narın birini əzdi, sordu, ağzına bircə damcı da şirə getmədi. Hamısını əzdi, hamısını sordu, nə fayda!..

Susuzluqdan tüstüsü təpəsindən çıxası oldu. Qocanı səslədi:

-Yanıram, qoca, mənə su!..

Qoca hələ də uçunurdu, titrəyirdi, canı qızmırdı. Zorla dikəldi:

- Ey şah, -dedi, -bu zülmə neçə ildir biz dözürük, bircə gün də sən tablaş.

### *210. Elə bildim siz oyaqsız*

Bir kəndlinin var-dövləti bir inəyi vardı. Ailəsinin ehtiyac içində olmasına baxmayaraq vergini ödəmək üçün inəyini satmaq qərarına gəlir. Kəndli olandan-qalandan azuqə götürüb inəyi bazara aparır. Xeyli yol gedir. Günbatana yaxın gəlib Naltökənə çatır. Yorulduğu üçün inəyin ipini qoluna bağlayıb yatır. Səhər oyananda görür ki, inək yoxdur, oğrular inəyin ipini kəsib aparıblar.

Kəndli hara gedirsə şikayətinə baxan olmur. Axırda naəlac qalıb inəyin oğurlanması barədə şaha şikayət eləyir.

Hökmdar soruşur:

- Sən hardaydın ki, inəyini oğurlayıblar?

Kəndli:

- Gözəl hökmdar, yatmışdım.

Hökmdar:

- Niyə yatmışdın?

Kəndli:

- Düzdür, həm, yorulmuşdum, həm də gecə düşmüşdü. Ancaq bunlara görə yatmazdım. Sizin sayıqlığınıza arxayın olub yatdım. Dedim: Yəqin bu boyda millətin, bu boyda məmləkətin yiyəsi gecə də, gündüz də oyaq olar. Bilsəydim ki, yatıbsınız, vallah mən yatmazdım.

Kəndlinin sözləri hökmdarı ayıldır: «Ölkəni vəzir-vəkilin ümidinə buraxmaq, maraqlanmamaq, elə yatmaq kimi bir şeydir. Kəndli düz deyir. Əgər mən oyaq olsaydım, ölkədə bu qədər oğurluq, əyrilik olmazdı».

### *211. Qızıl yeyilməz*

Keçmişdə bir qan içən, istilaçı hökmdar vardı. İşi-peşəsi müharibə etmək, ölkələri viran qoymaq, çapıb-talayıb qənimət yığmaq, xəzinəsini qızıl-gümüşlə doldurmaq idi. Bu xəzinənin qəribə sirri vardır. Qapısı ancaq bayırdan açılırdı. Açarın biri hökmdarda, o biri isə xəzinədarda idi. Qapı gərək ehtiyatla açılaydı. Örtüldüsə onu içəridən açmaq mümkün deyildi.

Padşah bir gün yenə böyük qənimətlə səfərdən qayıtmışdı. Xəzinədəki daş-qaşa, qızıl-

gümüşə, zəngin sərvətə tamaşa etmək üçün xəzinəyə yollandı. Sirli qapı hökmdarı məşğul etməyə başladı: «Görəsən nə səbəbə qapı örtülür, amma açılmır?». Bu fikir içində padşah xəzinənin qapısını açanda ehtiyatsız tərpəndi. Qapı örtüldü. Heç kəsin xəbəri olmadan o içəridə qaldı.

Bir gün, iki gün, üç gün keçdi. Padşah aclığa tab gətirə bilmirdi. Gördü ki, burda qalıb öləcək. Oğluna belə bir məktub yazdı:

«Oğul, Allah anladandı. Taleyim elə gətirdi ki, ölkələr fəth eləyən atan xəzinədə acından öldü. Bu qədər qızıl, daş-qaş bircə həftə məni yaşada bilmirdi. Bir xəzinə bir çörəyi əvəz edə bilmirdi. İndi başa düşdüm ki, bundan ötrü bu qədər qan tökməyə dəyməzmiş. Ölkəni sülhlə idarə elə. Daş-qaşdan, qızıldan, var-dövlətdən ötrü müharibə eləmə, qan tökmə. Xəzinəni boş saxla. Təki anbarların taxılla, teknələrin çörəklə dolu olsun. Qızıl insanı yaşada bilməz, çörək yaşadar. Qızıl yeyilməz, çörək yeyilər».

### *212. Dağ adamı çağırır*

Rum hökmdarının qoşunu Şamaxı şəhərini mühasirəyə alır. Səhər hökmdara xəbər verirlər ki, bu gecə qoşunun yarısını Fit dağı bir-bir çağırıb aparıb. O səmtdə olan qoşundan bir nəfər də qalmayıb.

Hökmdarı heyrət bürüyür: «Necə yəni daş qoşunu çağırıb aparıb?». Hökmdar sirdən agah olmaq üçün inanılmış adamlarından bir neçəsini seçib həmin dağa tərəf göndərir. Onlar Suluta çatar-çatmaz Fit dağı adamları bircə-bircə öz adı ilə səsləyir. Çağrılanlar gedir, amma geri qayıtmır.

Təkcə bir-iki nəfər səsə hay vermədiyindən xilas olur.

Onlar qayıdıb hər şeyi olduğu kimi hökmdara danışırlar. Hökmdar deyir: «Torpaqla insan birləşdi, onları istila eləmək olmayacaq». Hökmdar Şamaxını buraxıb, vətəninə qayıtmalı olur.

### *213. İsgəndər və Diri baba*

İsgəndər axtara-axtara gəlib Dirilik çeşməsini Şirvan torpağında tapır. Qızıl piyaləsini bulaqdan doldurub içmək istəyəndə, bir quş qanad çalıb suyu yerə tökür. İsgəndər bundan qəzəblənir. Yay-oxunu çıxarıb quşu vurmaq istəyir. Bu vaxt İsgəndər qaibdən bir səs eşidir:

- Ey İsgəndər, o quşu öldürmə, o sənin xilaskarındır.

Bu səs sərt bir qayanın arasından gəlirdi. İsgəndər ona tərəf yeridi və səsə yaxından qulaq asmağa başladı.

- Ey İsgəndər, bir vaxt mən də Şirvanın bu Dirilik çeşməisindən içib ölməzlik qazandım. Adım oldu «Diri baba». Dünya durduqca mən durdum. Qərinələr keçdi. Yar-yoldaşım, nəvəm, nəticəm, kötücəm, mənicəm, iticəm, yadıcam, elim-günüm dünyadan köçdü. Tək qaldım. Vaxt vardı mən insan kimi yaşayırdım. Ürəyim duyurdu, sevirdi, ağlım yaradıb-qururdu, əllərim tikirdi. Bir adamın hayına çatanda, bir elin dərdinə, sevincinə şərik yatırdım. Düşünürdüm ki, həyat gözəldi, yaşamaq ondan da gözəldir. İndi nə gözlərim görür, nə beynim düşünür, nə ürəyim məhəbbət oduna isinir, nə də əllərim birinn əlindən yapışır. Özün söylə, belə bir dirilik

kimə lazımdır? Odur ki, sənə yazığım gəldi. O quşu göndərdim ki, mənim günümə düşməyəsən.

Bu sözlərdən sonra İsgəndər Dirilik suyundan içməyib kor-peşman öz qoşununun yanına qayıdır.

### *214. Xatın arxı*

Şah öz vəziri ilə seyrə çıxıbmış. İkisi də çox susuzlayır. Gəlib bir dağa çıxırlar. Görürlər ki, bağda bir qız ağacdan nar dərir. Bağ nə bağ! Ürəyindən hansı meyvə keçsə burda var. Yamyaşıl budaqların arasından qızaran narlar baxanı heyrətə gətirirdi. Bağın tən ortasından şirin sulu bir arx astadan zümzümə eləyə-eləyə axır. Şah qıza deyir:

-Susuzlamışıq, nardan birini dər, suyunu kasaya sıx, ver içək.

Qız narın birini kasaya sıxır. Kasa tamam ağzınacan dolur. Padşah fikirləşir ki, bu böyüklükdə bağdan niyə mən az vergi alıram? Belə arxın suyu ilə bu cür bərəkətli torpaqdan möcüzə yaranır. Onun məhsulunu yığıb-yığışdırmaqla qurtarmaq olmaz. Gərək bağın vergisini iki-üç qat artıram.

Şah kasanı qızın əlindən alıb nar suyunu içir, ləzzətindən doymur. Qıza deyir:

- Yenə də kasaya nar sıx, ver içək.

Birdən-birə zümzüməli arxın suyu quruyur, bağdakı ağacların yarpaqları xəzələ dönür. Şirəli meyvələr, bulaqlar da solur. Şah bu hala təəccüb eləyir. Qız padşahın gözünün qabağında neçə nar sıxırsa, suyu kasanı doldurmur. Padşah qıza deyir:

- Bayaq bir narın suyunu sıxanda kasa doldu. İndi neçə nar sıxırsan, kasa yenə yarımçıqdı. Bunun səbəbi nədir?

Qız deyir:

- Qibleyi-aləm sağ olsun, axı bilmək olmur ki, şahlar şahının ürəyindən nə keçib…

Şah o saat anlayır ki, bağa həyat verən bu arxın suyu və bir də nar dərən qızın əlləridir. Qızın cavabı şahın xoşuna gəlir. Fikrində gəldiyi qərarı geri götürür. O saat zümzüməli arx yenidən çağlayır! O saat bağ yenidən yaşıllaşır.

O vaxtdan bəri həmin arx o qızın adına «Xatın arxı» adlanır.

### *215. Ərəşin oxu*

Bir neçə il idi ki, İranla Turan arasında müharibə gedirdi. Bu müharibədə İran qalib gəldi. Bundan sonra sülh sazişi bağlandı. Turan bildirdi ki, əldə etdiyiniz xəzinələr, dəfinələr, qənimətlər sizin olsun. Ancaq Turan torpaqlarını özümüzə qaytarın.

İran tərəfi bildirdi ki, bizim Rüstəm-Zala bərabər ortaya bir pəhləvan çıxarın, qoy uca dağın başına çıxıb bir ox atsın. Ox nə qədər uzağa düşərsə, o qədər də torpaq da sizindi.

Turanlılar öz cəsur pəhlavanları Ərəşi axtara-axtara gəlib bir mağarada tapdılar. Ərəş əyninə pələng dərisi geymişdi. O, bu xəbəri eşidən kimi qoşun əhlinin yanına gəldi. Ərəş çatan kimi əynindən pələng dərisini çıxardı, mərmər kimi bədənini göstərib dedi ki, yetmiş il döyüşmüşəm, bədənimə bir ox ucu dəyməyib, heç kəsin atı atımı, oxu oxumu keçməyib. Turanlılar ondan soruşdular ki, bir oxla heç olmasa Turan torpağının yarısını qaytara biləcəksənmi?

Ərəş dedi:

- O mənim işimdi. Siz yalnız mənim məsləhətimə qulaq asın. Qırx atla indidən yola süvar

olun. Mən çimib Savalan dağına müsəlləyə çıxacağam. Diqqətiniz məndə olsun. Dağın başından bir ox atacam, ox alov saça-saça gedəcək. Siz də alovun altı ilə atları çapa-çapa gedin. Üç gün yol gedəcəksiz. Mənim oxum bir çinar ağacına sancılacaq. Oxun yeləyinin üstündə Ərəş yazılmış olacaq.

Atlılar üç gün yol getdilər və Ərəşin oxunu gəlib Seyhunla Ceyhun arasında uca bir çinara sancılmış halda tapdılar. Bu, Turan torpağından nə bir qarış artıq, nə qə bir qarış əskik idi.

### *216. Davud və saz*

Davud peyğəmbər cinlər padşahının qızı ilə evlənmişdi. Amma baş ağrısı ona aman vermirdi ki, qızla xoş gün görsün. Cin padşahının qızı dedi ki, qoy gedim atamın yanına, sənin başağrına bir əlac diləyim. Qız əfsun oxuyub bir anda atasının yanında hazır oldu. Cinlər padşahı əhvalatı biləndən sonra dedi:

- Qızım, gərək sən bəni-insana ərə getməyəydin. Bala bağır ətidi, səndən keçə bilmirəm. Gedərsən Nuh dağının ətəyində bir bağ var. O bağda min bir yaşlı bir qoca yaşayır. O qoca sirli-sehirli bir saz düzəltməklə məşğuldur. Davudun çarəsi o alətdədi. Bircə, qoca işi başa çatdırmış ola.

Çox keçmədi, qız qocanın hüzurunda hazır oldu. Gördü ki, qoca atasının dediyi alətlə məşğuldur. Qız göz yaşları içərisində vəziyyəti qocaya anlatdı. Qoca dedi:

- A bala, görürsənmi, mən bu saz alətini başa çatdırmışam. Simindən tutmuş tazyanəsinə kimi hazırdı. Ancaq nə qədər çalışıramsa, səsi çıxmır.

Apar bu sazı peyğəmbərə ver. O məndən üstündü. Bəlkə səsinə əlac elədi. Onda xəstəliyi də ötüb keçər.

Qız yenə bir əfsun oxuyub sazla birlikdə ərinin yanında oldu. Qocanın sözlərini Davuda danışdı. Peyğəmbər əllərini sazın sinəsində, simlərin üstündə gəzdirdi. Saz dilə gəldi. Qız sevimli əri üçün çalıb oxudu. O saat peyğəmbərin başının ağrısı kəsdi. O vaxtdan sazın sinəsinin üstündə Davudun əlinin izi qalıb. Ona görə deyirlər ki, saz Davuddan qalıb.

### *217. Salsal pəhləvan*

Şamama-Nigar Köhnə qalada əri Salsal pəhləvanla birlikdə mehriban yaşayırdı. Bir gecə Şamama-Nigar yuxuda görür ki, Həzrət Əli əlində Zülfüqar, altında Düldül Köhnə qalaya tərəf gəlir. Qeybdən bir səs Şamama-Nigara deyir:

-Ey Şamama-Nigar, sözümə qulaq as, imana gəl, İslam dinini qəbul elə. Salsal öz dini olan Zərdüştlükdən əl çəkməyəcək. Ona görə də, Həzrət Əlinin qılıncı ilə öləcək, çalış sən də Əliyə kömək elə.

Səhər açılır. Şamama-Nigar baxır ki, budur, yuxuda gördüyü şəxs Köhnə qalanın qabağında dayanb. Sən demə bu elə Həzrət Əlinin özü imiş. Həzrət Əli Salsalı səsləyir. Salsal qaladan çıxır. Əlini görür. Əli əvvəl salam verir, sonra kimliyini bildirir və Salsalı öz dininə dəvət edir. Salsal Əlinin təklifindən qeyzlənib onunla döyüşə girir. Heç biri o birinə güc gələ bilmir. Yuxuda İslam dinini qəbul edən Şamama-Nigar Həzrət Əliyə tərəf keçir və xəlvətcə ona deyir:

-Sən Salsalın əynindəki köynəyi cır. Nə qədər ki, bu köynək Salsalın əynində salamatdı, ona qalib gəlmək mümkün deyil.

Əli fürsət tapıb Salsalın köynəyini parçalayır. Bundan sonra məğlub olacağını yəqin edən Salsal Əlinin qabağından qaçır. Təqib başlayır, nə başlayır. Əli qovur, Salsal qaçır. Nəhayət, Salsal bir daşa yetişir, daşın üstündən adlaya bilməyib bihal olur. Əli ondan bu vəziyyətə nə üçün düşdüyünü soruşur. Salsal deyir:

-Bu gördüyün mənim atamın qəbir daşıdır. Onu tək, həyansız qoyub gedə bilməzdim. Qəbrindən keçən, Vətənindən keçər. Bu mərdanəliyinə görə Əli istəyir Salsalla dost olsun. Salsal yenə onu qəbul etmir və deyir:

-Sən mənim köynəyimi cırmısan, bizim dostluğumuz tutmaz. Bundan sonra yad köynək geyib yaşamaq mənə yaraşmaz.

### ***218. Həzrət Əli ilə Koroğlunun görüşü***

Xotkarın oğlu, Nigar xanımın qardaşı Bürcü Sultan Pərzad adlı qıza aşiq olur. Lakin qızın tilsimkarlığından qorxaraq heç kəs ona yaxın düşə bilmir. Hətta atası xotkar da Bürcü Sultana kömək etmir. Çarəsiz qalan Bürcü Sultan son ümid yeri Koroğlunu bilir. Ona pənah gətirir. Nigarın xahişi ilə Koroğlu Qıratı minib Pərzadın dalınca tilsimli dağa gedir. Dağın və Pərzadın möcüzəsi odur ki, burada dumandan, çəndən göz-gözü görmür. Dumanda itən adam tilsimə düşüb daş olur. İnsanı isə bir quş aldadır. Quş bir daşa qonub oxuyur, insanı valeh edir. Ona heyran insanı gəzə-gəzə arxasınca aparır. İnsan bələni aşan kimi qurşaqdan aşağı daş olur.

Koroğlu tilsimli dağa çatar-çatmaz onun qabağını üzü niqablı bir atlı kəsir. Atlı soruşur:

- Sən nə cürətlə bu tilsimli dağa səfər eləmisən?

- Bəs sən nə cürətlə bura gəlmisən?

- Mənim altımda Düldülüm var.

- Mənim də altımda Qıratım var.

- Mənim belimdə Zülfüqarım var.

- Mənim də belimdə Misri qılıncım.

- Mənim nərəmdən qumlu səhralar lərzəyə gəlir.

- Mənim də nərəmdən dağ-daş titrəyir.

- Sən kimsən?

- Bəs sən kimsən?

- Mən ərəboğlu Həzrət Əliyəm.

- Mən də türkoğlu Qoç Koroğluyam.

Əli deyir:

- Sən kimi igidə qıymaq olmaz. Sənə kömək edəcəyəm. Oğlan, bu Tilsimli dağa elə-belə getmək olmaz. əvvəlcə gərək dağın başında oxuyan quşu dərhal oxla vurasan. Elə ki, vurdun, ən uca qaya nərildəyib iki yerə bölünəcək, əjdaha kimi açılacaq, dağda-daşda nə qədər duman-çən varsa öz kamına çəkəcək. Pərzad dağda kimsəsiz, tənha görünəcək. Onu xoşluqla dilə tut. Çünki onun ixtiyarında bir yox, yeddi belə dağ var. O, dağdan-dağa keçsə, onu tutmağa ömrün çatmaz.

Koroğlu deyir:

- Sağ ol, ərəboğlu. Mən elə duman-çən hökmdarıyam. Belə dağlardan çəkinəcəyim yoxdu. Hər halda köməyin gərəyim olacaq. Bu yerlərin dilini yaxşı bilirəm. Mənim də məsləhətim budur ki, geri qayıdanda dağlarla yox, düzlərlə gedəsən. Yoxsa yol atının nalını tökər, mənzilə çata bilməzsən.

Əli ilə Koroğlu halal-himmət eləyib ayrıldılar.

Koroğlu günə bir mənzil gəlib Tilsimli dağa çatır. Dağın başında oxuyan quşu görür. Quş yerindən tərpənməmiş ox ilə vurur. Quşun qanı daşa dağılır. Bir nərilti, gurultu qopur ki gəl görəsən. Daş başından iki bölünüb əjdaha ağzı kimi açılır. Dağın dumanı, çəni çəkilib daşın qəlbinə dolur. Pərzad şehli güllərin, çəmənlərin içindən keçib atlıya tərəf gəlir. Pərzad soruşur:

- Atlı, de görüm kimsən?

- Koroğluyam, xanım. Səni sevən Bürcü Sultan Çənlibelə pənah gətirib. Məni sənin arxanca Telli Nigar göndərib.

- Bürcü Sultan atası xotkarın zülm yuvasında qalsaydı, mən ona getməzdim. Mən yoxsul kəndli qızıyam. Əgər Bürcü Sultan həmişəlik Çənlibeldə qalmağa söz verirsə mən səninlə qayıdaram.

Koroğlu dedi:

- Bürcü Sultanın başqa yolu yoxdu, geri qayıtsa, xotkar onu tikə-tikə doğrayar. Çənlibel Bürcü Sultanın ölən-qalan yeridi. Pərzad bu sözdən şad olur, Koroğluya qoşulub çənlibelə gəlir. Onun gəlişi ilə Çənlibeldə böyük şadyanalıq edirlər. Pərzadı Bürcü Sultana verirlər. Onlar əl-ələ verib xoşbəxt yaşayırlar.

### *219. Koroğlunun daş qalası*

Deyirlər, Koroğlu böyük bir çayın vadisində yurd salır. Gecə yuxuda ona deyirlər:

-Çay sahili sel yoludur. Ey Koroğlu, igidin arxası dağlardır. Oyan yuxudan. Qulaq as, Qırat hansı dağda kişnəsə, həmin dağda daşdan qala tik!

Koroğlu yuxudan oyanır. Uca bir dağa çıxır. Qırat kişnəyir.

Koroğlu gözlərinə inana bilmir, baxır ki, Qırat ayağı-dırnağı ilə qala üçün böyük him açır. Atın polad nalı daşa dəydikcə ətrafa qığılcım səpələnirdi. At qan-tərin içərisindəydi. Koroğlu Qıratın belinə keçə salır. Onun alnından, alma gözlərindən öpür.

Səhər dəlilər görürlər ki, Koroğlu yatağında yoxdur. Ürəklərinə müxtəlif fikirlər gəlir. Onu axtarmağa başlayırlar. Bir də görürlər ki, Koroğlu və Qırat bir dağın başındadır. Dəlilər gözlərinə inana bilmirlər. Koroğlu deyir:

-Bəli, möcüzədir. Daş qalanın binasını bir gecədə ayağı-dırnağı ilə Qırat qazıb.

Sonra Koroğlu yuxusunu danışır. Hər dəli çaylaqdan dağın başına yetmiş yeddi daş qaldırır. Yetmiş yeddi günə daşdan böyük qala tikilir. Yeraltı tünglərlə qalaya yollar, su arxları və bulaqlar çəkilir.

Qalaya «Koroğlunun daş qalası» deyilir. Bundan sonra Koroğlu ancaq daş qalalar tikdirir.

### *220. Koroğlu daşı*

Deyirlər ki, Koroğlu hara gedir getsin, Çənlibeldən özü ilə bir daş apararmış. Yatanda başının altına qoyarmış. Bu daş Koroğlunun həyanı, vətən daşı, yoldaşı olarmış.

Bundan başqa Koroğlu dəliləri bir yerə göndərəndə özü gizlənirmiş, amma harada

olduğunu bu daşla bildirərmiş. Dəlilər üstü nişanlı olan bu daşı yaxşı tanıyırlarmış.

Deyilənə görə, Koroğlu öz dəliləri ilə Zəngəzur dağına ova çıxır. Hərə bir tərəfə dağılır, hamı bir-birindən aralı düşür. Koroğlu dəliləri bir yerə yığmaq üçün Çənlibel daşını Zəngəzur dağının arasından keçən yola qoyur. Bunu görən dəlilər bir yerə toplaşırlar.

Koroğlu daşı yerindən tərpətmir. Deyir:-Qoy daş bizdən yadigar qalsın.

O vaxtdan bu daşa «Koroğlu daşı» deyirlər.

### *221. Nal daşı*

Laçın rayonunda Cağazur kəndi yaxınlığında dərin bir dərə var. Nal daşı dərənin o tayındadır.

Deyilənə görə, Koroğlu düşmənlə təkbətək vuruşur. Sonra da aradan çıxmağı qərara alır. Nərə çəkib Qıratı çapır, at quş kimi uçub dərənin o tayına düşür. Qıratın ayağının biri sal daşın üstə bərk dəyir və daşa nalının dərin izi düşür.

Həmin daşa «Nal daşı», «Koroğlunun nal daşı» deyirlər.

### *222. Koroğlu qalası*

Bolnisi rayonunun Qoçulu kəndinin sağında əzəmətli bir qala var. Bu qalaya «Koroğlu qalası» deyirlər. Həmin qala Koroğlunun adını daşıyan başqa qalalardan onunla fərqlənir ki, onun başında yeddi tonqal yeri var.

Deyilənə görə, Koroğlu yeddi min yeddi yüz yetmiş yeddi dəlisini döyüşə çağırarkən, qalanın başında yeddi tonqal qalatdırarmış. Hər dəli əlində

bir alov lopası yana-yana düşmənin üstünə gedərmiş.

### *223. Koroğlunun qılınclı daşı*

Kəpəzin ətəyində bir dağ var. Adına Dod dağı deyirlər. Həmin dağın başında böyük bir daş vardır. Yaxından baxanda bu daş böyük bir stola oxşayır. Deyirlər, Koroğlu həmişə döyüşdən yorğun qayıdanda gəlib o daşın üstündə oturub dincələrmiş. Ətrafın seyrəngahı bu daşın üstündən daha gözəl görünərmiş. Hücumdan qabaq bu daşın üstündə döyüş planları cızılarmış. Bir sözlə, bu daş Koroğlunun məsləhət yoldaşı, sirdaşı imiş.

Deyirlər, artıq Koroğlu qocalıbmış. Qolu qüvvətdən, səsi nərədən düşübmüş. Ancaq Misri qılınc öz kəsərində qalırmış. Həyatının son günlərini yaşayan Koroğlunu bir fikir təşvişə salır, narahat edir: «Birdən Misri qılınc başqa bir qüvvətli ələ keçə bilər. Birdən o əl sahibi xalqın qanına yerikləyən olar, xanların, bəylərin, padşahların xidmətində dayanar. Xalq üçün vuruşan Misri qılınc birdən xalqa qarşı çevrilər».

Çox götür-qoydan sonra Koroğlu Misri qılıncı götürüb həmin daşa çaxır. Misri qılıncın taleyindən rahatlaşan, arxayınlaşan Koroğlu oradaca ölür. Buna görə də xalq həmin daşa indi «Koroğlu daşı» deyir.

Həqiqətən həmin daş durur. Daşın ortasında paslı yarıq var. Deyilənə görə, həmin paslı yarıq Misri qılıncın yeridir.

### *224.Çənlibel*

El dağa köçəndə sürünü haylayan bir çoban gördü ki, başı duman-çən içində itmiş dağın döşü ilə bir qoca dırmaşır. Qoca xeyli dikələndən sonra dayandı, əyilib bir bitili daşı tərpətdi, döşünü verib qaldırdı, daş aşağı dığırlandı. Uzanıb bir üzünü şehli otlara söykədi.

Aran köçündə bu çoban o qocanı yenə həmin yerdə gördü. Qoca yenə də yerdən bir qaya qopardı, sinəsi ilə itələyib diyirlədi, yenə də yerə uzandı, bir üzünü otluğa yatırdı, yerə yapışıqlı qaldı.

Çoban fikirləşdi ki, bu qoca ya dəli olub, çöllərə düşüb, ya da burda bir sirr, bir möcüzə var.

Sürünü dağın döşünə yaydı. Yavaş-yavaş qocanın yanına qalxdı. Çağırıb onu oyatdı:

-Ay əmi, sən niyə belə edirsən?

Qoca gülümsündü:

-Qocalanın ağlı azalmırmı?! Mən yaşda kişidən bundan artıq nə gözləyirsən?

Çoban da dünyagörmüş, dünya yorub yola salmışdı. Baxdı ki, qocanın gözündən ağıl yağır.

-Əmi, məni niyə günaha batırırsan, vallah, səncə ağlım olsaydı dünyanın yiyəsi olardım.

Qoca da gördü ki, bu çobanı asanlıqla azdıra bilməyəcək, düzünü danışdı:

-Koroğlu eşitmisənmi?

-Hə.

-Dəmirçi oğlu Dəli Həsən eşitmisənmi?

-Hə, çox eşitmişəm. Onlardan mənə babam danışırdı.

Qoca üzünü üstündən duman-çən sürünən dağa tutdu:

-Bu dağ Çənlibeldir, mən də Dəmirçi oğlu Dəli Həsən. Çoban əvvəlcə elə bildi ki, Koroğlu da, onun dəliləri də sağdır, yenə də Çənlibeldədirlər. Amma

ağlına sığışdırmadı; axı ona Koroğludan danışan babası yüz yaşında, özü də çoxdan ölmüşdü. Bəs bu Dəli Həsən necə sağ qalıb? Çoban inanmadı.

- Əmi, -dedi, -insan da bu qədər yaşayarmı?

Qoca qalxdı. Əlini sal bir qayaya atdı, yeddi öküzə yük olası bir parça qopartdı, nərə çəkdi, başının üstünə qaldırıb dərəyə atdı:

-Yerə yat, qulağını yerə yapışdır, gör nə eşidirsən!..

Qaya parçası diyirləndikcə atlar kişnədi, Koroğlu nərəsi eşidildi, qılınclar cingildədi, əmudların, gürzlərin zərbindən yer titrədi. Yerin təkindən təzə bir nərə də qopdu. Bu, qocanın bayaqkı nərəsinin eyni idi, elə bil indiki səsi, çağırışı hələ də yerin altında çağlayırdı, daşırdı.

Çoban dikəldi. Qoca da qalxıb oturdu:

-İgidin hünəri, qoçaqlığı təkcə gözlərdə, könüllərdə yaşamır, daşlarda, qayalarda da saxlanır. Mən gündə bir dəfə gəlib o səsləri oyadıram, o günləri danışdırıram, qulaq asıram, ömrümü bunlar uzadır.

### *225. Eyvaz qayası*

Pəmpək dağının ətəyində qədim bir kənd varmış. Bu kənddə iki tayfa yaşayırdı. Bunlardan biri böyük, ikincisi isə kiçik tayfa idi. Böyük tayfanın adına Qəhrəmanlı, kiçiyinə isə Həmzəli deyirdilər. Çünki birinci tayfanın ağsaqqalının adı Qəhrəman; iknicisinin  adı isə Həmzə idi.

Bir gün Koroğlunun oğlu Eyvaz bu kəndin yanından keçərkən elin gözəli Niluferlə görüşür, hər iki gənc bir-birinə vurulur.

Qız bu əhvalatı anası Şamnura danışır. Anası da atası Toxtamışa deyir. Valideynlər bu işdən razı qalır. Qız da Eyvaza xəbər göndərir ki, gəl məni apar.

Bu xəbəri eşidən Həmzəli tayfası çox məyus olur ki, Qəhrəmanlı tayfası onsuz da güclüdür, Koroğlu ilə qohumluqdan sonra bunlara heç də söz demək olmaz.

Tayfanın ağsaqqalı Həmzə deyir:

- Pusquda durun, yolları kəsin, Eyvaz gələndə ona tor qurun. Hiylə ayaq açmasa biz məhv olarıq. Koroğlu bunu Qəhrəmanlı tayfasından görəcək və onları qılıncından keçirəcək. Bu gördüyümüz yerlər Həmzəli tayfasının əlinə keçəcək. Həmzəlilər Eyvazı tutub iki qayanın arasında quyuya salıb, üstünə iri bir qaya çevirirlər.

Dəlilər görürlər ki, Eyvaz qayıtmadı. Onlar Pəmbək dağlarına tərəf atlanırlar. Eyvazı Qəhrəmanlı tayfasından tələb edirlər.

Toxtamış qabağa çıxıb deyir:

- Qəhrəmanlı adını daşıyan tayfadan xəyanət çıxmaz. Burada nəsə hiylə var. Möhlət verin, Eyvazı bir də axtaraq.

Hər yana car çəkirlər. Eyvazın yerini bilənlərə, deyənlərə bəxşiş vəd edilir. Ənam heç kimə qismət olmur.

Çoxbilənlər bir yerə yığışıb tədbir tökürlər. Ağlı işə salırlar. Ancaq yenə bir nəticə hasil olmur. İgidlər at minib, qılınc qurşayır, dağ-dərəyə, elə-elata hay salırlar. Güclü-gücsüz çıxır. Fala baxanlar fal açır, rəmmallar rəm atır. Eyvazın yerini doğru, dürüst xəbər verən tapılmır. Hamı məyus olur. Fikirli baxışlar Nilufərə dikilir.

Nilufər Eyvaz eşqinə, Eyvaz məhəbbətinə sığınıb yatır. Yuxuda görür ki, Eyvaz iki qayanın arasında quyudadır, quyunun ağzına iri bir qaya qoyulub.

Səhər Nilufər qız yoldaşları ilə yuxuda gördüyü qayalığa gedir. Nilufər pəhləvan kimi çox güclü idi. qızların köməyi ilə daşı kənara atır, Eyvazı çağırır, Eyvaz oradan səs verir. Kəndir sallayıb Eyvazı çıxarırlar. Qızlar Eyvazı kəndə gətirirlər. Bütün el sevinir, dəlilər isə hamıdan çox sevinir.

Elin ağsaqqalı Qəhrəman kişi deyir:-Mən xainləri görsəm, tanıyaram.

Eyvaz camaata göz gəzdirir və deyir:

- Onlar burada yoxdurlar.

Kim yoxdursa, onları tapıb gətirirlər. Eyvaz onların yaxasından bir-bir tutub silkələyir.

Qəhrəman kişi deyir:

- Bunların ki, hamısı həmzəlidir. Məsələ aydındır.

Elə oradaca Eyvazla Nilufərə toy vururlar. Kopoğlu ilə Qərəmanlı tayfasının qohumluğundan sonra həmzəlilər oradan köçüb başqa vilayətə gedirlər.

Elə o vaxtdan həmin qayanın adı «Eyvaz qayası» qalır.

### *226. Dolaşaların söhbəti*

Ovçu Pirim oğlu ilə ova çıxmışdı. Dağı-dərəni çox-gəzib dolaşmışdı, əllərinə bir şey keçməmişdi, qayanın kölgəsinə çəkilib dincəlir, axşam sərinin düşməyini gözləyirdilər.

Ovçu Pirimin başına belə işlər çox gəlmişdi, ya bəzən ova-quşa qıymamışdı, ya da heç nəyin izini

tapmamış, uçarı-qaçarı görməmişdi. Oğlu isə yerə-göyə sığışmırdı, yeməli-oldu, olmadı gördüyü hər canlıya ox atmaq istəyirdi. Ona görə də, onların kölgəsində din-cəldikləri qayanın başına dolaşalar qonanda yayı üzünə çəkdi, nişan aldı.

Atası:

- Atma,-dedi:

Oğul əl saxladı. Dolaşaların qırıltısı kəsildi. Oğul soruşdu:

-Ata onlar nə danışırdı?

Ovçu Pirim dirsəkləndi, söhbətə başladı.

-Ana dolaşa deyirdi ki, dünən uzağa çox uçmuşdum. O dağa mən bir də yüz il bundan qabaq qonmuşdum. O vaxtkı cah-cəlalı görmədim, igid nərəsini, köhlən kişnərtisini eşitmədim. Dağ elə bil yasa batmışdı. Dağın ətəyində bir qoca əyləşmişdi. Onun saqqalı da ağ idi, dağın başı da. Baxan elə bilərdi ki, dağın ətəyində bir koma qar qalıb…Qoca uzun yol gəlib yorulmuş adama oxşayırdı, deyəsən, dincəlib dizlərini bərkitdikdən sonra dağa qalxacaqdı.

O yandan üç atlı çıxdı. Yaraqlı-yasaqlı idilər. Biri atını qabaqda sürürdü, deyəsən, böyük adam idi, belə olmasaydı, o biri atlılar ondan qəsdən geri qalardılarmı?!

Qocanı görüb atlarını saxladılar. Qabaqdakı nə dedisə, daldakının biri atını qocanın yanına səyirtdi.

- Ay qoca, - dedi, - ağa səni çağırır.

Qoca dikəldi, xəbər aldı:

- Sözü var?

- Bilmirəm.

- Bəs neynir?

- Gedək özündən soruş.

- De ki, qanacaqlı olsun.

- Ağaya heç elə sözü demək olar?!

- Onda get de ki, kardır – eşitmir, laldır – danışa bilmir, əl-ayaqla da heç nə qandırmaq olmur.

O, atını ağanın yanına səyirtdi, nə söylədisə ağa öz köhləninə bir hirsli qamçı çəkdi, at göyə sıçradı, qocanın tuşuna quş kimi səkdi. Ağa hiddətlə bağırdı:

- Buralarda ov varmı?

Qoca başını tərpətdi.

Ağa səsini endirib soruşdu:

- Öz gözlərinlə görmüsən?

Qoca başını yenə endirib qaldırdı.

Ağa fikirləşdi ki, qocanın qulağı darı dəlir, nökər onun çəmini tapa bilməyib. Səsini bir az da alçatdı:

- Hansı tərəfdə?

Qoca əlini sinəsinə tuşladı.

Ağa tutuldu. Şübhəyə düşdü: - Bu kişi nə sayıqlayır? İnsanın sinəsində, ürəyində də ov-quş olarmı? «Bəlkə bu sirr o sirlərin tayı deyil? Bəlkə onun gördüyü ov da hər ova bənzəmir?» - deyə düşünən ağa nökərin birinə əmr elədi ki, atını da, yarağını da qocaya ver.

Qoca yaraqlandı, atın belinə qalxdı. Ata bir təpik vurub yalına yatdı. Ağa da, atlı da onun tozuna güclə çatırdılar. Sonra qocanın atı ildırıma döndü, hər dəfə də bir gurultu qoparıb gözdən itdi. Aradan xeyli ötəndən sonra qucağında bir cüyür geri döndü. Cüyürü göyə atdı, qılıncını çəkib, havadaca iki böldü. Atını bir də çapdı, qaçaraqda bir dəfə də əyilib cüyürün bir yarısını, ikinci dəfə əyiləndə ikinci yarısını götürdü.

Ağa da, nökərlər də mat qalmışdılar. Qocada bu cavan hünəri hardandı? Axı, hər cavan da belə at çapa bilməzdi?!

Ağa soruşdu:

- Qoca, sən kimsən?

Qoca atdan endi, yaraq-yasağı açıb sahibinə qaytardı.

- Mən Koroğlu dəlisi Eyvazam, - dedi. – Gördüyünüz bu dağ da Çənlibeldir – Koroğlu dağıdır.

## *227.Papaq altında oğul olar*

Yasamaldan bir oğlan enir. Şəmkir çayına çatanda Çardaxlıdan gələn üç atlı oğlana çatır.

Atlılar öz aralarında qızğın mübahisə edirlər. Birinci atlı deyir:

Bu elatda mənim qabağıma çıxmağa hünər göstərən igid olsa, bundan sonra nə at minərəm, nə qılınc qurşayaram, nə də özümü igid sanaram.

İkinci atlı birincinin sözünə rəvac verir:

- Bəs necə? Götürək elə mənim özümü, bilsəm ki, bu basalaxda mənnən tən gələn igid var, baş uzadıb eşiyə çıxmaram, ayağımı üzəngiyə qoyub at belinə qalxmaram.

Yalnız üçüncü atlı arabir onların sözünü ağızlarına təpirdi.

-Ay uşaqlar, ay südəmərlər! Həmişə bir özünüzdən deyəndə, beş də özgədən deyin, bir özünüzü biləndə, beş özgəni bilin. Dilnən basmağnan, əlnən basmağın asiman qədər təfavütü var. Hər daşın altına salavay tullamayın… Nə bilirsən ordan sərçə uçacaq, ya qartal qalxacaq. Bura Koroğlu yurdudur. Hər dərədə bir dəli kəşt edir, hər papağın altında bir oğul var.

Bu üç atlı görür ki, gözəl papağı, çuxası, geyimi, xəncəri, yar-yaraşıqlı bir cavan oğlan çöpüklü bir at minib gedir.

Birinci atlı deyir:

- Bu cavanın geyimi gözəl, atı isə ölüdür. Gəlin bunun libasını, silahını alaq.

İkinci atlı birincinin sözünü təsdiqləyir:

- Görmürsən, qılıncı belinə yıxılır.

Üçüncü atlı yoldaşlarına yenə xəbərdarlıq edir:

- Birdən papaq altında oğul olar.

Sən demə, cavan oğlan bu söhbəti eşidirmiş.

Birdən qarşıya bir ceyran çıxır.

Cavan oğlan atlılara deyir:

- Gəlin, bu ceyranı ata basdırıb tutaq.

Atlılar deyir:

- Qardaş: at ceyrana çatmaz…

Oğlan ölü, çöpüklü görünən atı mahmızlayır, kəmənd atıb ceyranı tutur və qılıncla başını kəsir. Oğlan özündən basan atlılara deyir:

- Qurban olun, o yanınızdakına. Sizin də başınızı bu ceyranın başı kimi kəsəcəydim.

Üçüncü atlı deyir:

- İnandınızmı ki, papaq altında oğul olar.

Onlar Koroğlunun cavan dəlisi Eyvazı tanıyıb ondan üzr istəyirlər.

### *228.Qaragöl əfsanəsi*

Laçının Minkənd kəndi yaxınlığnda bir dağ gölü var. Adına Qaragöl deyirlər. Bu gölün qəribə sehri var. Günəş batandan, Ay doğandan sonra Qaragöldən qoşa qanadlı bir ağ at çıxıb gölün ətrafında otlayır. Bu atı görənlər də olub. At bəni-adəm görən kimi bərkdən kişnər, fini-fini ötər, ya

qaçıb tez gölə girər, ya da uçub bir dağa qonar, görünməz olar.

Deyilənə görə, bu elə Qıratın özüdü. Koroğlu qeybə çəkiləndən sonra o da Çənlibeli tərk edib bu gölü əbədi olaraq özünə məskən seçib.

### *229.Halaypozanın Çənlibelə gətirilməsi*

Dan yeri yenicə ağarırdı. Koroğlu yuxudan oyandı, Qırata baş çəkmək istədi. Tövlənin yanında bir adam qaraltısı gördü, heyrətləndi. Amma özünü o yerə qoymadı. Koroğlu soruşdu:

- Ey, kimsən?

- Adamam.

- Bilirəm adamsan. Deyirəm burada nə axtarırsan?

-Koroğlunun atını oğurlamaq istəyirəm.

Koroğlu özünü o yerə qoymadı:

- Elə mən də Qıratı oğurlamağa gəlmişəm.

- Qapı-baca bağlı ola-ola, biz Qıratı çıxara biləcəyik?

Oğlan dedi:

- Damın pərdilərini söküb üstünü açaram, səni içəri salaram, bu kəməndi Qıratın belinə dolayarsan, sonra çəkib onu damın belindən çıxardaram.

Koroğlunu heyrət götürsə də üstünü vurmadı. Damın belindən açılan yerdən içəri düşdü, kəməndi Qıratın belinə doladı. Koroğlu gördü ki, oğru doğrudan da Qıratı göyə çəkib aparır. Ağırlıq salmaq üçün atın ayaqlarından asıldı. Oğlan iki yükü birlikdə bacadan çəkib çıxartdı. Vaxt itirmədən Qıratın belinə sıçradı, köməkçisini də tərkinə aldı. Yolda Koroğlu soruşdu:

- Qardaş, adın nədi?

- Halaypozan.

- Bəs Koroğludan qorxmursan, birdən Düratı minib dalımızca gələr?

Halaypozan dedi:

- Mən Koroğlunun nə özündən, nə dəlilərindən, nə də Misri qılıncından qorxuram. Ancaq onun dəli nərəsindən qorxuram.

Atın tərkində olan Koroğlu ağzını Halaypozanın qulağına dayayıb dəli bir nərə çəkdi, dağ-daş silkələndi. Halaypozan Qıratın ayaqları altına düşdü. Koroğlu oğruya toxunmadan Qıratın ağzını döndərib Çənlibelə qayıtdı. Səhər dəliləri başına yığıb olub-keçənləri danışdı.

Handan-hana huşu başına gələn Halaypozan bildi ki, onunla Qıratı tövlədən çıxaran, tərkinə minən, dəli nərəli adam elə Koroğlu imiş. Onun igidliyinə vuruldu və düşündü: «Koroğlu gör necə igiddi ki, basdığını kəsmir. Məni öldürə də bilərdi, amma qıymayıb. Belə igidin dəlisi olmaq olar».

Halaypozan üz tutub Çənlibelə gəldi. Koroğlu onu tanıdı, xoşca qəbul elədi, şərəfinə ziyafət düzəltdi. Bundan sonra Halaypozan Koroğlu dəlilərindən biri oldu.

### *230.Koroğlu və Kəlpeysər*

Koroğlu bir də gördü ki, uzaqdan bir karvan gəlir. Dəlilərə dedi ki, karvanın qabağını kəsin, tacirlərdən bac alın. Dəlilər səs-səsə verib dedilər:

- A Koroğlu, həmişə karvan qabağı kəsməyə biz gedirik, bu dəfə özün tək get.

Koroğlu dinməz-söyləməz Qıratı çəkib mindi və yola düşdü. Karvana yaxınlaşanda gördü ki, haqqında çox eşitdiyi Kəlpeysər dəstənin içindədi. Bir istədi geri qayıtsın, ancaq dəlilərin «Bu dəfə get özün gətir» deməsi yadına düşdü. Koroğlu dinməz-söyləməz karvanın bir bölüyünün arasına keçdi. Qabağına qatıb Çənlibelə tərəf üz qoydu. İşi belə görən karvançılar Kəlpeysərə dedilər ki, icazə ver gedək quldurun işini bitirək. Kəlpeysər icazə verdi. Koroğlu birdə geri baxanda gördü ki, bir neçə atlı gəlir. Onlar yaxınlaşıb Koroğluya hücüm elədilər. Koroğlu qılıncsız, toppuzsuz atlıları şilküt elədi, atdan yerə sərdi. Kəlpeysər gördü ki, quldur o qədər də fağır bala deyilmiş. Dərhal atını minib özünü Koroğluya çatdırdı. Əvvəl Koroğlu ilə qılınc oynatdılar, bir şey hasil olmadı. Atdan düşüb güştü tutdular. O qədər güləşdilər ki, yer eşim-eşim oldu. Hər ikisi də taqətdən düşdü, hərəsi çəkilib bir tərəfdə oturdu, nəfəsini dərməyə başladı. Kəlpeysər soruşdu:

- Ayə, kimsən, nəçisən, bizi niyə belə eyləyirsən?

Rəqibi dilləndi:

- Mənə Çənlibelli Qoç Koroğlu deyərlər.

Bunu eşidən Kəlpeysər qorxudan yerində donub qaldı. Handan-hana özünə gəldi. Öz əli ilə Koroğluya bir bölük yüklü qəflə-qatır bağışladı. Koroğlu karvanın parasını qabağına qatıb Çənlibelə üz qoydu. Dəlilər karvanı görüb utandılar. Sözləşdilər ki, Koroğlu Qıratdan düşəndə əlimizin üstündə havada tutub saxlayaq, bəlkə günahımızdan keçə. Dəlilər dedikləri kimi elədilər. Koroğlu onların günahından keçdi.

Muğan adlanan bir kənddə iki gənc yaşayırdı. Bunlardan biri qoçaq bir cavan olan Sarvan, o birisi isə Muğanın yaraşığı Gözəl idi. Bunlar yenicə evlənmiş, kasıb olsalar da çox mehriban bir ailə qurmuşdular.

Gözəl və Sarvan Arpaçayın sahilində boya-başa çatmışdılar. Gözəl Arpaçayın zərif, incə qızı kimi ad çıxarmışdı. Sarvan da Muğanda at çapmaqda, qılınc oynatmaqda şöhrət qazanmışdı.

Muğan camaatı əkinçilik və bənnaçılıqla məşğul olurdu. Sarvan özünü xoşbəxt sayırdı. Çünki bütün Muğan onu sevir, ona hörmət edirdi. Bir də o, Muğanın gözəli ilə evlənmişdi.

Aylar, illər keçdi. Gözəl hamilə oldu. Doqquz ay, doqquz gün, doqquz saat, doqquz dəqiqə keçəndən sonra Gözəl dünyaya bir qız gətirdi. Gəlin ana qızı olduğunu görüb çox sevindi. Ancaq özü çox zəif idi, getdikcə halı pisləşirdi.

Bütün Muğanın biliciləri tökülüşüb gəldi. Amma gəlinə heç bir kömək edə bilmədilər.

Gözəl ölüm yatağına düşdüyünü duyub Sarvanı yanına çağırdı, dedi:

- Əzizim, Sarvanım, mənim səndən bir xahişim var, qulaq as deyim. Məndən sonra evlənəcəksən evlən, amma qoyma balamı incitsinlər. Mən ömürdən yarımadım, barı osa yarısın. Körpəmizə hələ də ad qoyulmayıb. Adını mən verdim, yaşını Yaradan versin: Sara! Qoy hamı qızımı Sara çağırsın.

Mənim sözüm bu idi… indi də balamı gətir, qoy sonuncu dəfə onunla görüşüm.

Sarvan tez Saranı gətirib Gözələ vermək istədi. Amma yetişmədi… Gözəl artıq gözlərini əbədi

yummuşdu. Sarvan ağladı, ürəyində ağladı… Sara… balaca məsum körpə də elə bil anasının ölümünü duyub atasına qoşuldu, bərkdən qışqıraraq ağladı.

Ən ağır dəqiqələrində körpəsinin səsini eşitcək gözlərini açan Gözəl, bu dəfə Saranın qışqırmasına cavab vermədi. Bala səsini eşitmədi.

Gözəli torpağa tapşırdılar.

Sarvan Gözəlin hər dediyini etdisə də evlənmədi. O, Saranı qayğısız böyütməyə çalışırdı. Sara evdə oturmur, tez-tez Arpaçayın sahilinə gəlirdi. Qız heç kəslə oynamır, yalnız Arpaçayla oynayırdı. Arpaçay da sanki Saraya öyrəşmişdi; qız sahildən gedəndə kədərlənir, sakit-sakit axır, gələndə isə sevincindən aşıb-daşırdı. Bütün Muğan camaatı bu qızı görəndə Gözəli xatırlayıb deyirdilər:

- Sara lap elə Gözəlin özüdür ki, durub. Torpağı sanı yaşasın.

- Gözəl də uşaq çağlarını Arpaçayın sahilində keçirib, Sara da.

- Gözəl də Muğan gözəli idi, Sara da.

Belə deyənlər çox idi. Amma heç kəs istəmirdi ki, Saranın həyatı Gözəlin həyatına oxşasın.

Beləcə Sara qayğı bilmədən Arpaçayın sahilində oynaya-oynaya böyüdü.

Qızlar bulağından su içdi.

Qızı istəyən çox idi. Sara bu cavanlardan gözəl bir gənci – Xançobanı sevdi.

Xançoban çobanlıq edirdi. Onu bütün Muğan camaatı sevirdi; çox qızlar gizli-gizli onun həsrətini çəkirdi, o, isə təkcə Saranı sevirdi. Kəndin mötəbər qocaları Saranın atasına elçi düşdü. Ata qızının razılığı ilə onu Xançobana ərə verdi.

Muğan düzünə yaz gəldi. Xançoban sürüsünü yaylağa aparmalı oldu, o, Sarası ilə görüşüb ayrılanda, təzə gəlin ondan üzülüşmək bilmədi, ağladı, Xançoban bundan kədərləndi və soruşdu:

- Mənim Saram, sən axı niyə ağlayırsan? Bir-iki gündən sonra qayıdıb səni də aparacağam.

Sara dedi:

- Heç özüm də bilmirəm niyə ağlayıram… Səndən ayrıla bilmirəm, ürəyimə damıb ki, sən gedəndən sonra bir bədlik olacaq. Bəlkə bir də səni görməyəcəyəm, ondan qorxuram.

Xançoban güldü və Sarasının ipək tellərini sığalladı:

- Qorxma, gülüm, -dedi,- heç nə olmaz.

Çoban sürüsünü çəkib dağlara getdi.

Sara Xançobanı yola salandan sonra köhnə dostu Arpaçayın sahilinə gəldi, oturub fikrə daldı.

Bu vaxt ölkənin xanı çayın qırağından keçəndə Saranı görüb durdu, hərisliklə qıza tamaşa etməyə başladı.

Sara yad gözlərin ona zilləndiyini görmədi. Arpaçay isə gördü. Saranı qısqandı. Bu yad baxışlardan qəzəbləndi, aşdı-daşdı, Saranı öz qoynuna aldı, apardı, sonra da heç nə olmayıbmış kimi sakit-sakit axmağa başladı. Bütün Muğan camaatı tökülüb gəldi. Saranı oturduğu yerdə görməyib kədərləndilər, ürəklərinin ağrısı qəmli bir mahnıya çevrildi… O gündən həmin mahnı dillər əzbəri oldu:

***Arpa çayı, aşdı-daşdı,***
***Sel Saranı aldı qaçdı…***

## *232.İ n t i q a m*

Deyirlər ki, qədimdə Arpaçayın sahilində bir kişi yaşayırmış. Onun Saray adında gözəl bir qızı varmış. Saray hələ uşaqlıqdan əmisi oğlunu sevirmiş, əmisi oğlu da Sarayı. Saray boya-başa çatdıqdan sonra atası onu qonşu kənddən olan varlı bir adama ərə vermək istəyir. Bunu eşidən oğlan qızı qaçırmaq istəyir. Ata bunu duyur və mane olur. Oğlan əmisindən heyif almaq üçün çox fikirləşir.

Oğlanın bir atı var imiş. Sarayın gəlin köçməsinə az qalmış, oğlan atı tövləyə salır. Ata üç gün arpa verir, amma bir gilə də su vermir. Saray gəlin gedən gün atı bəzəyib toya gəlir, əmisinə deyir:

- Mən atımı Saraya bağışlayıram; istəyirəm ki, Saray bu atla gəlin getsin.

Arpaçay yaz yağışından sonra daşıbmış. Üç gün su içməyən at suyu görcək çaya cumur… Sellər onu gəlinlə birlikdə alıb aparır.

Deyirlər ki, Arpaçay hər il o vaxt aşıb-daşır.

## *233. A p a r d ı s e l l ə r S a r a y ı...*

Xançoban tayfasından Nuru adlı bir oğlan Şamaxı yaxınlığındakı Məlikçoban tayfasından Saray adlı bir qıza nişanlı idi. Yaz vaxtı idi. Toy başlandı.

Bu tayfalardan biri çayın bu tayında, o birisi isə o biri tayında idi. Oğlan evindən bir dəstə adam balabançılarla bərabər çayı keçib, Məlikçobanlı tayfasına, Saraygilin qapısına, gəlini aparmağa gəldi. Burada xörək hazır deyildi. Xörək bişinəcən,

yeyilənəcən axşam düşdü, hava qaraldı. Oğlan evinin adamları gəlini ata mindirib çayın qırağına gəldi. Biri dedi:

- Su elə gündüzkü qədərdir.

Başçı dedi:

- Azacıq artıb.

Kor yengə -Minabacı dedi:

- Çəkilin belə, mən balağımı çırmalayıb keçim. Çayda su nə gəzir?

Onun belə ürəkli danışması kişiləri cürətləndirdi. Atları suya vurdular. Heç iki qədəm getməmişdilər ki, gəlin minən at çayın çökək və dərin yerinə düşdü. Saray utandığından əlini yüyənə uzada bilmədi; su atı bükdü, qaranlıqda qız at qarışıq suya yıxılıb batdı. Kişilərdən biri bunu gördü, səs düşdü, atları geri qaytarıb qırağa çıxdılar. Lakin heç kəs cürət edib suya girə bilmədi, su da get-gedə artırdı, qaranlıqda göz-gözü görmürdü, adamlar çay aşağı çox yüyürdülər, çayın qıraq tərəflərində çox axtardılar. Lakin su daha da artdı, sel Sarayı apardı. Səsə, ağlaşmaya bütün Məlikçoban tökülüb gəldi. Sabaha kimi axtardılar. Saray tapılmadı. Kişilər axtarmağa, arvadlar isə ağız açıb, boğaz yırtmağa başladılar. Artıq sel yatdığı üçün Xançobanlı camaatı da çayı keçib onlara qoşuldu. Ağlaşma başladı:

N u r u n u n a n a s ı:

***Arpa çayı aşdı, daşdı,***
***Sel Sarayı aldı, qaçdı,***
***Nuru qaldı gözüyaşlı,***
***Apardı sellər Sarayı,***
***Bir ala gözlü balanı.***

S a r a y ı n a n a s ı:

***Arpa çayı dərin olmaz,***
***İçmə, suyu sərin olmaz,***
***Saray kimi gəlin olmaz.***
***Apardı sellər Sarayı,***
***Bir başı şallı balanı.***

S a r a y ı n b i b i s i:

***Düyünü tökdüm tabağa,***
***Bişmədi, qaldı sabaha.***
***Kor yengə düşdü qabağa***
***Apardı sellər Sarayı,***
***Bir üzü xallı balanı.***

N u r u n u n b i b i s i:

***Gedin deyin Xançobana,***
***Getməsin bu qış Muğana,***
***Getsə düşər nahaq qana,***
***Apardı sellər Sarayı,***
***Bir ala gözlü balanı.***

N u r u n u n a n a s ı:

***Gətir bura xas paltarı,***
***Qara boya as paltarı,***
***Oba geysin yas paltarı,***
***Apardı sellər Sarayı,***
***Bir üzü xallı balanı.***

N u r u:

***Alça dəyib dərməmişəm,***
***Dərib çığa sərməmişəm.***
***Mən Sarayı görməmişəm,***
***Apardı sellər Sarayı,***
***Bir ala gözlü balanı.***

S a r a nı n a n a s ı:

***Ceyran endi düzə gəldi,***
***Erkəciynən sözə gəldi.***
***Saray balam gözə gəldi,***
***Apardı sellər Sarayı,***
***Bir ala gözlü balanı…***

### ***234. S a r a , A r p a ç a y v ə ə j d a h a***

Deyilənlərə görə, Sara çox gözəl imiş. Sərv boylu, incə belli, ağ buxaqlı, alma yanaqlı Saranın bədənində günəş şoxu kimi heyrətli bir işıq varmış. Qızın aşiqi, dəli-divanəsi sandan keçibmiş. Lakin Sara öz ürəyini Xançobana veribmiş.

Saranın gözəlliyinə təbiət də vurğun imiş. Rəvayətə görə, zaman-zaman kükrəyib daşan Arpaçay və onunla düşmən kəsilən bir əjdaha Saranın vüsalı üçün alışıb yanırmış. Onlar qızla qovuşmağa fürsət axtarırlarmış.

Bir gün Sara sevgilisi Xançobanın yollarına baxmaq üçün kənddən aralanır. O, yavaş-yavaş gəlib Arpaçayın sahilinə çatır. Çayın həzin və yanıqlı nəğməsi, ləpələrin narahatlıqla oynaşması qızı təəccübləndirir. Çay hiss olunmadan coşmağa, qabarmağa, onun ayaqlarına doğru sürünməyə başlayır. Birdən kükrəyib Saranı ağuşuna alıb aparır. Arpaçayın Sara ilə vüsala yetdiyini görən əjdaha qısqanclıq qəzəbi ilə özünü çaya vurur. Çayı soğub Saranı xilas edir. Əjdaha qızı kamına çəkib özü onunla vüsala yetmək istəyir. Lakin Saranın gözəl bədəninin şoxu əjdahanın gözlərini qamaşdırır. Bunu görən Arpaçayın selləri, suları yenidən kükrəyir, hayqırır. Sahil boyu aşıb-daşan çayın ağ köpükləri yenidən Saranı öz qoynuna alır. Əjdaha isə bu vüsalın həsrətinə, qısqanclığına dözməyib Arpaçayın sahilində ürəyi partlayır.

### *235. Oğuzun təəccübü*

Çox qədim zamanlarda yer üzündə oğuz adlanan həddindən artıq ucaboylu insanlar yaşayırmış. Bu insanların ən kiçiyinin boyu ən hündür ağaclardan belə uca imiş. Oğuzların özləri kimi atları, qoyunları, mal-qaraları da iri və yekə imiş.

Bu oğuzların ikisi Qafqaz dağlarında yaşayırmış. Bunların biri ana oğuz, o birisi isə onun oğlu oğuz imiş. Ana və bala burada xoşbəxt və şad-xürrəm yaşa-yırmışlar.

Günlərin birində oğlan ova çıxarkən yolda özünə oxşayan balaca boylu bir məxluqa – insana rast gəlir. Onu tutub anasının yanına gətirir.

Anası tapılan bu kiçik məxluqu göstərib deyir:

Sən hələ bunu tanımırsan? Oğlum, bizim gələcək nəsli bunlar əvəz edəcək.

Oğlan təəccüblə bu xırda məxluqa baxıb deyir:

Yəni bunlar dolana biləcəklər?

Anası:

Boylarının elə balaca olmağına fikir vermə, sən onun ağlını sına.

Oğlan fikirləşərək öz-özünə deyir:

Yaxşı, indi mən ona bir torba arpa verəcəyəm. Aparıb atın başına keçirsin. Görüm bunu bacara biləcəkmi?

Oğuz belə də edir. Torbanı tapdığı adama verərək başa salır ki, atı yemləmək lazımdır. Balaca adam din-məz torbanı götürüb atın yanına gedir.

Ana və bala bacadan baxaraq onun necə hərəkət edəcəyini izləyirlər. O, ata yaxınlaşır və atı səsləyir. At yem torbasını görərkən başını torbaya tərəf əyir. Elə bu zaman kiçik adam torbanı cəld atın başına keçirir.

Oğlan anasına tərəf çevrilərək:

Doğrudan da sən haqlısan. Bunlarda həm cürət, həm də ağıl var.

Anası başı ilə onun sözünü təsdiqləyir.

### *236. Pərvanə əfsanəsi*

Pəri adlı bir qız olur. Bu qız həm varlı ailədən, həm də çox gözəl olur. Bu qızı bir oğlan sevir. Elə sevir ki, lap  həyatı qədər. Qız da oğlanı ürəkdən sevir. Oğlan qızın dərdindən gecələr yata da bilmir. Bir gün o, qıza elçi göndərir, amma atası qızı vermir. Çünki bütün elat qəm-kədər içindəydi. Xeyli əvvəl Yanardağ tərəfdən gələn düşmən tayfalar bu elatın

odunu-ocağını tamam söndürmüşdü. İndi bir ocaqdan da tüstü çıxmırdı. Belə bir halda toy kimin yadına düşərdi? Ancaq məhəbbət heç bir şeylə hesablaşmır.

Oğlan məhəbbətindən əl çəkmir. Bir gün yenə elçi göndərəndə qızın atası deyir ki, əgər oğlan gedib Yanardağdakı oddan bir parça gətirərsə, qızı verərəm.

Qız atasının şərti çox ağır idi. Gücsüz, köməksiz tək oğlan düşmən tayfasının əlindən necə od ala bilərdi. Ancaq oğlan bircə an da tərəddüd etmir. Fikirləşir ki, şücaət göstərə bilsə, həm camaatın ocağı yanar, həm də sevgilisinə qovuşar.

Oğlan gözdən yayına-yayına Yanardağa gəlib çatır. Odu götürəndə onu görüb tanıyırlar. Tez oğlanı mühasirəyə alırlar. Vəziyyətin çıxılmaz olduğunu görən oğlan odla özünü odlayıb irəli atılır. Hamı heyrətlənib ona yol verir. Oğlan yana-yana öz obalarına çatır. Son nəfəsdə sevgilisinin ocağına yıxılıb ocağı yandırır. Ocaqlar yansa da, oğlan həlak olur.

Qız öz sevgilisinin məhəbbət yolunda odlarda yandığını eşidən kimi göylərə yalvarır ki, məni elə bir canlı et ki, ömrüm boyu mən də öz sevgilimin oduna həm isinim, həm yanım, həm də onun dövrəsində hərlənib, sonra ölüm. Göylər onun sözünü eşidir. Onu pərvanə edir.

Ona görə də, Pəri daima odlara yanmağı, məhv olmağı özü üçün şərəf bilir. Pəri də o zamandan öz sevgilisinin dəlisi, divanəsidir: Pəri-divanə, Pərvanə…

### *237. Ağlayan söyüd*

Belə rəvayət eləyirlər ki, keçmişdə bir zalım şah varmış. Onun övladı yox imiş. Şah bunun fikrini çox çəkərmiş. Nəhayət, şah bir gün yatarkən görür ki, onun sarayının başına şeyda bülbül qonub oxuyur.

Bülbülün məftunedici səsi ətrafa yayıldıqca saray adamları pəncərələri açıb heyranlıqla zərif quşun mah-nılarına qulaq asırlar. Bülbülün nəğməsi şahı da maraqlandırır. Elə bu ara bağçadan başqa bir bülbül dimdiyində nəğmə, tək bülbülə yaxınlaşır. Onlar qo-şalaşıb qoşa nəğmə oxumağa başlayırlar. Şah buna qə-zəblənir, öz oxunu çıxarıb bülbülləri öldürür.

Şah yuxudan oyanır, rəmmal çağırıb yuxunu yozmasını əmr edir. Rəmmal deyir:

- Şah sağ olsun, sizin bir qızınız olacaq, amma onu öz oxunuzla öldürəcəksiniz.

Şah buna inanmır. Aradan bir neçə vaxt keçdikdən sonra həqiqətən, şahın bir qızı olur. Şah qızına xüsusi tərbiyə verir. Qız on beş yaşına çatanda gözəllikdə tayı-bərabəri tapılmır. Şah hər gün qızının taleyi və təxti-səltənəti haqqında fikirləşir. O, sevimli qızını elə bir sərkərdəyə, elə bir şahzadəyə vermək istəyir ki, onun qüvvəti, qüdrəti kürəkəninin hesabına birə-beş artsın.

Həqiqətən qıza çox yerdən adlı-sanlı, şücaətli, mərifətli adamlar elçi düşür. Ancaq qız heç birinə könül vermir. Şah qızının hərəkətlərinə həm təəssüflənir, həm də qəzəblənir. Çünki gözəl imkanlar dalbadal
əldən çıxır. Sən demə şah qızı könlünü sarayın qəddi-qamətli, ədəbli, cavan bağbanına veribmiş.

Çuğul bu məsələni şaha çatdırır. Şah qeyzə gəlsə də, qulaqlarına inanmır. O, hər şeyi gözləri ilə görmək istəyir.

Hər gün qız eyni vaxtda yoxa çıxır. O saatlarda axtarıb bağbanı da tapa bilmirlər. Şah bu sirrə məəttəl qalır.

Bağban bağın ortasında, çarhovuzun kənarında öz əlləri ilə bir söyüd ağacı basdırıbmış. Sevgililərin görüş yeri həmin söyüdün altı imiş. Onlar burada heç bir qorxu, təhlükə hiss etmədən gələcək taleləri barədə arxayın söhbət edərlərmiş. Adətən göyə doğru qol-budaq atan bu qəribə ağac, aşiqləri görən kimi budaqlarını salxımlandırar, aşağıya əyilər, iki növcavanı tamamilə görünməz edərmiş.

Çox çəkmir çuğul bu sirri də görür və şaha xəbər verir. Şah bu dəfə qızı daha diqqətlə izləyir və deyilən-lərin həqiqət olduğunu görür. Arzularının puç olduğunu görən şah dözə bilməyib oxu kamana qoyub atır. Hər ikisini oxdan keçirir.

Bu əhvalatdan sonra söyüd bir daha saçaqlarını torpaqdan qaldırıb günəşə baxmır. Nakam məhəbbətin faciəsinə ağlayır. Həmin vaxtdan deyirlər ki, başını əyən söyüd – ağlayan söyüddür.

## *238. Səhra əfsanəsi*

Əmioğlu ilə əmiqızı bir-birini sevirdi. Nəhayət, evlənib, əhdlərinə çatırlar. Amma onların sevincləri uzun çəkmir: qızın bədəni birdən-birə yara tökür. Oğlan yer qalmır ki, onu aparmasın, ancaq dərdinə dava-dərman tapılmır.

Həyatından bezmiş oğlan belə qərara gəlir ki, əmim qızıdır, boşasam – məni el qınar, yaxşısı budur aparım atım bir səhraya, qurd-quş yesin.

Oğlan qızı bir səhraya gətirir, onu aldadıb aradan çıxır. Qız səhrada tək qalır. Ərini çox gözləyir, o gəlib çıxmır. Qız bilmir hayana getsin. İns-cins görünmür, səs-səmir eşidilmir. Əlacı kəsilən qız, ağlaya-ağlaya biyabanın ümid bağladığı tərəfinə üz tutur. Bir az gedir ki, ayağının biri lilliyə düşür. Ayağını palçıqdan çıxaranda gözlərinə inanmır. Qılçasındakı yara yoxa çıxır. O, ikinci ayağını da palçığa salır, o da sağlam olur. Həmin palçıqdan ovuclayıb bədəninə sürtür. Canında bircə yara da qalmır, anadangəlmə kimi olur. O, quşa dönür, yüyürür, elə bil qaçmır, uçurdu. Çox gedəndən sonra acdığınıhiss edir. Boylananda yamacda bir qoyun sürüsü görür. Sürüyə tərəf gəlir. Çoban görür ki, ona tərəf bir qadın gəlir.

Soruşur:

Ey zənən, nə ənni-cinnisən ki, bu səhrada tək-tənha gəzirsən?

Qadın deyir:

Hələ bir parç süd ver, ağlım başıma gəlsin.

Çoban bir qara qoyunu tutub sağır, südü ona verir. Qadın qara qoyunun südünü içəndən sonra özünü daha da yaxşı hiss edir.

Qadın sözə başlayır ki, çoban, mənim ərim bu səhrada ov dalınca getdi, məni itirdi.

Çoban deyir:

Nə olar, qayıdıb gələr, qal yanımda, sən də ol mənim bacım.

Oğlan üç gündən sonra darıxır. Deyir: «Belə etibarsızlıq olmaz. Gedim, heç olmasa, meyidini tapım, gətirim».

Oğlan səhrada çox gəzir, heç nə tapa bilmir. Qayıdıb gələrkən gözü yamacdakı qoyun sürüsünə sataşır. Sürüyə çatanda gözlərinə inanmır, sevgilisi gəncliyində olduğu kimi gözəl idi, su sonasına oxşayırdı. Oğlan çox sevinir.

Qız başına gələnləri ona danışır. Oğlan qızın qolundan tutub: «Dur gedək», - deyir.

Qız inadla:

Mən buradan heç yana getmərəm-deyə cavab verir.

Oğlan tayfasını da köçürüb bu yerə gəlir, orda məskən salırlar.

## *239.Naftalan əfsanəsi*

Bir dəfə tacirlər indiki Naftalan ərazisindən keçirdilər. Burada çoxlu bulanıq sulu göllər vardı. Onlar ilk dəfə belə göllərlə rastlaşdıqları üçün şübhələnib, ehtiyatlanırlar. Heyvanlara ziyan dəyməsin deyə dəvələri bərk-bərk göllərdən qoruyurlar. Gecə növbə ilə keşik çəkirlər ki, birdən heyvanlar özünü gölə vurar.

Onların karvanlarında həddindən artıq arıq, yorğun, həm də xəstə bir dəvə vardı. Yük götürməyən, karvanla ayaqlaşmayan bu dəvə sahiblərini cana gətirmişdi. Və-ziyyətin daha da ağırlaşdığını görən karvanbaşı onu kar-vandan çıxarmağı əmr edir:

Belə heyvanın uzun müddət əzab-əziyyətlə ya-şamağındansa, gölün suyundan zəhərlənib biryolluq tələf olması yaxşıdır. Ayrı əlac yoxdur, biz də yazığıq, bu heyvan da.

Səhərisi karvan başçısı xəstə dəvəni orada qoyub yola düzəlir. Bir müddətdən sonra karvan həmin çöldə, həmin yolla geri qayıdarkən xəstə dəvə ilə rastlaşır. Görür ki, xəstə dəvə tamamilə dəyişib – kökəlib, sağlamlaşıb. Onlar mat-məəttəl qalırlar. Maraqlanıb, dəvəni izləyirlər. Baxırlar ki, dəvə bir gölün sahilində çox gəzinir, gölə tez-tez girir, çimir, sonra da kənarında yatır. Onlar gölə əl vurarkən onun su deyil, yağ olduğunu görürlər. Belə düşünürlər ki, xəstə dəvəyə şəfa verən, onu bu cür dəyişdirən bu yağın hikmətidir. Bunu yəqinləşdirmək üçün onlar yağdan bir az götürüb yaralı yerə sürtürlər. Həmin yara tezliklə sağalır.

Beləliklə, təkcə onlar yox, bu yerin yaxınlığında yerləşən kəndlərin camaatı da həmin yağdan bir dərman kimi istifadə etməyə başlayırlar. Onlar bu yağa «Naftalan» adı verirlər.

### *240. Gilan qarısı*

Naxçıvanda bir şəhər xarabalığı var. Buna «Xaraba Gilan» deyirlər.

Əfsanəyə görə, Gilan hökmdarının bircə qızı varmış. Bu qız elə gözəl imiş ki, günə deyərmiş sən çıxma, mən çıxım, aya deyərmiş sən çıxma, mən çıxım; o çöldə, həyət-bacada görünəndə hamı onun tamaşasına çıxarmış.

Bir gün Gilan hökmdarı qızını yanına çağırıb deyir:

- Qızım, qızıl xəzinəmin yerini sən bilirsən. Get, mağaradan xeyli qızıl gətir. Sənə əlavə saray qur-duracam. Gün doğan tərəfi fil sümüyündən, gün batan tərəfi isə quş sümüyündən. Gərək sən

imarətdən çıxanda hamı tamaşana dursun. Sənə həmin bərli-bəzəkli imarətdə toy vurduracam.

Qız sevincək yola düşür. Mağaranın dərinliklərinə girir. Qızın qulağına gurultu gəlir. Əlində qızıl bayıra çıxanda görür ki, Gilan yerlə-yeksan olub. Deyib-gülən insanlardan, bərli-bəzəkli evlərdən, imarətlərdən, çarşı bazarlardan əsər-əlamət qalmayıb.

Gilanın xarabalıqlarında tək-tənha qalan qızın başı bircə gecədə elə ağarır ki, qız qocalıb qarı olur. Qız xaraba Gilanı gördükcə qəhərlənir, dərdi gündən-günə artır. Dərdini pünhan-pünhan çəkmək üçün mağaraya çəkilir.

Deyirlər ki, xaraba Gilan qarısı hər yeddi ildən bir mağaradan çıxıb şəhərdən soruşur:

- Sən abadsan, yoxsa yenə də bərbad.

Sonra da seyr edib köks ötürür, ağlayır və təkrar mağaraya çəkilir.

## *241. Başıkəsik günbəzlər*

Qarabağda usta Vəlini tanımayan yox idi. Onun da özü kimi qabiliyyətli şəyirdi vardı. Şəyirdi Məhəmməd yetim idi. Hüseyin xanın qızı Həcəri o da sevirdi, ustanın oğlu Əlif də.

Məhəmməd dərdini heç kimə açmırdı. Axı, onun kimi vardı ki, elçi gedə, xanın qızını ona istəyə, «hə»sini ala, toy tədarükü görə. Çox da ki, Məhəmmədin qızıldan qızılı, puldan pulu vardı, neçə ilin qazancını üst-üstə yığmışdı,  bu varı bir qatıra yükləsələr, götürə bilməzdi. Onun işində böyüklüyü, ağsaqqallığı usta Vəli eləyə bilərdi, o da öz oğlunun yüngülünü qoyub, özgənin ağırı altına girərdimi?!

Usta Vəlinin oğlu neçə ay, neçə il dözmüşdü, ata-anasından bir haray çıxmadığını görüb dilə gəlmişdi, özünü yeyib tökürdü ki, Həcəri mənə almasanız, özümü öldürəcəm, sizi gözüyaşlı qoyacam, oğul deyib, oğul eşidəcəksiniz.Usta Vəli əlindəki yarımçıq işi qutarandan sonra Hüseyin xanın qapısına elçi gedəcəkdi. Onu bu yandan da şəyirdinin dərdi almışdı. Baxıb gördü ki, Məhəmməd günbəgün geri gedir, yarpaq tək saralır, cuna tək yuxalır, qollarında əvvəlki hey qalmayıb, bir dağa gücü çatası adam indi bircə qucağa sığışası xırda daşı, beşcə bellik palçıq təknəsini qaldıra bilmir. Usta neçə dəfə onun dərdini soruşurdu. Məhəmməd kal cavab ve-rirdi. Axı şəyird necə deyərdi ki, usta, Həcərin diva-nəsiyəm. Sənin oğlun da onun dəlisidir, oğlunu unut, məni tut. Necə söyləyərdi ki, bir günbəz başlamışam, gecələr orada əlləşirəm ki, xan məndən çoxlu qızıl-pul, qırx gün qırx gecənin toy xərcini istəyəndə, mənim bu qədər haqq-muzda gücüm çatsın.

Usta bir gün çay-çörəkdən sonra, şər qarışanda öz şəyirdini qarabaqara izləyir. Məhəmməd uclanıb kənd-dən çıxır. Kəngərli qəbiristanlığına girir. Usta Vəli da-yanıb fikirləşir: yəqin kimsəsizlik dərdi ürəyinə yük olub, hər axşam atasının, anasının qəbirləri üstə gəlir, ürəyini boşaldır. Usta geri qayıtmaq istəyir. Bir də görür ki, yox, Məhəmməd yarımçıq bir günbəzə girdi, hara-dansa bir qız peyda oldu, o da ora varid oldu. Usta quru-yub yerində qalır: «bu mahalda məndən başqa da günbəz ustası var ki, ad-san çıxara? Bəlkə Məhəmməd məndən ayrılmaq fikrinə düşüb, bu günbəzi də o başlayıb? Bəs o qız kim idi? Onun qəbiristanlıqda, özü də gecə vaxtı, nə iti azmışdı?

Yox, burada bir sirr var…»Usta asta addım-larla günbəzə yaxınlaşır. İçərini dinşəyir. Şəyirdinin qəmli pıçıltılarını, qızın isə ürək-dirək verən cavablarını eşidir. Qızı söz-söhbətdən tanıyır, bilir ki, bu, Hüseyin xanın qızı Həcərdir, dərdindən oğlunun dəli-divanə ol-duğu qızdır.

Usta beli sınmış kimi sürünə-sürünə evinə gəlir. O, gecə səhərə kimi yata bilmir. Biri oğlu, digəri şagirdi, bunların hansından keçsin?

Səhər Güllücəyə yollanır. Başını bağlamaqda olduğu günbəzin üstünə çıxır. Xeyli oturub fikirləşir. Bir də görür ki, şəyirdi də gəlir. Amma yorğundur, üzgün-dür, elə bil gecə səhərə kimi daş daşıyıb.Məhəmməd ustanın dillənməyini gözləmir, palçıq tutur, sonra da bir daşı barının başına qaldırır. Usta Vəli daşı saxlaya bilmir, daş Məhəmmədin başına düşür.Şəyirdinin ölümünə ustanın ürəyi tab gətirmir, o da canını tapşırır.

Ustanı Güllücədəki, şəyirdi isə Kəngərlidəki yarımçıq günbəzdə dəfn edirlər. O vaxtdan həmin kəndin adı «Kəngərli», oğlanın dəfn olunduğu günbəzin adı isə “Başıkəsik günbəz” qalır.

## *242. Eşq Abdal*

Xındırıstan xanı Teymurun övladı olmurdu, sonsuz idi. Ömür-gün yoldaşı Xatun xanımı da çox istəyər, amma uşaq görəndə ürəyinin başı göynəyirdi. Qalmışdı odla su arasında: nə sevimli arvadından keçir, nə də arzusunun gözlərində qalmasını istəyirdi.

Bir gecə Xatun xanıma dedi:

- Başımıza nə çarə qılaq?

Xatun xanım da fikirləşmişdi. Bilirdi ki, sonsuzluq dərdi Teymur xanın könlündə tüğyan edəcək, bir gün bu evdə qara yel kimi əsəcək, xeyir-bərəkətini qaçıracaq, isti bucaqlarını soyudacaq. O, xanın bu sözlərini çoxdan gözləyirdi. Hara gedəydi? Təzədən kimin qoynuna qısı-laydı? Səmt-sorağına bələd olduğu bu evdə qalıb qaravaş olmaq, özgənin, yadın çölü yağ, içi zəhər tikəsindən dadlı olmazdımı?!

- Xan,-deyə Xatun xanım ərinin qılığına girdi,- fal açdırmışam, sonsuzluğun günahı məndədir. Sən evlən, mən də olum təzə xanımın kənizi…

Xatun özünü sevinir təki göstərdi,- sənin övladın, ya mənim, nə təfavütü?.. Bunu sənə çoxdan demək istəyirdim, qorxurdum acığın tutar.

Teymur xanın baqqal Həsən adlı bir kəndlisi vardı. Seyrək görüşürdülər, amma bir-birinin xətrini uzaqdan-uzağa çox istəyirdilər.

Teymur xanı baqqal öz evinə bir dəfə qonaq çağırmışdı. O gündən gözü Həsənin qızı Sənəmdə qal-mışdı.

O, baqqalın qapısına elçi göndərdi. Baqqal «yox» deyə bilməzdi. Xanla qohum olurdu, qızını hörmət-izzəti dünyanın yarısını tutan bir kişiyə verirdi.

Qırx-gün, qırx gecə toy vuruldu.

İllər keçdi. Sənəmin bir qızı oldu. Adını Eşq qoydular. Eşqi yayda yaylağa, qışda ovlağa apardılar, yağ içində böyrək təki bəslədilər. Qızın üstündən acı yellər əsmədi, onun başına qızmar günlər, şaxtalar, sazaqlar dəymədi. Xatun xanım onu hamıdan çox əziz-lədi, özünü nənə kimi tanıtdı. Axşamlar nağıl danışıb yatırırdı, səhərlər mahnı

oxuya-oxuya oyadırdı. Eşq hər şeyi ondan soruşdu, hər gizli sözünü, dərdini ona danışdı.

Eşq böyüdü, gözəlliyinə gözəllik, göyçəkliyinə də göyçəklikdə çatan olmadı. Teymur xanın qapısına elçi elçi dalınca gəldi. Axırda qızı Paprəvənd xanın oğlu Səlim bəyə nişanladılar. Amma Eşq onu sevmirdi, başına çəmənli rəncbərinin oğlu Abdullanın havası düşmüşdü. Özləri də dağ köçündə görüşmüşdülər. O vədə Xatun xanım çoxdan götürdüyü, belə bir qayalı, uçurumlu yolda gərək olacağını düşünüb saxladığı cırıq, hörmə papağını Eşqin atının altına atmışdı. At qızı götürüb qaçmışdı, özünü hara gəldi, vurmuşdu. Neçə dərədən, sıldırımdan, neçə çınqıllıqdan dördnalla keçmişdi. Çəmənli köçündən atın bir qızı qaçırdığını hamı görmüşdü, amma özünü irəli verən təkcə Abdulla olmuşdu. Abdulla atını yelə döndərmişdi. Eşqin atını qabaqlamış, dibi görünməz bir uçurumun başında qızı hop götürüb ölümdən qur-tarmışdı, bu gözəl qızın atı isə sıldırımdın düşüb tikə-tikə olmuşdu.

O vaxt Eşq özündən getdi. Abdulla qızı çəmənliyə uzatdı, papağında bulaq suyu gətirib qızın üz-gözünə səpdi. Qız ayılanda elə bildi dünyaya təzədən gəlib: Xilaskarına vuruldu. Bir dəfə arana köçəndə görüşdülər. Əhd-peyman bağladılar. Bir yaz köçündə də bir-birinə qoşulub qaçdılar. Teymur xan bu yandan, Səlim bəy də o yandan xəbər tutdu. İki qoşun onların dalınca düşdü. Atların kişnərtisi göylərə dirək oldu. Çölləri torpağın tozu basdı.

Abdulla ilə Eşq öz el-obalarından çox aralanmamış baxıb gördülər ki, iki qoşun sel kimi onların üstünə gəlir, hərəsi də bir yandan. Bu sellərdən can qurtarmaq müşkül işdir. Tez bir

qəbiristanlığa dönürlər. Abdulla Eşqə özünün bir dəstə təzə paltarını geyindirir ki, qızı tanımasınlar, elə bilsinlər iki oğlan, iki tay-tuş harasa gedir. Amma bunun xeyri olmur: hər iki qoşunun gözü onları çoxdan almışdı.

Abdulla və Eşq qəbiristanlıqdan çıxıb yola düzəlmək istəyəndə onları oxa tuturlar. Aşiqlər günbəzdə daldalanırlar. İki selin qabağında iki pöhrə neyləyə bilərdi?!

Günbəzdən iki fəryad qopdu. Oğlan son nəfəsində: «Eşq!»-deyib qızı, qız isə qırıq bir nalə ilə oğlanı çağırdı: «Abd…al!»

İki fəryad Çəmənli çöllərini üşütdü. Üçoğlan örüşlərini titrətdi. Camaat hər yaz «Eşq Abdal»ın ziyarətinə axışdı.

### *243. Şıxdursun*

Bəhram şahın maral duruşlu, ceyran baxışlı, gülüşü nəğmə, danışığı mahnı, səsi dağ havası, nəfəsi ətir qoxulu bir qızı vardı. Adı Dursun. Qışda da gəzməyə çıxanda elə bilirdin dünyaya təzə bir bahar gəlib.

Cavanşir şahın oğlu Elçinə də tay olası oğul hardaydı?! Kürəyinin ortasında iki adam gizlənərdi. Beli üzükdən keçərdi. Qollarında fil gücü vardı. Əlini ipə-sapa yatmaz atların qulağına bircə dəfə çatdıran kimi muma döndərərdi. Onun atdığı ox göylərdə süzüb gözdən itərdi.

Elçin Dursuna yamanca bənd olmuşdu. Qız da onun dərdindən az qalmışdı dəli-divanə olub çöllərə düşsün. Dursunu Cavanşir şahın vəziri Zöhrab da sevirdi. Zöhrab bilirdi ki, Elçinin gözü olan qızı ona verməzlər. Şah oğlu hara, Allahın bir vəziri hara.

O, bir gün Bəhram şaha bir namə göndərdi. Yazmışdı ki, şah oğlu Elçin pis niyyətli, pis nəfəsli bir cavandır, neçə qızı bədbəxt eləyib, neçə atanın namusuna kəsir gətirib, neçə qardaşın papağını xirtdəyinə keçirib, neçə dayını xəcalət eləyib. İndi o kələkləri sənin gözəl qızının da başına gətirmək istəyir. Qızının quşu uçub, Elçinə qonub, biabırçılıq bu gün-sabah qurşağa çıxacaq. Sən buna dözəcəksənmi?

Bəhram şah Cavanşir şahın qalasına qoşun göndərir. Tapşırır ki, bircə adam da öldürməyin, yaralamayın, təkcə Elçini tapıb gətirin, bu, baş tutmasa, onda anasını qaçırın. Qoy məni bədnam eləmək istəyənin namusu əllərdə qalsın.

Bəhram şahdan xəyanət gözləməyən Cavanşir şah qoşunu cəm saxlamırdı, beş-altı keşikçidən başqa bir əsgərin də gecə yuxusuz qalmasına razı olmurdu. Hər dəstə bir kənddə, bir obada gecələyirdi. Halayların komlanmasına azı bir gün vaxt lazımdı ki, çaparlar səhərdən axşama, ya da axşamdan səhərə kimi at çapaydılar, haray salaydılar.

Bəhram şahın qoşunu Cavanşir şahın qalasını mühasirəyə alır, içəri doluşurlar. Elçini tapmırlar. Cavanşir şahın nə özünə, nə müqavimətinə rast gəlirlər. Demə, şah öz oğlu ilə bir həftəlik ova çıxıbmış, başının kiçik bir dəstəsilə çöldə gecələyibmiş.

Bəhram şahın qoşunu təkcə Zibeydə Xatunu götürüb geri qayıdır. Cavanşirin arvadını zindana sa-lırlar. Dursun xəbər tutur, Elçinin anasını xəlvətcə öz otağına gətirir, xata-baladan qoruyur. Cavanşir şaha da soraq göndərir ki, namusun mənim himayəmdədir.

Cavanşir şah qoşunu toplayıb hücuma keçir. Qoşunlar neçə gün, neçə gecə qılınc çalır, at oynadır, ox atır, gürz vurur, qan su yerinə axır, qıranla qırılan məlum olmur. Cavanşir şah bu yanda Bəhram şahın qoşununun başını qatanda o yandan qalaya bir dəstə adam göndərir ki, Zibeydə Xatunu tapsınlar, aradan çıxarsınlar. Bəhram şah məğlub olan məqamda onun övrətinin başına pis oyunlar açdırmasın, ona göz dağı verdirməsin.

Bəhram şahın qalasına keçən dəstədə Elçin də, vəzir Zöhrab da vardı. Cavanşir şah oğlu Elçini qəsdən göndərmişdi ki, ana qeyrətini oğul hamıdan yaxşı çəkər, amma Zöhrab özü könüllü getmişdi, guya şaha sədaqətli idi, onun uğrunda hər əzaba dözməyə hazır idi.

Zöhrab öz dəstəsindən ayrılıb gizli yollarla Bəhram şahın hüzuruna gedir. Ona ərz edir ki, Cavanşirin oğlu Elçin qaladadır, sənin qızını axtarır, bu saat onun mənzilini tapıb həm onu, həm də anasını aradan çıxaracaq, sonra da gəlib səni öldürəcək. Elçin çox qoçaqdır, ona nə ox batır, nə də qılınc kar edir, kəməndə saldırmaqdan özgə çarəsi yoxdu.

Bəhram şahın adamları əl-ayağa düşəndə Dursunun qasidi Elçini tapır, əhvalatı ona danışır. Elçin dəstəsini çəkib aparır. Aradan xeyli keçmiş Zöhrab vəzir tövşüyə-tövşüyə özünü Cavanşir şahın yanına çatdırır, diz çöküb deyir:

- Oğlunuz Elçin Bəhram şahın yanına getmişdi. Ona söz verdi ki, Dursun mənim olsa, atamın qoşununu aldadıb qalanın bir tərəfinə aparacam, o biri yandan sənin qoşunun çıxar, onların arxasına keçər, bununla da aşlarının suyunu verərlər. Ey şah, oğlunuz sizə xəyanət etdi, ona bel bağlamayın.

Cavanşir şah vəzirinin sözlərinə inanır, cəllada əmr edir ki, oğlunun boynunu vursun.

Cəllad oğlunu atanın gözləri qabağında qətlə yetirmir. Daldaya, çəkir, onun paltarını bir əsirə geyindirir, öldürür, sonra da qanlı geyim-gecimini gətirir.

Elçinin öldürüldüyünü Dursuna xəbər verirlər. O, oğlan paltarını geyinib Cavanşirin qoşununa qoşulur.

Zöhrab onu tanıyır, boğazının tez-gec çatıya keçəcəyini bilib Ərəbistana qaçır.

Zibeydə xatun «oğul!» deyib, «oğul!» eşidir, ağlamaqdan gözləri tutulur. Oğul dərdi Cavanşir şahı da üzür. Bu kədərə dözə bilmir. Bir gün arvadına deyir:

-Bu yerlər ac qurda dönüb məni yeyir. Oğlumuzun gəzdiyi çöllər, getdiyi yollar tikan olub gözlərimə sancılır. Gecələr yata bilmirəm, birdən mənə elə gəlir ki, yerin təkindən də onun naləsi qopur: «Ay ata, məni niyə öldürtdün, niyə bir az səbr eləmədin?» - deyir.

Zibeydə xatun:

- Köçək buradan, - deyir,-köçək!..

Cavanşir şahlığı təzə vəzirə tapşırıb Talıstana köçür. Bu vaxtlar ərəblər Azərbaycana hücum edirlər. Qorxuya düşən vəzir atını Cavanşirin yanına çapır.

- Ərəblər yel kimi gəlirlər,-deyir,-bizim qoşun hələ davaya girişməmiş vahiməyə düşüb. Ey böyük şah, qoşunumuzun qabağınca özün getməsən, el-obamız ərəb atlılarının dırnaqları altında qalacaq.

Cavanşir atlanır. Qoşunun içinə gələndə görür ki, ərəb atlılarının arasında bir döyüşçü boğanağa dönüb, qılıncını şimşək təki oynadır, sağdan vurub

soldan çıxır, soldan vurub sağdan çıxır. Neçə batman ağırlıqda gürzü bir əlində çöp kimi oynadır, kimin başına endirirsə, atdan kəlləsi üstə yerə enir.

Cavanşir şah bir də baxanda ərəblərin arasında Zöhrabı görür. Qan beyninə vurur. Ancaq həmin «boğanaq» ondan da bərk qəzəblənir, qılıncı necə endirirsə, Zöhrabın hər şaqqası yerə düşür.

Cavanşir özünü ora çatdırhaçatdırda ərəblər o «boğanağın» qılınc çalan qolunu vururlar, sonra da gürz oynadan qolunu çapırlar. O, atdan yerə yıxılmır, at onu götürüb geri qaçır.

Cavanşir ərəb qoşununu pərən-pərən salandan sonra həmin yaralının yanına gəlir, onun: «Məni Elçinin qəbrində basdırın»,-deyə pıçıldadığını eşidir.

Cavanşir şah çaşır, ağlı başından çıxır, soruşur:

- Sən kimsən?

- O cavab verir:

- Mən Bəhram şahın qızı Dursun - Elçinin sevgilisiyəm. Elçin öldürülən gündən onun atasının qoşunundayam, onu əvəz edirəm.

Dursun gözlərini yumur, bir də açmır.

Cavanşir şah oğlunun qəbrini axtarmaq istəyir, bu vaxt cəllad deyir:

- Şah sağ olsun, Elçini öldürmədim, Elçin sağdır.

Cavanşir şah sevindiyindən az qalır dəli olsun. Elçini tapdırır və ona tapşırır:

- Tez ananın yanına get, səsini eşidən kimi gözlərinə işıq gələcək. Sonra da Dursunu Talıstanda dəfn elə, üstündə günbəz tikdir. Qoy yorulan yolçular yayda, qışda orda daldalansınlar. Qoy ley görmüş quşlar da ora pənahlansınlar.

### *244. Xatun Çiçəyin tərlanı*

Quşçu xanının bir cüt əkiz qızı vardı. Qızlar böyüyüb həddi-buluğa çatmışdılar. Qızın birinin adı Xatun Çiçək, o birinin adı Xatun İpək idi. Xatun Çiçək Alp Ərən adlı bir oğlanı sevirdi. Oğlan da qıza qəlbən bağlanmışdı.

Qızlar əkiz olduqlarından xan hansını əvvəlcə gəlin köçürəcəyi barədə yaman tərəddüd edirdi. Qızların hərəsinin bir tərlan quşu vardı. Quşlar Quşçu xanın dadına çatır. Xan deyir:

- Qızlara deyin, quşları ötüşə buraxsınlar, kimin tərlanı Ağqalaya tez dəyib qayıtsa, əvvəlcə onun toyunu edəcəyəm.

Qızlar tapşırığa əməl edirlər. Ancaq yarış zamanı bədbəxtlik üz verir. Xatun Çiçəyin tərlanının ayağındakı bağ Ağqalanın daşına ilişir. Qız bu hadisədən çox pərişan olur. Xan isə bərk həyəcan keçirir. O, bunu xanlıq üçün qorxulu bir əlamət kimi qarşılayır. Elə bu an kimsə uzaqdan bir ox atır, ox daşa ilişmiş bağı qırır. Xatun Çiçəyin tərlanı xilas olan kimi elə coşur, elə qanad çalır ki, o biri quşu qabaqlayır. Xanın başında dolanan qara fikirlər dağılır. Görmədiyi, tanımadığı naməlum qəhrəmana böyük səxavət göstərir:

- Xatun Çiçəyi onun tərlanını xilas edən igidə ərə verəcəyəm.

Xatun Çiçək atasının qərarından çox məyus olur. Axı o, Alp Ərəni sevirdi. Quşçu xanı deyir:

- Tərlanı xilas edən oğlan meydana çıxsın!

Hamı sonsuz maraqla izdihama baxır. Xatun Çiçək nə qədər çalışırsa həyəcanını boğa bilmir.

Görəsən, onun yeni adaxlısı kimdir, necə adamdır? Fərqi yoxdur, özünü öldürəcək, amma sevmədiyi adama getməyəcək.

Elə bu vaxt adamların arasından Alp Ərən əlində yay-ox meydana çıxır. Xatun Çiçəyin köksündə ürəyi atlanır, üzü gülür. Bu hamının ürəyindən olur.

### *245. Tərlan vurulan*

Poladlı kəndi yaxınlığında kiçik bir obada bir ovçu yaşayırdı. O, hər səhər tezdən ova çıxardı. Ovladığı heyvanların və quşların əti ilə öz ailəsini dolandırardı. Onun Tərlan adlı şüvərə bir oğlu vardı. Ata hər dəfə ova gedəndə Tərlanı da özü ilə aparardı. O öz sevimli peşəsini həvəslə oğluna öyrədirdi. Uçan quşu, qaçan heyvanı, susan qaraltını nişana gətirməyin bütün sirlərini oğluna açmışdı.

Ata qocalırdı, zaman öz işini görürdü. Yavaş-yavaş, ara-sıra ovlar onun nişangahından yayınardı. Bu dağlarda, düzənlərdə bir gülləsi boşa çıxmayan ovçunun daha barmaqları tətiyə gecikir, gözləri qəflətən alaca-lanırdı.

Vaxt gəlib çatdı. Ata-bala sınaq ovuna çıxdılar. Bu günə qədər cavan ovçu hələ təkbaşına orman-meşələrə girməmiş, uca dağlara dırmanmamış, dərin dərələrə enməmişdi. Ovçular görüş yerini şərtləşib ayrıldılar. Bir-birinə «ovun qanlı olsun» duası oxudular.

Ovçular çox gəzib, dolaşdılar. Tərslikdən heç bi-rinin tüfəngi gözünün tuşuna qalxmadı. Hər ikisinin əli, torbası boş idi. Cavan ovçu sınaqdan

üzüağ çıxmaq üçün sönməz bir atəşlə alışıb yanırdı. Birdən qarşıda qaraltı göründü. Cavan ovçu hənirtisini içinə çəkdi. Tüfəngi qaraltıya tuşlayıb nişangaha gətirdi. Birdən-birə qolları boşaldı, elə bil onu doğma bir nəfəs vurdu. Titrək barmaq nə qədər uzandısa tətiyə çatmadı. Özündən asılı olmayaraq tüfəngi endirdi, qaraltını səslədi:

- Ey, kim var orda, dillənməsən vurdum ha!..

Dərhal ata ovçunun səsi havalandı:

- Mənəm, a bala! Nə yaxşı xamlığına salıb nahaq qan eləmədin.

Ata-bala sevincək görüşdülər. Tüfənglərini yerə qoydular. Süfrə açıb iştahla çörək yedilər. Yaxındakı bulağın gözündən su içib yenidən ayrıldılar.

Yorğun ayaqlar bir az da yoruldu. Elə bil ov ərşə çəkilmişdi. İlk dəfə idi ki, ata uğursuz, xeyirsiz ova çıxırdı. Nəhayət, ata ovçunun da gözünə bir qaraltı göründü. Kişi sevindiyindən heç bilmirdi neyləsin. Ovçunun yenicə gözünün çayırı açılmışdı ki, bu tərəfdən də qəribə bir həyəcan, təlaş onu bürüdü. Təcrübəli ovçu naməlum, sirli ovun qabağında açıq-aşkar titrəyirdi. Kişi özünü ələ almağa çalışır, fürsəti fövtə vermək istəmirdi. Ancaq özü də hiss etmədən soyuq lülə nişangahdan uzaqlaşır, əyri tətik barmağın altından qaçırdı. Ata ovçu nəsə duydu, nəsə hiss etdi. İstədi « ey, kim var orda, dillənməsən vurdum ha!..» deyə ağzını açsın. Tüfəng tələsib qabağa düşdü. Ata ovçudan əvvəl, o, ağzını açdı. Qaraltıdan qopan inilti qoca ovçunu - ata ovçunu sarsıtdı. Bu inilti Tərlanın səsi idi. Başına döyə-döyə özünü son nəfəsdə olan oğluna yetirdi. Onun qanlı sinəsini bağrına basdı. Tərlan son sözlərini dedi:

- Ustalığın göründü, ata!.. Tanrı mənim diləyimi hasilə yetirdi. Ovun qanlı oldu.

Həmin vaxtdan camaat bu müsibətli yerə «Tərlan vurulan» dedilər.

### *246. Ovçu Ayaz*

Ox atmaqda ad-san qazanmış Ayaz adlı ovçu bir oğlan var imiş. O, kəndlərindən varlı bir kişinin Gülgəz adlı qızını sevirmiş. Qız da onu sevirmiş. Ancaq qızın atası və qardaşı bu sevdaya razı deyilmiş. Onlar Gülgəzi qonşuluqda olan varlı-hallı, çox hiyləgər, amansız tədbirləri ilə neçə-neçə evlər dağıtmış, neçə-neçə ocaqlar söndürmüş bir kişinin maymaq oğluna vermək istəyirmişlər.

Gülgəz atasının və qardaşlarının məqsədini bilir. Ayaza qoşulub dağlara qaçır.

Qızın qardaşı başına dəstə yığıb Ayazı axtarmağa başlayır. Ayaz bir dəfə qızın qardaşı alma dərdiyi yerdə oxla vurub əlindəki almanı iki bölür, bir dəfə oxla vurub papağını yerə salır. Odur ki, bacısını oğluna istəyən kişinin yanına gəlir. Varlı kişi maymaq oğlunun intiqamını almaq üçün hiyləsini, var gücünü işə salır.

- Oğlum, o sənə bu oxlarla işarə edir ki, öldürərəm, amma qıymıram, bu işdən əl çək. Onu bil ki, onu mərdi-mərdanə nə tuta bilərsən, nə də öldürə bilərsən. O, yenilməz bir igiddir. Sən ona nə etsən, hiylə ilə edərsən.

- Elə isə baba, mənə kömək elə, yol göstər.

- Qulaq as deyim. O, sərt bir qayada yapılmış tilsimli qalada yaşayır. Qalaya heç cür girə bilməzsən. Odur ki, bir maral vur, dərisini bütöv soy.

Həmin dərini ağır tərpənən bir eşşəyə geydir. Eşşəyi ala-toran apar qalanın qənşərindəki düzənliyə burax otlasın. Oğlan elə biləcək ki, bu doğruçu maraldı. Ovu görən kimi çıxıb, ona ox atacaq. Sən də yoldaşlarınla pusquda durarsan, onun ox atmağa başı qarışanda fürsəti itirməyib oxlarsınız.

… Qızın qardaşı qocanın dediklərinə əməl edir. Ovçu Ayaz otlayan «maral»ı görcək vurmaq üçün uca bir qayanın başına çıxır. Elə bu vaxt Gülgəz pusquda duran qardaşını və onun dəstəsini görür. Hiyləni başa düşür. Tez Ayazı qorumaq üçün onun qabağına keçir.

Amma artıq gec idi. Ox yaydan çıxmışdı. Kamandan çıxan ox geri dönməz. Nəmərd qardaşın atdığı ox Gülgəzin sinəsindən dəyib. Ayazın ürəyinin başına sancılır. Bir ox iki həyatı əbədi susdurur.

### *247. Qəlbin gözüylə*

Dərbənd tərəflərdə bu əhvalatı indi də bir möcüzə kimi danışırlar.

Aşıq Rəcəb anadangəlmə kor imiş. O, əsasını qayalara vura-vura Ehrək dağlarından enib, obalara çalıb-çağırmağa gedərmiş. Yazın əvvəl günləri imiş. Amma dağların başında qar var imiş. Aşağılarda isə təkəmseyrək pencər bitibmiş. Samur qəzasındakı Ehrək kəndinin yeddi qızı yol qırağında pencər yığırmış. Birdən görürlər ki, Aşıq Rəcəb budur gəlir. Əl saxlayıb onu gözləyirlər. Aşıq Rəcəb qızlara çatıb onlara salam verir. Qızlar onun salamını ehtiramla alırlar. Rəcəb əsasının ucu ilə qayanın dibində təkcə açmış nərgiz gülünü nişan verib deyir:

- Ay Hürü, o nərgizi dər mənə ver.

Qızlar baxıb gördülər ki, doğrudan da yaxındakı qayanın dibində bir nərgiz gülü açıb.

Qızları təəccüb götürür. Bir-birinə göz vururlar ki, qoy nərgizi başqa qız qoparsın, görək onu biləcəkmi?

Əsmər adlı qız əlini uzadır ki, nərgizi qoparsın. Aşıq Rəcəb səslənir:

- Olmaz.

Qəmər irəli durur. Aşıq onu da nərgizi üzməyə qoymur.

Beləliklə, altı qızın hamısı nərgizə əl uzadır. Lakin Aşıq Rəcəb onlara imkan vermir ki, nərgizi qoparsınlar.

Növbə Hürüyə çatır. Aşıq Rəcəb deyir:

- Hə, aşiqin nərgizini məşuq dərər.

Kor Aşıq Rəcəbin ilk açmış nərgizi görməsini və sevdiyi Hürünü yeddi qız içərsində tanıyıb seçməsini hələ də heyranlıqla danışırlar.

### *248. Kiçik xanım və çoban*

Keçmiş zamanda bir padşah yaşayırmış. Onun hərəmxanasında çoxlu gözəl varmış. Bu gözəllər padşahın qəlbinə girmək, onun məhəbbətini qazanmaq üçün öz aralarında daima rəqabət aparırlarmış. Bunların hamısını padşah yaxşı hiss edirmiş. Ancaq padşahı hərəmxanaya təzəcə gətirdiyi Kiçik xanım daha çox maraqlandırırdı. Hökmdar nə qədər gücündən, qüdrətindən, səxavətindən istifadə edirdisə bir şey çıxmırdı. Kiçik xanımın qəlbini ələ ala bilmirdi ki, bilmirdi. Padşah Kiçik xanımın başqasını sevməsindən şübhələnmişdi. Görəsən o xoşbəxt kim idi?

Sən demə Kiçik xanım padşahın öz çobanı ilə sevişirmiş. Kiçik xanım hələ hərəmxanaya zorla gətirilməmişdən əvvəl çoban ilə əhd-peyman bağlayıbmış. Onlar niyyətlərini böyüklərə açmaq istərkən padşahın təsadüfi görüşü hər şeyi alt-üst etmişdi. Hökmdar bir könüldən min könülə Kiçik xanımın gözəlliyinə vurulmuş, onu zorla hərəmxanasına gətirtmişdi.

Bir dəfə Kiçik xanım hovuzun kənarında gəzərkən çobanla qarşılaşır. Sevgililər peymanlarına sadiq olduqlarını bildirirlər. Onlar hamı yuxuya gedəndən sonra axırıncı bağda alma ağacının altında görüşməyə vədələşirlər.

Aradan bir müddət keçir. Padşaha xəbər verirlər ki, gecə yarıdan sonra hərəmxanadan bir nəfər axırıncı bağa gedir, səhərə yaxın qayıdır. Xanımı tanımaq olmur. Çünki o, hər gecə bir libas geyinir. Hökmdar güdükdə dayanır, özü ona xəyanət edən xanımın kimliyini aydınlaşdırmaq istəyir. Gecənin birində padşah sevgililəri yaxalayır. Ağıllı çoban özünü ələ versə də Kiçik xanımı aradan çıxarır. Padşah çobanın üstünə nə qədər dirənir, hədələyir, yağlı dilə tutur, qılıncla doğrayacağını söyləyirsə də, fədakar aşiq sirr vermir. Çobanla görüşənin kimliyi yenə qaranlıq qalır. Bu işdən bərk qeyzlənən hökmdar çobanı zindana saldırır.

Bu hadisə padşahı rahat buraxmır, gecə sübhəcən gözlərinə yuxu getmir. Dərdini vəzirə açıb ondan kömək istəyir. Dünyagörmüş, olduqca hiyləgər, xəbis bir adam olan vəzir şahına ürək-dirək verir:

- Burada o qədər də çətin məsələ yoxdur. Göz məhəbbətin aynasıdır. Biz bu aynada sizə xəyanət

edən rəzili açıq-aydın görərik. Sevən baxışlar qarşılaşanda sifətlər rəngdən-rəngə düşməlidir.

Bu söz-söhbət zindanda çobana da çatır. Çoban hiyləgər vəzirə ürəyində lənətlər yağdırır. O, Kiçik xanımın həyatı üçün təlaş keçirir. Doğrudan da baxışlar üz-üzə dayanıb, danışanda aşiqlər aşkar olacaq. Bu da Kiçik xanımın məhvi demək idi. Tezliklə etibarlı bir tədbir görülməli idi.

Vəzirin məsləhəti ilə padşah bütün hərəmlərini yaxındakı uçurumun kənarına toplayır. Əyanlar çobanı gözləri bağlı halda həmin yerə gətirirlər. Hərəmlər sıra ilə düzülürlər. Çobanın gözlərini açırlar. Padşahın hökmünə əsasən çoban bir-bir gözəllərin hamısı ilə baxışmalı idi. Qoy olsun. Çoban arxayındır. O, Kiçik xanımın həyatını xilas etmək üçün tədbir görmüşdür. Onu sakitləşdirmək üçün bu barədə sevgilisinə xəbər də göndərmişdir.

Gözəllərlə baxışma davam edir. Ancaq məhəb-bətin güzgüsündə bir şey görünmür. Çoban öz gözlərinə mil çəkmiş, başqa çıxış yolu tapmamışdı. Yoxsa baxışları toqquşar, danışar, ikisi də məhv olardı.

Çobanın baxışı sınmadı, rəngi dəyişmədi, səsi titrəmədi. Bu ola bilməzdi. Burada nəsə dərin bir əsrar vardı. Hiyləgər vəzir bunu hamıdan tez duydu. O, ucadan qışqırdı:

- Afərin çoban! Sən sınaqdan çıxdın. Dayanma, yoluna davam elə! Sənə uğurlar olsun!

Həyat işığından məhrum olan çoban qarşıda uçurum olduğunu bilmirdi. O, yoluna davam edirdi. Hamı təlaş və həyəcan içində idi. Çoban uçurumdan uçanda Kiçik xanımın fəryadı ətrafa yayıldı. O, çobandan sonra yaşamağın faydasız olduğunu görüb xəncəri ürəyinə soxub, özünü al qanına

qəltan elədi. Ancaq bundan sonra hamı çobanın sevgilisinin Kiçik xanım olduğunu bildi.

### *249. Nakam məhəbbət*

Çox qədim zamanlarda iki qonşu tayfa yaşayırmış. Lakin tayfalar bir-birilə düşmənçilik edirmiş. Onları yaxınlaşdırmaq, barışdırmaq mümkün olmurmuş.

Bir dəfə cavan bir oğlan öz tayfasının ərazisindən uzaqlaşıb gəzə-gəzə düşmən tayfaya məxsus meşəyə gəlib çıxır. Həmin tayfanın qızları bu zaman meşədə meyvə yığırlarmış. Necə olursa qızlardan biri dəstədən ayrı düşür və təsadüfən oğlanla rastlaşır. Oğlan qızın gözəlliyinə valeh olur və bir könüldən min könülə ona vurulur. Qızın da qəlbində oğlana məhəbbət oyanır. Gizli görüşlər bir müddət davam edir. Görüşlərin birində oğlan deyir:

- Nə qədər gizli görüşmək olar? Bizim məhəbbətimiz aşkara çıxmalıdır. Sabah sənə elçi göndərəcəyəm.

Qız oğlanın sözlərindən sevinir:

- Məhəbbət o vaxt düşmənçiliyə qalib gələr ki, arada cəsarət olsun.

Geri qayıdan kimi oğlan qərarını, niyyətini öz tayfasına çatdırır. Tayfa başçıları onun tutduğu işdən razı qalır. Çünki bu sevda, bu qohumluq düşmənçiliyi aradan qaldırmaq üçün yaxşı kömək olardı. Adətə görə tayfa ağsaqqalı qız üçün elçi göndərir. Ancaq düşmənçiliyi davam etdirmək fikrində olan qız tərəfi oğlanın elçilərini rədd edir. Bunu bilən oğlanla qız bir-birinə qoşulub qaçmaq qərarına gəlirlər. Bir neçə gün yol getdikdən sonra yorulduqlarını və yaşadıqları tayfadan

uzaqlaşdıqlarını görüb, bir dağdağan ağacının altında uzanıb yatırlar. Qızın və oğlanın qaçmasından xəbər tutan hər iki tayfanın adamları onları axtarmağa başlayırlar.

Dan yeri söküləndə qız dəhşət içərisində gözünü açır. Böyük bir əjdaha-ilan qızın ayaqlarını dizinə qədər, sonra bədənini bütöv udur. Oğlan əjdaha-ilana hücum edir. Xəncərlə onu doğrayıb öldürür. Cəld qızı ilanın qarnından çıxardır. Ancaq hər şey qurtarmışdı. Oğlan naəlac qalıb xəncəri köksünə sıxaraq özünü öldürür.

Bu vaxt tayfa dəstələri gəlib, hadisə yerinə çıxır. Vəziyyətdən hali olandan sonra günahlarının böyük-lüyünü görürlər. Onlar nakam məhəbbətin qurbanlarını dağdağan ağacının altında dəfn edirlər.

### *250. Tısbağa əfsanəsi*

Keçmiş zamanlarda adət belə imiş ki, çimmək vaxtı gələndə adamlar çayın qırağında qaynar qazan asıb çimərlərmiş. Həya-abrı hər şeydən üstün tutarlarmış. Buna görə də, həmin çimərliklər etibarlı yerdə, bütün nəzərlərdən gizli olan yerdə olarmış.

Bir gün gözəl bir gəlin çay qırağında çimmək istəyir. Ancaq bu gəlinin böyük bir eybi vardı. O yaman tənbəl idi. Bunun da ucbatından həmişə danlanırdı. Gəlin nə qədər çalışırdısa eybini düzəldə bilmirdi. Çünki tənbəlliyin daşını atmağı bacarmırdı. Elə tənbəlliyin ucundan gəlin çimərkən özünə etibarlı yer seçmir.

Gəlin sudan çıxarkən bir də görür ki, isməti, abır-həyası paklığını itirib. Yad bir kişi kənardan onun gözəlliyinə tamaşa edir. Gəlin dəhşətə gəlir,

çimdiyi ləyəni başına çevirib ismətini yad nəzərdən qoruyur. Allaha yalvarır ki, onu bu vəziyyətdən xilas etsin. Gəlinin arzusu yerinə yetir, o dönüb tısbağa olur. O vaxtdan bəri tısbağa insan görəndə yad nəzərlərdən qorunur, başını çanağında gizlədir.

### *251. Sehrlənmiş qız*

Qədim zamanlarda bir qız və bir oğlan varmış. Onlar bir-birini dəlicəsinə sevirlərmiş. Günlərin birində həmin qızı bir cadugər oğlan görür. O, qızın gözəlliyinə heyran olur.

Aradan bir müddət keçəndən sonra hər iki oğlan qıza elçi göndərir. Qız da, ata-anası da əvvəlki oğlanın elçisinə söz verirlər. Qız tərəfindən rədd cavabını alan cadugər oğlan bərk qəzəblənir. O, zorla da olsa qızı özünə arvad edib, rəqibinin gözlərini yaşlı qoyacağını söyləyir.

Cadugər oğlan qızı sehrləyir. Caduya düşən qız sevdiyi oğlanla əhd-peymanı, pozub sevmədiyinə ərə getmək istədiyini deyir. Hamı bilir ki, oğlan qızı sehrə salıb. Ancaq heç kimin əlindən bir şey gəlmir. Oğlan toy edib qızı evinə aparır.

Həmin gün xoşbəxtliyi tarımar olan oğlan ahu-zar içində çırpınır. Özgəsinin səadətini əlindən alanla haqq-hesab çəkmək istəyir. Ancaq sehrbaz oğlan evinin ətrafında keşikçilər düzdürür. Oğlan intiqam almaq, sevgilisini azad etmək üçün nicat yolu tapa bilmir. Odur ki, Allaha yalvarıb ondan kömək diləyir. Oğlanın arzusu yerinə yetir, o çevrilib ilan olur.

Gecə gəlin otağına ilan cadugərdən qabaq gəlir. Ehtiyatla qızın belinə sarılır. Qız ilandan qorxmur, əksinə onda doğmalıq, bir məhəbbət hiss

edir. Bu vaxt cadugər oğlan sərxoş halda içəri girir. Qəhqəhə ilə gülür:

- Mən səni sevdiyin oğlandan ayırdım. Onun gözlərini həmişəlik yaşlı qoymuşam. Səni sehrləyib özümü sevdirmişəm.

Cadugər bu sözləri deyib qızı qucaqlamaq istəyir. Bu vaxt ilan sevgilisini qorumağa qalxır. Qızın belindən açılıb cadugəri çalır. O saat da qız sehrdən azad olur.

Həmin vaxtdan deyirlər ki, ilan ancaq onu sancanı sancır.

### *252. Sehrli çubuq*

Qədim zamanlarda Borçalı torpağında bir xan varmış. Adına Quşçu xanı deyirmişlər. Dağların, düzlərin gözəli Çiçək xanın yeganə qızı imiş. Xanın varı-dövləti başından aşırmış. Gözü-könlü tox olan, ədalətini hər şeydən üstün tutan hökmdarın rəiyyəti də firavan yaşayırmış.

Xan qızını ölkənin adlı-sanlı, səxavətli, igid oğlu Uğura nişanlamışdı. Onlar dönə-dönə and içmişdilər ki, son nəfəslərinə qədər bir-birinə sadiq olacaqlar. Nə əsən acı külək, nə aclıq, nə işgəncə onların andını poza bilməz.

Borçalı torpağının qonşuluğunda zülmkarlıqda ad çıxardan, isti ürəkləri, isti ocaqları külə döndərən Sultan adlı bir xan da varmış. Həmişə ömrünü müharibələrdə keçirən xanın əhalisini səfalət bürümüşdü. Dilənçilik ayaq tutub yeriyirdi. Sultan Borçalı torpağının var-dövlətinin sel-su kimi axmağının sirrini öyrənmək üçün adamlar saldı.

- Xan, sizin bu kiçik torpağın böyük sərvəti nəyin hesabınadır? Mümkündürsə bu sirri bizə açasınız, camaatımız acından qırılır.

Borçalı xanı təmkinlə cavab verdi:

- Sirr yoxdur. Ədalət torpağa ədalət gətirər. Zülmlə yanan şam işıq saçmaz. Elçilər çox, sorğular çox, Quşçu xanın cavabı isə bir:

- Ədalət!

Sultanı qəzəb coşdurdu, kin-küdurət titrətdi. «Quşçu xanı firavan yaşamağın sirrini açmadı. Deməli, yenə qılınca əl atmaq, yenə müharibə aparmaq lazım gəlir. Sirri xoşla deməz, zorla dedirərəm».

Sultan qəflətən Borçalı torpağına hücum edir. Bunu gözləməyən xan igidləri təcili ayağa qaldırır. Uğur qoşunun başında dayanır. Qanlı vuruşmalar başlayır. Hər iki tərəf ağır təlafat verir. Buna baxmayaraq, Sultan xan qızı Çiçəyi ələ keçirir. Borçalı gözəlini görən kimi bir könüldən min könülə ona vurulur. Sultanın ürəyi əsir, qıza əsir olur. Qız Sultanı fikrindən daşındırmağa çalışır.

- Mənim Uğur kimi sevgilim var, - deyir.

Sultan əsəbləşir:

- Onu bil ki, Uğur da içində olmaqla bütün Borçalını qılıncdan keçirərəm, səni heç kimə vermərəm.

Sultanın qəzəbindən qorxan Çiçək yumşalır.

- Yaxşı, qoşunu içəri çək, az nahaq qan tök.

Sultan qoşunu geri çəkir. Qırğın dayanır. Bununla Çiçək öz xalqına olan borcunu çıxır. Amma əhdi-peymanına borclu qalır.

Sultanı bir qədər arxayın salan Çiçək özünü öldürmək istəyir. Ancaq Sultan ondan şübhələndiyi üçün gözətçilər qoyur.

Sultan Çiçəyə deyir:

- Bizim toyumuza az qalır. Gərək daha sən Uğuru yox, məni düşünəsən. Sizin ölkədəki əmin-amanlığın, firavanlığın sirrini mənə açasan. Atan həmişə bu sirri gizli saxlamış, məni şirin sözlərlə aldatmışdır.

Fürsətin ələ düşdüyünü görən Çiçək sevinir.

- Bəli, atam səni ədalət sözü ilə aldatmışdır. Onun möcüzələr yaradan balaca bir çubuğu vardır. Bu çubuğun sehrini oxuyub hara vursan, hansı səmti göstərsən, nə arzu etsən, dərhal çubuq onu yoxdan var edir. Siz müharibəyə başlayanda atam o çubuğu gizlətməyi mənə tapşırmışdı. Bax, o budur.

Sultan beləcə balaca çubuğun böyük qüdrətə malik olduğuna təəccüb edir.

- Sözlərinə necə inanaq ?

- Lap arxayınca məni öldür. Sonra sehr oxuyub çubuğu mənə vurarsan, dərhal diriləröm.

Sultanın şəkk-şübhəsi qalmır. Xəncərlə Çiçəyi öldürür. Sonra nə qədər sehr oxuyub çubuğu Çiçəyə vurursa, qız cana gəlmir.

Elə bu vaxt Uğur başının qoşunu ilə sarayı mühasirəyə alır. Sultanla təkbətək döyüşür və onu öldürür. Ancaq o, Çiçəyin cənazəsini görüb çox məyus olur. Sevgilisinin cənazəsini doğma Borçalı torpağına gətitib, orada dəfn edir. Uğur bu həsrətə dözməyib Çiçəyin məzarı üstə özünü xəncərlə öldürür.

Vətənin sehrli çubuğu Çiçəyi öz torpağına qaytarır, sevgililər bir yerdə dəfn olunurlar.

### *253. Qızlar yurdu*

Qışlaq kəndinin qəribə adət-ənənəsi var imiş. Yay vaxtı el yaylağa çıxanda həddi-buluğa çatmış qızlar ayrıca «Qızlar yurdu» yaylağına gedərmişlər.

«Qızlar yurdu»nda özlərinə başçı seçirmişlər. Hansı oğlan qızı sevirmişsə, ona ürək açmaq üçün «Qızlar yurdu»na yollanırmış. Oğlan gedib elçi daşının üstündə oturarmış. Qızlar gəlib onu öz başçılarının yanına aparармışlar. Oğlan hansı qızı istədiyini ona bildirərmiş. Qızı çağırarmışlar. Qız oğlanı sevirsə, onun qarşısında bir sınaq şərti qoyarmış. Bu şərtlər at çapıb ötüşməkdən, oxla almanı iki bölməkdən, ağır daşları qaldırmaqdan və qızın bir neçə sualına cavab verməkdən ibarət imiş.

Oğlan çətin sınaqdan məharətlə çıxan kimi qız öz güllü yaylığını oğlana verərmiş. Oğlan bu yaylığı bir nişanə kimi qızın anasına çatdırarmış ki, payıza qədər toy üçün hazırlıq görsün. Toylar kənddə el adəti ilə olarmış.

Adətin qəribəliyi onda imiş ki, qız seçmək, ər bəyənmək kimi çox məsuliyyətli bir işə valideynlər, ağsaqqalar qarışmazmış. Buna görə də cavanların qar-şısında çətin məsələ dururdu. Hər şeyi yoluna qoyan, səhvdən yayındıran, təsadüfdən uzaqlaşdıran sınaq idi. Sınaqsız bir gözəl igidə könül verməzmiş. Elə bunun üçün Qışlaq kəndindən ömrün keşməkeşli yollarında nə bir qoca, nə də bir cavan həyat yoldaşından giley-güzarlı deyilmiş.

Sevgi baş tutduqda oğlan güllü yaylıqla kəndə şad, baş tutmadıqda isə əliboş, kədərli qayıdarmış.

### *254.Komurad əfsanəsi*

Əli pəhləvan Qəbələ şəhərini mühasirəyə alsa da, qoşunu sudan keçirib qalanı özünə təslim edə bilmir.

Qalanın yolunu Zərnişan adlı bir yerli qadından öyrənir və qələbə qazanır. Əli pəhləvan həmin qadınla evlənir.

Bir neçə gündən sonra Əli pəhləvan şimala tərəf yola düşür. O, Zərnişandan ayrılarkən ona bir bazubənd verir və deyir:

- Sözsüz ki, bu səfərim uzun illər çəkəcək, biz gec görüşəcəyik. Al, bu bazubəndi saxla. Hərgah qızımız olsa, satıb cehiz xərci edərsən, yox, oğlumuz olsa, qoluna bağlayıb arxamca göndərərsən.

Zərnişanın oğlu oldu. Adını Murad qoydular. Murad böyüyüb pəhləvan cüssəli bir oğlan oldu. Tay-tuşlarından heç kəsin ona zoru düşmürdü.

Əli pəhləvanın ikinci dəfə yolu yenə də Qəbələ şəhərindən düşür. O görür ki, bir dəstə uşaq yolda oynaşır. Ancaq bunlardan biri çox qoçaq və cəsurdur. Tay-tuşlarını bir əli ilə atıb-tutur. Əli pəhləvan həmin oğlana yaxınlaşıb deyir:

- Məni də o cür atıb tuta bilərsənmi?

Oğlan çəkinmədən: «Bəli», deyir.

Əli pəhləvan oğlanı götürüb elə atır ki, uca bir qayanın başına dəyib parça-parça olur.

Bunu görən uşaqlar qışqıra-qışqıra deyirlər:

- Ko Murad, ko Murad!

Yəni «ko» olmadı, düz olmadı. Murad uşaqdır, sənsə böyük. Qüvvələr bərabər deyil.

Elə orada bir uşaq Əli pəhləvana yaxınlaşıb deyir:

- Onun atası xəbər tutan kimi yer üzündən nəslini kəsəcək.

Əli pəhləvan soruşur:

- O kimin oğludur?

- Tanımırsan, Əli pəhləvanın?

Əli pəhləvan kor-peşman evə gəlir. Zərnişan onun boynuna sarılır və deyir:

- Bilirsən, oğlumuz Murad nə igid olub?

Əli pəhləvan deyir:

- Daha Murad yoxdur…

Qadının əlləri yanına düşür.

Muradı o dağın yanında dəfn edirlər. Həmin vaxtdan dağın adı «Komurad» qalır.

### *255. Bələk daşı*

Nisə öz əmisi oğlu Sadığı sevib seçmiş, başqa istəyənlərin heç birinə «hə» deməmişdi. Sadıq kasıb olsa da, qız onu sevdiyi üçün dövlətlilərdən üstün tutmuşdu. Nisəni Sadığın evinə gəlin gətirdilər. Sadıqgil kasıb olduğundan Nisə üçün bir əməlli pal-paltar da almamışdılar. Nisə dövlətli oğlanların başqa qızlar üçün gətirdiyi paltarlara həsrətlə baxır, özünə təskinlik verirdi: «Eh, Sadığın bircə məhəbbəti mənə bəsdir».

Bir-iki il gəlib keçdi, Nisənin övladı olmadı. Qayınanası narahat olmağa başladı. Onu mamalara, falçılara göstərdi. Aparmadığı pir qalmadı, demədiyi nəzir, götürmədiyi qurban, paylamadığı sədəqə olmadı. Amma Nisənin uşağı olmadı ki, olmadı. Nisə artıq səkkiz il idi ki, ər evində idi. Əvvəlki bir-iki ili xoş keçmişdisə, sonrakı illərdə üzü gülüb könlü açılmamışdı. Əvvəllər təkcə qayınanası, sonra qayınatası deyinirdisə, son vaxtlar sevimli əri Sadıq

da açıq-aşkar narazılığını bildirir, övlad istədiyini eşitdirirdi.

Bir gün Nisə yuxuda gördü ki, dağda şiş bir qayanın başında yerə bir bələkli oğlan uşağı qoyulub. Kimsə ona dedi ki, o uşaq sənindir. Get, götür əmizdir.

Nisə hövlnak yuxudan ayıldı, yuxusunu heç kimə demədi. Səhər bir bəhanə ilə evdən çıxıb dağa getdi və yuxuda gördüyü şiş qayanı axtarmağa başladı. Bir xeyli gəzəndən sonra həmin qayalığı tapdı. Az qalırdı ki, ürəyi ağzından çıxsın. Qıçları titrəyir, ürəyi çırpınırdı. Güclə özünü qayanın üstünə çatdırdı. Birdən baxıb gördü ki, qayanın üstündə uşaq qundağına oxşayan bir uzunsov daş var. Gəlib daşı qucağına götürdü. Özü bəs deyincə ağladı. Sonra isə belə bir bayatı dedi:

***Ağlamışam başdan hey,***
***Təngə gəldim yaşdan hey.***
***Nə atan var, nə anan,***
***Yaranmısan daşdan hey.***

Sonra uşağa oxşayan daşı bələdi, qucağına göturub kəndə gəldi, utandığından evə girməyib, tövlədə bir qaranlıq bucağa qoydu. Gündə iki-üç dəfə gəlib daşa baxıb gedirdi.

Bu ara əri açıqca dedi:

- Əgər bu yazacan uşağın olmasa, gedib bir döşüsüdlü arvad alacağam. Səndən ötrü sonsuz olmayacağam ki…

Nisə çox ah-zar elədi, göz yaşı tökdü. Gecə yuxuda gördü ki, bir nurani qoca ona deyir:

- Ay qızım, şükür Allaha, boynunda uşaq var, niyə evdəkilərə demirsən?

Nisə ayıldı, «Allaha pənah» deyib qayınanasına dedi ki, bəs deyəsən uşağım var. Əvvəl qayınanası inanmadı. Bir ay sonra Nisə yenə yuxuda o nurani kişini gördü. Kişi dedi:

- Ay, qızım, beş aylıq uşağı niyə ərindən, öz anandan, əmindən gizlədirsən?

Nisə əlacsız qalıb bunlara da dedi ki, uşağım var, özü isə hər gün tövləyə gedib bələkli daşa baş çəkirdi. Daha vaxt az qalmışdı, amma nə Nisə özündə bir şey başa düşürdü, nə də başqaları.

Aradan doqquz ay keçmişdi. Bir gecə Nisə yuxuda gördü ki, həmin nurani kişi deyir:

- Ay qızım, dur, o uşağı götür, ağlamaqdan səsi batdı. Nisə hövlnak yerindən qalxıb qaranlıqda qorxa-qorxa tövləyə girdi və içəri gircək körpə uşaq səsi eşidib özündən getdi. Bir qədərdən sonra ayılıb gördü ki, bələkdəki daş deyil, bir uşaqdır. Tez ağlaya-ağlaya qundağı sinəsinə basdı, döşünü ağzına verdi. Nisə gördü ki, döşünə də süd gəlib, ucadan ağlamağa başladı. Səsə əri, əmisi və qayınanası yuxudan ayılıb tövləyə girdilər və Nisənin qucağındakı uşağı görüb onu danlaya-danlaya evə gətirdilər.

- Ay qız, niyə utanırsan? Niyə bizə deməmisən ki, sancı çəkirsən?

Gecə vaxtı hamıya səs düşdü, şadyanalıq oldu.

Amma o əhvalatdan bəri Nisə tez-tez həmin qayalığa gedərdi. O yerə indi «Bələk daşı» deyirlər.

### *256. Yesxırman daşı*

Deyirlər, Nadir şah Azərbaycana soxulan zaman ona boyun əyməyən adamlar şahın qoşunu ilə mübarizəyə başlamışlar. Şahın nizamlı ordusu

xalqın pə-rakəndə mübarizəsini darmadağın etmişdi. O zaman şah üsyançılardan əsir aldıqları adamların qollarını bağlatmış, yan-yana düzdürərək üstlərində at oynat-dırmışdı. Sonra da, bütün süvari və piyada qoşun həmin adamların üstündən keçmişdi. Adamların cəsədi atların dırnağında getmişdi.

Deyirlər, Nadir şah geri qayıdanbaş yolunu yenə də həmin yerdən salır və o, burada möcüzəyə rast gəlir. O, adamları diri-diri «yesxırman» elətdiyi yerdə çox böyük sal daşlar əmələ gəlmişdi. Şah əmr edir:

- Mən gərək düşmənlərimin qanı töküldüyü yerdə ceyran ətindən kabab yeyəm.

Şahın əmri yerinə yetirilir. Həmin daşın üstündə saqqız odunundan ocaq qalanıb kabab bişirilir. Şah vəzirindən soruşur:

- Vəzir, de görüm bu nə olan işdir? Biz gedəndə burada daş yox idi. İndi bu daşlar necə əmələ gəlmişdir?

Vəzir deyir:

- Şahım, sən bu torpağa nahaq qan tökmüsən. Odur ki, atalar deyib: «Nahaq qan tökülən yerdə ot bitməz». Nahaq qan töküldüyündən bu yerlər birdəfəlik daş olmuşdur.

Şah qəzəblənib ocaqdan iki saqqız kösövü götürüb sal daşların üstə atır və deyir:

- Doğrudan da, mən nahaq qan tökmüşəmsə, torpağı daş edən qüvvə qoy bu saqqız ağacının kösövlərini də həmin daşların üzərində göyərdib ağac etsin.

Şah bir neçə həftə həmin düşərgədə qalır. O, bir gün atdığı saqqız kösövlərinin daş üzərində göyərdiyini görür. Şah deyir:

- Sən torpağın hökmünə bax!

O vaxtdan etibarən həmin daş olan sahəyə «Yesxırman» deyilir.

### *257. Qaşqa Sərdar*

Zalım bir hökmdarın qorxusundan Başkənd kəndinin adamları evlərini tərk edib dağlara qaçır, çox çətinliklə sığınacaq tapıb gizlənirlər. Lakin bələkdə olan körpə bir uşaq elə hey ağlayır, kirimək bilmir ki, bilmir. Adamlar qorxurlar ki, uşağın səsini eşidib onları tapalar. Odur ki, kəndin əhalisini xilas etmək üçün çarəsiz qalıb, uşağı aparıb «Tozlu dərə» deyilən yerə atırlar.

Bir neçə gün keçir, dava sovuşur, ara sakitləşir. Ana can yanğısı ilə uşağı atılan yerə gəlir. Övladının nə dirisini, nə də ölüsünü tapa bilir. Yəqin edir ki, körpəni qurd-quş aparıb. Kor-peşman geri dönür.

Aradan bir neçə il keçir. Başkeçidli bir ovçu çöldə görür ki, bir sürü maralın içərisində bir oğlan uşağı var. Uşaq ovçunu görcək marallara qoşulub qaçır. Kişi nə qədər qovursa, uşağı tuta bilmir.

Axşam kəndə gəlir, əhvalatı bir möcüzə kimi hamıya danışır. Xəbər həmin kənddə yaşayan Gülyanaq arvada da çatır. O, ovçunun yanına gəlir, yalvarıb deyir:

-O uşağı harada gördün? O, mənim oğlum Sərdardır. O kimdən qaçsa da, məndən qaçmaz.

Adamlar ora yollanırlar, həmin dağın dalında gizlənirlər. Ovçu maralların ovlağını Gülyanağa nişan verir. Ana bir qaya üstünə çıxıb: «Sərdar!» - deyə çağırır, yanıqlı fəryadı ilə dağlara, dərələrə şivən salır. Bu səs maralları qənşərə çıxarır.

Gülyanaq maral sürüsünün içində oğlunu görür, ürəyi qəşş edib yerə yıxılır. Gözünü açanda görür ki, marallar onu dövrəyə alıb, Sərdar isə anasının saçını sığallayır. Sərdar ananın özünə gəldiyini gördükdə qaçmaq istəyir. Gülyanaq cəld onun boynuna sarılır. Elə bu vaxt pusquda duran adamlar köməyə çatırlar. Sərdarı güc-bəla ilə kəndə gətirirlər. Ana maral hücuma keçərək tez-tez özünü adamların arasına vurur, Sərdar da ona tərəf can atır…

Sən demə ana maral uşağı öz südü ilə böyüdübmüş.

### *258. Maralın göz yaşı*

Marala hər yerdən elçi gəlirdi. O isə elçiləri doqqazdan qaytarırdı. Gələnlərə «gözaltısı var» cavabı verirdilər. Aşiqlərin sayı çoxalırdı, Maralın sevgilisi Rövşən isə kasıb bir dəyirmançı idi, hər həftə bircə çanaq arpa unu yığırdı, dörd-beş ayda bircə çuval un satırdı. Bu hesabla o, on ilə də toy tədarükü görüb qurtarmayacaqdı.

Dəyirman gecə-gündüz taqqataq işləyirdi, Rövşən-lə Maral axşamdan az keçmiş dəyirman dərəsinin başına çəkilir, pıçıldaşır, bir-birinə həsrətlə baxır, dəyirmanın səsini intizar içində dinləyirdilər. Sanki dəyirman dən üyütmür, onların ikisinə bir tale, bir bəxtiyarlıq mahnısı oxuyurdu. Bu mahnı isə bitmir, tükənmir, bir sonsuzluq girdabında çırpınırdı.

Aşiqlərin biri də Maralı hamıdan çox istəyirdi, onun da gecəsi, gündüzü yox idi, o da az qala dəli-divanə olub çöllərə düşəcəkdi. O, bu əzablı intizara dözmədi, başına dəstə topladı, ya ölüb Maralın

obasında qalacağına, ya da ellər çiçəyini dərib gətirəcəyinə qərar verdi.

Gecəyarı kəndə girdilər. Maralı öz evlərində tapmadılar, dəyirman dərəsinə yeriş etdilər. Rövşən də azacıq aşın duzu deyildi; dəyirman daşını tək götürürdü, əlində oyuncaq kimi oynadırdı. O aşiqin dəstəsinin içinə ac qurd kimi təpildi, hərəsinin ayağından, qolundan tutub bir yana atdı. Gördülər ki, hamısı yığışsa, onun bircə qolunu da qanıra bilməyəcəklər, yaxın gəlmə-lidirlər. Rövşəni kənardan oxa tutdular. Dəyirmançının sinəsinə, kürəklərinə neçə-neçə ox sancıldı, baş-gözündə sağ yer qalmadı. O, «Maral, qaç!»- deyib yıxıldı.

Maral dağlara üz tutdu. Gün doğanda Kəpəzin başına qalxdı. Arana baxdı. Dəyirman dərəsini qanla dolu gördü. Ağladı. Sağ gözünün yaşı küləyin qanadında uçub bir dərəyə düşdü, bir dərəni doldurdu – Göy-Göl yarandı. Sol gözünün yaşı da ayrı bir dərəyə düşdü, dərə silkələndi – Maralgöl yarandı. Maralın həsrətinin, nisgilinin son acısı olan iki damla göz yaşı da uçub bir qayaya qondu, sürüşüb yerə, dərin bir çalaya düşdü – Qara göl yarandı.

### *259.Qanlı qobu*

Süsən bir ağ köynək hörürdü. Elə bil ki, köynək hörmürdü, sanki öz qəlbini ipək saplara bağlayırdı. O, bu köynəyi elin igid balası Qaya üçün toxuyurdu.

Süsən dünyanın gərdişini fikirləşib sevgilisinə məhəbbət köynəyi-vəfa, sədaqət, qüvvət köynəyi toxuyurdu:

- Dünyanın işini bilmək olmur. Səhər açılan çiçək, bir də görürsən günorta solur. Dünən sevgilisinə bir-birindən gözəl nəğmələr oxuyan bülbülün bu gün köksünün qanı sinəsini boyayır. Dünyada ölüm var, ayrılıq var, sınaq var. Gərək, boyuna qurban olduğum Qayama öz əllərimlə elə bir köynək toxuyam ki, o, sınaq qarşısında aciz qalmasın, hər cür çətinliyi dəf etsin, ona qələbə çalsın.

Lakin Süsəni elin başqa bir oğlu da, Alqaya da sevirdi. Alqayanın da qızın əlləri ilə toxunmuş, sehrlənmiş: köynəkdən xəbəri vardı.

Süsən köynəyi toxuyub qurtardı, onu Zümrüd bulağın axarında yuyub çəpərin üstünə sərdi.

Gecə Alqaya Süsəngilin evlərinin qənşərindən baxa-baxa keçirdi. O, gecənin qaranlığında süd kimi ağaran bir şey gördü. Atı həmin səmtə sürdü, əlini çəpərə atarkən ağ köynək əlinə keçdi. O, sevincək özünü çırağa yetirdi, baxıb gördü ki, Süsənin ilhamla hördüyü bayxalı (bəzəkli) ağ köynəkdir. Paltarını soyunub köynəyi geydi. Elə bil bədəni köynəkdən od aldı, qollarına qüvvət, ürəyinə təpər gəldi. Özündə ildırım gücü hiss etdi. Sübh tezdən durdu, atını mindi, qılıncını qurşadı, yay-oxunu əlinə alıb evdən çıxdı…

Süsən məyus halda Daşbulağa tərəf gedirdi. Alqaya çaparaq gəlib, qızı yerdən çalıb götürdü.

Süsən nə qədər etdi, müqavimət göstərə bilmədi. Nəhayət, dedi:

- Ağ köynəyi sərgidən sən aparmısan, köynək əynində olmasa səndə bu cürət olmazdı.

Alqaya qürürla:

- Bəli, köynək əynimdədir. İndi mən elə güclüyəm ki, bir qoşuna tək qalib gələrəm.

Xəbər Qayaya da çatdı. O da yaraqlanıb yola düşdü. Onlar «Eldar ovu» adlanan dağa çatdılar.

İki igid bir-birinə ox yağdırırdı.

Süsən var gücü ilə qışqırırdı:

- Qaya, özünü qoru, ağ köynək onun əynidədir, ox ona kar etməz.

Qaya işarəni başa düşdü. O özünə yer seçdi. Bir neçə dəqiqədən sonra ağ köynəyi onun əynində para-para etdi. Ancaq çarpışma yenidən başladı. Hər iki igid döyüşdə bir-birini məhv etdi.

Bu faciəni görən Süsən özünü yaxınlıqdakı qobu ilə axan gur suya atdı. İgidlərin qanı suyu qıpqırmızı boyamışdı. Süsən bu qanlı suda boğuldu. Qanlı köynək isə su ilə axırdı. Elə o vaxtdan xalq o qobunu «Qanlı Qobu» adlandırır.

### *260.Çoban və qoyun sürüsü*

Başı dumanlı-çənli Kəpəzin qoynuna həmişə aran elindən yaylağa çıxarmışlar. Bir gün bu dağlara bir çoban da qonaq gəlir. O, öz sürüsünü Kəpəzin ətəyində otarır, buz kimi bulaq suyundan həm özü içərmiş, həm də qoyunlarını suvarırmış. Bir gün bu dağların daima qonağı olan duman-çən gəlib meşələri bürüyür. Nabələd çoban meşədə azır. O, havanın açılmasını gözləyir. Çox keçmir ki, hava açılır. Gözəl bir gün çıxır. Çoban baxıb görür ki, Kəpəz dağının çınqıllı bir qoluna gəlib çıxıb. Hava getdikcə isinir, çobansa bu çınqıllıqdan çıxıb getməyə bir yol tapmır. Çoban bərk susayır, baxıb görür ki, qoyunlar da susuzdur. Çoban dərin fikrə gedir, gəzir, dolanır, buradan çıxıb getməyə nə bir yol tapır, nə də bir bulaq ki, qoyunlarını suvarsın.

Çarəsiz qalan çoban Kəpəz dağına üzünü tutub yalvarır:

- Ey Kəpəz, əgər səndə elə bir qüdrət varsa qoy buradan bir bulaq çıxsın, həm qoyunları suvarım, həm də özüm içim. Onda sənin yolunda bir ağ, bir dənə də qara qoç qurban kəsərəm.

Çox keçmir ki, çınqılların arasından bir bulaq qaynayıb çıxır.

Çoban həm qoyunlarını suvarır, həm də özü doyunca su içir.

Ancaq çoban andına əməl etmir. O, Kəpəzi aldatmağına sevinərək gülür. Bunu görən Kəpəz dağı hirslənir, çobanı öz sürüsü ilə birlikdə həmin bulağın başındaca daşa döndərir. Elə o vaxtdan da Kəpəzin ətəyində çınqılların arası ilə şırıl-şırıl bir bulaq axır. Bulağın başında isə əlində çomağı olan bir çoban və onun sürüsü daş olub qalıb.

Dağlara ova çıxan ovçular uzaqdan baxanda elə bilirlər ki, bu çoban yox, bir sürü daşdır.

### *261. Qızıl təpə, Mıxır təpə*

Çox qədim zamanlarda böyük bir tayfada varlı, dövlətli bir xan yaşayırdı. Bu xanın gözünün ağı-qarası yeganə Qızıl adlı bir qızı var idi. Ağlı, gözəlliyi və fərasəti ilə hamını özünə heyran edirdi. Başqa bir tayfadan Mıxır adlı bir oğlan bu qıza aşiq olur. Oğlanın atası çox yoxsul olduğundan gündə birinin naxırına gedər, birinin qapısında işləyər, bu cür ağır əziyyətlə çörək pulu qazanardı. Belə ağır vəziyyətdə bu cür məhəbbətə layiq olması oğlanı çox sarsıdır. O, öz tayfalarının başçılarını bir neçə dəfə xanın qapısına elçi göndərir, ancaq rədd cavabı alır.

Məhəbbətin uğursuzluğu oğlanın başına olmazın bəlalar gətirir. Qız oğlanın bu vəziyyətini görüb, ona böyük bir təpə qurdurmasını təklif edir. Həm də elə bir təpə ki, özünün qurduğu təpədən hündür və böyük olsun. Belə olsa sözümüz sözdü- deyir.

Oğlan razı olur. Hər iki gənc işə başlayır. Qırx atlı-torba ilə oğlan, qırx atlı-torba ilə qız. Hər kəs öz yaxın adamları ilə təpəni qurmağa başlayır. Bir gün belə, iki gün belə, nəhayət bir neçə gündən sonra xan qızı öz tayfalarından bir çapar göndərir ki, oğlan indi çıxsın meydana görək, sözümüz sözdü, ya yox. O, oğlan çaparla getdikdə qızın qurduğu təpənin çox hündür olmasını görüb, məyus halda özünü qurduğu təpədən atır və ölür. Oğlanın qırx atlı torba ilə torpağını daşıdığı yerdə böyük bir göl əmələ gəlir. O vaxtdan bu təpələr Qızıl və Mıxır təpələri adlanır. Gölün adına isə «At gölü» deyirlər.

### *262. Səhənguçan təpə*

Belə rəvayət edirlər ki, guya keçmiş zamanlarda varlı bir kişi yaşayırdı. Onun varı-yoxu bir qızı var imiş. Zaman keçdikcə qız böyüyür, atası onu özü kimi varlı, dövlətli bir kişinin oğluna ərə vermək fikrinə düşür. Ancaq qız buna razılıq vermir. Atası nə qədər etsə də qızını razı sala bilmir.

Bir müddət keçdikdən sonra kişi qızının kəndli oğlunu sevdiyini bilir və onu evdən qovur.

Qız yaylağa, nənəsinin yanına gəlir. O, burada atasından qorxub, heç yana çıxmaz, ancaq axşamlar qonşu qızları ilə təpənin üstündəki bulaqdan su gətirməyə gedərmiş.

Sonra qız atasının onu atdığını eşidir və nənəsinin razılığı ilə kəndli oğluna nişanlanır. Bundan sonra kişi qızına dağ çəkmək fikrinə düşür. Kişi kəndli oğlunun üzərinə hücum çəkir, amma məğlub olur. Bir neçə gün keçdikdən sonra kişi kəndli oğlunu gecə yatarkən tutdurur, başını kəsdirir və təpənin üstünə qoydurur.

Axşam qız səhəngini götürüb suya gedərkən, nişanlısının halına dözə bilmir, yıxılır və səhəngi təpədən düşərək sınır. Ona görə bu təpə «Səhənguçan» təpə adlanır.

### *263. Camış daşı əfsanəsi*

Keçmiş zamanlarda Əhməd adlı bir çoban var idi. Əhməd bütün gününü düzdə mal-qara otarmaqla keçirirmiş. Əhmədin bir camışı və daldalanmaq üçün yerdən qazıb düzəltmə daxması var imiş. Əhməd axşama kimi gözünü camışdan çəkməz, hər dəfə camışa baxanda elə bil özündə yüngüllük hiss edərmiş. O, yemək üçün götürdüyü bir parça çörəyi də camışa yedizdirərdi. Əhməd çörəyi camışa verdiyi zaman, camış dil bilən adam kimi çörəyin bir hissəsini yeməkdən imtina edərmiş. Elə bil camış duyurmuş ki, Əhməd çörəkdən özünə saxlamır. Ona görə də Əhməd çörəyin o qalan hissəsini yeyincə yanında durar, sonra isə rahat-rahat ondan aralanarmış. Bir gün kəndin ağası adlanan Sadıq çölü-çəməni seyr etmək üçün gəzməyə çıxır. Gəzə-gəzə gəlib düzdə mal otaran Əhmədə rast olur. O, Əhmədin yanına çatar-

çatmaz, camış adəti üzrə mallardan ayrılıb, Əhmədin yanına gəlir. Demə onların günorta naharının vaxtı çatıbmış. Sadıq bir xeyli camışla Əhmədin hərəkətlərinə nəzər saldıqdan sonra Əhmədin yanına gəlir. Sadıq fikirləşir, bu necə olan işdir, necə olub ki, o buna kimi bu camışı görməyib. Sadığı dərd götürür. Nə üçün Sadıq kəndin ağası ola-ola belə yaraşıqlı, ətli, qanlı, insan qəlbini duyan belə bir camış lüt, bir qarın çörəyə möhtac olan bir yetimin olsun. Sadıq dərd dağıtmağa çıxmışdı, dərd artırıb evə qayıdır. Sadıq evdə çox fikirləşir, götür-qoy edir. Nə etsin, necə etsin, necə bəhanə gətirsin ki, o camışı Əhmədin əlindən çıxartsın. Sadıq nə qədər çalışırsa bu camış məsələsini yaddan çıxara bilmir. Bu camış ona ağır bir dərd olur.

Səhəri gün Əhmədin gözünə camış olduqca bikef dəyir. Əhmədi qəm bürüyür. Axı, camış nə üçün bikef olsun. Günorta nahar vaxtı camış nahara gəlmir. Əhməd onun yanına gedir. Nə qədər onu tumarlayırsa, o üz, bu üzünə keçirsə, xeyri olmur. Sadıq onu görən gündən camışa əyan olmuşdu ki, onu sevimli sahibi Əhməddən və seyr etdiyi məskəni olan çəməndən ayıracaq. Camış sonsuz kədər içərisində Cirgiz sahilinə yaxınlaşır, dizini qatlayıb aramla su içməyə başlayır. O içir, içir, doymaq bilmir. Elə bil duyub ki, bu su onun son suyudur. Çox fikirləşdikdən sonra qət edir ki, ağanın iyrənc ocağına qismət olunca, dönüb daş olsa ondan yaxşıdır. Bu camışın qəti və son fikri idi. Bunu qət etdikdən sonra camış üzünü sonsuz göylərə tutub deyir: «-Ey Yaradan, məni Əhməd hər gün axşama kimi bir qarın çörəyə işlədib, axırda da o bir qarın çörəyi öz boğazından kəsib, yedirdib bəslədiyi,

son ümidi olan camışı da onun əlindən almağa çalışan iyrənclərin bıçağına düçar edincə, elə bax bu sonsuz səhrada daş elə, qoy mən bir parça daşa dönüb Əhmədə həmdəm olum». Əhməd camışın bu vəziyyətini görüb, ürəyindən qara qanlar axıda-axıda büzüşüb bir qayaya söykənir və camışa baxır. Əhməd görür ki, camış otladığı otlaqları süzə-süzə durduğu yerdə də yatdı. Camış yatdığı yerdən qalxmır. Bayaqdan bəri durub camışa tamaşa edən Əhməd durub taqətsiz halda camışa yaxınlaşır. Gördüyü mənzərə onu bir tərpənməz heykələ döndərir. O, gözlərinə inanmır. Camış yatan yerdə camış şəklində, nəhəng bir daş görür. Gördüyü bu qorxunc və olduqca təəccüblü mənzərə onu kəndə qaçmağa məcbur edir. Əhməd üz tutub kəndə doğru qaçmağa başlayır. O, kənddə görünən bütün adamlara hadisəni olduğu kimi danışır. Kənd camaatı dəstə ilə yığılıb Cirgiz çayına doğru gedirlər. Onlar çobanın göstərdiyi yerdə camışın dönüb tərpənməz daş olduğunu görüb, bir müddət heyranlıqla daşa tamaşa edirlər.

## *264. Güllərin hünəri*

İrandan şahın pəhləvanı Gəncəyə gəlir və xanın qırx pəhləvanını yıxır. O vaxt qayda beləymiş ki, əgər şahın pəhləvanı və ya aşığı xanlığın qırx pəhləvanını yıxsa və ya aşığını bağlasa, vergilər yarıbayarı artarmış. Yox, əgər xanlığın bir pəhləvanı və ya bir aşığı qalib gəlsə, vergilər yarıbayarı azalarmış.

Gəncə xanı onsuz da ağır olan vergiləri ödəyə bilmirdi. Bu tərəfdən də qırx pəhləvanın məğlubiyyəti onu dərdə salmışdı. Şahın pəhləvanı xana üç gün möhlət verdi və dedi:

- Mahala car çəkdir, qoy qolunun gücünə, dizinin möhkəmliyinə inanan varsa, meydanıma gəlsin.

Bir çoban meydandakı adamları yara-yara düz xanın yanına gəldi, əyilib qulağına dedi:

- Möhtərəm xan, bir möcüzəni sizə bildirməyə gəlmişəm. «Gülazar bulağı»ndan xeyli yuxarıda, Naltökən yaxınlığında «Xan bulağı»nın yanına bir mal binəsi düşüb. Hələ də gördüklərimə inana bilmirəm. Qızlığını, gəlinliyini deyə bilmərəm, bir qadın camış sağırdı. Camışın balağı qabaq ayaqlarına bağlanmışdı. Birdən camışın iki yaşar balası o biri tərəfdən anasının altına soxuldu. Qız iki yaşar balanı nə qədər qovdusa, bir şey çıxmadı. Qız necə hirsləndisə, iki illik camış balasını quyruğundan yapışıb çəpərin o biri üzünə atdı. Heyvan yerindəcə öldü.

Xan soraq elədi, adı Güllər olan qızı gətirtdi. Güllər kişi paltarı geyib həmin pəhləvanla bir süfrə arxasında yanaşı oturdu. Ayağa durmaq bəhanəsi ilə dirənəcək əvəzi sağ əlini pəhləvanın sol qıçının üstünə qoydu, hiss olunmadan güc verdi. Sonra pəhləvan qiyafəsində rəqibini güləş meydanına dəvət etdi. Şah pəhləvanının sol ayağı qırıldığından yerindən tərpənə bilmədi.

### *265. Şeyx və çoban*

Xalq arasında böyük inam qazanmış Şeyx Qobustan qayalarının yanından keçib Xəzər

dənizinə tərəf gedirdi. Bir də gördü ki, yolun kənarında qoyun otaran bir çoban yapıncısını yerə salıb üstündə o üzə-bu üzə aşır. Şeyx soruşdu:

- Çoban, neynirsən?

Çoban dedi:

- Ağa, namaz qılıram.

Şeyx bildirdi ki, namazı belə qılmazlar. Görk üçün Şeyx atdan düşdü. Canamazını yerə sərdi, möhür daşını sahmanladı, ədəb-ərkanla namaz qılmağa başladı. Bu qayda çobanın xoşuna gəldi. O da Şeyxlə bərabər namaz qıldı.

Şeyx atına minib getdi. Çoban namazı təkrarlamaq istədi, mümkün olmadı. Namaz yadından çıxmışdı. Vaxt itirmədən Şeyxin dalınca tərpəndi.

Şeyx atını çapa-çapa gedir, çoban isə çomaq çiynində ondan əl çəkmirdi. Müqəddəs Şeyx atını Xəzər dənizinin üstü ilə çapırdı: «Ey Yaradan, məni bu zırramanın əlindən qurtar». Geri çevriləndə gördü ki, budur, çoban çomaq çiynində onun dalınca gəlir. Özü də suda batmır. Bildi ki, çoban övliyadı. Uca səslə dedi:

- Çoban, geri qayıt, sən müqəddəssən, namazını necə bilirsən, elə də qıl.

### *266. Şeyx və qardaşı*

İki qardaşdan biri Şeyx idi. Ömrünü-gününü məscidlərdə namaz qılmaqla keçirmişdi. Heç kimin işinə qarışmazdı. Nə bir adama quyu qazmışdı, nə də bir adamın əlindən tutub quyudan çıxarmışdı. Ondan kiçik qardaş isə zindanbaşı idi. Şeyx buna

görə qardaşını dindirmirdi. Onu Allahın yolundan uzaq hesab edirdi.

Qardaşlar qocalmışdılar. Bu vəziyyət kiçik qardaşı üzürdü. Şeyx isə onun əzabına məhəl qoymurdu. Kiçik qardaş fürsət tapıb bir dar doqqazda Şeyxin qabağını kəsdi və dedi:

- Biz qardaşıq, ömrümüz keçir, nəyə görə küsülü qalmalıyıq?

Şeyx bildirdi ki, bizim işimiz, əməlimiz bir-birinə ziddir. Mənə mane olma, namazımın vaxtı keçir.
Kiçik qardaş dedi:

- Əyləş, namazını qıl.

Şeyx bildirdi ki, burda su yoxdur, dəstəmaz almalıyam.

Kiçik qardaş dedi:

- Qırx ildir ki, məsciddə namaz qılırsan, Allaha dua eləyirsən. Yalvar, qoy burdan bulaq çıxartsın.

Şeyx nə qədər dua edirsə, yerdən bulaq çıxmır. Belə olanda o biri qardaş belindəki əyri qılıncı çıxarıb yeri cızdı. Cız yerindən su fəvvarə vurdu. Şeyx dedi:

- Qardaş, bu nə möcüzədi?

Zindanbaşı dedi:

- Sən qırx il namaz qılmaqla öz işini bitmiş hesab eləmisən. Mən isə haqq uğrunda çalışmışam. Günahı olanı cəzalandırmışam, günahsızı da ölümdən azad eləmişəm. Bunların hamısı o böyük Tanrıya agah olduğu üçün sözümü yerə salmadı.

### *267. Xəyanətin cəzası*

Astaranın Sarıdaş mağarasının yaxınlığında bir igid olurmuş. Ox atmaqda, at çapmaqda, kürnəş tutub güləşməkdə bir adam ona çatmazmış. Vilgic yaylağı, Beşikli qaya, bütün mənzərəli yerlər onun ixti-yarındaymış.

Alaşa qalada isə üç pəhləvan qardaş yaşayırmış. Onlar həmin Sarıdaş mağarası yaxınlığında yaşayan igidin düşməni idilər. İgid bir az sifətcə kobud, qadını isə çox gözəl idi.

Qardaşlar bu igidi məhv etmək üçün hiyləyə əl atmalı oldular. Bir məkrli qarı tapıb igidin evinə göndərdilər. Pəhləvan gündüzlər səfərə çıxırdı. Geri qayıdana kimi qarı qadının beynini doldururdu:

- Ərin igiddir, amma nə fayda, sənin kimi gözəl, zərif bədənli bir gəlinin tayı deyil.

Bir belə, beş belə, qadını fikir götürür. Amma qadın ərinin gücündən qorxurdu. Odur ki, hiyləyə keçdi. Könlünü üç qardaşdan birinə vermişdi. Oğlan boylu-buxunlu, sifətdən yaraşıqlı idi. Qadın ər evində olsa da, qəlbi düşmən evinə çoxdan köçmüşdü. Bir gün ərinin qılığına girib soruşdu:

- Sənin nəyə gücün çatmaz?

- Qolumu yeddi qat zəncirlə bağlasalar, pul-pul eləyərəm.

Qadın onun qolunu zəncirlə bağladı. İgid bircə təkanda zəncirləri qırıq-qırıq elədi. Yeddi qat örkən bağladı. İgid onu da qırdı. Ər arvadına dedi:

- Amma məni özünə bənd edən hörüklərinin hər birindən yetmiş tel ayırıb qollarımı daldan bağlasan, aça bilmərəm.

Qadın yemək-içmək götürdü, Baba bulağının üstünə gəldilər. Gül-çiçək dərdilər. Oturub ləzzətlə yeyib-içdilər. Sonra qadın ərinin başını dizinin üstünə aldı. Kişini oxşaya-oxşaya yatırdı. Hörüklərini

açıb bulud kimi üstünə tökdü. Tel-tel ayırıb kiriş hördü. Ərinin qollarını arxadan bir-birinə çatıb möhkəm bağladı.

İgid yuxudan ayıldı, nə qədər elədi qollarını aça bilmədi. Başın tükü əti yarıb sümüyə keçdi. Bunu görən arvad yaxınlıqda ocaq qaladı. Tüstü ərinin düşmənlərinə işarə idi. Pusqudan çıxan qardaşlar xəncərlə əl-qolu bağlı igidin başını kəsdilər, qadını da özləri ilə Alaşa qalasına apardılar. Ara düzəldən qarını ona qulluqçu verdilər. Qarı bir gün xəbər gətirdi ki, qadın nə quzu əti, nə də başqa ət yemir. Oğlan qadının yanına gəldi ki, səbəbini öyrənsin. Qadın dedi:

- Mənim ərim çətin ovlanan, otlu biçənəklərin, göy zəmilərin nəğməkarı olan bildirçinlərin gündə bir cütünü ovlayıb mənə yedizdirirdi. Mən bildirçin əti yeməyə adət eləmişəm.

Elə bil ərli qadının tutduğu qəbahətin böyüklüyü təzə sevgilisinə indi aydın oldu:

- Bildirçin əti yedizdirən igid əri bada verən qadın, yəqin bir gün qardaşlarıma mənim də başımı kəsdirəcək, -deyə kiçik qardaş əl atdı qılınca və xəyanətkar qadının başını bədənindən ayırdı.

### *268. Kişi qızıl olur*

Novruzun son günü gecə gündüzlə tən yarı olur. Bu vaxt çay bir an dayanır, sonra yenidən axır. Kim nə arzu eləsə, dilində hansı sözü desə, o iş hasil olur.

Araz qırağındakı kəndlərdən birində bir təzə gəlin yaşayırmış. Bu gəlin axır çərşənbə gecəsi, dan ulduzu

doğan kimi qalxıb çayın qırağında gözləyir. Birdən görür ki, coşğun Araz çayı dayandı. Gəlin tələsik deyir: «İndi gedib görüm ki, ərim qızıl olub».

Gəlin evinə qayıdıb yatağına uzanır. Bir azdan sabah açılır, hava işıqlaşır. Gəlin yerindən qalxır, ocaq qalayır, bayram süfrəsi bəzəyir, bayram aşı bişirir. Amma görür ki, əri oyanmır. Çağırır, silkələyir, kişi oyanmır ki oyanmır. Üstündən yorğanı götürəndə görür ki, əri qızıl olub. Gəlin ağlaya-ağlaya onu götürüb farmaşa qablayır, yükə qoyur. Qonum-qonşuya da deyir ki, ərim bayram aşını yemədi, gecəykən çıxıb ayrı məmləkətə işləməyə getdi.

Sahibsiz qalan gəlin gecə-gündüz ağlayır, peşmançılıq çəkir. Bir müddətdən sonra gəlinin yemək-içməyi tükənir. Gəlin bilmir dərdini kimə desin. Axırda naəlac qalır. Gecənin birində qalxıb farmaşı açır, ərinin çeçələ barmağını kəsir, səhərisi aparıb zərgərə verir, əvəzində pul alıb gətirir, xərclik eləyir və birtəhər dolanır. Nəhayət, ilin axır gecəsi gəlib çıxır. Gəlin lap axşamdan oturur Arazın qırağında, gözünü dikir çaya. Dan ulduzu doğan zaman birdən Araz dayanır. Gəlin deyir: «Ay su, gedim ki, ərim yenə adam olub». Sonra gəlin qalxıb evə gəlir, görür ki, farmaş tərpənir. Tez farmaşı açır, ərini oradan çıxarır. Başına gələn əhvalatı ona danışır.

Əri soruşur:

- Bəs mənim çeçələ barmağım hanı?

Gəlin deyir:

- Pis yola düşməkdənsə sənin barmağına qıydım.

Bundan sonra onlar əkin-biçin eləyib firavan gün keçirirlər.

## *269. Qarasaqqal*

Çox qədim zamanlarda Kür çayının sahilində qarasaqqal, cavan bir oğlan yaşayırmış. Oğlan cavan olmasına baxmayaraq ibadətindən qalmazmış. Bu salehliyinə görə ona çox sirli şey agah olarmış, həm də süfrəsinin bərəkəti tükənməzmiş. Onun qamışdan hörülmüş bir koması varmış. Bu yerlər ceyran, cüyür və maralla dolu imiş. Hər axşam-səhər marallar komaya yaxınlaşar, qarasaqqal oğlan onları sağarmış.

Günlərin birində iki ovçu ceyranı qova-qova gəlib çıxır həmin yerə. İkisi də ac imiş. Cavan oğlana qonaq olurlar. Oğlan bir neçə maralı sağıb kiçik tavada yayma bişirir. Ovçular təəccüblə soruşurlar:

- Bu yemək bizə çatarmı?

- Çatar, çatar, səbr eləyin.

Doğrudan da onlar yaymadan doyunca yeyirlər və görürlər ki, tavada yenə yayma qaldı. Ovçulardan biri qarasaqqal oğlandan çox razı qaldığından bacısını ona vermək fikrinə düşür. Oğlan razı olur. Toy günü gəlini atla oğlanın komasına gətirirlər. Komaya yaxınlaşar-yaxınlaşmaz qızın yengəsi qarasaqqal oğlanı görür, xeyir-dua əvəzinə deyir:

- Ay qız, bu kifirin, adama oxşamazın nəyinə gedirsən?

Elə bu vaxt oğlan camaatı ölü namazına durmağa dəvət eləyir. Təəccüblənənlər soruşur:

- Sən niyə toyda ölü namazı qılırsan?

- Düzdü, toydu, ancaq indicə bura ölü düşəcək.

Doğrudan da yengə atdan düşən kimi canını tapşırır. Hamı heyrətə gəlir. Elə oralarda ilk qəbir yengənin olur. Qarasaqqal oğlanın yaşadığı yer kəndə çevrilir. Bu kəndin adı oğlanın adı ilə Qarasaqqal adlanır.

### *270. Savalan ulduzuna baxmısan*

Keçmişdə cəsur bir oğlan vardı, amma olduqca kasıb idi. O, şahın qızına, şahın qızı da ona vurulmuşdu. Şah bunu eşidir. Təzə aşiqi də köhnə aşiqlərin dalınca yollamaq qərarına gəlir. Əvvəlki ustalığını işə salır.

Hər yanı qar almışdı. Çölün şaxtası adamın iliyinə işləyirdi. Hökmdar oğlanı yanına çağırıb dedi:

- Bilirəm ki, sən mənim qızımı, qızım da səni sevir. Lakin ata kimi mənim də öz sınağım, öz şərtim var. Qızımı o oğlana verəcəyəm ki, gecə səhərəcən bir köynəkdə ayazın ağzında odsuz-ocaqsız qala bilsin.

Oğlan hökmdarın şərtini qəbul edir və o gecə bir köynəklə çöldə qalır. Hər dəfə şaxta onu dondurmaq istəyəndə oğlan sevgilisinin adını çəkir, qanı coşur, ölümdən xilas olurdu. Səhər açılanda şah baxdı ki, oğlan sağ-salamatdı, elə bil nə qar görüb, nə də şaxtada qalıb. Şah təəccüb edir. Çünki qızının eşqinə düşən neçə-neçə gənc oğlanı qarda-şaxtada dondurmuşdu. Şah soruşdu:

- Necə oldu ki, soyuqdan donub ölmədin? Çöldə elə bir yanar varıydımı?

- Savalan dağının başında parlayan ulduzdan başqa heç bir yanar yox idi.

Şah cırnamağa bəhanə tapdı:

- Sən səhərə qədər Savalan ulduzuna baxmısan, onun istisinə qızınmısan. Şərti pozub mənə kələk gəldiyinə görə səni sürgün etdirirəm.

Hökmdar oğlanı sürgünə göndərtdirdi. Oğlan bəni-adəm yaşamayan bir səhrada ev tikib yaşayırdı. Bir gün şah vəzirlə ova çıxdı. Ov axtara-axtara gəlib bu tənha evə yetişdilər. Hökmdar gördü ki, evin qabağında ay camallı bir oğlan dayanıb, ondan soruşdu:

- Yeməyə nəyin var?

Oğlan hökmdarı tanıdı və ehtiramla cavab verdi:

- Ceyran əti, quş əti. Gəlin əyləşin, bu saat bişirərəm.

Qonaqlar evə keçib oturandan sonra oğlan qazana ət doğradı, ocaq qaladı, amma qazanı aparıb buxarının başına qoydu. Şah çölə çıxıb oğlanın xörək hazır-lamağına baxıb təəccübləndi:

- Ocaq aşağıda, qazan göyün bir qatında, ora isti çatar ki, xörək də bişə?

Oğlan dedi:

- Qibleyi-aləm, necə olur ki, burdan-bura ocağın istisi çatmır, amma Savalanın başında doğan ulduz adamı qarlı-şaxtalı gecədə qızdırır?

Hökmdar oğlanı tanıdı, uduzduğunu başa düşdü. Ürəyində fərasətli cavana afərin dedi. Yeyib, içdilər. Şah oğlanı özü ilə gətirdi, qırx gün, qırx gecə toy edib qızını ona verdi.

### *271. Quru kəllə*

Suda üzən kəllə öz-özünə deyirdi: «Mən mərdimazarlıq eləmişəm, birini də edəcəyəm». Bu

söz çayın qırağında oturan bir kəndlini o qədər əsəbləşdirdi ki, çubuğu ilə kəlləni sahilə çıxarıb evə apardı. Kəlləni çəkiclə döyüb, un kimi elədi, sonra evin bir küncünə basdırdı. Bunu nəvəsi gördü və soruşdu ki, baba, o basdırdığın nədir? Kəndli özündən asılı olmayaraq cavabında dedi: - Bala, bu ən ağır dərdin dərmanıdı.

Bir gün kəndli evdə olmayanda qızı bərk xəstələnir. Heç bir təbib ona çarə qıla bilmir. Birdən evin küncünə basdırılmış ağır dərdin dərmanı kəndlinin nəvəsinin yadına düşür. Dərmanı çıxarıb xəstə qıza verirlər. Qız zəhərlənib ölür. Evə gəlib məsələdən xəbərdar olan baba yana-yana deyir:

- Axı, o quru kəllə demişdi ki, bir mərdimazarlıq etmişəm, birini də edəcəyəm.

### *272. Dəmirçi və mismar əhvalatı*

Bir padşahın gözü dəmirçi arvadına düşmüşdü. Ancaq şəriətə görə dəmirçi arvadını boşamasa, yaxud dəmirçi ölməsə, onun övrətinə kəbin kəsmək günah sayılırdı. Nə dəmirçi arvadını boşayardı, nə də arvadı ondan boşanardı, əlac onun ölümünə qalmışdı. Ölüm üçün isə bəhanə lazım idi. Yoxsa padşahın adi rəiyyət ilə ədavət çəkməsi gülünc olardı.

Çox məsləhətdən, məşvərətdən sonra belə bir kələk qurdular: dedilər şahın qoşunları sabah günortadan sonra düşmən qoşunlarının üstünə yeriyəcək. Bu bircə gecədə dəmirçi qırx min mismar hazırlamalıdır.

Belə hökmü alan dəmirçi başa düşür ki, bu bəhanədir. Səhərəcən qırx min mismar düzəltmək olmaz, arvadına bildirmədi, sübh açılanacan yedi,

içdi, bildi ki, onu ölüm gözləyir. Hava qaralanda qapı döyüldü, dəmirçi arvadı ilə vidalaşıb çıxmaq istəyəndə padşahın adamları onu tələsdirdilər ki, mismar lazım olmadı, tez dörd mıx düzəlt, padşah ölüb, onun tabutu mıxlanacaq.

### *273. Hüröyün və elin igid oğlu*

Elin igid oğlu öz sevgilisinə cəmi bir həftə idi ki, qovuşmuşdu. Sevgililər günəşin çıxmasına, ayın doğmasına, quşların səsinə, küləyin əsməsinə, çiçəklərin ətrinə dünyanın bəxtəvərləri kimi sevinirdilər.

Hüröyünün gəlişi bu sevincə son qoydu .

Xəbər etdiyi obaların qolunda güc, ürəyində təpər olan bütün kişilərini neçə illərdi ki, yığdırıb, haqsız-muzdsuz qul kimi işlədirdi.

Gedənlər getmiş, hələ qayıtmamışdı. Gedənlərin öldü-qaldı xəbəri yox idi. İndi də bu eli uralatdırırdı.

Elin igidi ayağını qızmış qum yandıra-yandıra, gözlərini həsrət yaşları göynədə-göynədə Hüröyünün göylərə baş çəkən ehramları üçün neçə-neçə illər daş daşıdı. Neçə-neçə tanışı, eloğlanları qürbət eldə onun qucağında nisgilli gözlərini yumdu. Ancaq igid dün-yadan ümidini üzmədi.

Günlərin bir günü ehramın son daşı qoyuldu, Hüröyün sağ qalanları azad edib, evlərinə buraxdı.

Saç-saqqalı ağarmış, beli donqarlaşmış, əlləri düyün-düyün olmuş igid öz əli ilə tikdiyi yosma bir evin yerində cah-cəlallı imarət görəndə heyrətdən özünü itirdi.

İllərdən bəri həsrətini çəkdiyi arvadının dizləri üstünə yaraşıqlı bir kişinin baş qoyub yatdığını görəndə isə ümidləri qırıldı, irəli gəlib onu öldürmək istədikdə sevgililərin gözləri bir-birinə tuş gəldi. Onlar bir-birini tanıdı. - Əl saxla, əmanət qoyduğun oğlundur, - deyə arvadı dilləndi. -Aradan qırx il keçmiş, oğlun igid olmuş, yurdunu abad etmiş, sən yandırdığın çırağı sönməyə qoymamışdır. Gözün aydın olsun,- deyib əlavə etdi..

Uzun illərin həsrətliləri gah qucaqlaşıb öpüşür-dülər, gah keçənləri yada salıb ağlaşır, gah da vüsala qovuşduqları üçün şadlanırdılar.

### *274. Dağ Yunisin xəzinəsi*

Dağ Yunis adlı bir padşah varmış, dağ kimi yekə olduğuna görə ona belə deyirmişlər. Onun biri dağda, biri də aranda iki sarayı varmış. Yayda yaylaqdakı, qışda ovlaqdakı sarayına yığışırmış.

Bir payız o, xəzinəsini dəvələrə yüklətdirir, aran-dakı sarayına yollanır. Yolu yarı eləyəndə tufan qopur, Dağ Yunisin dəvələri də, xəzinəsi də tufanda qərq olur, ha axtarırlar, tapa bilmirlər.

Bir xan quş dili bilən bir adamı çağırıb deyir:

-Sən quşların köməyi ilə Dağ Yunisin xəzinəsinin yerini öyrən.

Quş dili bilən deyir:

-Sən məni filan quyuya sallat, quyunun başında bir neçə inək, camış, öküz kəsdir. Quşlar leşə gələcəklər. Mən quyuda onların söhbətinə qulaq asacağam.

Belə də edirlər. Quşlar yeyib doyandan sonra cavan qartal deyir:

-Amma bu gün yaxşı yemək oldu ha...

Qoca qartal cavab verir ki, belə bir şülən yemək qabaqdakı dağın belində Dağ Yunisin xəzinəsi batan il oldu.

Quş dili bilən adam xəzinənin yerini xana xəbər verir və böyük ənam alır.

### *275. Hardan alaydım?*

Biri ağır dərdə mübtəla olur. Özünə baxızdırmadığı türkəçarəçi, həkim qalmır. Mollalara, seyidlərə, axund-lara iman gətirir, kitab açdırır, dualar yazdırır, əlsiz-ayaqsızlara nəzir paylayır, xeyri olmur. Axırda hər dərdə dəva eləyənlərin başçısı loğmanın yanına gedir, özünü ona göstərir. Loğman deyir, sənin dərdinə əlac eləmək müşküllərin müşkülüdür. Sənin dərdinin dərmanı tapılan şey deyil.

Xəstə son ümidgahının da yanından imanını itirib qayıdır. Özü də görür hər gün geri gedir, evdəkiləri də zara gətirib, başını alıb çıxır, deyir, canımda nə qədər can var, ayağım yer tutur, dizlərimdə taqət var gedim, çöllərdə, düzlərdə ölüm, qoy mənim azarım ana-bacı, ata-qardaş, qohum-qançəkər ömrü gödəltməsin.

O, yıxıla-dura, sürünə-sürünə evlərindən aralanır, öz kəndlərinin örüşlərindən uzaqlaşır, qürbətə köçür. Tez ölmək, bu zülmdən tez qurtarmaq istəsə də, onu aclıq üstələyir. Qoyun otaran çobanı çağırır ki, çörəyim dəyə-nəyə dönüb, mənə süd sağ ver, qoy əppəyimi isladım yeyim.

Çoban da görür bunun üz –gözündən, sir-sifətindən azar yağır, istəmir öz heybəsindəki

qablaması onun ağzına dəyib murdarlansın. Qablamanı onda gərək qumla sürtəydi, qaynarlayaydı. Çobanın da hardaydı bu çölün düzündə elə oturum-durumluğu ki, təmiz-tarıqlıq gözləyəydi?

Baxır ki, bir tısbağa çanağı var yerdə. Onu götürür, qılçasına sürtünə-sürtünə otlayan qara qoyunu tutur, onun südünü tısbağa çanağına sağır, yastı bir daşın üstünə qoyur, onu naxoşun əlinə də uzatmır ki, birdən məni nəfəsi vurar, əlim əlinə toxunar, o azardan mənə də keçər.

Bu məqamda dağların dalından bircə koma qara bulud qalxır, guruldayır, şaqqıldayır. Çoban sürüsünü küşkürüb oradan uzaqlaşır. Qarayarpaq bir yağış başlayır.

Naxoşun nəfsini çobanın vasvasılığı küsdürür. O özünü sürüyüb yaxınlığındakı qayaların birinin altına da vermir ki, islanmasın.

Görür ki, hardansa qara bir ilan çıxdı, tısbağa çanağındakı süddən xeyli içdi, sonra da südün içinə zəhərini boşaldıb getdi, bir kolun dibinə girdi.

Naxoş fikirləşir ki, bu əzabdansa ölmək, özü də tez ölmək hamısından yaxşıdır.

Tısbağa çanağını başına çəkir, zəhərli süddən xeyli içir, deyir, bu saat canımı tapşıracam. Bir az gözləyir. Görür yox, canınını ölüm-əcəl halı-hilləti almadı, əksinə, bir az yüngülləşdi, dizlərinə taqət, qollarına qüvvət, gözlərinə işıq, ürəyinə təpər gəldi.

Südün qalanını da içir ki, bəlkə zəhər tısbağa çanağının dibinə çöküb, qoy hamısı qarnıma getsin, məni tez yox eləsin.

Südü son damcısına kimi içəndən sonra görür onun içindən nəsə ayağa qaldırır, canındakı azar-bezardan əsər-əlamət yoxdur, quşa dönüb, qollarını

qanad kimi açsa, göylərə havalanar, hara istəsə uçub gedər.

Durur sevinə-sevinə evinə gəlir. Ata-anası qurban dalınca qurban kəsirlər, bütün eli-obanı bu şadyanılığa çağırırlar.

Bu oğlan da yeyir-içir, ətə-qana dolur. Bir gün həmin loğmanın yanına gedir. Ona deyir:

-Məni tanıdınmı? Mən həmin naxoşam ki, dedin sənin dərdinin dərmanı yoxdur, öləcəksən. Bəs niyə ölmədim, niyə sağaldım, loğman?

Loğman deyir:

-Mən hardan alaydım yeddi il gün, sazaq döymüş yeddi yaşlı tısbağa çanağı, hardan alaydım yeddi il qısır qalmış qara qoyun südünü, yeddi il heç nə çalmamış qara ilanın yeddi illik zəhərini, yeddi il qısır qalmış, yerə bir damcı da salmamış bulud suyunu...

### *276. Ceyranbatan göl əfsanəsi*

İndiki Sumqayıt şəhərinin yerində qədim azərbaycanlılardan ibarət bir tayfa yaşayırmış. Bu tayfada Sum adlı bir igid oğlan və Ceyran adlı bir gözəl qız varmış. Bu iki gənc bir-birini təmiz bir məhəbbətlə sevirmiş və onlar əhd-peyman bağlayıblarmış.

Tayfanın yaşadığı yerin kənarında böyük bir çay axırmış. Bu çayda nəhəng bir əjdaha peyda olubmuş. Camaat əjdahanın qorxusundan nə özünə, nə də ki, mal-qarasına su apara bilmirmiş. Çaya yaxın düşəni əjdaha o saat parçalayıb yeyirmiş. Tayfa adamcıl əjdahanı rəhmə gətirmək üçün çayın kənarına gedib ona yalvarırlarmış.

Əjdaha da bu yalvarışlardan «insafa» gəlib, «güzəştə» gedir. Gündə onlardan bir adam istəyir. Bundan sonra sudan rahat istifadə edə bilərlər. Əlacsız tayfa başçıları adamcıl əjdahanın tələbi ilə razılaşırlar.

Bu qərarı eşidən Sum bir neçə igidlə tayfa başçılarının yanına gəlir. Əjdaha ilə aparılan danışıqlara etiraz edirlər.

-Gündə bir qurban vermək, tayfamızın tədricən məhv olması deməkdir.

Tayfa başçısı:

-Birdən məhv olmaqdansa, tədricən məhv olmaq faydalı deyilmi?

Sum qəzəblənir:

-Belə «faydalar» əslində heç kimə fayda gətirməyib. Elin qılınc vurub, qalxan tutan oğullarını səsləyin. Birlikdə əjdahanın üstünə getsək, şübhəsiz ki, asanlıqla onu məhv edərik.

Tayfa başçısı Sumun təkliflərindən qorxur:

-Yox bala, bizim əjdahaya gücümüz çatmaz. Hamımızı birdən kamına çəkib, məhv edər.

Sum təklənir. Beləliklə, adamcıl əjdahaya gündə bir ailədən bir adam qurban gedir. Camaat əjdahaya qurban verəndə yasa batır, su alanda şadlanırlar.

Nəhayət, növbə Sumla Ceyranın ailəsinə çatır. Sum deyir: Mən qurban gedəcəm! Ceyran sevgilisinə qəti etiraz edir: Xeyr, mən gedəcəm. Səndən sonra onsuz da mən yaşaya bilmərəm. Sum nə qədər çalışırsa, Ceyranı razı sala bilmir. Axırda onu aldatmağa məcbur olur. Sum gecə Ceyranı yuxuya verib, yaraqlanır, yasaqlanır, əjdaha ilə təkbaşına döyüşə yola düşür. Ceyran ayılanda işi

başa düşür. Dəlicəsinə evdən çıxıb, sevgilisini haraylayır:

-Sum, qayıt!...Əjdahanın meydanına özüm gedəcəyəm. Sum, qayıt!...

Sum, qayıt!...

Ceyranın səsi dağlarda, daşlarda əks-səda verir: . Sum, qayıt!... . Sum, qayıt!... . Sum, qayıt!...

Ceyran çaya çatanda görür ki, indicə göz yaşı kimi axan çayın suyu qıpqırmızı axır. Dəhşətə gəlir… O, başa düşür ki, çayın yuxarısında əjdaha Sumu parçalayıb. Suyun rəngini qırmızı boyayan da öz cavan canını sevgisinə , camaatına qurban verən Sumun qanıdır.

Ceyran tələsik özünü hadisə yerinə çatdırır. Görür ki, Sum əjdahanı öldürüb, özü də ölüb. Sevgilisinin bu halına dözə bilmir, oradaca havalanır, yenidən Sumu tapmaq üçün fəryad edir, dağlara-daşlara səs salır:

-Hardasan, Sum?!!! Sum, qayıt!!!

Ceyran bir gün yenə də çöllərdə Sumu axtararkən bir bataqlığa düşür. Onun taqəti belə olmur ki, bu sulu bataqlıqdan çıxsın. Bataqlıq onu yavaş-yavaş yerin tərkinə çəkir və Ceyran burada boğulur. Vəfalı qız ölüm ayağında da sevgilisini səsləyir:

-Sum, qayıt!!! Sum, qayıt!!!

Ceyranın ölümündən sonra həmin tayfa öz yaşadığı bu yeri Ceyranın Sumu çağırdığı kimi, Sumqayıt qoyurlar. Ceyranın boğulduğu yer isə Ceyranbatan gölü adlanır.

### *277. Bülbül və tikansız gül*

Bir şeyda bülbül xoş ətri ilə hamını valeh edən bir qızılgülə vurulmuşdur. Qızıl gülün çiçəkləri nə qədər gözəl, nə qədər təravətli, nə qədər cazibəli, nə qədər ətirli olsa da, amansız tikanları bir o qədər qorxulu idi. Şeyda bülbül qızılgülün eşqindən bir parça alov kimi alışıb, yanırdı. Bülbül, gecə-gündüz sevgilisinin başına dolanır, yanıqlı, lətif nəğmələri ilə daşları da dilə gətirirdi. Bu məhəbbətdən, bu nəğmələrdən qızılgül daha da gözəl-ləşir, daha da pardaxlanırdı. Bülbül vüsala yetmək üçün çox çalışırdı. Lakin tikanlı budaqlara qonub, sevgilisi ilə şirin söhbət edə bilmirdi.

Şeyda bülbül zalım tikanlardan o qədər nalə çəkdi ki, axırda qızılgülün ona rəhmi gəldi, onu qoruyan, onu qiymətə mindirən tikanlarını tökdü. Şeyda bülbül arxa-yınca sığallı budağın üstünə qonub, vüsala çatdı. Bundan sonra necə oldusa, onun yanıqlı, lətif nəğmələri kəsildi. Onun səsinə, nəğməsinə alışmış güllər, çiçəklər, meşələr darıxmağa başladılar. Ancaq Şeyda bülbül nə qədər çalışdısa, əvvəlki nəğmələri oxuya bilmədi. Hamı onu nəğməsiz bülbül kimi tanımağa başladı. Bülbül belə tənələrə, belə xiffətə dözməyib, tikansız qızılgül bu-dağının üstündə öldü. Qızılgül də öz tutduğu əməlin peşimançılığına dözmədi.

### *278. Əsli-Kərəm əfsanəsi*

Günlərin bir günü Ziyad xan veziri Qara Keşişlə məmləkəti yoxlamaq üçün səfərə çıxırlar. Onlar söhbət edə-edə yol ilə gedirlərmiş. Birdən gözləri yolun ortasında olan bir almaya sataşır. Ziyad xan almanı götürmək istəyir. Qara Keşiş tez

qılıncını sıyırıb, almanı qılıncın ucunda götürür. Görür ki, almanın bir tərəfi çıraqdır-qıpqırmızı. O biri tərəfi isə dümağdır. Almanı götürüb, tən yarı bölür. Ağ tərəfini Ziyad xana verir, qırmızı tərəfini isə özü götürür.  Hər ikisi almanı yeyirlər. Deyirlər ki, o vaxta qədər nə Ziyad xanın, nə də Qara Keşişin övladı yox imiş. Elə ki, onlar almanı yedilər, sonra yola başladılar. Məmləkəti dolanıb, şəhərə qayıt-dılar. Bu əhvalatdan bir müddət keçir. Günlərin bir günü Ziyad xanın bir oğlu,  Qara Keşişin bir qızı olur. Uşaq-ların birinin adını Məryəm, birinin adını Mahmud qo-yurlar. Ziyad xan Qara Keşişin qızını oğluna deyikli edir. Bundan bir müddət sonra uşaqlar təhsil alır. Həddi –buluğa çatırlar. Ziyad xan artıq oğluna toy etmək istədiyini Keşişə xəbər verir. Keşiş bir söz deməyib, möhlət istəyir. Ziyad xan ona möhlət verir. Deyirlər ki, o vaxta qədər qızla oğlan bir-birini görməyiblərmiş. Bir gün Mahmud əlində tərlan ova gedirmiş. Birdən tərlan havaya qalxır, yaxınlıqda olan bir bağa uçur. Mahmud da tərlanın dalınca bağa keçir. Tərlan özünü bağda olan bir qızın qucağına verir. Mahmud qızı görüb, ona aşiq olur və tərlanı istəyir. Qız "Kərəm oğlan, kərəm eylə, quşu al" deyib, tərlanı oğlana verir. Bu vaxtdan Mahmudun adı Kərəm qalır. Kərəm evə gəlib əhvalatı atasına söyləyir. Atası o qızın Mahmudun deyiklisi olduğunu söyləyir. Qara Keşiş Ziyad xanın oğluna toy etmək istədiyini bilib,  bu məmləkətdən ailəsini də götürüb, başqa yerə köçür.

Mahmud Qara Keşişin Əslini də götürüb qaçdığını bilir. Anasından izin alıb, Əslinin dalınca gedir. Bir çox yerlər gəzir. Əslini bir dəfə tapır. Lakin Qara Keşiş bunların birləşməsinə hər vasitə ilə mane olur. O deyir:

-Bu qızla oğlan bir almadan əmələ gəliblər, onların birləşməsi heç cür mümkün deyil.

Kərəmə allah tərəfindən aşıqlıq verilir. O, gəzdiyi bir çox yerlərin gözəllərinə söz qoşur. Lakin Əslini heç cür yadından çıxara bilmir. Kərəm kimə baxırsa, Əslini görür, kimə söz qoşursa, elə bilir ki, Əsliyə söz qoşur. Kərəm çox dolaşır, axırda gəlib bir məmləkətdə Əslini tapır. Lakin Kərəm qəm-qüssəyə düçar olduğu üçün Allahdan ölüm istəyir. Elə bu vaxt Əsli Kərəmin gözünə görünür. Kərəm Xan Əslini görüb, kədərlənir. Ah çəkir. Onun ağzından bir qığılcım çıxıb, canına düşür. Kərəm yanıb, kül olur. Camaat bu nakam eşqin külünü bir qaba yığıb, el qəbiristanlığında dəfn eləyirlər.

Qara Keşiş başa düşür ki, qızının da aqibəti Kərəmin aqibəti kimi olacaq. Ona görə də Əslini heç yana buraxmır. Ona göz yetirmək üçün, qulluğunda durmaq üçün üç kəniz alır. Kənizlərə tapşırır ki, nəbadə-nəbadə Əslini Kərəmin qəbrinin üstə getməyə qoyasınız. Əsli günlərini belə ah-fəryadla keçirir.

Günlərin bir günü Əsli kənizləri ilə bağda gəzirmiş, birdən Kərəm Əslini yadına düşdü. Əsli kənizlərə qəbiristanlığa getmək istədiyini bildirir. Kənizlər onu bu fikirdən daşındırmaq üçün atasının Əsliyə qəbiristanlığa getməsinin qadağan etdiyini söyləyirlər. Əsli israrla qəbiristanlığa getmək istədiyini, heç olmasa uzaqdan da olsa, Kərəmin qəbrini görmək istədiyini söyləyir. Kənizlər istər-istəməz razı olurlar. Bir şərtlə ki, qəbrin yaxınlığına getməyəcəklər. Əsli razı olur. Onlar qəbiristanlığa gəlirlər. Əsli uzaqdan Kərəmin qəbrini tanıyır. Kərəmin qəbrini kənizlərə göstərir. Kənizlər qəbri tanımırlar. Əsli əyilib yerdən balaca bir daş götürüb,

qəbrə atır. Daş başdaşına dəyən kimi qəbirdən bir çınqı qopur. Daş qayıdıb Əslinin üstünə düşür. Əsli od alır. O, da yanıb kül olur. Xəbər Qara Keşişə çatır. Keşiş külü basdırmaq istəyəndə xalqın israrı ilə Kərəmin qəbri ilə yanaşı basdırmalı olur. Xalq iki nakam sevgilinin qəbri üstə ağlayır. Deyirlər, xalqın göz yaşlarından hər qəbrin üstündə bir qızılgül kolu bitir. Hər bahar gələndə qızılgül qönçələnir, bir-birinə doğru can atır. Lakin Qara Keşiş qəbrlərin tən ortasında bir qara tikan kolu əkir. Güllər bir-birinə nə qədər can atsalar da, qara tikan onların birləşməsinə mane olur. Necə ki, Qara Keşiş onların sağlığında bir-birinə qovuşmasına mane olurdu.

Qara Keşiş gənclərin bir almadan əmələ gəldiyini bilirdi. Bilirdi ki, onlar mütləq bir-birinə qovuşmalıdır, Kərəmin aqibəti yanıb kül olubsa, qızının da aqibəti yanıb kül olacaqdır.

# İzah və qeydlər

***İzah və qeydlərin əhəmiyyəti ondan ibarətdir ki, orada əfsanələrin hansı coğrafi ərazidən və hansı nəsil şəcərəsindən toplanması haqqında şərh verilir. Həmçinin, toplayıcının hansı aqil babalarla, sinədəftər nənələrlə təmasda olduğuna, ünsiyyət saxladığına onlar şahidlik edir.***

## *Əfsanələr*

## Dağ, daş və qayalar

***1.**Oğlan-qız daşı.* Bu daşlar Gədəbəy rayonunun Böyük Qarabulaq kəndindədir. Əfsanə həmin kəndin sakini, 63 yaşlı Cahan Qahrı oğlu Abdalovdan yazılmışdır.

***2**.Qanlı daş.* Həmin daş Kəpəz dağının döşündədir: Əfsanəni Xanlar rayonundakı Sarısu kənd sakini, 72 yaşlı Xəlil Əsəd oğlu Bağırov danışmışdır.

***3.**Gəlin daşı.* Əfsanə Goranboy rayonundakı Todan kənd sakini, 90 yaşlı Rza Şahrza oğlu İsmayılovdan yazılmışdır.

***4.**Daş gəlin.* Şuşa şəhərində yaşayan, 90 yaşlı Nisə Lələbəy qızı Zeynalovadan yazılmışdır. Bu qaya rayonun Şırlan kəndi yaxınlığındadır.

***5**.Qılınc və qaya.* Əfsanə Şamaxı rayonundakı Çarxan kənd sakini, 65 yaşlı Şəmsəddin Məlik oğlu İbrahimovdan yazılmışdır.

***6.**Yaslı qaya.* Həmin qaya Daşkəsən rayonundakı Əmirvar kəndinin yaxınlığındadır. Əfsanəni Daşkəsən rayonundakı Əmirvar kənd sakini, 90 yaşlı Gövhər Rüstəm qızı Əhmədova söyləmişdir.

***7**.Laçın qayası.* Həmin qaya Kəlbəcər rayonunun Almalı və Laçın kəndlərinin yaxınlığındadır. Əfsanə Kəlbəcər rayonundakı Yellicə kənd sakini, 120 yaşlı Münəvvər Kərim qızı Cəfərovadan yazılmışdır.

***8.**Gəlin atılan qaya.* Qaya Göyçə mahalının Dərələyəz elinin ərazisindədir. Əfsanəni Göyçə mahalının Əmirxeyir kənd sakini, 92 yaşlı Səlminaz Mirzə qızı Allahverdiyeva danışmışdır.

***9**.Gəlin qaya.* Eyni adlı bu qayalardan üçü Xanlar, ikisi isə Daşkəsən rayonundadır. Bu əfsanə isə «Maral göl»ün yaxınlığındakı Gəlin qaya haqqındadır. Əfsanəni Xanlar rayonundakı Hacıməlik kənd sakini, 100 yaşlı Dursun Sadıq qızı Göyüşova söyləmişdir.

***10**.Əriyən qaya.* İsmayıllı rayonundakı Lahıc kənd sakini, 86 yaşlı Ağabacı Gülməmməd qızı Fahimovadan yazılmışdır.

***11**.Qanlı qaya.* Göyçə mahalının Çaykənd kənd sakini, 103 yaşlı Nəcabət Hacı qızı İskəndərova söyləmişdir.

***12.**Təklə igidləri.* Şamaxı rayonundakı Çarxan kənd sakini, 60 yaşlı Məryəm Veysəl qızı İbrahimovadan yazılmışdır.

***13.**Göyəzəndə qızıl piyalə.* Göyəzən Qazax rayonundakı Alpoud kəndi yaxınlığındadır. Deyilənə görə, hələ də həmin qızıl piyalə Göyəzənin zirvəsindəki mağarada qalır. Göyəzən haqqında əfsanə çoxdur. Biz bu əfsanəni məqbul saydıq. Əfsanənin bu variantını Qazax rayonundakı Musagöy kənd sakini, 79 yaşlı Güləndam Məhəmməd qızı Şahvələdova söyləmişdir.

***14**.Saçlı qaya.* Əfsanə Şamaxı rayonundakı Çarxan kənd sakini, 65 yaşlı Şəmsəddin Məlik oğlu İbrahimovdan yazılmışdır.

***15**.Gəlin qayası.* Əfsanə Gədəbəy rayonundakı Söyüdlü kənd sakini, 85 yaşlı Tapdıq Qasım oğlu Talıbovdan yazılmışdır.

***16.**Gəlin qayıdan qaya.* Əfsanəni Kəlbəcər rayonundakı Zivel kənd sakini, 80 yaşlı Güləmbər Abdulla qızı Abdullayeva söyləmişdir.

***17**.Zəncirli qaya.* Əfsanəni Gədəbəy rayonundakı «Komintern» kənd sakini, 85 yaşlı İsa Tağı oğlu söyləmişdir.

***18**.Qum-qum daş.* Əfsanə Laçın rayonundakı Vəlibəyli kənd sakini, 83 yaşlı Əşrəf Əziz oğlu Əmirovdan yazılmışdır.

***19.**Kar daş.* Əfsanə Füzuli rayonundakı Yağlıvənd kənd sakini, 65 yaşlı İnsaf Əliaslan oğlu Quliyevdən yazılmışdır.

***20**.Oğlan-qız daşı.* Əfsanəni Qubadlı rayonundakı Boyunökər kənd sakini, 89 yaşlı Maral İskəndərova söyləmişdir.

***21**.Daş pəhləvan.* Goranboy rayonundakı Nizami kənd sakini, 130 yaşlı Muşqulu İsmayıl oğlu Qurbanovdan yazılmışdır.

***22****.Oğlan-qız daşı.* Əfsanə Gürcüstanın Marneuli rayonundakı Qaçağan kənd sakini, 92 yaşlı Ruxsarə Əli qızı Həsənovadan yazılmışdır.

***23.****Daş qız.* Əfsanə Ağdam rayonundakı Qərvənd kənd sakini, 83 yaşlı Fatma Pirməmməd qızı Salahovadan yazılmışdır.

***24.****Çoban və daşa dönən sürü.* Əfsanə Qəbələ rayonundakı Tikanlı kənd sakini, 75 yaşlı Züleyxa Həsənalı qızından yazılmışdır.

***25****.Soltanbud.* Soltanbud təpələri Beyləqan rayonun-dadır. Soltanbud əfsanələri də çoxvariantlıdır. Əfsanə Beyləqan rayonundakı Bünyadlı kənd sakini, 70 yaşlı İntizar Məhərrəm qızı Məmmədovadan toplanmışdır.

***26****.Dəyirman dağı.* Həmin dağ Gədəbəy rayonundakı Dəyirman dağı kəndinin üst tərəfindədir. Əfsanə Gədəbəy rayonundakı Sovetkənd kənd sakini, 96 yaşlı Müseyib Məsim oğlu İmamquliyevdən yazılmışdır.

***27****.Qaraçənli və Dəlidağ.* Dəlidağ və Qaraçənli kəndi Kəlbəcər rayonundadır. Əfsanə Kəlbəcər şəhərində yaşayan, 105 yaşlı Salman Nəcəf oğlu Nəcəfovdan yazılmışdır.

***28****.Sənan dağı.* Əfsanə Salyan rayonundakı Varlı kənd sakini, 80 yaşlı Nəcəbət Ruhulla qızı Heydarovadan yazılmışdır.

***29.****Dağların ayrılığı.* Əfsanə Goranboy rayonundakı Zeyvə kənd sakini, 65 yaşlı Humay Namazovadan və Todan kənd sakini, 90 yaşlı Rza Şahrza oğlu İsmayılovdan yazılmışdır.

***30.****Siyah zənən.* Bu məhşur qaya Dəvəçi rayonunun ərazisindədir. Əfsanə Dəvəçi şəhər sakini, 80 yaşlı Fazil Adıgözəlovdan toplanmışdır.

***31****.Ağrı dağı.* Əfsanə Göyçə mahalındakı Bala Məzrə kənd sakini, 75 yaşlı Firəngiz Aslan qızı Rəsulovadan yazılmışdır.

***32****.Ana ağrı dağı, bala Ağrı dağı.* Əfsanə Göyçə mahalındakı Zod kənd sakini, 93 yaşlı Nabat Məhəmməd qızı Tağıyevadan yazılmışdır.

***33.****Qırmızı dağda quşların söhbəti.* Belə bir əfsanəli Qırmızı dağ Qəbələdə də var. Əfsanə Kəlbəcər rayonundakı Zivel kənd sakini, 80 yaşlı Güləmbər Abdulla qızı Abdullayevadan yazılmışdır

***34****.Yanardağ əfsanəsi.* Yurdumuzda Yanardağ adlı dağlar çoxdur. Masallıda, Qubada, Göy-göl ətrafında, Ağdaşda, Gədəbəydə və başqa yerlərdə Yanardağ, Ocaqdağı adını daşıyan dağlar vardır. Ağdaşdakı Surxay xan qalası həmin Yanardağdadır. Əfsanə Masallı rayonundakı Sığdaş kənd sakini, 75 yaşlı Xanımsultan Məmmədrəhim qızı İsmayılovadan və Dəmbəlov kənd sakini, 72 yaşlı Təbriz İmanqulu oğlu Quliyevdən toplanmışdır.

***35.****Keyti dağı.* Həmin dağ Kəlbəcər rayonundakı Zar kəndinin üst tərəfindədir. Birinci əfsanə Kəlbəcər rayonundakı Zivel kənd sakini, 80 yaşlı Güləmbər Abdulla qızı Abdullayevadan, ikinci əfsanə Bərdə rayonundakı köhnə Leninabad kənd sakini, 95 yaşlı Həmilə İnnətalı qızı Muradovadan toplanmışdır.

***36.****Qoşa qardaş dağı.* Şəmkir rayonundakı İrmaşlı kəndi yaxınlığında olan bu dağların əfsanəsi həmin kənddə yaşayan, 70 yaşlı Qara Həsən oğlu Məmmədovdan yazılmışdır.

***37****.Beşikli dağ.* Əfsanə Ağdam rayonundakı Qaradağlı kənd sakini, 65 yaşlı Xurşid Vəli qızı Əliyevadan yazılmışdır.

***38.****İncəbel.* Əfsanə Şamaxı rayonundakı Udlu kənd sakini, 75 yaşlı Əliqardaş Əmrah oğlu Ağaməmmədovdan öyrənilmişdir.

***39****.Ocaq dağı.* Əfsanə Gədəbəy rayonundakı Parakənd kənd sakini, 80 yaşlı Hökmalı Bayram oğlu İmanovdan yazılmışdır.

***40****.Xanım tala əfsanəsi.* Əfsanə Xanlar rayonundakı Balçılı kənd sakini, 70 yaşlı Xanım Novruzovadan və Danayeri kənd sakini, 80 yaşlı Hava Əli qızı Allahverdiyevadan yazılmışdır.

***41***.*Kürsəngi dağı.* Əfsanə Salyan rayonundakı Kürsəngi kənd sakini, 75 yaşlı Qönçə Süleyman qızı Qəribovadan yazılmışdır.

***42.****Şah dağı.* Əfsanə Quba rayonundakı Amsar kənd sakini, 101 yaşlı Məmmədşah Baxşalı oğlu Əsgərovdan yazılmışdır.

***43.****Ləlvar dağı.* Əfsanə Dərələyəz mahalındakı Güldüzü kənd sakini, 80 yaşlı Gülnisə Şahsuvar qızı Bəxtiyarovadan yazılmışdır.

***44***.*Qısır dağ.* Əfsanə Dərələyəz mahalındakı Güldüzü kənd sakini, 80 yaşlı Gülnisə Şahsuvar qızı Bəxtiyarovadan yazılmışdır.

***45.****Abdulləsər dağı.* Əfsanə Qax rayonundakı İlisu kənd sakini, 86 yaşlı Vəli Balay oğlu Qocayevdən yazılmışdır.

***46***.*Qara dağ əfsanəsi.* Gürcüstan Marineuli rayonundakı İlməzli kənd sakini, 90 yaşlı Zinyət Abbas qızı Hacıyevadan yazılmışdır.

***47.*** *Ağrı dağı.* Əfsanə Göyçə mahalındakı Kərkibaş kənd sakini, 76 yaşlı Baxış Vəli oğlu Yusifovdan yazılmışdır.

***48.****Qırxqız.* Əfsanə Laçın rayonundakı Armudlu kənd sakini, 83 yaşlı İslam Qasım oğlu Cabbarovdan yazılmışdır.

***49.****Nuh və qarı.* Əfsanə Ağdam rayonundakı Əlimədədli kənd sakini, 101 yaşlı Həmid Şirin oğlu Əliyevdən öyrənilmişdir.

***50.****Yanardağın qəzəbi.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür (toplayanı və tərtib edəni Sədnik Paşa Pirsultanlı. Bakı, Azərnəşr, 1999.)

***51***.*Lələ əfsanəsi.* Əfsanə Şəmkirin Könüllü kənd sakini 80 yaşlı Pənah Aslan oğlu Məmmədovdan yazılmışdır.

***52.*** *Nisə dağı.* Əfsanə Göyçə mahalından toplanmışdır.

***53.****Təkədonduran dağı.* Əfsanə Göyçə mahalından top-lanmışdır.

## Bulaq, çay və dəniz

***54.****Damcılı bulaq.* Həmin bulaq Qazax rayonundakı Daşsalahlı kəndinin yuxarı hissəsindədir. Əfsanə həmin kəndin sakini, 73 yaşlı Göycə Kamil oğlu Cəfərovdan yazılmışdır.

***55.****Oğlan bulaq, qız bulaq.* Həmin bulaqlar Qax rayonundakı İlisu kəndinin üst tərəfindədir. Əfsanə Qax rayonundakı Turaclı kənd sakini 78 yaşlı Səlbi Tanrıverdiyevadan yazılmışdır.

***56****.Qırxbulaq.* Əfsanə Xanlar rayonundakı Hacıməlik kənd sakini, 100 yaşlı Dursun Sadıq qızı Göyüşovadan yazılmışdır.

***57****.Qırxqız bulağı*. Əfsanə Yevlax rayonundakı Xaldan kənd sakini, 60 yaşlı Fatma Mustafa qızı Sultanovadan yazılmışdır.

***58.****Nəğməli bulaq*. Ağdam rayonundakı Əlimədədli kənd sakini, 101 yaşlı Həmid Şirin oğlu Əliyevdən yazılmışdır.

***59****.Qızbənövşə bulağı.* Quba rayonundakı Amsar kənd sakini, 101 yaşlı Məmmədşah Baxşalı oğlu Əsgərovdan yazılmışdır.

***60****.Qara at bulağı.* Əfsanə Masallı rayonundakı Sığdaş kənd sakini 75 yaşlı Xanımsultan Məmmədrəhim qızı İsmayılovadan yazılmışdır.

***61.****Pərvanə gölü.* Əfsanəni Qarayazı elatındakı Qaracalar kənd sakini, 110 yaşlı Nabat Məmməd qızı Əliyeva söyləmişdir.

***62****.Qanlı göl.* Eyni adlı gölün biri Kəlbəcər rayonundakı Cəmilli kəndi yaxınlığında, ikincisi isə Göyçə mahalının Dərələyəz elatındadır. Əfsanə Göyçə mahalının Dərələyəz elatının Güldüzü kənd sakini, 80 yaşlı Gülnisə Şahsuvar qızı Bəxtiyarovadan yazılmışdır.

***63.****Qız gölü.* Əfsanə Qəbələ rayonundakı Mıxlıqovaq kənd sakini, 82 yaşlı Alagül Əziz qızı Hümbətovadan yazılmşdır.

***64****.Qızıl məcməyi əfsanəsi.* Əfsanə Kəlbəcər rayonundakı Başlıbel kənd sakini, 75 yaşlı Gilə Rza qızı Mirzəyevadan yazılmışdır.

***65****.Qanlı gölün maralları.* Əfsanə Masallı rayonundakı Xırmandalı kənd sakini, 82 yaşlı Gülüstan İbadulla qızı Hüseynovadan toplanmışdır.

***66.****Dəniz və qağayı.* Əfsanəni Sumqayıt şəhər sakini, 90 yaşlı Leyla Cavad qızı Novruzova söyləmişdir.

***67.****Göyçə gölü.* Əfsanə Göyçə mahalındakı Zod kənd sakini, 93 yaşlı Nabat Məhəmməd qızı Tağıyevadan yazlmışdır.

***68****.Göy-Göl*. Əfsanə Xanlar rayonundakı Qaryağdı sakini, 78 yaşlı Museyib Musa oğlu Həsənovdan yazılmışdır.

***69.****Ağdəvə gölü.* Əfsanə Yardımlı rayonundakı Arus kənd sakini, 103 yaşlı Bağdı Mirzəyevadan toplanmışdır.

***70.****Murana göl.* Əfsanə Qax rayonundakı Qıpçaq kənd sakini, 80 yaşlı Mir Hacı Kərəm oğlu Məmmədovdan yazılmışdır.

***71.****Qırxqız gölü və Şahbulaq*. Əfsanə Ağdam rayonundakı Güllücə kənd sakini, 95 yaşlı İbrahim Zal oğlu Zalovdan yazılmışdır,

***72.****Qanlı çay.* Əfsanə Şuşa şəhər sakini, 65 yaşlı Rübabə Əsəd qızı Əmiraslanovadan öyrənilmişdir.

***73.****Mincivan bulağı və Tərtər çayı.* Əfsanə Bərdə rayonundakı Hüseynallar kənd sakini, 120 yaşlı Zeynəb Alxar qızı Səmədovadan yazılmışdır.

***74****.Cirgiz çayı.* Əfsanə Ağdam rayonundakı Papravənd kənd sakini, 90 yaşlı Güləndam Kərimovadan yazılmışdır.

***75****.Fatma axan çay.* Əfsanə Qazax rayonundakı Qaymaqlı kənd sakini, 85 yaşlı Əhməd Nağdalı oğlu Suleymanovdan yazılmışdır.

***76 İlahi izin vermədi****.* Əfsanə Yevlağın Salahlı kəndindən toplanmışdır.

***77**.Həmzə bulağı.* Əfsanə Ağdam rayonundakı Maqsudlu kənd sakini, 70 yaşlı Sümər Naibovadan yazılmışdır.

## Çiçək və gül əfsanələri

***78. Lala xaş- xaş əfsanəsi***. Əfsanə Gəncə şəhərinın sakini Fəridə Əbülfəzqızı tərəfindən toplanmışdır.

***79.**Gəlinbarmağı.* Əfsanə Şamaxı şəhərində yaşayan, 74 yaşlı Minəbəyim Əliyevadan yazılmışdır.

***80.**Qızılgül əfsanəsi.* Əfsanə Xanlar rayonundakı Toğana kənd sakini, 90 yaşlı İsa Musa oğlundan və 78 yaşlı Yasəmən Alıyevadan yazılmışdır. Əfsanəyə görə, Kəpəz dağının ilk adı Arzu dağı olmuş, zəlzələdən sonra dağın adı dəyişib, Kuhipəs-yəni Yanardağ olmuşdur. Əlbəttə, bu, hər şeydən əvvəl, xalq etimologiyası ilə bağlı mülahizədir. Türk yazılı mənbələrinə görə, Kəpəz qədim dövrlərdə toyu olan qızın gəlinlik papağının, daha doğrusu, gəlinlik tacının adı olmuşdur. Həqiqətən Kəpəz dağlar gözəli Göy-Gölün başında gəlinlik tacına bənzəyir.

***81**.Bənövşə əfsanəsi.* Əfsanə Göyçə mahalının İlməzli kənd sakini, 70 yaşlı Firuzə Məmməd qızı Məmmədovadan yazılmşdır.

***82**.Şehli güllər içində.* Əfsanə Şuşa şəhərində yaşayan, 90 yaşlı Nisə Lələbəy qızı Zeynalovadan öyrənilmişdir.

***83.**Çobanyastığı çiçəyi.* Əfsanə Borçalı mahalının Darbaz kənd sakini, 120 yaşlı Ayna Məmməd qızı Abbasovadan yazılmışdır.

***84.**Lalə əfsanəsi.* Goranboy rayonundakı Todan kənd sakini, 90 yaşlı Rza Şahrza oğlu İsmayılovdan yazılmşdır.

***85**.Qızboyu çiçəyi*. Əfsanə Kəlbəcər rayonundakı İstibulaq kənd sakini, 75 yaşlı İntizar Uğurlu qızından yazılmışdır.

***86**.Ağgul və bülbül.* Şuşa rayonundakı Turşsu kənd sakini, 90 yaşlı İmran Şükürovdan toplanmşdır.

***87.**Şeşənbülbül çiçəyi*. Əfsanə Yevlax rayonundakı Xaldan kənd sakini, 60 yaşlı Fatma Mustafa qızı Sultanovadan öyrənilmişdir.

***88**.Bənövşə əfsanəsi.* Əfsanə Cəbrayıl rayonundakı Niyazqulular kənd sakini, 87 yaşlı Ziynət Ağalar qızı Quliyevadan yazılmışdır.

***89.**Köksü qaralan lalə.* Əfsanə Zəngəzur mahalının Zəngibasar kənd sakini, 84 yaşlı Məmməd Cəfər oğlu Məmmədovdan yazılmışdır.

***90.**Lalədə qara xal.* Əfsanə Ağdaş rayonundakı Kotavan kənd sakini, 82 yaşlı Züleyxa İsmayılovadan yazılmışdır.

***91.**Yeddi il solmaz çiçək.* Əfsanə Göyçə mahalının Bala Məzrə kənd sakini, 75 yaşlı Firəngiz Aslan qızı Rəsulovadan toplanmışdır.

***92.**Bənövşə əfsanəsi*. Bərdə rayonundakı Lək kənd sakini, 69 yaşlı Durna Aşıralı qızı İbrahimovadan yazılmışdır.

***93**. Ceyrançöl əfsanəsi.* Samux rayonu, Poylu kəndinin sakini Məcid tərəfindən yazıya alınmışdır.

## Quş və heyvanlar haqqında

***94.** Qızılquş əfsanəsi.* Əfsanə Gədəbəy rayonundan toplanmışdır.

***95.**Ovçu Pirim və Xan Kəlbi.* Əfsanə Kəlbəcər rayo-nunun sakini Aşıq Şəmşirdən toplanmışdır.

***96**. Bülbül və qızıl.* Əfsanə Samux rayonundan toplan-mışdır.

***97**. İlan və bağban.* Əfsanə Masallı rayonundan top-lanmışdır

***98**. Bülbül və qoca.* Əfsanə Gəncə şəhərindən top-lanmışdır.

***99.****Qarğa öyüdü.* Əfsanə Qazax rayonunun Qaymaqlı kəndindən toplanmışdır.

***100.****Səməndər quşu.* Bu əfsanə Şamaxı, Şəmkir və digər rayonlarda eyni məzmunda danışılır. Əfsanə Şamxor (Şəmkir) rayonundakı Morul kənd sakini 85 yaşlı Teymur Əli oğlu Hüseynovdan yazılmşdır.

***101.****Səməndər əfsanəsi.* Salyan rayonundakı Yolüstü kənd sakini, 110 yaşlı Sədəf Hüseynovadan öyrənilmişdir.

***102.****Şanapipik.* Şamaxı rayonundakı Çarxan kənd sakini, 65 yaşlı Şəmsəddin Məlik oğlu İbrahimovdan yazılmışdır.

***103.****Vaqif, Nəsim və Bülbül.* Əfsanə Qazax rayonundakı Daşsalahlı kənd sakini, 103 yaşlı Balaxanım İsmayıl qızı Məmmədovadan yazılmışdır.

***104.*** *Bülbül və gül*. Əfsanə Masallı rayonundan toplanmışdır.

***105.****Göyərçin.* Əfsanə Şəki rayonundakı Oxut kənd sakini, 70 yaşlı Xədəstə Əbdürəhman qızından toplanmışdır.

***106****.Hophop.* Əfsanə Ağdaş şəhərində yaşayan, 85 yaşlı Gülayə Tərlan qızı Məmmədovadan yazılmışdır.

***107.****Kəklik.* Şamaxı şəhərində yaşayan, 95 yaşı Gülzeynəb Ağayevadan yazılmışdır.

***108.****Turac quşu.* Xanlar rayonundakı Füzuli kənd sakini, 80 yaşlı Mirzə Məmməd oğlu Verdiyevdən yazılmışdır.

***109.****Quş qeyrəti.* Əfsanəni Naxçıvan MR-nın Sirab kənd sakini, 93 yaşlı Murad Abbas oğlu Quliyev söyləmişdir.

***110.****Təmənnalı yaxşılıq.* Naxçıvan MR-nın Şərur rayonundakı Düdəngə kənd sakini, 75 yaşlı Səriyyə İmran qızı Şirəliyevadan yazılmışdır. Bu əfsanənin Xanlar, Şəmkir və Goranboy rayonlarından toplanmış ikinci variantı da var. İkinci əfsanəyə görə qaranquş varlının damında yuva qurmalı olur. O isə icazə vermir. Qaranquşu qovur. Onun qonşusu olan kasıb kişi qaranquşu mehribanlıqla qarşılayır. Buna görə də

qaranquş kasıbın bağçasına gül, varlının bağçasında isə qaratikan toxumu gətirib səpir.

***111.**Xoruz və Tovuz quşu.* Əfsanə Şəmkir rayonundakı Dəllər-Cəyir kənd sakini, 78 yaşlı Nərgiz Abbas qızı Bağırovadan yazılmışdır.

***112.**Qu quşu əfsanəsi.* Əfsanə Salyan rayonundakı Varlı kənd sakini, 80 yaşlı Nəcabət Ruhulla qızı Heydərovadan yazılmışdır.

***113.**Qu quşlarının kədəri.* İmişli rayonundakı Boşçal-lılar kənd sakini, 80 yaşlı Quba Səlim qızı Yusifovadan yazılmışdır.

***114.**Bülbülün son nəğməsi.* Əfsanə Tərtər rayonundakı Küçərli kənd sakini, 80 yaşlı Nərgiz Hüseynovadan toplanmışdır.

***115.**Bülbül niyə görmür.* Şuşa rayonundakı Xəlifəli kənd sakini, 90 yaşlı Qızbəs Məmməd qızı Mirzəyevadan yazılmışdır.

***116.**Xarıbülbül.* Şüşa şəhər sakini, 90 yaşlı Nisə Lələbəy qızı Zeynalovadan yazılmışdır.

***117.**Qaranquş əfsanəsi.* Əfsanə Tərtər şəhərində yaşayan, 65 yaşlı Kubra Xanbala qızı Həsənovadan öyrənilmişdir.

***118.**Göyərçinin ayağı niyə qırmızıdır.* Əfsanə İmişli rayonundakı Əliqullular kənd sakini, 75 yaşlı Minayə Hüseynqulu qızı Nəcəfovadan yazılmışdır.

***119.**Sarı bülbül əfsanəsi*. Qazax rayonundakı Kəmərli kənd sakini, 85 yaşlı Yetər Carçalovadan öyrənilmişdir.

***120.**Göyərçin.* Əfsanə Gəncə şəhərinin sakini, 80 yaşlı Bəyaz Salman qızı İsmayılzadədən yazılmışdır.

***121.**Bəy quş.* Əfsanə Bərdə rayonundakı Lənbəran kənd sakini, 75 yaşlı Züleyxa Musa qızı Əliyevadan yazılmışdır.

***122.**Bülbül və qaratikan kolu.* Əfsanə Gədəbəy rayonundakı Çalburun kənd sakini, 75 yaşlı İmran Ramazan oğlu Zeynalovdan toplanmışdır.

***123.****Qarğa haqqında əfsanə*. Bərdə rayonundakı Xəsilli kənd sakini, 110 yaşlı Bilqeyis Bədəlovadan yazılmışdır.

***124.****Simurğ quşu*. Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***125.****Qızıl quş*. Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***126.****Xilaskar ilan*. Əfsanə Gədəbəy rayonundakı Çaldaş kənd sakini, 67 yaşlı Səlmi Cəfər qızı Zeynalovadan yazılmışdır.

***127.****Qızıl ilan*. Əfsanə Qazax rayonundakı Musagöy kənd sakini, 79 yaşlı Güləndam Məhəmməd qızı Şahvələdovadan yazılmışdır.

***128****.Keçi südü və ilan zəhəri.* Əfsanə Daşkəsən rayonundakı Şəkərəm kənd sakini, 80 yaşlı Bağçalı Rəsul oğlu Məmmədovadan öyrənilmişdir.

***129.****İlan oğlan.* Əfsanə Yevlax şəhər sakini, 100 yaşlı Bahar Ağahəsən qızı Ağahəsənovadan toplanmışdır.

***130.****Ağ ilan əfsanəsi.* Yevlax rayonundakı Boşçalılar kənd sakini, 74 yaşlı Gülgəz Hüseyn qızı Qurbanovadan yazılmışdır.

***131.****Zümrüd quşu və ilan.* Əfsanə Kürdəmir rayonundakı Şilyan kənd sakini, 95 yaşlı Paşa Səlim oğlu Kərimovdan yazılmışdır.

***132.****Gülzarı ilan da sevir.* Əfsanə Ağdam rayonundakı Paprəvənd kənd sakini 90 yaşlı Şölə Alıiskəndər qızı Məm-mədovadan öyrənilmişdir.

***133.*** *Qarpız.*Əfsanə Ağdaş rayonundan toplanmışdır.

***134.****İlan məhəbbəti.* Əfsanə Kürdəmir rayonundakı Şilyan kənd sakini, 95 yaşlı Paşa Səlim oğlu Kərimovdan yazılmışdır.

***135.****Qız və ilan.* Əfsanə Saatlı rayonundakı Azadkənd sakini, 103 yaşlı Narınc Cəlil qızı Məmmədovadan yazıl-mışdır.

***136.****Qızıl ilan.* Ucar rayonundakı Alpoud kənd sakini, 71 yaşlı İmmixanım Ağa qızı Kərimovadan yazılmışdır.

***137.****İlanların müharibəsi.* Birinci əfsanə Xanlar rayonundakı Eldar kənd sakini, 68 yaşlı Mayısxanım Böyükkişi qızı Nəsibovadan, ikincisi Salyan şəhərində yaşayan, 70 yaşlı Laləzər İmanovadan, üçüncüsü Naxçıvan MR-nın Güzvüd kənd sakini, 83 yaşlı Abbas Səfər oğlu Səfərovdan yazılmışdır.

***138.****Qızı əjdaha udur.* Əfsanə Beyləqan rayonundakı Örənqala qəsəbə sakini, 90 yaşlı Abuzəndə Piri qızı Həsənəliyevadan yazılmışdır.

***139.****İlan və qaranquş.* Əfsanə Naxçıvan şəhərindən toplanmışdır.

***140****.Maralın göz yaşları.* Əfsanə Bərdə rayonundakı Lək kənd sakini, 69 yaşlı Durna Aşıralı qızı İbrahimovadan yazılmışdır.

***141.****Hərşənin maralları.* Əfsanə Borçalı mahalının Darbaz kənd sakini, 120 yaşlı Ayna Məmməd qızı Abbasovadan yazılmışdır.

***142.****Maral qayası.* Əfsanə Şəmkir rayonundakı Dəllər-Cırdaxan kənd sakini, 92 yaşlı Rüstəm Məsim oğlu Tağıyevdən yazılmışdır.

***143****.Ana maral.* Əfsanə Göyçə mahalının Ağbaş kənd sakini, 73 yaşlı Paşa Süleyman oğlu Əliyevdan yazılmışdır.

***144.****Qızıl beşik.* Əfsanə İmişli rayonundakı Sərxanlı kənd sakini, 86 yaşlı İmamqulu Məhəmməd oğlu Məm-mədovdan yazılmışdır.

***145.****Maralyan.* Əfsanə Cəbrayıl rayonundakı Soltanlı kənd sakini, 90 yaşlı Nigar Quliyevadan yazılmışdır.

***146.****Maral qayası.* Əfsanə Daşkəsən rayonundakı Dardərə kənd sakini, 70 yaşlı Mina Qədim qızından yazıl-mışdır.

***147.****Gülqədəmin əfsanəsi.* Əfsanə Qazax rayonundakı Çaylı kənd sakini, 80 yaşlı Mahmud Orucəli oğlu Mahmu-dovdan yazılmışdır.

**148.*Ovçu Pirim və üç ceyran*.** Əfsanə Bərdə rayonundakı Soğanverdilər kənd sakini, 98 yaşlı Sədəf Mə-həmməd qızından öyrənilmişdir.

***149**.Maral sağına gəlir*. Əfsanə Xanlar rayonu, Samux zonasındakı Yuxarı Qarasaqqal kənd sakini, 80 yaşlı Fatma İbrahimxəlil qızı Abdullayevadan yazılmışdır.

## Ay, gün və Dədəgünəş əfsanələri

***150**.Göyün qəzəbi.* Xanlar rayonundakı Sarısu kənd sakini, 66 yaşlı Tamara Abbas qızı Bağırovadan yazılmışdır.

***151.**Günəş və Ay haqqında əfsanə.* Əfsanənin birincisi lənkəranlı, 73 yaşlı Rəcəb Səfər oğlu Ramazanovdan, ikincisi Yevlax şəhərində yaşayan, 71 yaşlı Şəhniyar Rəsul oğlu Yusifovdan yazılmışdır.

***152.Al**dədə əfsanəsi.* Əfsanə Tovuz rayonundakı Ağ-dam kənd sakini, 105 yaşlı Səkinə Alı qızı Vəliyevadan və 55 yaşlı oğlu Əli Qəhrəman oğlundan yazılmışdır.

***153**.Mahpeykər əfsanəsi.* Tovuz rayonundakı Ağdam kənd sakini, 105 yaşlı Səkinə Alı qızı Vəliyevadan yazıl-mışdır.

***154.**Qurd oğlu əfsanəsi.* Tovuz rayonundakı Ağdam kənd sakini, 90 yaşlı Oruc Məmməd oğlu Məmmədovdan yazılmışdır.

***155.**Naltökən.* Əfsanə Xanlar rayonundakı Balçılı kənd sakini, 99 yaşlı Mürsəl Novruzəli oğlu Yusifovdan yazılmışdır.

***156.**İldırım qılınc.* Tovuz rayonundakı Sarıtala kənd sakini, 81 yaşlı Əli İsmayıl oğlu Tağıyevdən yazılmışdır.

***157.**Nəqşi-nigar.* Əfsanə Tovuz rayonundakı Ağdam kənd sakini, 105 yaşlı Səkinə Alı qızı Vəliyevadan yazıl-mışdır.

***158.**Atanın od nəfəsi.* Əfsanə Şamaxı şəhər sakini, 95 yaşlı Gülzeynəb Ağayevadan yazılmışdır.

***159.****Odlu məzar.* Əfsanə Şamaxı şəhər sakini, 95 yaşlı Gülzeynəb Ağayevadan yazılmışdır.

***160****.Dədə Günəş.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***161****.Əzrayılın tora düşməsi.* Əfsanə Ağdaş rayonunda yaşayan Qüdrət Talıbovdan yazılmışdır.

***162****. Məleykə əfsanəsi.* Əfsanə Daşkəsən rayonunun Qazaxyolçular kənd sakini, yaşı 100-ü keçmiş Leyli Məmmədhəsən qızından toplanmışdır.

## Qədim qalalar

***163.****Qəbələ qalası.* Əfsanə Qəbələ rayonundakı Nic kənd sakini, 95 yaşlı Zakir Ələsgər oğlu Məmmədovdan yazılmışdır.

***164.****Pəri qalası.* Qax rayonundakı Əskibazar adlanan yerdədir. «Pəri qalası»nın divarları Balakən rayonunun ərazisinə qədər uzanır. «Pəri qalası» əfsanələri Qax, Zaqatala və Balakən rayonlarında geniş yayılmışdır. Əfsanənin bu variantı Qax rayonundakı Güllük kənd sakini, 90 yaşlı Şaban Baba oğlu Babayevdən yazılmışdır.

***165.****Sumu qalası.* Əfsanə Qax rayonundakı İlisu kənd sakini, 86 yaşlı Vəli Balay oğlu Qocayevdən yazılmışdır.

***166.****Gülüstan qalası.* Goranboy rayonundadır. Şamaxıda da bu adda məşhur qala xarabalıqları mövcuddur. Qalanın əfsanəsi Goranboy rayonundakı Todan kənd sakini, 90 yaşlı Rza Şahrza oğlu İsmayılovdan yazılmışdır.

***167.****Örənqala.* Əfsanə Beyləqan rayonundakı Örənqala qəsəbə sakini, 90 yaşlı Abuzəndə Piri qızı Həsənəliyevadan yazılmışdır.

***168.****Dərbənd qalası.* Əfsanələr Dərbənd şəhər sakinləri 82 yaşlı Zeyvə Qədirovadan və 55 yaşlı Fazil Dərbəndidən yazılmışdır.

***169.****Qanlı qala.* Əfsanə Gədəbəy rayonundakı Çalburun kənd sakini, 90 yaşlı Nazbalış Qara qızı Cəfərovadan yazılmışdır.

***170.****Öncəqala əfsanəsi.* Əfsanə Masallı rayonundakı Təklə kənd sakini, 70 yaşlı Mənsurə Zeyni qızı Qasımovadan yazılmışdır.

İndiki Öncəqalada iki yanaşı qəbir var. Qalanın qalıqları Masallı rayonundakı Öncəkələ kəndindədir. Kəndin adı qalanın adından götürülmüşdür.

***171.****Surxay xan qalası.* Əfsanə Ağdaş rayonundakı Kotavan kənd sakini, 82 yaşlı Züleyxa İsmayılovadan yazılmışdır.

***172.****Ağca qala.* Əfsanə Şəki şəhərində yaşayan, 107 yaşlı Mövlan İsa oğlundan yazılmışdır.

***173.****Qarı körpüsü.* Əfsanə Ucar rayonundakı Bağban kənd sakini, 112 yaşlı Vahid Abdulla oğlu Cavadovdan yazıl-mışdır.

***174.****Qızıl körpü.* Borçalı mahalının İlməzli kənd sakini, 90 yaşlı Zinyət Abbas qızı Hacıyevadan yazılmışdır.

***175.****Qız qalası.* Qala Qax rayonundakı Ağçay kəndinin üst tərəfindədir. Əfsanə həmin rayonun İlisu kənd sakini, 86 yaşlı Vəli Balay oğlu Qocayevdən yazılmışdır.

***176.****Qız qala.* Qalanın xarabalıqları Xanlar rayonundakı Balçılı kənd sakini, 98 yaşlı Hüseyn Rüstəm Yüsifovdan yazılmışdır.

***177****.Qız qala- namərd qala.* Şəmkir çayının sahilindədir. Əfsanə Daşkəsən rayonundakı Tapan kənd sakini, 102 yaşlı Gülüstan Bayram qızı İmamverdiyevadan yazılmışdır.

***178****.Qız qalası.* Qalanın Masallı rayonundakı Qəriblər kəndi yaxınlığında xarabalığı qalır. Əfsanə Masallı rayonundakı Xırmandalı kənd sakini, 82 yaşlı Gülüstan İbadulla qızı Hüseynovadan yazılmışdır.

***179****.Qız qalası.* Əfsanə Gəncənin Bağbanlar qəsəbəsində yaşayan, 95 yaşlı Cəlil Muxtar oğlu

Zeynəlabdinovdan yazılmışdır. Tala Xanlar rayonundakı Qızılca kəndi yaxınlığındadır.

***180.****Qız qalası.* Əfsanə Zəngilan rayonundakı Ağalı kənd sakini, 116 yaşlı Güllübəyim Baxşəliyevadan yazılmışdır.

***181****.Lənkəran qalası.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***182***. *Cavanşir qalası.* Əfsanə İsmayıllı rayonundan top-lanmışdır.

## «Dədə Qorqud» boyları ilə səsləşən əfsanələr

***183.****Dədəm qorxdu.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***184.****Xornaçı.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***185.****Uzunqız.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***186.****Dədə Qorqud və Salmani-fars.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***187.****Qızıl bellə qazılan qəbir.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

## Nizami mövzuları ilə səsləşən əfsanələr

***188.****Nizami və Gəncə əmiri.* Əfsanə Bərdə şəhərində 75 yaşlı Qızxanım Muxtar qızı Bayramovadan yazılmışdır.

***189.****Əsir padşah.* Əfsanə Şamaxı şəhərindəki Sarıtorpaq məhəlləsi sakini, 75 yaşlı Böyükxanım Əliheydər qızından yazılmışdır.

***190.****Şah və qarı.* Bakı şəhər sakini, 80 yaşlı Nisə Məmməd qızından yazılmışdır.

***191.****Ədalətli Ənuşirəvan.* Əfsanə Dərbənd şəhər sakini, 81 yaşlı Misirxan Miriyevdan öyrənilmişdir.

***192.****Maral sədaqəti.* Əfsanə Füzuli rayonundakı Horadiz kənd sakini, 90 yaşlı Xanlar Əziz oğlundan taplanmışdır.

***193***. ***Gencə- Gəncə***. Əfsanə Xanlar rayonundan toplan-mışdır. “Azərbaycan xalq söyləmələri” kitabından götürül-müşdür.

***194*** *Xan yurdu.* Əfsanə Xanlar rayonundakı Sarısu kənd sakini, 66 yaşlı Tamara Abbas qızı Bağırovadan yazılmışdır.

***195***.*Şirin qala*. Hallavar kəndinin yuxarı hissəsindədir. Əfsanə Hallavar kənd sakini, 82 yaşlı Əli Haqverdi oğlu Ələsgərovdan öyrənilmişdir.

***196.****Şirin bulaq.* Əfsanə Şəki rayonundakı Böyük Dəhnə kənd sakini, 80 yaşlı Züleyxa Əsgərovadan yazıl-mışdır.

***197.****Fərhad və Şirin əfsanəsi.* Əfsanə Oğuz rayonundakı Muxas kənd sakini, 120 yaşlı Hürü Rəşid qızı Əhmədovadan və 65 Məməş Məhəmməd oğlu Həbibullayevdən yazıl-mışdır.

***198***.*Fərhadın səsi.* Əfsanə Göyçə mahalının Zod kənd sakini, 93 yaşlı Nabat Məhəmməd qızı Tağıyevadan yazıl-mışdır.

***199.****Nəğməkar Fərhad.* Əfsanə Tovuz rayonundakı İbrahimhacılı kənd sakini, 96 yaşlı Camal Cəfər oğlu Cəfə-rovdan yazılmışdır.

***200.****Fərhadın əjdaha ilə vuruşu.* Əfsanə Naxçıvan MR-nın Şərur rayonundakı Gümüşlü qəsəbə sakini, 82 yaşlı Fərman Zeynəlabdı oğlu Məmmədhəsənovdan yazılmışdı.

***201***.*Sən Şirini ərdə bil.* Əfsanə Bərdə rayonundakı Ləmbəran kənd sakini, 75 yaşlı Züleyxa Musa qızı Əliye-vadan yazılmışdır.

***202***.*Şəbdizin ölüm xəbəri.* Əfsanə Füzuli rayonundakı Horadiz kənd sakini, 75 yaşlı Cəlal Əhmədovdan yazılmışdır.

***203..****Çahargah əfsanəsi.* Əfsanə Şuşa sakini, 90 yaşlı Nisə Ləlbəy qızı Zeynalovadan yazılmışdır.

***204.****Şindan qalası.(I,II əfsanə)* Əfsanə Astara rayonundakı Motalayataq kənd sakini, 58 yaşlı İbrahim Nurulla oğlu Əkbərovdan yazılmışdır.

***205.****Ustanın qarğışı.* Əfsanə İsmayıllı rayonundakı Qubaxəlilli kənd sakini, 70 yaşlı Şahsənəm Mənsur qızı Şirəliyevadan yazılmışdır.

***206.****Ağ körpü.* Əfsanə Astara rayonundakı Motalayataq kənd sakini, 58 yaşlı İbrahim Nurulla oğlu Əkbərovdan yazılmışdır.

***207****.Xan sarayı.* Əfsanə Şəki şəhərində yaşayan 56 yaşlı Mədinə Mustafa qızı İsmayılovadan yazılmışdır.

***208.****Acınohur.* Əfsanə Zaqatala rayonundakı Suvagil kənd sakini, 70 yaşlı Şəmsiyyə Həsən qızı Eminovadan yazılmışdır.

***209.****Şah və bağban.* Əfsanə Qutqaşen (indiki Qəbələ) rayonundakı Mıxlıqovaq kənd sakini, 82 yaşlı Alagül Əziz qızı Hümbətovadan yazılmışdır.

***210.****Elə bildim siz oyaqsız.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***211.****Qızıl yeyilməz.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***212.****Dağ adamı çağırır.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***213.****İsgəndər və Diri baba.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***214.****Xatın arxı.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***215.****Ərəşin oxu.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***216.****Davud və saz.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***217.****Salsal pəhləvan.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

## Koroğlu əfsanələri

***218**. **Həzrət Əli ilə Koroğlunun görüşü**.* Əfsanə Tovuz rayonunun Azaflı kənd sakini, el şairi Mikayıl Azaflıdan top-lanmışdır.

***219.**Koroğlunun daş qalası.* Əfsanə Gədəbəy rayonundakı Söyüdlü kənd sakini, 85 yaşlı Tapdıq Qasım oğlu Talıbovdan yazılmışdır.

***220.**Koroğlu daşı.* Həmin daş Zəngilan rayonundakı Ağalı kənd sakini, 85 yaşlı Umud Arızəlli oğlu Xəlilovdan və Goranboy rayonundakı Todan kənd sakini, 90 yaşlı Rza Şahrza oğlu İsmayılovdan yazılmışdır.

***221.**Nal daşı.* Əfsanə Laçın rayonundakı Armudlu kənd sakini, 83 yaşlı İslam Qasım oğlu Cabbarovdan yazılmışdır.

***222**.Koroğlu qalası.* Əfsanə Gürcüstanın Marneuli rayonunun Quşçu kənd sakini, 95 yaşlı Rəhim Məmməd oğlundan yazılmışdır.

***223**.Koroğlunun qılınclı daşı.* Əfsanə Xanlar rayonun-dakı Sarısu kənd sakini, 72 yaşlı Xəlil Əsəd oğlu Bağırovdan yazılmışdır.

***224.**Çənlibel.* Əfsanə Tovuz rayonundakı İbrahimhacılı kənd sakini, 100 yaşlı Sona Novruz qızı Cəfərovadan yazılmışdır.

***225.**Eyvaz qayası*. Əfsanə Göyçə yaxınlığındakı Hallavar kənd sakini, 67 yaşlı Ənvər Əli oğlu Məmmədovdan yazılmışdır.

***226.**Dolaşaların söhbəti*. Əfsanə Bərdə rayonundakı Hüseynallar kənd sakini, 120 yaşlı Zeynəb Alxar qızı Səmədovadan yazılmışdır.

***227.**Papaq altında oğul olar*. Əfsanə Şəmkir rayonundakı Seyfəli kənd sakini, 95 yaşlı Gülsüm Qasım qızı Kərimovadan toplanmışdır.

***228.**Qaragöl əfsanəsi.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***229.**Halaypozananın Çənlibelə gətirilməsi.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***230.**Koroğlu və Kəlpeysər.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

## Apardı sellər Saranı

***231***.*Çay qızı.* Naxçıvan MR-nin İliç rayonundakı Düdəngə kənd sakini, 70 yaşlı Bilqeyis Sadiq qızı Şirəliyevadan yazılmışdır.

***232***.*İntiqam.* Əfsanə Cəbrayıl rayonundakı Süleymanlı kənd sakini, 100 yaşlı Həsiyyə Hüseyn qızı Rüstəmovadan yazılmışdır.

***233***.*Apardı sellər Saranı.* Şamaxı rayonundakı Udulu kənd sakini, 80 yaşlı Talı Mustafa oğlu Təhməzovdan yazılmışdır.

***234.****Sara, Arpaçay və əjdaha.* Əfsanə Naxçıvan MR-nın Ulya-Noraşen kənd sakini, 75 yaşlı Amana Əhməd qızı Əliyevadan öyrənilmişdir.

## Müxtəlif mövzulu əfsanələr

***235.****Oğuzun təəccübü.* Əfsanə Daşkəsən rayonundakı Qazaxyolçular kənd sakini, 95 yaşlı Leyli Məmmədhəsən qızından yazılmışdır.

***236***.*Pərvanə əfsanəsi.* Əfsanə Ağdaş rayonundakı Aralıbir kənd sakini, 103 yaşlı Göyüş Bəkirovdan yazılmışdır.

***237***.*Ağlayan söyüd.* Əfsanə Borçalı mahalının Saraclı kənd sakini, 80 yaşlı Məryəm Əsəd qızı Qurbanovadan yazılmışdır.

***238***.*Səhra əfsanəsi.* Əfsanə Goranboy rayonundakı Qaşaltı kənd sakini, 90 yaşlı Muştulu Qoca oğlu Əhmədovdan öyrənilmişdir.

***239***.*Naftalan əfsanəsi.* Əfsanə Goranboy rayonundakı İrəvanlı kənd sakini, 80 yaşlı Şura Xəlil qızı Vəliyevadan öyrənilmişdir.

***240.****Gilan qarısı.* Əfsanə Naxçıvan MR-nın Güznüt kənd sakini, 83 yaşlı Abbas Səfər oğlu Səfərovdan yazılmışdır.

***241**.Başıkəsik günbəzlər.* Əfsanə Ağdam rayonundakı Qərvənd kənd sakini, 74 yaşlı Maral Hümbət qızı Quliyevadan toplamışdır.

***242**.Eşq Abdal.* Əfsanə Ağdam rayonundakı Güllücə kənd sakini, 95 yaşlı İbarhim Zal oğlu Zalovdan yazılmışdır.

***243**.Şıxdursun.* Əfsanə Ağsu rayonundakı Ağarx kənd sakini, 75 yaşlı Əli Babakişi oğlu Atakişiyevdən və Daşdəmirbəyli kənd sakini, 85 yaşlı Qızlarxanım Salman qızı Xəlilovadan yazılmışdır.

***244**.Xatun çiçəyi tərlanı.* Əfsanə Gürcüstanın Marneuli rayonundakı Quşçu kənd sakini, 76 yaşlı Əsli Qənbər qızı Abbasəliyevadan toplanmışdır.

***245**.Tərlan vurulan.* Əfsanə Şamaxı şəhərinin Sarıtorpaq məhəlləsi sakini, 75 yaşlı Böyükxanım Əliheydər qızından yazılmışdır.

***246.**Ovçu Ayaz.* Qax rayonundakı İlisu kənd sakini, 86 yaşlı Vəli Balay oğlu Qocayevdən yazılmışdır.

***247.**Qəlbin gözüylə.* Əfsanə Dağıstan vilayəti Tabasaran rayonu, Yersi kənd sakini, 95 yaşlı Gülpəri Məhəmməd qızından yazılmışdır.

***248**.Kiçik xanım və çoban*. Əfsanə Şəki şəhər sakini, 107 yaşlı Mövlam İsa oğlundan öyrənilmişdir.

***249**.Nakam məhəbbət.* Əfsanə Bərdə rayonundakı Soğanverdilər kənd sakini, 98 yaşlı Sədət Məhəmməd qızı Şirinovadan yazılmışdır.

***250**.Tısbağa əfsanəsi.* Əfsanə Xanlar rayonundakı Alıuşağı kənd sakini, 65 yaşlı Fatma İsa qızı Qasımovadan yazılmışdır.

***251**.Sehirlənmiş qız.* Saatlı rayonundakı Azadkənd sakini, 103 yaşlı Narınc Cəlil qızı Məmmədovadan yazılmışdır.

***252.**Sehirli çubuq.* Gürcüstanın Marneuli rayonundakı Quşçu kənd sakini, 76 yaşlı Əsli Qəmbər qızı Abbasəliyevadan yazılmışdır.

***253**.Qızlar yurdu.* Əfsanə Cəbrayıl rayonundakı Süleymanlı kənd sakini, 100 yaşlı Həsiyyə Hüseyn qızı Rüstəmovadan yazılmışdır.

***254.****Komurad əfsanəsi.* Oğuz rayonundakı Xaçmaz kənd sakini, 70 yaşlı Dilbər Zaman qızı Feyzulayyevadan və Qəbələ rayonundakı Nic kənd sakini, 95 yaşlı Zakir Ələsgər oğlu Məmmədovdan yazılmışdır. Komurad dağı Oğuzla Qəbələ arasındadaır.

Başqa bir varianta görə Əli Pəhləvan Muradı qılıncla tən bölür. Para şaqqası dağa düşür, parası isə başqa yana düşür. Ona görə də Muradın bir yox, iki qəbri olduğunu söyləyirlər.

***255****.Bələk daşı.* Əfsanə Şamaxı şəhər sakini, 95 yaşlı Gülzeynəb Ağayevadan yazılmışdır.

***256.****Yesxırman daşı.* Əfsanə Ağdam rayonundakı Qərvənd kənd sakini, 86 yaşlı Fatma Pirməhəmməd qızı Salahovadan yazılmışdır.

***257***. *Qaşqa Sərdar.* Əfsanə Oğuz rayonunun Xaçmazlı kəndindən toplanmışdır.

***258.****Maralın göz yaşı***.** Əfsanə Gəncə şəhərindən toplanmışdır.

***259.****Qanlı Qobu.* Əfsanə Samux rayonundakı Yuxarı Qarasaqqal kənd sakini, 80 yaşlı Fatma İbrahimxəlil qızı Abdullayevadan yazılmışdır.

***260.****Çoban və qoyun sürüsü.* Əfsanə Xanlar rayonundakı Danayeri kənd sakini, 97 yaşlı Məmmədhüseyn Məmmədqulu oğlu Allahverdiyevdən yazılmışdır.

***261****.Qızıl təpə, Mıxır təpə.* Əfsanə İmişli rayonundakı Boşçalılar kənd sakini, 80 yaşlı Quba Səlim qızı Yusifovadan yazılmışdır.

***262.****Səhəng uçan təpə.* Əfsanə Dərələyəz mahalındakı Güldüzü kənd sakini, 80 yaşlı Gülnisə Şahsuvar qızı Bəxtiyarovadan toplanmışdır.

***263.****Camış daşı əfsanəsi.* Ağdam rayonundakı Paprəvənd kənd sakini, 90 yaşlı Güləndam Kərimovadan yazılmışdır.

***264.****Güllərin hünəri.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***265.****Şeyx və çoban.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***266.****Şeyx və qardaşı.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***267.****Xəyanətin cəzası.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***268.****Kişi qızıl olur.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***269***.*Qarasaqqal*. Əfsanə samux rayonundan toplanmışdır.

***270.****Savalan ulduzuna baxmısan.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***271.****Quru kəllə.* Əfsanə «Xalqın söz mirvariləri» kitabından götürülmüşdür.

***272***.*Dəmirçi və mismar əhvalatı*. Əfsanə Füzuli rayo-nundan Vahid Xələfovdan toplanmışdır.

***273***.*Hüröyün və elin igid oğlu.* Əfsanə Füzuli rayonundan Vahid Xələfovdan toplanmışdır.

***274.*** *Dağ Yunisin xəzinəsi.* Əfsanə Şəkir rayonunun Qaraxanlı kənd sakini Məmməd Dəmiroğlundan toplanmışdır.

***275***. *Hardan alaydım.* Əfsanə Daşkəsən rayonunun Qazaxyolçular kənd sakini İbrahimxəlil Səmədoğlundan toplanmışdır.

***276***. *Ceyranbatan göl əfsanəsi*. Əfsanə Göyçay rayo-nunda xalq şairi Rəsul Rzanın yaxın qohumlarından toplanmışdır.

***277***. *Bülbül və tikansız gül.* Goranboy rayonu, Tapqaraqoyunlu kənd sakini el şairi Bisavad Teymurdan toplanmışdır.

***278****. Əsli və Kərəm əfsanəsi.* Əfsanə Daşkəsən rayonu, Əmirvar kənd sakini Aşıq Abuzərdən toplanmışdır.

# Mündəricat



## *Əfsanələr*

### ***Dağ, daş və qayalar***

***Bulaq, çay və dəniz***

### *Çiçək və gül əfsanələri*



### *Quş və heyvanlar haqqında*

## *Ay, Gün və Dədəgünəş əfsanəsi*



## *Qədim qalalar*

***«Dədə Qorqud» əfsanələri***



***Nizami mövzuları ilə səsləşən əfsanələr***

***Koroğlu əfsanələri***

***Apardı sellər Saranı***



***Müxtəlif mövzulu əfsanələr***

**PROF. DR. SƏDNİK PAŞA PİRSULTANLI**

